FİRİDUN BƏY KÖÇƏRLİ





# AZƏRBAYCAN ƏDƏBİYYATI

İKİ CİLDDƏ

II CİLD

"AVRASİYA PRESS"
BAKI-2005

*Bu kitab "**Firidun bəy Köçərli**. Azərbaycan ədəbiyyatı. İki cilddə. II cild" (Bakı, Elm, 1981) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni, müqəddimə, izah və qeydlərin müəllifi: **Ruqiyyə Qənbərqızı**

Redaktorları: **Əziz Mirəhmədov**
**Bəkir Nəbiyev**

**894.36109 – dc 21**
**AZE**
**Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı.** İki cilddə. II cild. Bakı, "AVRASİYA PRESS", 2005, 464 səh.

Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, alim, tənqidçi və pedaqoq Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı" adlı fundamental əsərində ədəbiyyat tariximizin ən önəmli səhifələri, ədəbi proseslər elmi ardıcıllıqla nəzərdən keçirilmişdir. İndi də öz ədəbi və elmi dəyərini azaltmayan "Azərbaycan ədəbiyyatı" əsəri milli-bədii söz sənətimiz haqqında mötəbər məxəz sayılmış və sayılmaqdadır.

**ISBN 9952-421-17-4**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# BAHAR ƏYYAMI VƏ HACI SEYİD ƏZİM DÖVRÜ[1]
# BAHAR ŞİRVANİ – MİRZƏ NƏSRULLAH İBN MƏRHUM HACI ƏBÜLQASIM ŞƏMAXI "BAHAR"

Mirzə Nəsrullah Bahar Şamaxının ən müqtədir şairlərindən birisi hesab olunur. Azərbaycan şairlərinin tarixinə az-çox bələdiyyatı olanlara Baharın nami-möhtərəmi və kəlami-dilpəziri mə'lum olmamış deyil.

Necə ki, sabiqdə zikr olundu, Şamaxı şəhəri qəribə dahiyələrə gəhvareyi-tərbiyə olduğundan naşi bədiül-misal alimlər və şairləri və ədibi-fazilləri öz ağuşi-nazbəxşində bəsləyib ərseyi-dünyaya gətirmişdir. Qüdəmalarından ən bərgüzidə olanları Xaqani Şirvani, Sahib Şirvani[2], Ağaməsih və Nişat Şirvani və qeyriləri olduğu halda, mütəəxxirindən dəxi mərhum Mirzə Bahar Şirvani, Molla Qədir Şirvani, Bixud Şirvani, Hacı Seyid Əzim Şirvani və Sabir Şirvani Azərbaycanın ən mö'təbər və məşhur şairləri hesab olunur.

Mirzə Nəsrullah Bahar artıq tizfəhm, rəvan təb'li, iste'dadlı bir şair imiş ki, kəmalatına layiqincə vaqif olmaq istəyənlər lazımdır ol ədibin türkcə və farsca və hətta fransızca vücuda gətirdiyi asari-nəf'isəsini mütaliə edib, onun qüvveyi-fikriyyəsinə və ülüvvi-məratibi-xəyalına bələd olsunlar.

Bahari-namdar hicrətin 1251-ci[3] tarixində Şamaxı şəhərində təvəllüd etmişdir. Pədəri-möhtərəmi Hacı Əbdülqasım silsileyi-tüccardan nəcib və alitəb' bir şəxsi imiş.

Bahar sinni-tüfuliyyətdə məktəbdə oxuduğu vaxt zəkavət və fətanətilə çoxlarını heyrətə salarmış və uşaqlıqdan şe'r və qəzəl deməyə həvəsi varmış. Belə ki, farsca oxuduğu qəzəlləri türk dilinə nəzmən tərcümə edərmiş. O cümlədən qəzəli-məşhurdan:

> Moğan kəz daneye-ənqur ab misazənd,
> Setareha şekənənd, aftab misazənd

– beytini belə tərcümə etmişdir:

> Əngur danəsin ki, əzəllər şərab üçün,
> Guya sitarələr pozulur afitab üçün.



Yenə məşhur beyti:[4]

> To ke, əz xordəne-mey lə'le-ləbət rənginəst,
> Bəs səbəb çist ke, mey təlx, ləbət şirinəst?!

– belə tərcümə qılmışdır:

> Gər mey içməklə sənin lə'li-ləbin rəngindir,
> Səbəbi bəs nədi mey təlx, ləbin şirindir?!

Cibilli fitrət və zəkavəti sayəsində Bahar az vaxtda çox məlumata dara olmuşdur. Fars, ərəb və türk dillərini kamalınca təhsil etmişdir. Müasiri mərhum Abdulla bəy Asi kimi Bahar dəxi laübali və laqeyd bir şəxs imiş ki, kefi istədiyi kimi azadə dolanıb, heç kəsin hökmü fərmanına itaət etməzmiş və övqatını eyşü işrətdə keçirərmiş. Onun bu gunə rindisifət dolanmağını dayısı xoşlamayıb və bir qədər ona pul verib və mayəmləkdən ixrac etdikdə şair bədahətən bu məzmunda bir qit'ə demişdir:

> Dayım məni həzrəti-Adəm kimi
> Buğda yedim çıxartdı cənnətdən.
> Beş-on tümən nədir mənim karıma,
> Şükri-xuda qurtardım minnətdən.

Dayısından aldığı məbləği bir az müddətin zərfində kənarda xərcləyib, şəhərə müraciətində həməsri olan Molla Qədir Naci Şirvani ilə görüşdükdə bu beyti bədahətən demişdir:

> Bir aydan sonra gəldim şəhrə, ey Naci, hilalasa,
> Məni el lağərü üryan görüb, meyl etmədi əsla.

Baharın bədihəguluqda binəzir bir şair olduğu müxəmməsi-məşhuriatisindən aşikarən mə'lum olur. Şamaxıda məşhur Hacı İbrahim bəy bağında rüfəqaları Əndəlib Kaşani[5], Naci Şirvani, Seyid Şirvani və qeyriləri olduqda rəfiqlərindən birinin hüzurda olmadığına görə, xadimi onun dalınca göndərdikdə birqələmə yazdığı qəsideyi-bədihiyyəsidir ki, belə başlanır:

> Neşəst aftabha, meye-ço aftab ku?
> Ço şod neqare-məhleqa, piyaleye-şərab ku?
> Sorude-rud, mey koca, təraneye-robab ku?
> Became'-bossədin koca meye-ço lə'le-nab ku?
> Becane-mən qolamikə konun şetabe-kar kon[6].

Cəhalət və təəssübün, ələlxüsus, təəssübi-cahilanənin düşməni olub, onun kökünü və rişəsini qazıb çıxartmaq üçün məhafilü məcalisdə məqalələr və gözəl niqlər deməkdən əsla çəkinməzmiş. Məcalisdə sözlərinin haqq olmasını şafi dəlillər vasitəsilə sübuta yetirərmiş. Belə ki, bir kərə bir məclisdə mövhumat və əsatiri-əvvəlin babında mübahisəyə girişdiyi vaxt tərəfi-müqabilə söz anlatmaq üçün bir misal gətirmişdir. Belə ki, deyibdir: "Əfəndilər! İndi mən bu divara bir inək şəkli çəkərəm və o inəkdən sizin üçün süd sağaram". Müstəmein iştiyaqi-tamam ilə israr etmişlər ki: "Cənab mirzə, lütfən mərhəmət edin, bir baxıb seyr edəlim". Bahar cavabında demiş ki: "Bəli, əfəndilər, sizlər mö'təqid olduğunuz mövhumatın əksəri bu qəbildəndir. Bunca təfəkkür və təəqqül etmirsiniz ki, divara çəkilmiş inək şəklindən süd sağmaq məhal və qeyri mümkündür. Bu payədə sadəlövhlükdən süd tələb edirsiniz".

Necə ki, zikr olundu, mərhum Bahar müasiri Abdulla bəy Asi və Seyid Şirvani kimi badəpərəst olub, çox açıq və xövfsüz meyi-nabı tə'rif qılarmış və bə'zi vaxt Şeyx Xəyyam kimi onun tə'rifində əndazədən keçərmiş. Necə ki, bir məclisdə münasibətən bu beyti oxumuşdur:

Bade vəhyəsto səbukeş cəbrəil,
Hər ke inra mixorəd, peyğəmbərəst[7].

Əhli-məclis bunu eşidib küllən əleyhinə qiyam edib, onu tənü lə'n etməkdən çəkinməmişlər. Təkfirinə üləmadan dəxi hökm olunmuşdur. Əlhəqq, Baharın bu halı biçarə Abdulla bəyin halına çox müvafiq gəlir. Hər iki şair ziyadə xoştəb' və şirinkəlam və nəcib və xoşxülq olduqları halda əsiri-badeyi-gülfam və şərabi-bədfərcam olub, abru və hörmətlərini itirib, təb'i-rəvanpərvərlərini boş şeylərin üstünə sərf etmişlər.

Yuxarıda zikr olunan vəq'ədən sonra mərhum Mirzə Nəsrullah Şirvanda artıq iqamət edə bilməyib, tərki-şəhrü diyar edib İrana müsafirət etmişdir və Tehranda Nəsrəddin şaha[8] bir qəsideyi-qərra təqdim etmiş ki, mə'nləi budur:

Şəbəm benalevo ruzəm qozəşt dər tari,
Fəğan ze gərdeşe-in asemane-zənqari*.

Qozəşt əz sere-bam aftabe-omr hənuz,
Ze bəxte-xofte nədarəm omide-bidari.

Xəmide şod qədəm əz bare-mohnəte-əyyam,
Bəli, xəmide şəvəd qamət əz gəranbari.

* Zənqar – yaşıl, göy mə'nasındadır



Mənəm sepehre-qəmin şadəm ke, şəb ta sobh
Setarehaye-sereşkəm konənd səyyari.

Bebustane-cəhan həmço bide-məcnunəm
Konəm tərəqqiye-mə'kus dər nequnsari[9]...

Bu qəsideyi-qərra vasitəsilə Mirzə Nəsrullah şahın xidmətində təqərrüb hasil edib, hüzur şüəralarından məhsub olmuşdur və axırda "Məliküşşüərə" ləqəbini almışdır və ona şahın xəzinəsindən məvacib tə'yin olunmuşdur. Haman vaxtlarda şair xaricdən bir müəllim tutub fransızca tə'lim almağa məşğul olub, bir az vaxtın ərzində firəng lisanını bir dərəcədə kamil öyrənmişdi ki, o dildə şe'r deməyə dara olmuşdur. O cümlədən ərəbcə, farsca, türkcə və fransızca dediyi bir qəzəldir.

Ərəbcəsi:

Əya xilləti qəd nəqəztil-uhud,
Aufərti minhu yaumə məhsud[10].

Farscası:

Ze dəste-fərağət çenan zar geryəm –
Ke əz dide cari konəd Zenderudi[11].

Türkcəsi:

Yetişməzmi naləm sənə, ya ilahi,
Dağıtmazmı ahim bu çərxi-kəbudi?

Fransızcası:

Ciel, où suis – je, où etais – je où serial – je ah?
Peut on supproser une nouvelle assez rude?
Chere amie, serai – je en etat de decouvrire?
Vous vestige en Est, Oueste, nord, sud?[12]

Məşhur rəvayətə görə, Mirzə Bahar 1295-ci[13] sənədə Tehrandan Təbrizə əzimət qılmışdır və burada təəhhül ixtiyar edib sakin olmuşdur. O vaxtlarda Təbrizdə iqamət edən ingilis səfiri ilə tanış olub, səfir şairin elmü kamalını və əxlaqi-həsənəsini görüb onunla səmimi dost olmuşdur. Tarixi-hicriyyənin 1300-cü ilində ki, miladın 1883-cü sənəsinə mütabiqdir, aləmi-bəqaya rehlət edib və "Məqbərətüşşüərə"da vətəndaşı Xaqaninin həmsayəliyində dəfn olunmuşdur...

Vəfatından sonra rəfiqi olan ingilis səfiri mərhumun türkcə, farsca və fransızca olan təranələrini və əsərlərindən bə'zini əmanət təriqi ilə almış ki, London şəhərində təb' etdirsin, vəli tabəhal ondan bir xəbər və nişanə yoxdur. Ancaq mərhum Baharın tərcümeyi-halına dair məlumatı möhtərəm Hacı Səfdər Şirvani cəmləşdirib lütf üzü ilə bizə göndərmişdir. Ol cənabın yazmağı ilə şairin əlhal əldə olan əsərlərindən məşhuru bunlardır: türkcə – "Qəzəliyyat"ı, farsca -"Divani-qəsaidü qəzəliyyat"ı və "Töhfətül-İraqeyn" adlı məsnəvisi və "Nərgis və gül" adlı bir kitabı vardır ki, heç biri hala təb' olunmamışdır. Bu əsərlərin heç birisi bizim nəzərimizə çatmayıbdır. Ancaq bir neçə qəzəliyyat fars lisanında bizə Ağaəli bəy Əfəndiyev "Naseh" təxəllüs göndəribdir ki, çap olunur.*

Qəzəli-Bahar:

Nemiquyəm ke, del əz dəst giro şad kon mara,
Əgər bini ze pa oftadeira, yad kon mara!

Becan dadən nəxahəm şekve kərdən əz cəfaye-to,
Təvani hər çe, ey namehreban bidad kon mara!

Nəqoftəm ğeyrra əz rəhm kon ommidvare-xod,
Tora qoftəm ke yek şəb quş bər fəryad kon mara!

Bexun balo pərəm dər keş əgər ze azare-mən şadi,
Benaləm gər ze courət, əz qəfəs azad kon mara!

Behəsrət ta key, ey həmaşiyan, sər zire-pər manəm,
Xodara, rəhbəri bər xaneye-səyyad kon mara!

Bovəd ta key deləm xun dər vosal əz olfəte-ğeyrəş,
Kocai, ey şəbe-hecran, biya, emdad kon mara!

Konəm ta çənd əz to çon Bəhar ezhare-naşadi,
Berahi qah-qahi əz neqahi şad kon mara![14]

Əyzən qəzəli-Bahar:

Ruze-vəsləst, xodara, bekoş əz naz məra,
Baz bər həsrəte-didar məyəndaz məra!

* Ağaəli bəy cənablarının bizə artıq hüsni-xidmətləri olubdur və Şamaxı şüərasının seyr-sülukuna dair bə'zi mühüm məlumatı ol cənabın həmiyyəti ilə kəsb etmişik. Buna binaən münasib məqam bilib burada ol cənaba izhari-məmnuniyyət qılmağı gözəl vəzifələrimizdən əddedirik.



Ba həme couro cəfa suye-to ayəm çe konəm,
Beqozarəd del çon gəşte bexod baz məra.

Ah əz in şiveye-səyyad ke əz səngdeli,
Beşkənəd balo dəhəd roxsəte-pərvaz məra.

Cay darəd ke xoda xanəmət, ey məh ke, çenin
Hər nəfəs mikoşiyo zende koni baz məra.

Çe qədr be mən mikoni əz koştəne-mən,
Kərdei zende məgər, ey bote-tənnaz, məra?!

Beçenin dideyi-keryano roxe-zərde-Bəhar
Aşekara nəş'əvəd çon becəhan raz məra[15].

Əyzən qəzəli-farsiyi-Bahar:

Rixti, bərhəm zədi kisiyi-ənbərfamra,
Baz rosvaye-cəhan kərdi məne-bədnamra.

Şod moşəvvəş əz deləm zolfe-to, ari, mişəvəd
Əz təpidənhaye-morğ aşoftegiha damra.

Və'de dadi sobh bər vəsləm, məgər danestei
Hecre-to bər mən bərabər kərde sobho şamra?!

Qoftəməş: Siminbərətra xahəm əndər bər keşid,
Qoft: Ro, əz del borun kon in xəyale-xamra.

Gər besurət bər to manəd surəte-bothaye-Çin,
Vaceb aməd səcde kərdən bəd əz in əsnamra.

Henduye-zolfət əgər zin qune qəsde-din konəd,
Səcdeqahe-kofr sazəd qebleye-eslamra.

Çon koni bər mostəhəqqan bəxşe-ne'məthaye-hosn,
Bər Bəhare-xəstədel əvvəl bedeh doşnamra[16].

Qəzəli-farsiyi-Bahar:

Şəvəd bexak nehan sobhe çon şərab dər ayəd,
Setare celve nədarəd ço aftab dər ayəd.

Ze şərm mah keşəd sər bexak pirəhəne-sobh,
Şəbi ke mahe-mən əz xane bineqab dər ayəd.

Ze didənət rəvəd əz dide gər sereşkəm, əcəb nist,
Dər aftab ço bini ze dide ab dər ayəd.

Ze şərhe-qesseye-zolfe-to şəb nəxosbəm əgər çe
Deraz şod ço hekayət ze dide xab dər ayəd.

Məgər ze çine-do zolfe-to kərde nafe qoşayi
Ke əz nəsime-səhər buye-meşke-nab dər ayəd.

Ze geryeəm ləbe-lə'ləş şəvəd be xənde qoşude,
Bəli, bexənde qol əz geryeye-səhab dər ayəd.

Ze yade-xuye-roxəş şod Bəhar təb'qozari,
Ço qətre dər sədəf oftəd dore-xoşab dər ayəd[17].

Əgər fars ədiblərinin ən məşhur və kamili bu qəzəllərdən hər birini mütaliə edib diqqət yetirə, anladığımıza görə, yenə də təşxis edə bilməz ki, bunlar türk oğlunun kəlamıdır. Bundan mə'lum olur ki, mərhum Bahar fars dilinin şivəsinə və üsuli-inşasına bir dərəcədə bələd imiş ki, onu öz ana dili kimi bilirmiş.

Baharın bu qəzəlləri müasiri olan Qaaninin və sair məşhur fars şairlərinin kəlamına bənzəyir. Xaqani Şirvaninin səfəhati-İranda o qədər adı və şöhrəti yoxdur, nə qədər ki, Baharın namü nişanı və ehtiramı ziyaddır.

Farslar özləri iqrarü etiraf edirlər və Xaqaninin şe'rlərini oxuduqda deyirlər: "Buye-tork miayəd"[18]. Və lakin Baharın kəlamına o qəbil isnadat verilmir.

Cinas, eyham, təşbihat və istiarat iste'malında Bahar mərhum Qaaniyə bərabər imiş. Bu qövlümüzün təsdiqi üçün axırıncı qəzəldən bir neçə beytlərin tərcüməsini burada gətirməyi lazım gördük: Günəş doğub asiman üzrə tülu etdikdə ulduzların cilvəsi pozulub, nəzərə gəlmədiyi kimi, şərabi-gülfam dəxi məclisə gəldikdə təsbeh tarları gözdən düşüb məhvü nabud olur. Sənin nurani üzünü gördükdə gözlərimdən yaş axmağı təəccübünə gəlməsin, zira ki, günəşə hər kəs baxsa, gözlərindən su axar. Sənin müəttər və uzun saçının qissəsini şərh etdikdə gecələr sabaha kimi yatmadığım ondandır ki, hekayət tul çəkdikdə gözdən yuxu gedər. Mənim ağlamağımdan onun lələ bənzər dodaqları xəndə edib gül kimi açılır, yə'ni mən ağladıqca nigarım gülür. Bəli, bunda təəccüb yoxdur, həmişə göy üzündə bulud ağlayanda çəməndə gül xəndə edir və hakəza.

Baharın türk dilində yazdığı şe'rlərdən bir neçə qəzəlləri ələ düşdü ki, burada dərc olunur.



Qəzəl:

Mey puni cilvə eylədi cami-bülurdən.
Cami-büluri gör ki, ləbaləbdi nurdən.

Ruxsarın atəşi məni yandırdı durdən,[19]
Əlbəttə, yandırar, düşə gün gər bülurdən.

Naz ilə bir xuramə gəl, əmvatə qıl güzər,
Ta "mərhəba!" səsi gələ əhli-qüburdən.

Zahid sözilə kim büti-meyxanədən keçər,
Özü görək keçirmi behişt ilə hurdən?[20]

Ol bivəfa tutarmı vəfa ilə dəstimi,
Basmaz ayağını gözümə çün qürurdən.

Meyxanəyə Bahar qürur ilə meyl edər,
Zahid qüsura meyl qılır [kim] qüsurdən.

Qəzəl:

Zülfün kimi qaraldı könül dudi-ah ilə,
Eşqində idda edərəm bu güvah ilə.

Netsin o tari-zülfünə bu qan olan könül,
Mümkünmüdür bacarmaq o zülfi-siyah ilə?!

Hər guşəsində gözlərinin min bəla yatıb,
Necə can almasın belə göz bir nigah ilə?

Lütf ilə yığdı sün'i-qəza hüsni-ruyinə,
Necə ki, bağban gülü bağlar giyah ilə.

Müjgan səfini sinəmə çəkmək rəva deyil,
Gəlmək xərabə mülkə nə lazım sipah ilə?!

Fikri həmişə qanını tökməkdir aşiqin,
Muxtardır, nə etmək olur padişah ilə?

Meyxanəyə Bahar girib "ya sənəm" deyir,
Zahid girəndə Kə'bəyə yüz "la ilah"[21] ilə.

Qəzəl:

Hər kim ki, hicri-yar ilə düşsə dimağdən,
Heç açılırmı könlü onun seyri-bağdən?

Sordum sorağını, dedilər qeyrə yar olub,
Ey kaş, lal olaydı dilim bu sorağdən.

Ölməkdən özgə yox mənə eşqində bir vüsul,
Pərvanə yanmağın sevər ancaq çirağdən.

Bir lalə üzlü yar çəkib dağ sinəmə,
Ya rəb, sən etmə sinəmi xali bu dağdən!

Yetdikdə gül dodağına mey bilməzəm alır
Meydən dodaq nəş'əni, ya mey dodaqdən:!

Sənsiz əgər bahar açıla istəməz Bahar,
Nə qönçə bağdən açıla, lalə dağdən.

Qəzəl:

Aç qara zülfünü ta səfheyi-ruxsarı tuta,
Xoş olur sünbül əgər açıla gülzarı tuta.

Hər zaman müşki-Xitadən iy oğurlar zülfün,
Möhtəsib hanı ki, bu düzdi-xətakarı tuta?

Bilməyirsən neçə min aşiq olub zülfünə bənd,
Zülf qalmaz sənə gər hər biri bir tarı tuta.

Hiç insaf deyil, zülfünə canım qurban,
Mən duram, özgələr ol türreyi-tərrarı tuta.

Qorxum oldur ki, görə zülfünü zahid nagəh,
Buraxıb sübheyi-səddanəni, zünnarı tuta.

Nə əcəb etməsə ol şux mənimlə göftar,
Neyləsin, yox o qədər ağzı ki, göftarı tuta.

Yalvara-yalvara zülfün nə olur tutsa Bahar,
Çox əcəb sanmayın əfsungər əgər marı tuta.

Qəzəl:

Lə'li-ləbin ki, xəlq deyirlər şərab ona,
Xasiyyəti-şərab tapar yetsə ab ona.

Şirin ləbin ki, lə'l ürəyin qanə döndərib,
Yoxdur üzündə qanı, deyən lə'li-nab ona.



Görmək şüai-arizini kimdə tabi var,
Bitablıq edib nə salırsan niqab ona?!

Gündən-günə saraldı, görüb hüsnünü yenə,
Girməz yerə ki, qarşı çıxar aftab ona.

Nəf'yi-vücudi-nöqteyi-mövhum edər həkim,
Ağzın deyəydi kaş açılıb bir cavab ona.

Zahid ki, eşqi küfr deyib hökm edər, Bahar,
İmanə gəlməz, oxuyasan min kitab ona.

Qəzəl:

Tutsam şərabı gər ləbinə tay, haramdır,
Gər nöğrə söyləsəm təninə, hərfi-xamdır.

Ruxsarın üzrə zülfünə baxdım o qədr kim,
Gördüm ki, gün qürub eyləyib, vəqti-şamdır.

Mahi-tamam səhv ilə bir gün dedim sənə,
Hər kəs eşitdi, dedi: bu söz natamamdır.

Zalım, bu qədr könlümü qan etməyin nədir,
Qan etmədim, dedim ləbinə lə'l, namdır.

Zahid bilirmi hiç miyanın hekayətin,
Nazik sözü nə bilsin o kəs kim, avamdır.

Zahid, təvafi-Kə'bəni qoy, bir güzar qıl,
Meyxanə içrə gör nə səfalı məqamdır?!

Dedim ki, şəhddir ləbin, ey cani cismimin,
Dedi: görün Bahar nə şirinkəlamdır.

Qəzəl:

Derdim o məst gözlərinin çox bəlası var,
Gördüm o qara zülfü onun da xətası var.

Hərgiz behiştə meyl eləməz, huri istəməz,
Hər aşiqin ki, sən kimi bir dilrübası var.

Derlər bahadır ağzına can, bilməzəm neçün
Bu yox olan şey'in bu qədər çox bahası var?

Müjganın ilə çeşmini gər sorsalar nədir,
Bimar piri gör ki, əlində əsası var.

Bir naz ilə xuramə gəl, ey sərv, ta görək
Hüsn içrə hansı sərvqədin iddiası var.

Yox eybi gərçi hicrin ilə ölməgin, vəli
Çeşmin görəndə ölməgin özgə səfası var.

Fəxr eylə kim, qulamınam, ey xublər şəhi,
Hansı şəhin Bahar kimi bir gədası var?

Mərhum Baharın türk lisanında yazdığı başqa kəlamlarından, məəttəəssüf, ələ gətirə bilmədik. Onların vasitəsilə şairin qədrü qiyməti və dərəceyi-kəmalü təb'i-şe'riyyəsi daha da artıq təhqiq və tə'yin olunardı.



## MOLLA QƏDİR ŞİRVANİ "NACİ"

Şamaxı şüərasının mütəəxxirinindən olub keçmiş əsr əvasitində, yə'ni tarixi-hicriyyənin 1240-5-ci[22] illərində hali-həyatda var imiş və Bahar Şirvani ilə neçə dəfələr bir bəzmdə olubdur. Bahar onun, elmü kəmal sahibi olmağa görə, xatirini əziz tutarmış. Nacinin əş'arü asarından bir çoxu müfti əfəndinin "Məcmuə"sinə daxil olubdur ki, onlardan əksəri qəzəliyyat qismindən ibarət olan şe'rlərdir. Bu qəzəllərdən Naci əfəndinin mütləq bir məsləkdə davam etməsi anlaşılmır. Onlardan bə'zisində şair ancaq meyi-gülfamdan və eşqi-yardan bəhs edib özgə babda söz söyləmir və bu qisim kəlamlarının bir neçəsində mətləbi o qədər açıq və xövfsüz söyləyir ki, onun həqiqi meypərəst və rindi olmasına şəkk qalmır. Məsələn, bir qəzəlində deyir:

Əksi-ruxi-saqi görünür badədə, oldur
Bais həvəsim badeyi-gülfamə düşübdür.

Eyb eyləmə, ey Nacini meyxarə görən kəs,
Yengicə kişi şiveyi-islamə düşübdür[23].

Bəzi qəzəllərində Naci mö'minü müttəqi və həqiqi müsəlman olmağını bəyan edib nicat və səlaməti məhz ibadət və riyazətdə görüb, haqqtaalanın rəhmət dəryasına və intəhasız lütfü şəfəqqətinə ümid bağlayır. Necə ki, deyibdir:

Naciya, rəhməti-həqdən eləmə qət'i-rica,
Yox onun rəhməti dəryasına qərü sahil[24].

Bəzilərində büxlü xəsasətin zəmmini, səxavətü ədalətin, füqəra halına yanmağın mədhini təhrir qılır. Necə ki, bu babda bir qəzəlində deyibdir:

Bir fəqirin halına rəhm eyləməkdən yaxşıraq
Əzmi-suyi-bağı-cənnət eyləsən yoxdur dəlil[25].

Bir para qəzəllərində zahiri ibadəti və riyai zöhdü təqvani nəhy edib tamahkar və hiyləsaz vaizləri müttəhim edir. Bir qisim qəzəllərində nəfsi-əmmarəni[26] və cifeyi-dünyanı və hirsü təmə'i, yalançı şöhrət və izzəti cümlə fəsadların mayası hesab edib insanın bunlardan xilas olmasını, fəqrü zillətə tab gətirməsini və hər işdə sabirü şakir olmasını tövsiyə edir. Və bir para əş'arü kəlamında dünyavü mafihanın fənavü bibinavü bivəfa olmasını rişteyi-nəzmə çəkib özü həm talibi-fəna olmasını izhar eləyir və sufiməslək olmağını bildirir:

Gər müti'-nəfssən lafi-məhəbbət urmagil,
Xatirindən etməsin bu fikrlər əsla xütur.

Masəvanı tərk edib pakü mücərrəd olmamış,
Eyləməz mir'ati-qəlbin feyzi-həqdən kəsbi-nur.

Naciya, qəflətdə bey' etdim məta'i-ömrüm,
Eşq sövdasında sudim olmadı qəlbi-hüzur[27].

Xülaseyi-kəlam Molla Qədir Nacinin hər qisim kəlamları vardır ki, təmamisini buraya yazmaq ilə qurtarmaz*.

Nacinin kəlamının çoxusu Füzuli Bağdadinin kəlamının səbkində və nəzirə sayağında təhrir olunubdur. Nümunə üçün Nacinin qəzəllərindən bir neçəsi burada yazılır.

Münacat:

Ya həyy ki, yox dəhrdə həmta sənə əsla,
Ya hər dü cahan maliki Allah-taala!
Ya əvvəlü axır, ya zahirü batin,
Ya hafizü ya rafei-nöh çərxi-müəlla!
Ey şamı qılan taleyi-Məcnun kimi tirə,
Ey rövşən edən sübhi misali-ruxi-Leyla!
Məcnueyi-aləm həmə möhtaci-nəvalın,
Ey lütf ilə ruzidəhi-ə'davü əxilla,
Sal könlümə bir ləm'eyi-eşqin şərərindən,
Heyvan suyu təkdir mənə ol od, dəxi ə'la.
Həll et sənə şükr etmək üçün əqdi-lisanım,
Qıl ayineyi-təb'imi həm safü mücəlla!
Tövfiqini həm Naciyi-naçizə rəfiq et,
Ta kim, qıla bu nüsxəni inşa, edə imla[28].

Qəzəli-Naci Şirvani:

Verdikdə mey xəlayiqə ol saqiyi-əzəl,
Yüz şükr ona ki, qoymazdı nəş'əmdə bir xələl.

Bir gunə meydir ol ki, içən huşyar olur,
Qəflət yuxusu tutmaz onu ta dəmi-əcəl.

Zatü sifati-saqini isbat qılmağa[29]
Düşmüş miyani-aləmə yüz bəhs ilə cədəl.

* Əgər Nacinin cənab müfti əfəndinin "Məcmuə"sində olan əş'arü kəlamı və sair asari-lətifəsini bir yerə cəmləşdirib məxsus bir divan səbkində çap etdirən olsa, ədəbiyyat xəzinəmizə gözəl bir cəvahir bəxş etmiş olur.



Əni xitab olanda "ələstü birəbbiküm",[30]
Vəhdət meyin "bəla" deyibən çəkdim ol məhəl.

Ey dil, çəkinmə, bimeyi mə'şuq qoyma kim,[31]
Bica rahi-fənayə gedə ömri-bibədəl.

Hər kim ki, bəzmi-eşqdə mey nuş qılmadı,[32]
Sudi nədir əgərçi yüz il eyləsə əməl?

Meydən buyurma tövbə məni-rində, Naciya,
Təğyir olurmu hökmi-xudavəndi-ləmyəzəl?![33]

Naci Şirvaninin bu kəlamından aşkar görünür ki, onun tə'rif qıldığı mey üzüm suyundan əmələ gələn və insanın əqlü huşunu başdan çıxarıb, onu bihörmət və məsti-layə'qəl edən mey deyil. O mey vəhdət və məhəbbəti-ilahi meyidir ki, onu çəşid edən dəxi də artıq huşyar olub mə'nəviyyat aləmində uca məqamlara nail olur. Necə ki, deyir:



Bir gunə meydir ol ki, içən huşyar olur,
Qəflət yuxusu tutmaz onu ta dəmi-əcəl.

Müasiri olan ədalətli və mürüvvətli və əhli-səxa bir şəxsin haqqında demişdir:

Ey cəm'ii-xislətin məmduhü əxlaqın cəm'il,
Xəlq ara insafü ədlindən düşübdür qalü qil.

Görməsin qəm xatirin, olsun vücudun ta əbəd
Xürrəmü sərsəbz keçdikcə zamanü ayü il.

Bir fəqirin halına rəhm eyləməkdən yaxşıraq
Əzmi-suyi-baği-cənnət eyləsən yoxdur dəlil.

Əhli-dövlət ol kişidir kim, səxavətpişədir,
Olsa gər sultan gədadən həm mühəqqərdir bəxil.

Malü əmlakın görüb ücb eylədi Qaruni-dun,
Çəkdi yer kamına əjdər tək anı zarü zəlil.

Etdi Fir'onu qüruri-səltənət dindən bədər,
Qərq qıldı ləşkəri birlə bzün dəryayi-Nil.

Sanma istiğna görən saətdə bir fəqr əhlini,
Vermə qəm üzrə ona qəm, eyləmə həmlin səqil.

İnkisari-nəfsdən əşxasi-safitinətin
Mənzili gülzari-cənnətdir, şərabi səlsəbil.

Qissə kutəh, bu zamanın sahibi-dövlətləri
Payimali-kibr edər gördükdə bir mərdi-zəlil[34].

Türfə könlüm arizuyi-Kə'bəni eylər müdam –
Kim, onu mə'mur qılmış həzrət İbrahimxəlil.

Cəhd edərlər yıxmağa məhzun könüllər xanəsin,
Xane'i kim, xass öziçün tərh qılmışdır cəlil.

Ey yıxan dillər evin, gör nə üqubət gördülər
Bir evi yıxmaq təmənnasında ol əshabi-fil.

Naciyi-biçarəni çox xar tutmun fəxr edib,
Cümlə xəlqin rizqinə xəllaqi-aləmdir kəfil[35].

Nacinin bu qəzəlində çox məzmunlar və nazik işarələr vardır ki, onlara diqqət yetirməmək olmaz. Şair insanın qəlbinə toxunma[ğı] və könlünü xarab etməyi böyük bir günah bilib, ona işarə edir və əhli-zülmə cavabən deyir ki, ey dillər evini dağıdan cəfakarlar, görün bir evi yıxmaq təmənnasına düşən əshabi-filin başlarına nə bəlalar gəldi, sakının qadiri-zülcəlalın əzabından ki, könüllər onun evləridir və heç kəsin onlara xələl və pozğunluq gətirməyə ixtiyarı yoxdur. Necə ki, Naci dəxi bu babda deyibdir:

Dil ərşi-ilahidir, onu eyləmə təxrib,
Dəsti-bəşər ol xənani tərmimə nə mümkün[36].

Və bizim türklərin arasında atadan qalma söz vardır ki, deyirlər: "Kə'bə yıxmaq bir evdir, könül yıxmaq yüz qandır".

Bəs, adam nə qədər mülayim və qeyrilərin haqqında mehriban və canfəşan olsa, nə qədər alçaq təbiətli, təvazölü, hörmətli və qədirşünas olsa, bir o qədər xalq içində möhtərəm və mö'təbər və Allah-taala nəzərində əziz və müqəddəs sayılar. Ol kəsin həqiqətdə "mənzili gülzari-cənnətdir, şərabı səlsəbil".

Vaizi-tamahkar və riyaşüar haqqında deyibdir:

Həmişə iş sənə və'zi-xudadır, ey vaiz,
Qəsəm o və'zinə kim, bu, riyadır, ey vaiz!

O nasə kim, buyurursan xətadən istiğfar,
O səndə olmasa, əmrin xətadır, ey vaiz!



Məgər xəyalına düşməz "ətəəmrunən-nas" –
Ki, fe'l'in özgə, sözün ittiqadır, ey vaiz!

Cəmaəti ki, qılırsan hərisi-rəsmi-səxa,
Bilən bilir sənə nə iddiadır[37], ey vaiz!

Sorub ibareyi-xoş xəlqdən alırsan dil,
İbarədirmi bu ya[38] dilrubadır, ey vaiz!

Görər cəhənnəmi hər kəs ki, gəlsə məclisinə,
Dəmin xəlayiqə duzəxnümadır[39], ey vaiz!

Kəlami-izədir dersən ki, mal edim hasil,
Deyil bu moizə, bey'ü şiradır, ey vaiz!

Zəkatə kim, füqəra malıdır, dikirsən[40] göz,
Bu hansı məzhəbü dində rəvadır, ey vaiz?!

Təmə'dən ötrü tökərsən sirişk vəz' edibən,
Təmə' deyil, bu səninçün bəladır, ey vaiz!

Həmin səni deməzəm, bu biladə qaziyi-şəhr –
Sənin kimi, dəxi çox mübtəladır, ey vaiz!

Buyurma Naciyə tövbə şərabdən, kərəm et –
Kim, ol [riya] mərəziçün də'vadır, ey vaiz![41]

Mərhum Hacı Seyid Əzimin belə tamahkar və xudbin vaizin zəmmində yazdığı qəzəl bu sayaq başlanır...[42]

Mə'nən Nacinin bu kəlamına çox bənzəyir. Amma Seyidin şiveyi-lisanında və üslubi-kəlamında başqa bir lətafət vardır.

Dilbəri-sitəmgər haqqında deyibdir:

Ey rahəti-ruhi-natəvanım,
Bimar gözün fədası canım!

Rəhm et məni-zarü binəvayə,
Hicran oxun atma, tökmə qanım!

Qurbani-kəmani-qaşın olsun
Bu cismi-zəifü natəvanım!

Zülfündə könül məqam tutmuş,
Yox ricətinə dəxi gümanım.

Suzi-dilimə tərəhhümün yox,
Yetməzmi sənə məgər fəğanım?

Aləm mənə olsa qəm, deyil qəm,
Lütfün əgər olsa mehribanım.

Hicrin bilə getdi Naciyi-pir,
Sağlıq bilə qal, sən, ey cəvanım![43]

Əyzən qəzəli-Naci:

Səbadən gül üzarın üzrə zülfi-müşkbar oynar,
Gülün yanında guya sünbüli-pürtabdar oynar.

Edən təhrik ruyində niqabi-əbrgundurmu
Və yaxud afitab üzrə gəzər əbri-bahar, oynar?

Sənin tək bibədəl şuxi gətirmiş əsrə həft aba,
Nişatü zövqdən daim fələkdə biqərar oynar.

Görüb öz mehrini zail, fələk salmış sənə mehrin,
Dolanur başına yüz şövq ilə leylü nəhar oynar.

Niqabın kəşf edib üzdən əgər ərzi-cəmal etsən,
Olub məczubi-bihuş hər nə kim aləmdə var, oynar.

Yerindən canü dil oynar kim, içmiş badeyi-vəslin,
Olub sərməstü layə'qəl, rəqibi-xaksar oynar.

Nəsimi-zülfünü bulsa məşami-Naciyi-xəstə,
Olub pakubü dəstəfşan fərəhdən məstvar oynar[44].

Peyğəmbərimizin şə'nində deyibdir:

Ey pak vücudun səbəbi-xilqəti-əflak,
Bu qövldə bəsdir mənə şahid iki "lövlak".

Verimş sənə izəd o qədər rütbeyi-əla,
Yüz il uça, yetməz o yerə tayiri-idrak.

Xak üzrə ki, qoydun qədəmin, oldu müşərrəf,
Ötdü fələki-əzəmi bu mərtəbeyi-xak.

Aləm həmə meydani-riyasətdə əsirin,
Olmuş sənə şahani-cahan bəsteyi-fitrak.



Yox zərrəcə bir eyb vücudunda sərasər,
Xəllaqi-cahan cövhərini öylə qılıb pak.

Gülzari-məlahətdə qədin sərv, ləbin gül,
Yanında gülü sərv misali-xəsü xaşak.

Gülşəndə ki, hər gül açılır, sanma səbadan,
Eşqi-ruxi-alında edibdir yaxasın çak.

Gər ruzi-əcəl yetsə mənə müjdeyi-vəslin,
Ol müjdəyə yüz can verərəm şadü[45] fərəhnak.

Qıl əfv, dərində nə ki, tərki-ədəb etmiş,
Naci kimi yox dəhrdə divaneyi-bibak[46].

Mərhum Molla Qədir Nacinin burada zikr olunan kəlamlarından onun təbi-səlim sahibi olmağı anlaşılır. Qəzəliyyatdan əlavə müfti əfəndinin "Məcmuə"sində bir neçə qəsidələr dəxi vardır və lakin onların burada təhrir olunması münasib görülmədi.

## MOLLA AĞA HACI MOLLA TAĞIZADƏ "BİXUD"

Şamaxının xoştəb' və şirinkəlam şairlərindən birisi də mərhum Molla ağa Hacı Molla Tağı oğlu "Bixud" təxəllüsdür ki, Mirzə Nəsrullah Baharın və Hacı Seyid Əzimin müasiri olubdur.

Molla ağa Bixud təvəllüd edibdir şəhri-Şamaxıda hicrətin 1247-ci tarixində şəban ayının 19-cu günündə[47]. Tə'lim və tərbiyəsi Şamaxı şəhərində olubdur.

Məktəbdə tə'limini itmama yetirdikdən sonra kütübi-mütənəvvea mütaliəsilə xeyli məlumat əxz etmişdir. Türk və fars dillərini yaxşı bilirmiş. Ədəbiyyata dair əsərlərin mütaliəsinə artıq meylü həvəsi olmaqdan naşi özü dəxi əyyami-tüfuliyyətdən şe'r deməyə məşğul olarmış.

Ol vaxtlarda sən'əti şərbaflıq olubdur. Amma axırlarda ətriyyat şeyləri satarmış.

Mərhum Bixud qayətdə xoşxasiyyət, batəvazö, güşadəcəbin və səlimün-nəfs bir şəxs olub, müddəti-ömründə cümlə mə'nahilərdən və şürbi-xəmr və qeyri məzmum əməllərdən uzaq imiş. Və lakin həmməsləki-üdəbavü ürəfa və həmcəlisi-şüəra olub, əksər kəlamlarında hikmətamiz mətləblər söylədiyindən zahirpərəst, yekçeşm və fanatik müsəlmanlar arasında məzmumü müttəhim olmuşdur.

Müddəti-ömründə neçə dəfələr İrana və Qafqazın qeyri-şəhərlərinə səfər edibsə də, vaxtının çoxunu Şamaxıda keçiribdir.

Təbi-şe'riyyəsi əgərçi çəndan səri' deyilmiş və lakin şe'rləri ziyadə mövzun və dilpəzirdir. Bir nüsxə "Kitabi-qəzəliyyat"dan başqa özgə bir asarı qalmamışdır. O da çap olunmayıbdır[48].

Hicrətin 1310-cu[49] sənəsində 62-63 yaşında axirət mənzilinə köç edibdir. Vəfatı vəba naxoşluğundan olubdur. Şamaxının ümumi camaat qəbristanlığında mədfundur. Kəlami-abdarlarından bir neçəsi burada yazılır.

Qəzəli-Bixud:

Könül, bu gün ki, müyəssərdi vəsli-yar sənə,
Təqafül etmə, baxar kəc bu ruzigar sənə.

Könül, vüsalına xürsəndsən bu gün yarın,
Fəğan o gündən ola ayrılıq düçar sənə.

Gedə əlindən o məhparə, ayrıla səndən,
Verə zəmanə yenə dərdi-bişümar sənə.



Fələk, məramım ilə gərçi varsa dövranın,
Nə sud, yoxdu səbatın, nə e'tibar sənə.

Könül, o mahruxun zülfün eyləmə məskən,
Məhaldır o pərişan ara qərar sənə.

Edib o şux səni məst bir nigah ilə,
Saqın, bu nəş'ə verir aqibər xumar sənə.

Fəraq dərdi ilə vəslində xövfi-hicran var,
Düş öl qurtar dəxi, Bixud, budur mədar sənə.

Zahid ki, məscid içrə öziçün məkan tutub,
Bayquşdu kim, xərabə ara aşiyan tutub.

Nadanlığın görün ki, könüldə o bişüur
Yüz min qüsur ilə yenə qəsri-cinan tutub.

Kövsərsə mətləbin, olasan kur, zahida,
Görmürsən əldə saqi meyi-ərğəvan tutub?!

Naməhrəm olduğiçün özün novərusi-mey
Səndən çəkib kənara, cəmalın nihan tutub.

Yox badədə nəsibinü kövsərdə qismətin,
Bədbəxtlik basıb səni, zahid, ziyan tutub.

Fitva verir ki, sağəri-səhbanı sındırın,
Ey rindlər, görün, bu xətəkarı qan tutub.

Bixud, yəqin kəlamını dərk eyləməz avam,
Saxla nihan ki, aləmi zənnü güman tutub.

Əyzən kəlami-Bixud:

Ey qoyan könlümə qan, oldumu hüsnün fani,
Tapdımı xarü xəsi-xüş o tər bostani?

Aldımı badi-xəzan, eylədimi əfsürdə
Baği-hüsnündə gülü sünbülü həm reyhani?

Varmı yadında gədalər kimi boynu burulu
Qabağında sənə əcz eylər idim pünhani?

Həsrətində ləbinin əşk əvəzi didəmdən
Qətrə-qətrə saçılırdı cigərimin qani...

Arizu eylər idim hər çi təkəllüm edəsən,
Ta edim canımı şirin ləbin[in] qurbani.

İndi, səd şükr, o gül bərginə bənzər dodağın
Olub əfsürdə, solub rəngi, qaçıbdır qani.

Şükrililləh ki, mənim surətə düşdün axır,
Yetdi tez başə o naz eylədiyin dövrani.

O gözəllik ki, həmişə ona fəxr eylər idin,
Al ələ ayinə, bax gör o gözəllik hani?

Bəsdi, Bixud ki, camal əhlinə adətdir bu,
Bivəfa olmasa, olmaz işinin samani.

* * *

Cövr ilə tökdü qanımı, fəryad, gözlərin,
Öldürdü aqibət məni cəllad gözlərin.

Hər yanda bir ümid evi tikdimsə səbrdən,
Yıxdı, dağıtdı, eylədi bərbad gözlərin.

Min can alır baxanda bir oğrun nigah ilə,
Kimdən alıb bu dərsi o ustad gözlərin.

Qalmaz Xitadə, Çində ahu, edər şikar,
Bir guşə ilə baxsa o səyyad gözlərin.

Etməz əsər sənə dili-biçarə naləsi,
Qan içməyə olub dəxi mö'tad gözlərin.

Zülfün kəməndinə dili-miskin əsir olub,
Rəhm eləyib nola edə azad gözlərin.

Eylə şəhid Bixudi tiri-nigah ilən,
Xunrizlikdə ta ki, qoya ad gözlərin.

* * *

El dil, həzar şükr, xəbər gəldi yardən,
Şükr et, qutardın axırı bu intizardən.

Ey göz, kənarə qoy dəxi qan ağlamağını,
Oldun xilas sən də dəxi ahü zardən.

Dərdi-xəzan hicrini çəkmişdim, aqibət,
Verdi səba xəbər o güli-novbahardən.



Ey məqdəmin fədası, bəlalar çəkən başım,
Gəl, gəl ki, keçdi səbrü qərarım qərardən.

Eşqində qoydular mənə Məcnunluq adını,
Düşdüm bu xəlqi-aləm ara e'tibardən.

Səd şükr kim, yetişdi sənə vədeyi-vüsal,
Bixud, şikayət etmə dəxi ruzigardən.

Bixudun bu qisim bir-birindən gözəlraq qəzəlləri çoxdur. Cümləsini burada yazmağı artıq bildik. Mərhumun kəlami-mövzunu Qarabağ şüəralarından knyaz Mehdiqulu xan Vəfanın[50] kəlamına çox oxşayır. Hər iki şair əxlaqi-lətifə sahibləri olduğu kimi, təbi-şe'riyyələri dəxi ziyadə rəqiq və zərifdir, necə ki, tərzi-kəlamlarından görünür.

Əshabi-"Beytüs-Səfa"dan[51] Qarabağ şairlərinə təşxis və təmiz üçün göndərilmiş qəzəllərdən əvvəlinci dərəcədə qoyulanı və cümləsindən artıq bəyənilmiş mərhum Bixudun qəzəli olubdur. Bu babda Qarabağ şüəralarından Abdulla bəy Asinin tərcümeyi-halında təfsilən əhval yazılacaqdır.

Qəzəli-Bixud:

Riyazətsiz, könül, bu nəfs bir tövsəndi, ram olmaz,
Buna cövlangəh ərsə-ərz ola, seyri tamam olmaz.

Cahanı dust tutduqca edər düşmənçilik peyda,
Bu düşmən kamdən, ey nəfs, hasil hiç kam olmaz.

Cahan mə'murəsində künci-üzlət ixtiyar eylə,
Qənaət əhlinə, ey dil, belə rahət məqam olmaz.

Ayaqdan düşməmiş sə'y eylə əldən vermə mey camin,
Cavanlıq şuri qalmaz başda, bu nəş'ə müdam olmaz.

Nə təşviş eyləyirsən cam əlində ruzi-məhşərdən,
Əgər piri-muğan vermişsə, qorxma, heç həram olmaz.

Təmənna eyləsəm, saqi, ləbindən busə, mə'zurəm,
Bu rövşən əmrdir kim, məst olan kəsdə nizam olmaz.

Bürünmə xirqeyi-salusə, Bixud, tə'nədən qorxub,
Bu, meydani-məhəbbətdir, bu yerdə nəngü nam olmaz.

Bixudun bu qəzəli-dilpəzəri ərbabı nəzərində Füzuli Bağdadinin qəzəlindən ki, ona nəzirə olaraq yazılmışdır, nə tərkibi-kəlamda və nə

şiveyi-lisanda və nə də məzmunu mə'nada heç bir cəhətdən əskik deyil. Füzuli kimi böyük şairin kəlamını məhəlli-tənqidə qoyub onun eybü qüsurunu göstərməyə, əlbəttə, bizdə o qədər bilik və istitaət yoxdur və Bixud kimi ismü əsəri namə'lum olan mühəqqər bir şairi Füzuliyə bərabər edib, onların asari-qələmiyyələrini tərəzinin gözlərinə qoyub müvazinə qılmağa cür'ət etməyib də, hər iki şairin qəzəllərindən əvvəlinci və axırıncı beytləri burada nəzəri-ərbabi-məaniyə[52] təqdim edirik və hansı birisinin digərinə tərcih qılınmağını yenə əshablarına həvalə eləyirik.

Füzuli:

Təriqi-fəqr tutsam, təb' tabe, nəfs ram olmaz,
Qina qılsam tələb, əsbabi-cəm'iyyət tamam olmaz.

Burada Füzuli iki çətin məsələ arasında çaşıb qalıbdır: bilmir təriqifəqrimi tutsun, yoxsa qinamü simü zər tələbindəmi olsun. Əvvəlinci yolda, yə'ni mal və dövlət kəsbindən bilkülliyyə özünü məhrum və kənar edib, canın salamatlığını gözləməkdə nəfsi-şumun hücum və qələbəsi vardır ki, onu tabe və ram etmək çox da asan və yüngül iş deyildir. Bu yolda artıq dəyanət və mətanəti-qəlb lazım gəlir; burada nəfs ilə cəngü cidal etmək zəruri bir haldır.

İkinci yol intixab olunsa, yə'ni qina tələbində olub, nəfsin istədiyi şeylərə təmənnalar hasilə gəlsə, can fövtə gedəcəkdir. İnsaf, ədalət, mürüvvət və həqqaniyyət cümləsi nəfsin xahişinə qurban olub bada gedəcəkdir. Bəs nə etməli? Füzuli bu çətin məsələni həll etməyib özgə mətləb üstə keçir.

Bixud:

Riyazətsiz, könül, bu nəfs bir tövsəndi, ram olmaz,
Buna cövlangəh ərsə-ərz ola, seyri tamam olmaz.

Bixud nəfsi-bədxu və tündrovu bir at mənzələsində qoyub deyir ki, hərgah o bədhava atın başına riyazət cilovu, zəhmət və mə'rifət noxtası vurulmasa, onun cövlangahı üçün ərseyi-ərz, yə'ni tamami-kürreyi-ərzin səthi dar və təng bir meydandır. Bəs, Bixudun rə'yü e'tiqadınca tövsəninəfsin ağzı gərəkdir müdam riyazət noxtası ilə bağlansın və illa insanın canını, dinü imanını o bədhava heyvan dağa və daşa çırpıb parça-parça elər.

Axırıncı beyt. Füzuli:

Füzulini məlamət eyləyən bidərd bilməzmi –
Ki, bazari-cünun rüsvalərində nəngü nam olmaz.



Bixud:

Bürünmə xirqeyi-salusə, Bixud, tə'nədən qorxub,
Bu, meydani-məhəbbətdir, bu yerdə nəngü nam olmaz.

Burada Füzuli əleyhirrəhmənin kəlamına heç bir iradımız olmayıb da, ancaq Bixudun cür'ətli və bibak söz söyləməyi şayani-təhsin bir hal olmağını bildirmək istəyirik. Bixud təni-xəlqdən ehtiyat etməyib hiyləsaz və salus kimsələrə öz nifrətini açıq-açığına biruz edir.

Dərbənd şairləri "Qumri" və "Şüai" təxəllüslərin həcvində yazdığı qəsidəni dəxi burada yazmağı münasib gördük ki, qareini-giram Bixudun özgə qisim kəlamları ilə dəxi aşina olsunlar və bir də görsünlər ki, şair həcv yazıbsa da onda əsla bir föhş və nalayiq söz söyləməyibdir. Çünki necə ki, şair özü deyibdir, arifü dana olan kəs hərzəkar və ləğvşüar gərək olmasın.

Haman qəsidə budur:

Könül, hər kəs gəlib aləmdə sahibiqtidar olmaz,
Cahanda, haşəlillah, hər yetən kəs namdar olmaz.

Verə xurşidi-rəxşan tərbiyət gər səngxarayə,
Məazəllah, gəlib ol səng dürri-şahvar olmaz.

Çəkə neyrəng ilə gər səngə Mani* surəti-nərgis,
Ona əhli-nəzərlər məclisində e'tibar olmaz.

Nə sud, aləmdə xəlli-turş** həmrəngi-şərab olsa,
Səfayi-dil gətirməz, başda ondan bir xumar olmaz.

Əgərçi surəti-şəxsiyyəsi insandı nəsnasın,***
Vəli əxlaqü sirətdə bəhaimdən kənar olmaz.

Dirəxti-bidə gər su versə rizvan hövzi-kövsərdən,
Çiçək verməz, gül açmaz hiç, əsla meyvədar olmaz.

Nə xövfüm səndən, ey Qumri, nə bakım həm Şüaidən,
Neçün kim, gürbəvü rubahə şiri-nər şikar olmaz.

* Mani – məşhur Hindistan nəqqaşının ismidir
** Xəlli-turş – turş sirkə
*** Nəsnas – insana çox oxşayan bir növ' meymundur

Əgər həcvim qoya yüz şur ilə Dərbəndə, ey Qumri,[53]
Salır ol şəhrə bir aşub kim, səddi[54] hasar olmaz.

Təlatüm eyləsə dəryayi-həcvim, mövc göstərsə,
Vücudun zövrəqində xövfü dəhşətdən qərar olmaz.

Vəli təb'im rəva görməz ki, ləğviyyatə meyl etsin,
Neçün kim, arifü dana cahanda hərzəgar olmaz.

Sizə bundan ziyadə pənd verməklik deyil cayiz –
Ki, sizlər kəlləsiz dərbəndlisiz, sizlərdə ar olmaz.

Sizin əcdadınız ağ divə[55] matəm saxlayanlardır,
Sizin tək nəsldən asari-daniş aşikar olmaz.

Bəli, mə'zursuz şe'rim məzaqın dərk qılmaqdan,
Sarımsaq çün deyil şe'rim, siz üçün xoşgüvar olmaz.

Gediz xingəl içiz siz, neyləyirsiz nəzmü əş'ari,
Güruhi-zağə qəndi-Misrə meyl etmək şüar olmaz.

Bizi siz özgə məzhəb sanmayız, kəc getməyiz, canım,
Bizə dünyavü üqbadə Əlidən qeyri yar olmaz.

Vəli hər kəs bizə öz fəhmi qədri bir güman eylər,
Biz ol pürcövhəri fərdik ki, kəmmü keyfi var olmaz.

Mənəm babi, mənəm şeyxi, mənəm sünni, mənəm şiə,
Mənəm ol bütpərəst kim, məndə cəbrü ixtiyar olmaz.

Bixudun bu həcvnüma kəlamının məalından belə anlaşılır ki, Dərbənd şairləri Qumri və Şüai Bixudu həcv edib, onun din-məzhəb məsələsində süstrə'y və bie'tiqad olmağını zəmm ediblərmiş. Bu barədə Bixud onlara aqilanə cavabi-şafi verib deyir ki, siz bizləri ancaq öz fəhmü dərrakəniz qədərincə tanıya bilirsiniz. Sizdə o qədər mə'rifət və kamal olmaz ki, bizim zatımıza müxtəss olan övsafi-cəliləni və biz tutduğumuz məsləkin şürutü adabını təfhim edə biləsiniz. Şair xülaseyi-kəlamda:

Mənəm babi, mənəm şeyxi, mənəm sünni, mənəm şiə,
Mənəm ol bütpərəst kim, məndə cəbrü ixtiyar olmaz –

dediyi sözlərdən aşikarən görünür ki, şair müsəlmançılığı tək bir məzhəb və məslək üzrə sabitqədəm olmaqda görməyib, həqiqi müsəlmançılığı



insan olmaqda və bəşəriyyət vəzifəsini dərk edib layiqincə ifa etməkdə görür.

Aşağıda yazılan şe'ri-müstəzad Bixudi-mərhumun Hacı Seyid Əzimə və qeyri rəfiqlərinə yazdığı gilayədir ki, onlar bağa seyrə gedib də Bixudu də'vət etməyiblər.

Seyidə xitabən yazmışdır:

Kim verdi dünən bəzminizə bağdə zivər,
Hansı qədi ərər?
Kim eylədi ruxsarı ilə bağı münəvvər,
Hansı məhi-ənvər?
Kim kakili-mişkinin onun eylədi əfşan,
Hansı büti-dövran?
Kim eylədi öz zülfi ilə bağı müəttər,
Tökdü yerə ənbər?
Kim püsteyi-xəndanın açıb etdi təbəssüm,
Kim qıldı təkəllüm?
Kim tökdü o bəzm içrə ləbindən dürü gövhər,
Hansı ləbi şəkkər?
Kim etdi gülüstanı dünən qeyrəti-Xəlləx,
Hansı büti-gülrux?
Kim eylədi ol bağçəni səhəti-Kəşmər,
Firdovsə bərabər?
Ey dust, həmişə olasan seyrü səfadə,
Daim bu vəfadə!
Həmvarə sənə yar ola ol şuxi-sitəmgər.
Ol sərvü sənubər.
Ol şux təmaşasi səni eylədi məğrur,
Ey zülməti-binur.
İçdin o büti-sadə ilə badeyi-xüllər,
Ey rindü qələndər!
Olsun o dünən mənsiz içən badə həramın,
Düşsün yerə camın!
Dönsün cigərim tək yediyin qanə sərasər,
Zəhr ilə müxəmmər!
Gəzdin veribən əl-ələ ol şux ilə hər yan,
Sərməstü qəzəlxan,
Aldın bir ələ saidini, bir ələ sağər,
İçdin meyi-əhmər.
Mən badeyi-gülfam əvəzi xuni-dil içdim,
Bir növ' ilə keçdim,
Sən eylədin ol mah ilə hər ləhzə səfalər,
Yüz eyşi-mükərrər.
Axir sənə mən həmdəmü həmraz deyildim,
Dəmsaz deyildim?

Həsrətlə dünən canıma saldın yanar əxkər,
Ey zalimü kafər!
Get, eşq səni mən yaxılan narına yaxsın,
Əşkin yerə axsın.
Ta kim, dilü canımda olan atəşi-müzmər,*
Olsun sənə zahir.
Gəzdikdə o mah ilə məni yaduva saldın,
Heç xatirə aldın?
Heç bircə dedin kim, hanı ol Bixudi-müztər,
Ol didələri tər?

Əyzən müstəzadi-Bixud:

Zahid, bu fəna mülkdə dövran sənin olsun!
Verdim sənə yeksər.
Zöhdü vərəü taətü iman sənin olsun,
Məcmu' sərasər.
Duzəx mənə şayəstədi, niran mənə layiq,
Mən yanmağa şayiq.
Sən cənnətə get, huriyü qılman sənin olsun,
Qalsın sənə kövsər.
Firdovsi-bərin qəsrü təla, çeşmeyi-təsnim
Olsun sənə təslim.
Çəkdim əlimi, lö'lövü mərcan sənin olsun,
Sən olma mükəddər
Səd şükr ki, mən natiqi-Qur'anə yetişdim,
İmanə yetişdim.
Get, get kütübü məshəfü Qur'an sənin olsun,
Daim oxu əzbər!
Əlminnətülilləh ki, könül yetdi muradə,
Qalmışdı aradə,
Sən get, dolan avarə, biyaban sənin olsun,
Bihadiyü rəhbər.
Bixud ki, məlamətlərə şəhr içrə boyandı,
Yatmışdı oyandı,
Get, dəhrdə, zahid, sərü saman sənin olsun,
Əl çək dəxi, kafər!

Mərhum Molla ağa Bixudun bu qisim mövzun kəlamları çoxdur ki, cümləsini burada yazmaq mümkün deyil. Belə xoştəb' şairin əş'arü kəlamı bu vaxta kimi təb' olunmayıb, cümləsi[nin] övraq və pərişan qalması külli-məişətimizin pərişan halda olmasına dəlalət etməzmi?!.

* Müzmər – gizli, örtülü



# HACI SEYİD ƏZİM ŞİRVANİ

Hacı Seyid Şirvani nəinki yalqız Şirvan vilayətinin, bəlkə tamami Azərbaycan türklərinin əazim şüərasından biri olub. Onun namü şöhrəti və şə'nü rütbəsi hal-hazırda əbnayi-vətənimiz mabeynində kamalınca iştihar olmayıbsa da, gələcəkdə olmasına şübhə yoxdur. Hacı Seyid Əzim Şirvaninin və Qasım bəy Zakir Qarabağinin bu hala kimi nə tərcümeyi-halları və nə əş'arü asarı kəmalınca öyrənilməyibdir və bu qəflət və kəme'tinalıq bizim hala cəhalət və kəsalət içrə yaşayıb qalmağımıza böyük dəlildir.*

Budur bizim əvvəlinci şairimizin, milli ədibimizin və mayeyi-fəxrimiz olan Seyidin əsərlərinə və yadigarlarına olan hörmət və ehtiram!..

Əgər Hacı Seyid Əzim kimi şair, Avropa əhlini kənarda qoyaq, bizim qonşularımız içində vücuda gəlmiş olsaydı, onların əsərləri kərrat ilə çapdan çıxıb millətləri arasında bir dərəcədə intişar tapmışdı ki, uşaqdan böyüyə kimi cümləsi onları oxuyub əksərini əzbərdən bilərdilər.

1907-ci sənədə sentyabrın 30-da gürcülərin şairi və ədibi İlya Çavçavadzenin təşyi'i-cənazəsində olub, gürcülərin öz ədiblərinə göstərdikləri ehtiramı gördük. Bu qisim ehtiramı, bu sayaq tə'ziyədarlığı, belə ittihadü ittifaqı bir kəsin haqqında görməmişdik. Cəm'i Gürcüstan, demək olardı ki, bir nəfsi-vahid kimi böyük bir hüznü qəmə, böyük bir yasa düçar olub öz şairlərinin cəsədi ilə belə ruhani zindəganlıqlarının mayasını hazırlaşırdılar qara torpaq altında dəfn etsinlər. Gürcüstanın hər yerindən – uzaq dağlarından, qalın meşələrindən və dərin dərələrindən deputatlar Tiflisə cəm' olub hər biri bir növ' ilə izhari-təəssüf edib zarü təzərrö edirdilər.

Əkinçidən tutmuş ərbabi-qələmə kimi, rəiyyətdən knyazlaracan, fəqir-füqəralardan sərvət, dövlət əhlinədək, hər qisim sən'ətkar və

* İndiyə kimi Qasım bəy Zakirin əsərlərindən Adolf Berjenin Leypsiqdə təb' olunmuş məcmuəsinə daxil olan nəviştəcat və bə'zi qəzəliyyatdan başqa birisi də çap olunmayıbdır. Hacı Seyid Əzimin əsərlərindən bir parası çap olunubsa da, bir çoxu dəxi təb' və nəşr olunmayıbdır. Çap olunanları dəxi xeyli biqayda və bisəliqə tərtib olunubdur. Lüzumiyyəti olmayan, təqazayi-zəmanəyə müvafiq gəlməyən əsərlər məcmuəyə daxil olduqda, ziyadə əhəmiyyətli və lazimələri unudulub kitaba salınmayıbdır. Nəstə'liq xətti ilə Kamal əfəndi Ünsizadənin[56] mətbəəsində çap olunan kitabda həddən ziyadə səhv və qələtlər vardır və kitabın kağızı qalın və cod bə'zi yerləri bir sayaq qarışıq və dolaşıq xətt ilə çapdan çıxıbdır ki, düz oxumaq savad əhlinə dəxi müyəssər deyil[57].

əsnaflardan, şagirdlərdən, müəllimlərdən, ruhanilərdən və qara camaatdan, müəllimə və mütəəllimələrdən, hər bir firqə və partiyalardan, sahib mənsəblərdən və mütəəddid dəftərxana çinovniklərindən iki yüzdən ziyadə venoklar mühəyya olunub, hər firqə öz venokunu məhzun və qəmgin bir halda təşyi'i-cənazədə aparmaqda idilər.

Gürcü qəzetə və jurnalları sərapa hüznavər və ənduhsirişt məqalələrlə dolmuşdu. Hər yazıçı bir dil ilə, hər şair bir növhə ilə yetmiş sinnində məqtul olunmuş ədiblərini oxşayırdı.

Amma bizim şairlərə gəldikdə, onların ən mö'təbərlərindən bir əsər və bir nişanə qalmayıbdır. On sənə tamamına az qalıbdır ki, mən fəqir bizim şairlərin tərcümeyi-hallarına dair əhval yığmağa çalışıramsa da, yenə kifayətincə məlumat cəmləşdirmək bizə müyəssər olmadı.

Hacı Seyid Əzimin, Asinin və mərhum Mirzə Fətəlinin vəfatlarına gəldikdə, bunların haqqında izhar olunan bie'tinalıq və biədəbliyi dilə gətirməsək yaxşıdır. Ancaq mayeyi-təsəllimiz bu ola bilər ki, bizim ədiblərin qədrü qiyməti öz vaxtlarında bilinməyibsə də və bu halda dəxi bilinməyirsə də, şayəd gələcəkdə qəflət yuxusundan ayılmış millətimizin zirək və qədirşünas balaları onların namü şöhrətlərini uca məqama qalxızsınlar və unudulmuş əsərlərini təb'ü intişar etməklə adlarını zində qılsınlar. Çünki onlar cismən ölüb fövt olublarsa da, ruhən və mə'nən həlak olmayıblar.

Farsların Sə'disi və Hafizi diri qalan kimi, bizlərin də Zakiri və Seyidi, Nəbatisi, Saliki, Arifi, Kamisi gərəkdir diri qalsınlar. Mərhum Seyidin bu beyti ki, onun qəbir daşına yazılıbdır, bizim arzumuzun gələcəkdə nəticəbəxş olmasına şəhadət verir:

Mövti-cismani ilə sanma mənim ölməyimi,
Seyyida, ölmərəm, aləmdə səsim var mənim.

Bu beyt ilə Seyidin özü əbədi fövt olmağını nəhy buyurub, aləmlərdə onun sövtü sədası baqi qalmağını xəbər verir.

Mərhum Hacı Seyid Əzim təvəllüd edibdir Şamaxı şəhərində hicrətin 1251-ci tarixində rəbiüləvvəlin 14-cü günündə, təsadüf edir tarixi-miladın 1835-ci sənəsinə və iyun ayının 27-ci gününə[58].

Muma'ileyh yeddi yaşında ikən atası Seyid Məhəmməd vəfat edibdir. O halda Dağıstanın Yaqsay kəndində onun ana babası Molla Hüseyn dövlət tərəfindən hakimlik edərmiş. Mərhum Molla Hüseyn öz qızını və nəvəsini yanına apardıb və özünün oğlu olmadığından nəvəsinə artıq dərəcədə məhəbbət göstərmiş və Seyid Əzim uşaqlıqdan çox zirək və qabil



bir tifl olduğundan dəxi də artıcıq babasının meylü məhəbbətini kəsb etmişdi.

Burada Seyid babasının və anasının təhti-tərbiyəsində nəşvü nüma tapıb, türk, fars dillərində tə'lim almağa və bir əfəndidən ərəb dilini öyrənməyə başlayıbdır. Bu qərar ilə on bir sənəyə kimi Dağıstanda iqamət ediblər və lakin Seyidin anası bundan artıq qürbətə tab gətirə bilməyib yenə oğlu ilə Şamaxıya müraciət ediblər.

Mərhumun təhsili-üluma şövqü həvəsi çox olmaqdan Dağıstanda kəsb qıldığı elmə kifayət etməyib iyirmi sinnlərində Nəcəf-əşrəfə məkmili-ülum üçün azim olubdur. Bir neçə ildən sonra Nəcəf-əşrəfdən Bağdad şəhərinə və oradan da Şami-şərifə getmişdir.

Əlbəttə, qürbətdə fəqir Seyidin övqatü güzəranı çəndan rahətü rifahətlə keçmirdi və hər qisim zəhmətü məşəqqətlərə düçar olurdu. Vəli Seyid təhsili-ülum kimi böyük ne'mətin uğrunda belə cismani əziyyətləri özünə qəbul edirdi. Xüsusən onun günləri Şam vilayətində ağır keçirmiş və bu babda dediyi bir neçə şe'rlərindən həqiqəti-hal bəyan olunur:

Diyari-Şamə ol gün kim, məni hökmi-qəza çəkdi,
Nə möhnətlər gör ol viranədən bu binəva çəkdi.

Şamdan dostlarına yazdığı qeyri bir kəlamında ki, bu sayaq başlanır:

Ey dustlər, ol sərvi-xuraman sizin olsun,
Canan sizin olsun.
Seyri-gülü gülzarü gülüstan sizin olsun,
Reyhan sizin olsun.

Seyid fəraqdan şikayət edib təqdiri-qəzayə riza verməkdən savayı bir çarə görmür:

Düşdük belə möhnətlə biz avarə vətəndən,
Ol qönçədəhəndən,
Təqdirə nə çarə dəxi Şirvan sizin olsun,
Hər yan sizin olsun.
Biz cəm' ikən ol silsilədən təfriqə düşdük,
Bir damə ilişdük,
Sərhəlqeyi-gisuyi-pərişan sizin olsun,
Saman sizin olsun.

Sonra bu naməni Şamda yazmağın bu sayaq bəyan edir:

Zülfi həvəsindən bizə Şam oldu nişimən,
Etdik onu məskən,
Ol arizi-xurşid ilə Şirvan sizin olsun,
Dövran sizin olsun.

Mərhum Hacı Seyid Əzim təhsili-ülum etdikdən sonra öz vətəninə müraciət edib, bir müddətdən sonra Kə'bəni ziyarət qəsdilə Məkkəyə getmişdir və bu ziyarətə azim olduqda Mədinədən gedib cəddi Məhəmmədəl-Mustafanın rövzəsində bədahətən bir qəsidə oxumuşdur. Qəsidənin eyni-mə'tləi budur:

Fəda bu astananın xakinə can, ya rəsulüllah –
Ki, əhli-dərdədir bu dərdə dərman, ya rəsulüllah!

Peyğəmbərin mərqədi-şərifini ziyarət edib, oradan canibi-Məkkəyə rəvan olmuşdur və Məkkeyi-mükərrəmədə hərəmi-şərifin qara örtüyünü gördükdə yenə bədahətən bir qəsideyi-qərra söyləmişdir ki, onun da mə'tləi budur:

Nədəndir bilmirəm, yaran, edib rəxtin qəra Kə'bə,
Tutubdur hansı şahi-dəhrpərvər[59] çün ə'za, Kə'bə?

Həcc ziyarətindən fariq olduqdan sonra Misrə gəlib və Əlqahirə şəhərində sakin olan üləma, füzəla və şüəra ilə xeyli vaxt ülfət və mülaqat etmişdir. Belə ki, həqiqət aləmindən və mə'rifət sərçeşməsindən məlumat cəm' etmək üçün dünyanı gəştü güzar edib hər tərəfi gəzibdir. Necə ki, bu xüsusda mərhum Abdulla bəy Asi cığatay dilində ona yazdığı naməsinə xitabən deyibdir:

Əlin öp Seyyidin, ondan son ərz et –
Ki, Həcc əzmilə tüşgandin cahanə,

Künişti* – Rumdə ya kim, hərəmdə
Bulubmu mətləbindən bir nişanə?

Və ya mən dək o da məhrum qalmış,
Arayıb gər cahanı xanə-xanə?[60]

İrişdirmiş əgər mə'lum üçün elm,
Xoşa, hala şərikdir cavidanə.

Meyi-vəhdət məsəllün qəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

* Künişt – yə'ni kilsə



Biz şəhadət verə bilirik ki, mərhum Seyid həqiqət aləmindən nuri-mə'rifət kəsb etmişdir və xoşa onun halına ki, mə'lum üçün elm irişdirib cavidana şərik olmuşdur.

Axirül-əmr Hacı Seyid Əzim vətəni Şamaxı şəhərinə müraciət edib burada bir məktəb binası qoymuşdur ki, onda türk, fars və rus dilləri tə'lim olunurdu. Və lakin o vaxtlarda tə'lim-tərbiyə məsələsi çox çətin əmrlərdən birisi hesab olunurdu. Çünki üsuli-cə'did üzrə uşaqlara oxumaq və yazmaq öyrətmək layiqincə müntəşir olmamışdı və tə'lim işlərinə mübaşir olan əşxasın üsuli-cə'did nədən ibarət olduğundan xəbəri yoxdu və köhnə qaydadan bir müəllim dışqarı çıxsaydı və tə'lim üçün təzə və yüngül bir cığır açsaydı, camaat ona rəğbət göstərməyib, nifrətlərini çox namərbut və kobud ə'da və hərəkətlər ilə izhar qılardılar.

Bundan əlavə tə'limü tədris üçün və ətfalın təhzibi-əxlaqına səbəb olan kitablar türk lisanında bilmərrə yox idi. Bu qüsuru rəf' etmək üçün mərhum Seyid nəzmən və nəsrən türkcə xoşməzmun və ibrətamiz nəqlü hekayələr ana dilində tərtib edib şagirdlərinə oxudardı.

Mərhumun tərtib etdiyi kitabçadan bir nüsxəsi ki, öz dəst-xətti ilə yazılmışdır, sabiqdə müsəlman şö'bəsinin inspektoru olan mütəvəffa Çernyayevskiyə[61] göndərmişdi. Haman hekayələrdən bir neçəsini Çernyayevski öz "Vətən dili"[62] nam kitablarına salmışdır.

Mərhumun Çernyayevskiyə göndərdiyi məcmuə əl'an bizdədir. Əgər onu çap etdirmək üçün bir xeyirxahi-millət xahişmənd olsa, kamali-məmnuniyyətlə haman məcmuəni ona təqdim edərik. Məcmuə isə üç dəftərdən ibarətdir.

Əvvəlinci dəftərdə yazılıbdır: Şeyx Sə'dinin "Gülüstan" və "Bustan" kitablarından və bə'zi hükəmanın əsərlərindən sadə və açıq türk dilinə tərcümə olunmuş nəsihətamiz hekayələr.

İkinci dəftər həmçinin bu qisim hekayələrdən və 51 öyüd və nəsihətlərdən əmələ gəlmişdir.

Üçüncü dəftərin mündəricatı nəzm ilə yazılmış əxlaqü ətvara dair timsallardan ibarətdir.

Bunlardan əlavə bir para xırdaca məzhəkələr və gülməli hekayə[lər] haman dəftərdə yazılıbdır ki, onların hissəsi və nəticeyi-kəlamı dürüst və səhih isə də, özləri tə'lim üçün yaramaz. Haman nəzmən yazılmış hekayələrin bir parası Ünsizadənin mətbəəsində çap olunmuş kitabda vardır.

Bu məzhəkələrdən və gülünc hekayələrdən başqa üçüncü dəftərdə mərhum şairin öz əli ilə bir neçə gözəl qəzəllər və aşura günü baş çapmaq barəsində Qudyal sakini kapitan "Hadi" təxəllüsə nəzm etdiyi cavab və bir para qit'ələr və rübaiyyat yazılmışdır.

Mərhum Hacı Seyid Əzim bir müddət özü tə'sis və bina etdiyi məktəbdə dərs deyib, sonradan Şamaxının şəhər məktəbində (qorodskoy işkullada) müəllimlik mənsəbi alıb orada şəriət dərsi və lisani-türki ilə məşğul olardı[63].

Seyidin əhibbalarından Asi Qarabaği onun şəhər məktəbinə müəllim tə'yin olduğunu eşidib zarafatyana bir kağızında bu şe'ri də yazmışdır:

Şenideəm ke, bepiri keşişe-deyr şodi,
Xoşa behale-şoma, aqebet bexeyr şodi[64].

Bu mə'muriyyətində mərhum ömrünün axırına kimi (on beş il) davam etmişdir. Amma bu arada bir vaxt səbəb nə olubsa da, Seyidi şəhər məktəbinin müəllimliyindən ixrac edirlər və mərhum Tiflisə popeçitel hüzuruna şikayətə gedib, bitəqsir mə'zul olmağını sübuta yetirir və yenə öz mənsəbini geri alır. Tiflisə getdiyi vaxt Gəncə şəhərindən keçərkən Şeyx Nizaminin türbətini ziyarət edib bu rübaini demişdir:

Ey Şeyx Nizami, ey nizami dağılan,
Ey Gəncədə izzü ehtişami dağılan,
Olmubdu səninlə mən kimi aləmdə
Beyti, evi, məktəbi, kəlami dağılan!

Seyidin bu rübaidə "məktəb" deməsi fransız şairlərindən və müstəşriqlərindən Y.Mohel cənablarının "ekol dö Nizami" adı ilə zikr etdiyi məktəbi xatirə gətirir ki, Xaqani və Seyid Zülfüqar və Hatifi və Xosrov Dəhləvi və qeyrilərin Nizaminin məktəb şagirdlərindən hesab edir.

Biçarə şairin qədrü qiyməti həyatında saxlanmadığı bizim üçün böyük bir töhmət və baisi-xiclətdir. Onun vaxtsız vəfatı qəlbimizi hüzn ilə doldurur.

Hicrətin 1305-ci ilində ramazanül-mübarəkin 20-ci[65] yövmündə əhya günündə mə'nəvi həyatımızın xoşəlhan bülbülü yaz mövsümündə məmata irişmişdir ki, tarixi məsihiyyənin 1888-ci sənəsinə və may ayının 19-cu[66] yövmünə mütabiqdir.

Millət mücahidlərindən birisi də bu binəva Seyid olubdur ki, haqq yolunda fanatizm və cəhalətlə mərdanə, xövfü ricasız dava etməkdən çəkinməyib canını haqqa fəda etmişdir.

Vəfatı Şamaxıda ittifaq düşübdür və şəhərin kənarında olan "Şahxəndan" qəbristanında dəfn olunmuşdur. Mərhumun vəfatı barəsində Naseh Şirvani bir qəzəl inşa edib və bu qəzəlin axır misrasında şairin tarixi-vəfatını əbcəd hesabilə bəyan etmişdir. Haman qəzəl budur:



Qan, ağla, gözüm, sərvəri-dövran getdi,
Sərdəftəri-əhli-fəzlü ürfan getdi.

Əfsus o şairü ədibü kamil
Əhbabın edib zarü pərişan, getdi.

Ayineyi-övqat idi ol zati-şərif,
Səngi-əcəl ilə sındı əl'an, getdi.

Heyrətdəyəm, ey xak, necə sığdırdın
Ağuşuna, ta o bəhri-Ümman getdi.

Cövfündə çox idi gərçi-kani-zərü lə'l,
Dəfn olmağa səndə başqa bir kan getdi.

Etmişdi qəza gər səni əmvatə məqam,
Fəxr et ki, bu dəm cismin üçün can getdi.

Naseh dedi tarixi-vəfatın qəm ilə,
Səd heyf ola Seyyidi-Şirvan getdi.

Mərhum Seyid əgərçi tüfuliyyətdən köhnə və qədimi qayda üzrə tə'lim alıb, Avropa mədəniyyətindən bir növ' bəhrəmənd olmamışdı, akademiya və universitet görməmişdi və lakin iste'dadi-cibilli və şüuri-fitri sayəsində, necə ki, yuxarıda zikr olundu, ənva'i-ülumü fününa dara olub, öz əsrində müasirləri arasında ən məşhur ədiblərdən, ən zərif ürəfalardan və ən mö'təbər və müqtədir şüəradan biri hesab olunurdu.

O mərhumun adabü əxlaqı dəxi ə'la dərəcədə müstəhsən olduğundan füzəlavü ürəfa məclisində həmə vəqt sədrnişin olub, fününi-şe'rdə binəzir olduğundan maədа bədihəguluqda türk şairləri arasında mislü bərabəri yox idi. Bu barədə Hacı Seyid Əzim rusların Puşkininə, ingilislərin Bayronuna[67] və polyakların Miskeviçinə[68] bərabər imiş. Bəzi vaxt məclisin qızğın halında şair zövqü şövqə gəlib və onun təbi-gövhərrizinin çeşməsi açılıb peydərpey, bilafasilə gözəl, müsəlsəl və mövzun eşir deyərmiş ki, tamam məclis əhlini heyrətə gətirərmiş.

Azərbaycan şairlərindən heç biri mərhum Hacı Seyid Əzim yazdığı qədərdə əsərlər vücuda gətirməyibdir. Onun hər qisim kəlamı vardır və biri-birindən gözəl və dilpəzirdir. Əsərlərindən məşhuru bunlardır: "Külliyyati-türki və farsi", "Divani-qəzəliyyat", "Divani-qəsaid və nəvahi", "Hekayati-mənzumə", "Xilafəti-həzrət Əbubəkr", "Qəzəvati-həzrət Əli", nəzmən və nəsrən "Qisəsül-ənbiya", "Təzmini-Xacə Hafiz və Şeyx Sə'di" və qeyriləri[69]. Bu əsərlərdən mətbu olanı "Qəzəliyyat"[70]və "Hekayati-mənzumə"dir. Yerdə qalanları çap olunmayıbdır[71].

Seyid Şirvaninin fövqdə zikr olunan asari-qələmiyyəsinin cümləsinə, əlbəttə, bu məcmuədə yer tapılmaz və lakin qareini-giramı onların bir neçəsi ilə aşina etməyi və onların vasitəsilə milli şairimizin qədrü qiymətini və şə'nü izzətini göstərməyi vacib bilirik[72].

Hacı Seyid Əzim öz əsrinin ayineyi-həqiqətnüması olub, bizim şüəranın möhtərəmlərindən Qasım bəy Zakir, Mirzə Əbülqasım Nəbati, İskəndər ağa Şair kimi millətin cəhalət və zəlalətdə qalmaqlarına bais olan üləma və fanatik ruhani sinfi ilə həmə vəqt cəngdə olubdur. Bu sinif onun ən ziyadə xoşuna gəlməyən bir firqə olubdur ki, ömrünün çoxunu onların paxırının üstünü açmağa, riyayi ibadət və taətlərini və min cür'ə hiyləvü təzvirlərini xalqa göstərməyə sərf edibdir. "Hekayəti-mənzumə"də "Vəq'eyi-tüllab", "Müctəhidin təhsildən vətənə gəlməyi", "Hekayəti-abidi-riyai", "Vəq'eyi-Bağdad", "Vəq'eyi-alimi-biəməl", "Vəq'eyi-molla və çoban", "Vəq'eyi-hacı və molla" və bunlardan əlavə bir xeyli hekayətlərin tamamisi üləma qisminin cürbəcür hiyləvü təzvirlərini zərifanə bəyan edir.

Müctəhidin təhsildən vətənə müraciət etməyini Seyid Şirvani elə bir məharət və ustalıqla, elə bir açıq və rəvan şe'rlər vasitəsilə təhrir qılıbdır ki, hər kəs onu mütaliə qılsa, elə bilsin ki, özü müctəhidin istiqbalına çıxıb cəlal və təntənə ilə onu şəhərə varid edibdir və müdam onun məclisində əyləşibdir:

Pişvazə çıxır səğirü kəbir,
Ucalır ərşə naleyi-təkbir –
Ki, bu gün nayibi-imam gəlir,
Eyləyib elmini tamam gəlir.
Yerbəyerdən o qövmi-niksifat
Üzünü görcəyin çəkir sələvat.
Tökülür xəlq solü sağından,
Öpələr ta ki, əl-əyağından.
Ehtiram ilə şəhrə varid olur,
Yeddi gün məclisi dolur, boşalur.
Kəsilir hər tərəfdə qurbanlar,
Açılır babi-lütfü ehsanlar,
Neçə əyyam olur ziyafətlər,
Eləyir əhli-şəhər də'vətlər.
Fikr edir ki, o qövmi-fərzanə,
Müctəhidçün gərəkdi bir xanə.
Bir də gördün ki, eyləyib tədbir,
Bir gözəl xanə etdilər tə'mir.
Yenə söylər o qövmi-danişvər,
Müctəhidçün gərəkdi bir həmsər.
Bir gözəl qız nikah edib anə
Mələki əqd edirlə şeytanə.



Müctəhidin məscidə təşrifi[73]:

Ta ki, məqsuduna yetişdi imam,
Məscidə naz ilə edər iqdam.
Özünə əvvəl eyləyər zivər,
Bir gəlin tək ki, axtarır şövhər.
Gözünü sürmədən edər məkhul,
Bir zaman zinətə olur məşğul.
Üzünə eyləyir gülab əfşan,
Barmağında nigini-lə'lnişan.
Başına durdu qoydu əmmamə,
Geydi nə'leynini o əllamə.
Var boğazında səxt təhtülhənək,
O qədər bərk çəkib olub döyənək.
Çiyninə saldı bir lətif əba,
Əlinə aldı bir zərif əsa.
Başda əmmamə, saqqalında hənа,
Barmağında üzük, əlində əsa.
Başda əmmamə, saqqalında hənа,
Barmağında üzük, əlində əsa.
Var ayağında cüft nəleyni,
Bil ki, peyğəmbərin budur qeyni.
Sağ-solunda qalıbdı çeşmi müdam –
Ki, görək kim verir imamə səlam.
Bu gün evdən çıxıb namazə gəlir,
Sufiyi-saf pişvazə gəlir.
Məscidə naz ilə olur daxil,
Girdi mehrabə alimü fazil.
Uydular xəlq, imam qıldı namaz,
Etdi min günə həqqə razü niyaz.
Edibən ta namazını itmam,
Minbərə vəz' üçün edər iqdam.

Müctəhidin və'zi:

Minbər üstündə ol fələkrif'ət
Oxur ahəstə bir uzun xütbət.
Xütbədən sonra bir gözəl ayə
Olur ol xoşzəbanə sərmayə.
Keyyühənnas, sirrdir bu dəqiq,
Hikməti şərə etmişəm tətbiq.
Sədrim olmuş vəsi' dəryadən,
Fəzlim artıqdı Molla Sədradən[74].
Bəhri-elmimdə, ey güruhi-bəşər,
Pak olan gövhəri muradə yetər.
Yazmışam sərbəsər füru'ati,

Açmışam ğamizati-ayati.
Köhnə təfsirə vermişəm təğyir,
Təzədən yazmışam özüm təfsir.
Bir neçə səhv edibdi Beyzavi,[75]
Olmuşam cümlə onlara havi.
Fəxri-Razi[76] qərini-raz deyil,
Yazdığı rəmzlər təraz deyil.
Eyləyib səhv sahibi-"Tibyan",[77]
Ruhdən bixəbərdü "Ruhi-bəyan"[78].
Etməyib fəth Molla Fətullah,[79]
Səhvi-vazeh yazıbdır ol gümrah.
Gah fələk, gah ərşdən danışır,
Bu sifət yüz çərən-pərən danışır.
Təmtəraqın görüb o qövmi-əvam,
Söyləyirlər ki, etmiş elmi təmam.
Bu filan müctəhiddən əkməldir,
Şeyxülislamdən bu əfzəldir.
Leyk bir parə mərdi-danişvər
Anlayıbdır ki, kənddə var nə xəbər.
Boşboğaz olduğun bilib dərhal,
Xövfdən leyk nitqin etmiş lal.
Bir deyən yoxdur, ey imami-şərir,
Edəcəksən nə vəqtədək təzvir?
Tutalım elmə olmusan vasil,
Bizə bu elmdən nədir hasil?
Hansı nadanı alim etdin sən?
Hansı bimarı salim etdin sən?
Hansı kuri sən etmisən bina?
Hansı əmvatı eylədin əhya?
Hanı islam üçün sərəncamın?
Yerə girsin o müctəhid namın!
Söylədin telqramı elmi-bilis –
Ki, onu ixtira edib iblis.
Kari-şeytan dedin dəmir yolunu,
Xəlqə etdin haram Dum pulunu.
Xaçpərəstlər tamam düşdü qabaq,
Tökülüb dalda qaldıq, ay sarsaq!
Aldı əhli-kitab dünyanı,
Şərh edirsən sən indi Qur'anı.
Əhli-islam oldu xarü zəlil,
Baisi sənsən, ey imami-cəlil!
Sən bizi nəf'ə etmədin vasil,
Barı qoy özgə elm edək hasil.
Bizi bəsdir bu qədər aldatdın,
Dini dinarə hər zaman satdın.
Sən bilən elmi bilməyən yoxdur,
Səndən ələm uşaqlar çoxdur...



Bu sayaq cür'ətli, mərdanə və xövfsüz söz danışmaq, nüfuzu ziyadə bir firqəni tənqid etmək ancaq Seyid kimi danişmənd və süxənvər şairlərin və alitəb', haqqpərəst və millətpərvər ədiblərin şə'ninə gəlmişdir. Hansı millətin içində belə hünərmənd və sahibi-rə'yü mə'rifət peyrəvilər olmasa, vay o millətin halına!.. Belə sahibsiz millət tezlikcə zəlalət və rəzalət quyusuna düşüb cəhalət çəngində boğulub məhvü nabüd olacaqdır.

İnsafü həqiqət məqamına gəldikdə Seyidin sözlərində zərrəcə iftira və yalan yoxdur. Şairin cigəri atəşi-qəzəblə alışıb yanır. Biçarə millətin pulu ilə ətəbatda və sair məşhədi-müqəddəslərdə uzun müddətlər yeyib-içib, bihudə vaxt keçirib, necə ki, Seyid deyir:

Oxuyur hər biri beş-altı vərəq,
Sonradan saqqala verir rövnəq.

– vətənə müraciət edən üləmadan millətə maddi və ya mə'nəvi bir mənfəət yetişmir, çünki onların əksəri vətənə əliboş, üzüqara qayıdırlar. Zahirdə avam nəzərində əllamə libasına və salus xirqəsinə bürünürlərsə də və ibarətpərdazlıq edib boş və mübhəm mə'nalı sözlər danışırlarsa da, batində və həqiqətdə əsil mə'rifət və kamaldan sinələri xali olmağını həqiqi mə'rifət əhlinə tezcə bildirirlər.

Amma nə eləmək ki, avam onların hiyləvü təzvirlərini anlaya bilmir. Avamın ağlı gözündə olmağa görə, zahirə aldanıb, yaxşı ilə yamana, doğru ilə yalana tərcih verə bilmir, dostu ilə düşmənini tanımayıb bədbəxt olur.

Əgər həqiqətdə ətəbatda millətin malı ilə elm təhsil edən "nayibi-imam"dan yazıq və sadədil millətə bir nəf'ü fayda hasil olsaydı, onda şəksiz millətimiz belə pozğun və pərişan halda mə'yus və sərgərdan qalmazdı.

Doğrudan da fəna halda qalmışıq; ağıldan ağlımız, əxlaqdan əxlaqımız yox, əsil dindarlıq nə olduğunu bilmirik, nə kamaldan kamalımız, nə hörmətdən hörmətimiz və nə dövlətdən dövlətimiz var... Hər tərəfə baxsaq, fəxr edəsi, könül şad qılası və ürək açası heç bir şey'imiz yoxdur. Vətən nədir bilməzik, millət və milliyyət nə olduğunu hissü dərk etməzik, ittihadü ittifaq bizim üçün boş və mə'nasız sözlərdir. Dildə onları tələffüz ediriksə də, o minval danışmaq moda olubdur. Onların həqiqi məzmununu düşünmürük, düşünmədikdə əməl də etmirik. Əllameyi-giram və füzəlayi-zülehtiram bizim içimizə ancaq təfriqə və partiya salıblar. Buna da səbəb öz şəxsi mənfəətlərini və nəfsi xeyirlərini görmək olubdur. Haqqa, doğruluğa, ədalət və mürüvvətə xalqı irşad qılmayıblar. Himmət və qeyrət, birlik və qardaşlıq, dostluq və mehribanlıq bilmərrə

unudulubdur; ülum və fünuna, sənaye və ticarətə, tərəqqi və təməddünə xalqı tərğib və təşviq etməyi üləma sinfi öz vəzifələrindən bəid bir əmr bilib, bu qisim məsələlərə əsla e'tina etməyiblər.

Budur bizim təhsildən vətənə müraciət edən müctəhidlərin millətə hüsni-xidməti, budur onların tə'siri, hidayət və irşadı!..

Mərhum Seyid başqa bir kəlamında tamahkar və şikəmpərvər ruhaniləri dəxi və atəşli sözlər ilə təzmim qılıb, oğluna xitabən deyir:

Ey oğul, alim olsa xoştinət,
Mali-dünyayə eyləməz rəğbət.
Çün həlali hesabdır malın,
Həm harami ə'zabdır malın.
Nə gərəkdir sənə bu dövlətü mal,
Yükünü yüngül eylə, ey hammal.
Ey oğul, var cahanda çox molla,
Güzəran üçün eyləyir qövğa.
Qeyrəti-milləti bəhanə qılır,
Gündə xəlq içrə yüz fəsanə qılır.
Əhli-dünyayə eyləyir lə'nət,
Özü dünyadən eyləməz nifrət.
Özgəni görsə eyləyir üsyan,
Lən edər ol fəqir üçün hər an.
Özünün həddən ötdü üsyanı,
Məhv edibdir füsuni-şeytanı.
Deyəsən ol səfihə, ey xənnas,
Oxudunmu "ətə'mürunən-nas",[88]
Eyləyirsən məzəmməti-hər kəs,
Niyə öz nəfsini unutdun bəs?

Biəməl, mühil və fasid mollaların haqqında deyibdir:

Alim öz elminə edəydi əməl,
Düşməz idi bu gunə dinə xələl.
Rəsmdir alim olsa əhli-fəsad,
Aləmi ol fəsad edər bərbad[81].
Uyma mollayə, olma çox da avam,
Sanma təhtülhənək qurubdur dam.
Baxma təsbihə, olma divanə,
Xam olan quşlara gərək danə.
Sanma alnında səcdədəndir əsər,
Gecə qoymuş həcamət ol kafər.
Xatəmindən demə Süleymandır,[81a]
Divdir ol lə'in, şeytandır.



Peyğəmbərə xitab:

Ah, ah, ey cənabi-peyğəmbər,
Dinüvi zaye' etdi bu kafər.
Eyləyib şər'üvi vəsileyi-nan
Bu şərirü lə'ini-biiman.
Vəqtdir, eylə çarə islamə,
Tazədən sal işi sərəncamə.

Seyidliyi və övladi-nəbiliyi əllərində mayeyi-nicat və aləti-kəsbi-məaş hesab edən öz həmnəsəblərinə məzəmmət təriqi ilə bu mənzuməni yazmışdır:

Demə, Seyyid ki, mən ali-rəsuləm,
Əli övladiyəm,[82] sebti-bətuləm.
Cahanda işlərəm fe'li-qəbahət,
Qiyamətdə edər cəddim şəfaət.
Bu gün kim, xəlqdir bizar səndən,
Edər məhşərdə cəddin ar səndən.
Nəsəblə fəxr olunmaz, ey mücahid,
Bu əmrə yövmi-laənsab şahid:
Nəsəblə fəxr edən kimsə şəqidir,
Kirami qul xudayə müttəqidir.
Kiramilikdə qıl Qur'anə taət –
Ki, "indəl-lahi əttaküm"dür[83] ayət.
Çü Nuhun oğlu Kə'nan oldu kafər,
Dedi izəd: "Deyil nəsli-peyəmbər".
Var ikən Nuhə eyni-intisabi,
Yetişdi "leysə min əhlik"[84] xitabi.

Seyid Əzim nə qədər ki, mühil, riyakar, biəməl və müfəttin ruhaniləri sevməzdi, bir o qədər də həqiqi ülamalara, hamiyi-din və hadiyi-millət ruhanilərə təbəiyyət və ehtiram göstərməyi özünə borc bilirdi, necə ki, mərhum Ağaseyidəli Şirvaninin haqqında oğlu Mircəfərə xitabən deyibdir:

Ey oğul, alim olsa rəbbani,
Sən onun ol dərində dərbani.
Mən özüm ki, zəmanə sərvəriyəm,
Üləmanın kəminə çakəriyəm.
Necə kim, vardı fazili-Şirvan,
Ol behinzadeyi-şəhi-mərdan,
Mənbəi-elmü helmü nuri-cəli,
Mə'dəni-fəzlü bəzl Seyyidəli,
Ələmü əfzəli-qəbaildir,

Məhbəti-cümleyi-fəzaildir.
Yoxdu zatında buyi-rəngü riya,
Qeyrlər ləfzdir, odur mə'na.

Yenə özgə bir kəlami-xoşməalında fərzəndi Mircəfərə həqiqi üləma və füqəhanın haqqını, müəllim və mürəbbilərin ehtiramını müraat edib onlara xidmət və bəndəçilik göstərməyi nəsihət təriqi ilə deyibdir:

Cəfər, ey nuri-dideyi-Seyyid,
Qönçeyi-novrəsideyi-Seyyid,
Üləma həqqini riayət qıl,
Əhli-elmə həmişə hörmət qıl!
Demə bu kafir, ol müsəlmandır,
Hər kimin elmi var, o, insandır.
Elmsiz adəmi xudayi-cəlil
Dedi: "Ənamü bəl əzəllü səbil".*
Babamız Adəm, ol səfiyüllah,
Elmi-əsmayə oldu çün agah.
Ona yeksər məlayik etdi sücud,
Səcdəsin fərz eylədi mə'bud.
Elmdən oldu həzrəti-Loğman
Hikmət ilə səramədi-dövran.
Elm bir nur, cəhl zülmətdir,
Cəhl duzəxdir, elm cənnətdir.
Üləma olmasa cahanda, yəqin
Olacaq paymal şəri-mübin.
Üləma varisi-şəriətdir,
Füqəha baisi-hidayətdir.
Əhli-təfsir açıbla Qur'ani,
Çıxarıblar vüzuha mə'nani.
Kimdir gör, xaşe'i-cənabi-xuda,
Dedi həq: – "Min ibadihil-üləma"**
Alimə kim ki, eyləməz hörmət,
O deyildir peyəmbərə ümmət.
Sənə hər kimsə elm edər tə'lim,
Ona vacibdi eyləmək tə'zim.
Harda görsən ona səlam eylə,
Baş əyib qul tək ehtiram eylə.
Qeyrini vəsf qılma yanında,
Sən dur ol söyləyən zamanında.
İznsiz etmə xidmətində cülus,

* "Ülaikə kəl ən'ami bəlhüm əzəlü səbilən"[85]

** "İnnəma yəxşəllahə min ibadihil-üləma"[86]



Olma zəcrindən,* ey oğul, mə'yus.
Adəm ol, incimə qiraətdən,
Çubi-molla çıxıbdı cənnətdən.
"Gülüstan" içrə bülbüli-Şiraz**.
Farsilə edib bu nəğməni saz:
"Padşahi pəsər bemək təb dad,
Lövhi-siminş bər kənar nəhad.
Bər səri'-lövhi-u nəvişt bəzər:
Cövri-ustad beh zimehri-pədər"[87].
Bil ki, ustadın, ey rəşid pədər,
Sənə ruhaniyyətdə oldu pədər.
Pədərin bir mənəm, bir ustadın,
Cəhd qıl yaxşı çıxmağa adın.
Səy qıl aqi-valideyn olma,
Ziştü mərdudi-xafiqeyn*** olma.
Eylə ustadına həmişə dua,
Məğfirət qıl tələb xudadan ona.

Burada mərhum Seyid üləma və füqəhanın, ustad və müəlliminin hörmət və xidməti hər bir müsəlmana Qur'anın hökmü və peyğəmbərin buyuruğu ilə vacib olduğunu və onların şə'nü rütbələri nə dərəcədə ali olduğunu gözəl və mövzun nəzmlər bəyan edir.

Şair həqiqi üləma və ustada tə'zimü təkrim etməyi və əmrlərinə müti' olmağı elə bir möhkəm tərz ilə və saf e'tiqad ilə tövsiyə qılır ki, bu heyndə, bu hürriyyət əsrində onlara əməl etmək hətta bir az ağır gəlir.

Həqiqi üləmaya Seyid əmr eləyir ki, baş əyib qul təki qulluqlarında durub ehtiram edəsən. Hüzurlarında artıq bir söz söyləməyib diqqəti-tamam ilə sözlərinə qulaq asasan, iznsiz xidmətlərində cülus etməyib, zəcirlərindən mə'yus və mükəddər olmayasan, çünki "ustadın çubuğu cənnətdən çıxıbdır", ustadın cövrü sitəmindən rəncidə olmaq nəinki dürüst deyil, bəlkə günahdır. Belə ki, bülbüli-Şiraz və Sə'diyi-nəğməsaz dəxi bu əmrin haqq olmasını təsdiq edibdir: "Cövri-ustad beh zimehri-pədər". Əlbəttə, bu halda üləma və ustadın çubuq zoru ilə tə'lim və tərbiyə verməsi əsrin təqazasına və zamanın övza'ına müvafiq gəlmir. Bu vaxtda onların nüfüz və tə'siri elm və bilik vasitəsilə gərək cari olsun. Bain həmə onlara ixlasü sədaqət göstərmək və əmri-nəhylərinə əməl etmək hər bir müsəlmana borc olduğu üçün şair dəxi öz cigərguşəsinə onların ehtiramını saxlamağı tövsiyə edir.

* Zəcr – mən' və nəhy etmək, qovmaq və qorxutmaq

** Bülbüli-Şiraz – Sə'di Şiraziyə işarədir.

*** Xafiqeyn – şərq və qərb deməkdir. Mərdudi-xafiqeyn – yə'ni şərq və qərbin qovulmuşu

Pəs, əşxasi ki, mərhumun haqqında sui-zənndə olub onu kəme'tiqad və süstrə'y müsəlmanlardan hesab ediblər, böyük səhvü xəta etmiş olublar. Biəməl alimlərə və zamankar vaizlərə açıq-açığına acı söz deyib onlara lə'nət oxuyan kəs layiqi-təhsin və afərindir, nəinki təzmim.

Doğru söyləyən və haqqı sevən kəs, əhli-insaf və sahibi-vicdan yaxşıya yaxşı, yamana yaman deməkdən əsla çəkinməyəcəkdir. Yamana yaxşı deyənlər, əyrini düz görənlər və yalana doğruluq libası geyindirənlər, əlbəttə, aşikarən zəlalətdədirlər və həmçinin aşkar zəlalətdədir o kəslər ki, yaxşıya yaman deyib, haqqı batil qılmağa çalışırlar.

Mərhum Seyid bu qisim kəcbin və kəcəndiş adamlardan həmişə nifrət edib onların zəmmində zəhralud şe'rlər deməkdən ehtiyat etməzdi. Oğluna verdiyi bir nəsihətdə yaxşıya yaxşı və yamana yaman demək xüsusunda böhtan və iftiradan ictinab etmək babında deyibdir:

Ey oğul, xəlqə söyləmə böhtan,
Yaxşıya yaxşı ol, yamana yaman.
Əslində yaxşı olsa bir mə'na,
Sən "yamandır" demək deyil ziba.
Tutalım sən gülü dedin bədbu,
Xəlq söylər ki, əqlsizdir bu.
Sənə bir yaxşı kimsə olsa yaman,
Xəlq onu söyləməz yaman, ey can.
Yaxşıdır ol ki, əslü bünyani,
Sən "yamandır" desən nə nöqsani?
Sən dedin ki, deyil xəlifə[88] Ömər,
Ömərə bu kəlamdan nə zərər?
Sən dedin ki, deyil imam Əli,
Olmadı zaye' ehtirami-Əli.
Dedilər Mustəfani sahirdir,
Var cünuni, səfihü şairdir.
Tapmadı şə'ni-Mustəfa nöqsan,
Yaxşını eyləmək olurmu yaman?!

Mərhum Hacı Seyid Əzimin mə'rifətüllah babında olan e'tiqadi-safı və həqiqi müsəlmançılığı atidə mərqum olunmuş qəzəllərindən görünür:

Ey nuri-səmavatü zəmin, gərçi nihansan,
Amma nəzəri-arifü danadə əyansan.

Batin gözünün yox səni görməkdə qüsuri,
Zahir gözü görməz səni, əlbəttə, nihansan.

Zatın eləyib cümleyi-əşyadə təcəlla,
Musa gözünə Turi-həqiqətdə əyansan.



Bir Adəmü İsadə deyil nəfxeyi-ruhun,
Aləm həmə qalibdi, sən ol qalibə cansan.

Kəssən nəzəri-feyzini bir ləhzə cahandan,
Nabud olur aləm, sən ona ruhi-rəvansan.

Gəh badi-səba tək verisən gülşənə rövnəq,
Gəh soldurusan gülləri, sən badi-xəzansan.

Sən qaimi-bizzat[sən], aləm hamı bilqeyr,
Xəllaqi-səmavatü zəmin, kövnü[89] məkansan.

Min bir adıvun hər biri bir aşiqə munis,
Tapmaz səni bir kəs, yenə binamü nişansan.

Ey Seyyidi-pir, eylə meyi-vəhdətə rəğbət,
İstərsən əgər olmağa həmvarə cavan, sən.

Nə gözəl əqidə və nə xoşməzmun kəlam!.. Əhsən bu e'tiqada, afərin bu təb'ə!..

Əyzən mə'rifətüllah babında demişdir:

Əgərçi cümleyi-aləmdə yox nişanə sənə,
Vəli salıbdı könül mehri-qayibanə sənə.

Kimi hərəm, kimi bütxanədən səni istər,
Qılır həvəs hərə bir növ' aşiqanə sənə.

Gəh əndəlibü gəhi saru, gah səlsəldən*
Çıxar mədihin üçün gah bir tərانə sənə.

Təğəyyürati-zəminü zəmanə səndəndir,
Vəli məhal təğəyyür verə zəmanə sənə.

Behiştə kimsənə getməz ibadət etmək üçün,
Qərəz bu əmri-ibadətdi bir bəhanə sənə.

Qərini-məqfirətin ilə cümlə zahirdir,
Nə iş ki, tutmuşam, ey qadiri-yeganə, sənə.

Nəsib Seyyidə tövhidi-zatın et, ya rəb,
Çıxıb bədəndən olan dəm rəvan, rəvanə sənə.

* Saru; səlsəl – quş adlarıdır

Bu kamalü mə'rifətdə və bu sədaqətü übudiyyətdə olan şəxsi təkfir edən cühəla və zahirpərəst üləma özləri təkfirə layiq deyillərmi?!

Ey kaş Seyiddə olan kamalü mə'rifət, insafü mürüvvət minbərin yuxarı pilləsində əyləşib riyai vəz' edən vaizlərimizdə və müqəddəs məkanlarda təhsil edən axundlarımızda olaydı!..

Mərhum Seyidin ərbabi-bəsirət və sahibi-mə'rifət olmağı onun əsərlərinin çoxundan görünür. Şairin insandan ən əvvəl tələb etdiyi məhz adəmiyyətdir, həqiqi insan olmaqdır. Şəxsin əqayidi-diniyyəsi ilə işi yox idi:

Müsəlman ol, müsəlman ol,
Qərəz oldur ki, insan ol!

Əsil müsəlmançılığı insaniyyətdə və əsil insaniyyəti həqiqi müsəlmançılıqda görüb də təkrarən deyir:

Müsəlman ol, müsəlman ol,
Qərəz oldur ki, insan ol!

Və lakin çoxumuz müsəlman isək də, insan deyilik, çoxumuz insanıqsa da, həqiqi müsəlmanlıqdan çox uzaq və kənarıq.

Seyidin ümdə mətləbi və baş arzusu insaniyyət dərəcəsinə və bəşəriyyət mərtəbəsinə vasil olmaqdır. Bu xüsusda onun nəzəri və mə'rifəti o qədər vəsi' və genişdir ki, ona tək Azərbaycan şairi demək dürüst deyil, bəlkə ol dürri-yeganə ümumi-insaniyyət şairidir.

Oğlu Mircəfərə yazdığı bir nəsihətnaməsində deyir:

Cəfər, ey qönçeyi-gülüstanım!
Ey mənim bülbüli-xoşəlhanım!
İki yüz yetmiş üçdə bədi həzar,[90]
Mötədil fəsl idi, zəmani-bahar,
Səni həq mən fəqirə etdi ə'ta,
Kə'bəyi-qəlbimə yetişdi səfa.
On beş ildir ki, ey ə'tayi-əzim,
Sənə adab eylərəm tə'lim.
Yetibən əqlə sərfəraz oldun,
Dəxi məndən ki, biniyaz oldun,
Əql peyğəmbərin qılıb rəhbər,
Öyrən adabi-məzhəbi-Cəfər!
Demirəm mən gedən təriq ilə get,
Əqli tut, ol gözəl rəfiq ilə get.
Sənə bürhan deyil təriqi-pədər,
Gör nə yol getdi zadeyi-Azər.



Demirəm rus, ya müsəlman ol,
Hər nə olsan get, əhli-ürfan ol.
Demirəm sünni ol və ya şiə,
Tək hədəf olma tiri-təşniə.
Demirəm şeyxi ol və ya babi,
Hər nə olsan tək olma qüllabi.
İstər əclaf, istər əşraf ol,
Hər nə olsan ol, əhli-insaf ol.

Filhəqiqə, nə gözəl nəsihətlərdir!.. Kaş əbnayi-millətimizə tez-tez bu gunə nəsihətlər oluna idi. Kaş üləmayi-millət məsacidü mə'nabirdə füru'ati-diniyyədən adabi-qüslü təyəmmüm tə'limindən bir azacıq usanıb, boş və biməzmun məsaildən və saxta hədislərdən vaz keçib Seyid kimi insafü ədalətdən, insaniyyət və mürüvvətdən bəhs edə idilər. Haqqtaalanın bimisil ətiyyəsi olan əqli-səlimi qasirü naqis deyib, onun qabağına sədd çəkməyə idilər.

Yəqindir ki, əgər onlar da ağıl peyğəmbərin milləti-islama rəhbər edib ağıl göstərdiyi təriq ilə salik olmağına bais olsaydılar, müsəlmanlar bu qədər dalda qalmazdılar və bu dərəcədə bətalətü fəlakətə düşməzdilər.

Müxtəlif dillərin öyrənilməyi və xüsusən rus dilinin bizim məktəblərdə tə'lim olunmağı barəsində və rus dilini bilməyə ehtiyacımız olduğu babında yazmışdır.

Şərhi-hədis:

Bir hədisi-səhihdir bu xəbər,
Söyləyibdir cənab peyğəmbər –
Ki, Süleyman nəbi əleyhi səlam
Hər güruhun dilin bilirdi təmam.
Ey oğul, bil, bu rəmzdən mətləb
Deyil ancaq lisan lisani-ərəb.
Həqq özü hər lisanə danadır,
Hər lisan həq yanında zibadır.
Var bizim dörd kitabımız, ari,
Hər biri bir lisan ilə cari.
Biri "Tövrat" idi giranmayə,
Gəldi ibri dilində Musayə.
Biri "İncil" idi, birisi "Zəbur",[99]
Hər biri bir lisan ilə məşhur.
Çün Məhəmməd ərəbdən etdi zühur,
Öz lisanında qıldı həq mə'mur.
Türkdən göndərəydi gər ani,
Türk dilində olurdi "Qur'an"i.

Xitab:

Ey oğul, məzhəbi-imamiyyə,
Xah Bağdadü, xah Şamiyyə,
Cümlə bu e'tiqada guyadır –
Ki, nəbi hər lisana danadır.
Xah rusi lisani, xah firəng,
Bilir anı imami-bafərhəng.
Hər lisani ki, bəs bilirmiş imam,
Sən də bilsən, nə eybi, ey bədnam?

Fərzəndi-dilbəndinə yenə başqa bir xitabında deyir:

Rəmzi-"həl yəstəvi"[92] müdəlləl imiş,
Bilməyəndən bilən kəs əfzal imiş.
Həq buyurmuş ki, ixtilafi-lisan
Ne'mətimdəndir, ey güruhi-cahan!
Kim ki, bəs bir dil eyləsə hasil,
Oldu bir ne'mətə o kəs vasil.
Cəhd qıl ne'məti-tamamə yetiş,
Elm təhsil qıl məqamə yetiş.
Ey oğul, hər lisanə ol rağib,
Xassə ol rus elminə talib*.
Çün ona ehtiyacımız çoxdur,
Bilməsək dil, əlacımız yoxdur.
Çatmayıb şər'dən bizə bu xəbər –
Ki, ərəbdən səva dil oldu hədər.
Nə ərəbdir xuda, nə rumü nə zəng,
Nə həbəşdir, nə zəngbarü firəng**,
Xah boq, xah Tanrı, xah xuda,
Birdi mə'nada, ey düri-yekta!
Ləfz edirsə ifadə mə'nani,
Sərf edər əhli-mə'rifət ani.

Burada Seyidin rus dilinin öyrənilməsi və məktəblərdə tə'lim olunmasını müsəlmanlar üçün ən lazım əmrlərdən biri olduğunu israrən tövsiyə qılmasına ümdə səbəb budur ki, mərhumun zamanında fanatik ruhanilərin vəzinin bərəkətindən çoxları bu e'tiqadda idilər ki, rus dilini və xarici lisanları bilmək və məktəblərdə tə'lim etmək günahdır və islamın rövnəqinə müxillü müzirr əsbablardan biridir.

* Bu rus elmindən mətləb rus dilidir.

** Bu misar "Əkinçi" qəzetinin 1876-cı sənədə 2-ci ilinin 11-ci nömrəsində "Nə həbəşdir, nə rusü türkü firəng" yazılmışdır.



O cəhətdəndir ki, Seyid dini-islamın hökmünə təkyə edib fasidü xasir üləmaların qövlü fe'lini təkzib edir:

Rəmzi-"həl yəstəvi" müdəlləl imiş,
Bilməyəndən bilən kəs əfzəl imiş.
Həq buyurmuş ki, ixtilafi-lisan
Ne'mətimdəndir, ey güruhi-cahan!
Çatmayıb şər'dən bizə bu xəbər –
Ki, ərəbdən səva dil oldu hədər.

Seyidin əqidəsincə hər lisanın öyrənilməsi şəxsə lazımdır. Amma biz müsəlmanlara laməhalə üç dilin tə'limü tədrisi vacib əmrlərdəndir. Onlardan birisi türk, birisi ərəb və üçüncüsü rus dilidir. Bunların vacib olmasını Seyid bu sayaq müdəlləl etmişdir:

Bizimçün laməhalə, üç dilin tə'limi lazımdır,
Biri elmi-ərəbdir kim, bilək mə'nayi-Qur'ani.

Biri vacib bizə bilmək vətəndə söylənən dildir,
Gərəkdir mətləbə biz eyləyək türkiylə ünvani.

Biri həm rusidir kim, bilməyi bizlərə lazımdır,
Ticarətçün bilək, həm dərk edək qanuni-divani.

Zəbani-rusi bilmək ya danışmaq qeyri dillərdə
Şəriətdə bizə nəhy olmayıbdır, yoxdu bürhani.

Süleyman ol, zəbani-hikməti aç hüdhüdü murə –
Ki, ta divü pərilər olsun əmrin bəndəfərmani.

Məgər Səlman[93] deyildi İsfəhan atəşpərəstindən?
Zəbani-fürs olsun ki, gərəkdir kamil iman'i.

Zəbani-fürs ilə tə'limə getdi həmdü ixlasi,
Şahənşahi-Ərəb bir qövm üçün göndərdi Səlmani.

Lisanın ixtilafın ne'mətindənədd edib xaliq,
Bilir bu sirri ol kəs kim, bilir ayati-Qur'ani.

Nə dildə olsa, olsun, elm olsun xəlq aləmdə,
Deyildir bir dilə məxsus, var hər dildə imkani.

Qalıbdır firqeyi-islam dalda cümlə millətdən,
Əhatə eyləyiblər başqalar elm ilə dünyani.

Deyirlər ki, üfünət eyləyibdir beyzeyi-islam,
Gərək rəfi-üfunətçün edək bu dərdə dərmani.

Gərək tazə üsul üzrə açılsın cümlə məktəblər,
Gətirmək tazə üslubə gərəkdir köhnə bünyani.

Vapurlar atəşindir xah yolda, xah dəryadə,
Gərək əldən qoyaq ərradəni, kəştiyi-yelkani.

Nolur idrak qılsan hər güruhun dillərin, canım,
Yerində hər birin sərf eyləsən vardırmı nöqsani?

Əfəndi, ya axund rusi danışsa, bir günah olmaz,
Xudaya, sən özün islah qıl bu qövmi-nadani!

Həqiqət söylə, Seyyid, qoy səni kafər desin mərdum,
Uyub nəfs əhlinə, tutma təriqi-küfrü xizlani*.

Nə vəsi' e'tiqad, rövşən fikir və nə pakizə və sələmət rə'y!.. Afərin bu istiqamət və sədaqətə! Nəinki yalnız Azərbaycan şüərasından, bəlkə ümumi müsəlman ədibü şairlərindən heç birisi milləti-islamı o dərəcədə təhsili-ülumu fünuna, himmətü qeyrətə, ittihadü ittifaqa, tərəqqiyü təməddünə də'vət qılmayıbdır, nə qədər ki, bu yolda Hacı Seyid Əzim sərfi-himmət edibdir.

Heç bir islam şairi Hacı Seyid Əzim kimi millətin qeyrətü təəssübün çəkməyibdir, onun oduna öz canını yaxmayıbdır. Şairin oğlu Mircəfərə yazdığı pəndü nəsihətlər tək bir oğlu üçün yazılmayıbdır, cümlə vətən övladının xeyir və səlahı üçün inşad olunubdur.

Seyid oğluna xitab etməklə bizim hamımızı mənzur qılıbdır. Türk məsəlinin misdaqınca: "Qızım, sənə deyirəm, gəlinim, sən eşit!" Mircəfərə verilən öyüd və nəsihətlər bizim üçündür. Onları biz gərək dərguş edib, bir an unutmayaydıq və şair göstərdiyi yol ilə gedib nicatü səadət bulaydıq. Çifayda... Əqlü şüursuz, fəhmü dərrakəsiz olduğumuzdan işarəni anlamayıb, irəliki halımızda – cəhlü nadanlıq qaranlığında qaldıq.

Otuz sənə bundan müqəddəm mərhum Həsən bəy Məlikov cənabları Bakıda nəşr qıldığı "Əkinçi" ruznaməsində Hacı Seyid Əzim sırf avamlıqda yaşayan və xabi-qəflətdə qeydsiz və rahat yatan millətimizi bu sayaq həyata, elmü mə'rifət təhsilinə də'vət eləyirdi:

### HƏSƏN BƏYDƏN İLTİMAS

Ey Həsən bəy, müəllimi-dana!
Ey edən əhli-aləmi əhya!
Ey çatan aləmə səfa səndən,
Eyləyir Seyyid iltica səndən –

* Xizlan – köməksiz və müinsiz, zar və zəbun qalmaq



Kim, bu məktub kim, xəyalımdır,
Əhli-Qafqazə ərzi-halımdır,
Edəsən çap, ey gözüm nuri,
Ta ola ruzigar məşhuri.

### QAFQAZ MÜSƏLMANLARINA XİTAB[94]

Əssəlam, ey əhaliyi-Qafqaz,
Ey rəisani-vacibül-ezaz!
Əssəlam, ey güruhi-xeyrəsər,
Millətin qeyrətin çəkən kəslər!
Kişidə olmasa əgər qeyrət,
Ondan, əlbəttə, yaxşıdır övrət.
Dadü fəryad, ey güruhi-izam,
Oldu zaye' bu milləti-islam.
Günü-gündən zəlilü xar oluruq,
Möhnətü qüssəyə düçar oluruq.
Bu qədər dərd kim, olur hadis,
Ona bielmlik olur bais.
Bir bəladır bu dərdi-nadani –
Ki, onun elm olubdu dərmani.
Bu, təəccübdür, ey güruhi-bəşər,
Bir kişi yatsa, naxoş olsa əgər,
Axtarır bir təbibi-danadil,
Ta ki, səhhət ona ola hasil.
İndi naxoşdu milləti-islam,
Ona lazımdır eyləmək əncam.
Dərdimizdir bu dərdi-nadanlıq –
Ki, tutubdur bizi pərişanlıq.
Qeyrilər etdilər tərəqqiyi-tam,
Qaldı zillətdə firqeyi-islam.
Kişinin olmadısa dünyası,
Barı lazımdır olsun üqbası.
Bizdə nə axirət, nə dünya var,
Olmuşuq bir yaman bəlaya düçar.
Hər vilayətdə var beş-on kəsəbə,
Əlli min seyyidü, axund, tələbə,
Əlli dərviş, əlli mərsiyəxan,
Hamının sözləri tamam yalan.
Əlli min suxtə, yeddi min sail,
Əlli min hoqqabazi-naqabil,
Hamının fikri xəlqi soymaqdır,
Quru yerdə bu xəlqi qoymaqdır.
Xəlqə bunlar hamı qurublar dam,

Bir bunu anlamır bu qövmi-avam.
Şiəmiz sünniyə edər töhmət,
Sünnimiz şiədən edər qeybət.
Bizi puç etdi şiə, sünni sözü,
Əhli-islamın oldu kur gözü.
Bizə qeyrilər eyləyir töhmət,
Çün tərəqqi edibdir hər millət.
Gərçi var iş qanan kişi tək-tək,
Əksəri-xəlq avamdır, eşşək.
Neyləsin iş qananlar, ay qardaş,
Qurunun oduna yanır həm yaş.
Babi-elm olmayıb bizə məsdud,
Kəsb edən yoxdur anı, leyk nə sud!
Bundan əqdəm əgərçi kəsbi-ülum
Müşkül idi və leyk, ey məxdum,
İndi işlər çıxıbdır asanə,
Rəsmi-dünya düşübdü samanə,
Tapub övza'i-masəva təğyir,
Göyə çıxmağa xəlq edər tədbir.
Paraxod oldu kəştiyi-yelkan,
Özgə samana düşdü xəlqi-cahan,
Leyk biz bilmərik göz açmaği,
Köhnə işlərdə qalmışıq baqi.
Babamızdan nə görmüşük əvvəl,
Dəxi ondan səvayə olmaz əməl.
Məsələn, bir müəllimi-ələm,
Deyə xurşidi mərkəzi-aləm,
Deyə sabit günü yeri səyyar,
Zəlzələ baisin bilirsə buxar,
Deyə kim var əraziyi-tisin,
Yerin altında yoxdu gavi-zəmin,
Şərh edə gün tutulmağın sözünü,
Deyə kim, ay tutur günün üzünü,
Tutulan vəqtdə məhi-taban,
Deyə kim, zilli-ərzədir pünhan,
Edə ərşin xürusunu inkar,
Etməyə bu kəlamə istiğfar,
Deyəcəklər ki, cümlə kafərdir,
Bu şəqi münkiri-peyğəmbərdir.
Bu nədəndir? Savadımız yoxdur,
Elmdə ictihadımız yoxdur.
Bilmirik biz hədis mə'nasın,
Qanmırıq əhli-şər' fitvasın.
Bixəbər olmuşuq şəriətdən,
Başımız çıxmır elmi-hikmətdən.
Bağlanıbdır rəhi-məişətimiz,



Gərçi var kəsbə istitaətimiz.
Olmuşuq misli-tənbəli-Bağdad,
Edirik cümlə bəxt əlindən dad.
Kəsb üçün həzrəti-rəsulüllah –
Dedi: – "Əlkasibü həbibüllah"[95].
Zinəti-şəxs elmi-ədyandır,
Elmsiz şəxs misli-heyvandır.

* * *

Əyyühənnas, kimyadır elm,
Məzhəri-zati-kibriyadır elm.
Çün ki, var idi bizdə nadanlıq,
Bizə üz verdi çox pərişanlıq.
İndi Şirvanda açmışıq məktəb,
Dərsimiz rusü, türkü, farsü, ərəb.
Zəhmətim çoxdu, hiç nəf'im yox,
Leyk həqqə ümidvarəm çox. –
Kim, bu zəhmətlər olmaya zaye',
Bəlkə bu macəra ola şaye'.
Şeyxül-islamü müftiyi-islam
İkisi bir olub, edə əncam.
Çünki bunlar rəisi-millətdir,
Mə'dəni-lütfü kani-qeyrətdir.
Seyyida, bəsdi, nəzmi qıl kütah,
Xatirin cəm' qıl ki, inşallah,
Şeyxül-islamü müftiyi-xoşnam
Məktəbin əmrinə edər əncam!

Mərhum Seyidin cigər qanı ilə yazılmış bu mövzun kəlamı hər millət qeydi çəkən şəxsin lövhi-zəmirində, əlbəttə, nəqş bağlayacaqdır.

Otuz beş il bundan irəli Seyid naləvü fəryad edib, müsəlmanların gün-gündən tənəzzül tapmasını, xarü zəlil olmasını, həlakətə düşməsini, miləli-müxtəlifənin ayaqları altında payimal olmasını rüəsayi-millətə göstərib onlardan tədbirü əlac istəyir:

Dadü fəryad, ey güruhi-izam,
Oldu zaye' bu milləti-islam.
Günü gündən zəlilü xar oluruq,
Möhnətü qüssəyə düçar oluruq.

Bu pərişanlığın, bu fəlakətin, bu ənduhü qüssənin, bu mərəzi-möhlikin səbəbü illətin Seyid elmsizlikdə və nadanlıqda görüb, onun çarə və müalicəsini ancaq elmü bilikdə tapıb deyir:

Bu qədər dərd kim, olur hadis,
Ona bielmlik olur bais.
Bir bəladır bu dərdi-nadani –
Kim, onun elm olubdu dərmani.

Otuz-qırx sənə Seyid mərhumun bu dadü fəryadı zamanından gəlib keçdi. Biz yenə haman qəflətdə, haman elmsizlikdə qalmışıq və gün-gündən başı aşağı tənəzzül etməkdə varıq...

Mərhum Hacı Seyid Əzim dəxi bu mə'nalardan və bu illətlərdən uzaq getməyib müsəlmanların dalda qalmağını və gün-gündən tərəqqi mə'kusda olmağını elmsizlikdən və adəmi-ittifaqi ittihaddan görür.

Söz yoxdur ki, əgər müsəlmanlar arasında ülfət və məhəbbət olsaydı, yek-digərinin xeyir və səlahını müraat etsəydilər, biri-birlərinin tərəqqi və səadətinə büklü həsəd etməyib şad olsaydılar, vətənin uğrunda abadü rövnəq bulmasında ittifaqla sə'yü kuşiş etsəydilər, bu fəlakətə və bu rəzalətə düçar olmazdılar və şair dəxi belə atəşi-cigərsuz ilə əbnayi-milləti müttəhim etməzdi:

Hamının fikri xəlqi soymaqdır,
Quru yerdə bu xəlqi qoymaqdır.
Şiəmiz sünniyə edər töhmət,
Sünnimiz şiədən edər qeybət.
Bizi puç etdi şiə-sünni sözü,
Əhli-islamın oldu kur gözü.

Hacı Seyid Əzim Şirvaninin böyük xidmətlərindən birisi də sünni-şiə məsələsində hər iki firqənin mabeynində vüqua gələn büğzü ədavətin, kinü küdurətin əbəs və bibina olmağını gözəl və abdar şe'rlər vasitəsilə müdəlləl etməyibdir. "İnnəməl-mö'minunə ixvətün, fəəslihü beynə əxəveyküm"[96-97] ayə misdağınca müsəlmanlara biri-birilə qardaş kimi müamilə və müaşirət etmək borc olduqda onlar biləks biri-birinin xeyir və səlahını mülahizə etməyib ədavət başlamışlar və Qur'anın hökmünü pozmaqla belə fəlakət və zəlalətə düşmüşlər.

Hacı Seyid Əzim hər iki tərəfin əbəs və bihudə biri-birilə müddəi olmaqlarını görüb, canü dildən ağrıyıb naləvü fəryad edirdi ki, biz bir millət olduğumuz halda, biri-birimiz ilə qardaş kimi dolanmağa Allahın hökmü ilə borclu ikən nə səbəbə iki firqəyə bölünüb ədavət başlayaq? Biri-birimizin puç və münhəzim olmasına özümüz səbəb olaq?

Bizi puç etdi şiə-sünni sözü,
Əhli-islamın oldu gur gözü.



Mə'lum olsun ki, şairin zamanında ki, camaat bizim bu tərəqqi əsrinə və hürriyyət zamanına nisbət sırf avamlıqda idi və onların külli-ixtiyarı müfəttin və tamahkar ruhanilərin əllərində idi və sünni ilə şiə məzhəb arasında böyük ziddiyyət və düşmənçilik var idi, bu sayaq açıq və xövfsüz danışmaq və hər iki tərəfin eybü qüsurunu, yekçeşmü kəcbin olmaqlarını göstərmək, hər iki tərəfə zəhralud niştər vurmaq, hər iki tərəfi məhəlli-istehzaya qoyub üzlərinə gülmək ancaq Seyid kimi qəyur və hünərmənd şəxslərin şə'ninə gəlmişdir.

Seyidin "Pərişannamə"[98] adlı kitabında sünni ilə şiə arasında vüqua gələn bir neçə gülməli məzhəkələr vardır ki, şair artıq məharət ilə hər iki tərəfin sadəlövh və avam olmağını nəzmə çəkib, boş və çürük şey'in üstündə mübahisə etməklərini göstərir. Nümunə üçün o məzhəkələrdən birini burada zikr etməyi lazım gördük:

Bir nəfər şiə ilə bir sünni
Bir-birindən acıqlı, həm kinni,
Bir yol ilə gedirdilər, o zaman
Nərdiban qoydular* yola xəndan.
Göftguyə çün etdilər rəğbət.
Çəkdi nazik yerə o gün söhbət,
Dedi sünni ki, bəs Ömər həqdir,
Ona töhmət qılan kəs əhməqdir.
Odu sərxeylü əfzəli-əshab,
Adili-əsrü zadeyi-Xəttab.
Dedi şiə ki, bədi-peyğəmbər
Hamının əfzəli olub Heydər.
Elm şəhri rəsuli-Bəthadır,
Babı ol şəhrin ol səfaradır.
Xüləfa tutmayıbdır hörmətini,
Qəsb ediblər onun xilafətini.
Dedi sünni ki, olmasaydı Ömər,
Aça bilməzdi dini peyğəmbər.
Çün Ömər dini-həqqə yar oldu,
Dini-islam aşikar oldu.
Fatehi-din Ömərdü nuri-cəli,
Ola bilməz o şaha misl Əli.
Həqq Ömərləndü, həm Ömər həqdir,
Aləm içrə bu söz mühəqqəqdir.
Gərm idi bəhsdə bular amma
Nagəhan bir nəfər olub peyda,
Dedilər, gəl tutaq həkəm bu kəsi,
Ta görək kimdi din dadrəsi.

* Yola nərdiban qoymaq – yə'ni əsnayi-rahda söhbət eləmək

Dedilər: – Ey rəşidi-danişvər,
Əli əfzəldi, söylə, yoxsa Ömər?
Çəkdi bir ah ol büلənd cənab
Onlara verdi ta bu növ' cəvab –
Ki, müqəssir Əlidir, ol mövla,
O yədüllahi-xaliqül-əşya.
Neyçün axır yaratdı kim, Öməri,
Özünə dəydi aqibət zərəri.
Oldu onlara teyyibü tahir,
Əliallahi olduğu zahir.

Şair özü şieyi-isna-əşəri olduğu halda xüləfayi-güzinə artıq meylü məhəbbəti vardı və bu məhəbbətdən naşi öz övladına onların adlarını qoymuşdur.

Mərhumun əkdiyi gözəl töxmün səməridir ki, lilləhil-həmd, bu halda bizlərə nəsib olmaqdadır və sünni-şiəlik sözü aralıqdan götürülməkdədir.

Seyid Şirvaninin "Əkinçi" qəzetində dərc olunan mənzumələrindən bir neçəsi onun "Məcmuə"sinə daxil olmayıbdır. Bizim anladığımıza görə, Seyidin haman mənzumələri bu halda dəxi mə'nadan düşməyibdir və onların tamamisi hissiyyati-təbiidən nəş'ət etməyə görə, hər vaxtda oxucuları şurü qeyrətə gətirəcəkdir.

Məsələn, qəzetin nəf'ini inkar edib, onda təb' olunan əhvalatın cümləsini sırf hədyan sayanlar, onu pul tələsi hesab edənlər indi də bizim içimizdə qəzetin nəf'ini və lazım olmağını bilənlərdən az deyil. Əgər belə olmasaydı onda bizim də neçə-neçə qəzet və jurnallarımız olardı və qəzet verənlər bu qədər korluq, sıxıntı və zərər çəkməzdilər, bu qədər töhmət və əziyyətə, maddi və mə'nəvi ehtiyaclara düçar olmazdılar.

Qəzetin nəf'ü faydasını inkar edən və elmü sən'ətin xeyrini bilməyən bir cahil Seyidə rast gəlib bu suallara ondan cavab tələb edir.

Sual:

Dün sual etdi bir nəfər cahil –
Ki, qəzetdən nədir bizə hasil?
Bu Həsən bəy nə istəyir bizdən,
Doldurub aləmi quru sözdən?
Dad edir ki, gərəkdir elm oxumaq,
Çəkmə tikmək və ya ki, bez toxumaq.
Danışır gah əkin, ziraətdən,
Gah maşın, gah özgə sən'ətdən.
Şərh edir gah süd qayırmağı –
Gah qatıqdan belə çəkib yağı.
Pendiri öyrədir ki, böylə tutun,



Saxlayıb artıcıq bahaya satun.
Gah Amerikadan eyləyir kim yad,
Bu sifət bir maşın olub icad.
Nəyə lazımdı bizlərə maşın,
Nə üçün xalqın aldadır başın?
Babamız görmədi maşın işini,
İngilis tək bu tovlayır kişini.
Biz məgər bilmirik yağı tutmaq,
Pendiri saxlayıb pula satmaq?
Çöldə hər övrəti-Qarabaği
Nehrədə çalxayır gözəl yaği.
Biz məgər bilmirik taxıl biçmək?
Nəyə lazımdı maşın öyrənmək?
Şöxmə vacibdir ola beş cüt kəl,
Biçinə çin gərəkdi, xırmana vəl.
Nə gərəkdir yazıb ki, ol sadə
Fəhlələr cəng edir Amerikadə.
Bilməmiş rəmzini bu dünyanın,
Söyləyir halını Amerikanın.
Hiç doğru deyil bunun nəfəsi,
Nə qəzetdir? Tamam pul tələsi.

Cavab:

Dedim: – Ey cahili-kərihxitab,
Gərçi nadana yoxdu hiç cavab,
Leyk vacibdü şərh edim hali,
Səni filcümlə eyləyim hali.
Bu qəzet kim, olub cahanda bina,
Nə üçün ixtira olub aya?
Hansı millət edib bunu icad?
Hansı dövlət ona edib imdad?
Nədir ol millətin görək qərəzi?
"Həst, əlbəttə, dər diləş mərəzi"[99].
Hamı millətdə var qəzetlər çox,
Demə kim, bunda hiç faidə yox.
Qəzetin çoxdu xəlqə mənfəəti,
Nə bilir kim ki, yoxdu mə'rifəti.
Demərəm vəhyi-asimanidir ol,
Leyk ərbabi-halə canidir ol.
Ümmül-əxbar, müxbirül-asar,
Kaşifür-rəmz, vaqifül-əsrar,
Özünə eyləyib həmiyyəti fərz –
Ki, edə aləm içrə teyyül-ərz.
Gah olur əsbi-telqramə səvar,

Şərqdən Qərbə söyləyir əxbar.
Gah Peterburqdan olur guya,
Gah olur Hindi-Şərqdən peyda.
Gah Dunaydan* verir qəribə xəbər,
Gah Parisdən gəlir o pakhünər.
Kəşf edir gah Londonun halın,
Söyləyir hər kralın əhvalın.
Nə qəzet, mayeyi-səadətdir,
Nə qəzet, eyni-elmi-hikmətdir.
Xassə kim, ol "Əkinçi"yi-dana
Əhli-Qafqazı eyləyib əhya.
Gər əkin söhbətilə guyadır,
Bəli, öz isminə müsəmmadır.
Ol gərək söyləyə ziraətdən,
Şöxmdən, keştdən, fəlahətdən.
Bu da bir feyzü ne'məti-digər –
Ki, verir gah zaman bir özgə xəbər –
Ki, filan yerdə əhli-Ürupa
Bu sifət bir maşın ediblər bina.
Sənə kim güc edər ki, get onu al,
Ey səfihü dəbəngi-çalsaqqal.
Paraxod minmə bəs sən, ey heyvan –
Ki, minibdir atan-baban yelkan.
Bəs mahut geymə, xoş deyil falı,
Çünki atan geyərdi dağ şalı.
Lənpə yandırma kim, sən, ey yaği,
Yandırırdı atan nöyüt çirağı.
Oxuma sən qəzet, şikəstə oxu,
Get, döşündən yalan hekayə toxu.
Kərəmü Əslinin danış nəqlin,
Sən bəyənmə Həsən bəyin əqlin.
Eyləyin əhli-fisqə imdadi,
Gəh bizi həcv eyləsin Hadi**;
Qoy bizi ta ki, həzrəti-kapitan***
Həcvlər eyləsin, olun xəndan.

* Dunay – Avropa qit'əsində neçə məmləkətlərdən axıb Qara dənizə tökülən böyük bir çayın [adıdır] ki, "Əkinçi" qəzeti verilən zaman Rus ilə Osmanlı davası olmağa görə, o tərəfdən tez-tez xəbər yazılırdı.

** Hadiyi-Müzəllin Qarabaği mərhum Seyidi və Həsən bəyi baş çapmaq məsələsi üstündə həcv etmişdir. O həcvdən bə'zi fərdlər "Əkinçi"də çap olunmuşdur. Hadinin tərcümeyi-halına müraciət etməlidir.

*** Qudyal sakini kapitan Sultanov yenə "Hadi" təxəllüs haman mətləb üstə hər iki ədibi nalayiq həcvləri ilə təzmim etmişdir. Seyidin ona verdiyi cavab atidə dərc olunacaqdır.



Ey Həsən bəy, bu qövmi-nadandan
İncimə, yoxdu baki hədyandan.
Bunlar ol qövmdür ki, Loğmani
Öldürüb oldular ə'zaxani.
Sonradan qədrini bilər bu avam,
Seyyida, xətm qıl, uzundu kəlam.

Qəzetin lüzumiyyəti və ondan hasil olan nəf'ü faydanı belə açıq dildə Seyid Şirvani bəyan etdisə də, heyfa ki, onun camaatımıza artıq tə'siri olmadı və xalq öz avamlığında qalıb, "Əkinçi"ni oxumağa meylü rəğbət göstərmədi. Belə ki, "Əkinçi"nin həyatının axır dəmlərində şair yenə müsəlmanlara üz tutub onları himmətü qeyrətə də'vət edib, qəzetin lazım olmağını dübarə şərh qılır:

Əssəlam, ey əhaliyi-zişan!
Ey olanlar bəla oxuna nişan!
Nə bəla? Cəhlü dərdi-nadanlıq,
Ey tutan cəm'ini pərişanlıq!
Neçə müddətdi kim, Həsən bəyi-zar,
Hüsni-tədbir ilə o fəxri-kübar,
Öz qədimi lisanımızda haman,
Qəzetə çapını edib ünvan.
İzn hasil qılıbdı dövlətdən,
Biz gərək dəm vuraq səadətdən.
Özünə gərçi yoxdu faidəsi,
Leyk var xəlqə feyzi-zaidəsi.
Feyzi-əvvəl budur ki, müxtəsəri,
Yetirir ol cənab hər xəbəri.
Oluruq hali-aləmə vaqif,
Bu bizə bəs deyilmi, ey arif?
Feyzi-sani budur ki, hikmətdən,
Şərh edir kəsbdən, ziraətdən.
Əkibən elm töxmünü o cənab,
Məzrə'i-aləmi edir sirab.
Ol bizə bir səhabi-rəhmətdir,
Baisi-abruyi-millətdir.
Gərçi hər dildə var qəzetlər çox,
Bizə ondan və leyk faidə yox.
Bilmirik rus ya firəng dili,
Hər dilin rəmzini öz əhli bili.
Bizdə yox rus, həm firəngi savad,
Olmuşuq türkü farsiyə mö'tad.
Onu da hiç bilmirik kamil,
Əksəri-xəlq avamdır, cahil.

Bəs, "Əkinçi" bizə münasibdir,
Qiyməti yaxşı, mali-kasibdir.
Bəs, "Əkinçi" cəlalımızdı bizim,
Baisi-ibtilalımızdı* bizim.
Səy edin, ey güruhi-niksifat!
Etməsin ta bizim "Əkinçi" vəfat.
Sonra göydən əgər enə İsa,
Edə bilməz o mürdəni əhya.
Ey "Əkinçi" xərid edən kəslər,
Verməsə cəngdən "Əkinçi" xəbər,
Qəzetə tərkin etməyin zinhar,
Nə gərəkdir bizə o nəqlü güzar.
Qədəğəndir o növ' söhbətlər,
Eşidin pəndlər, nəsihətlər.
Biz gərək sə'y edək məişət üçün,
Sən'ətü kəsb üçün, ziraət üçün.

"Əkinçi"nin belə zəif halında Rus və Osmanlı müharibəsi başlanır. Bu əsnada mərhum Həsən bəyə bərk qadağan ol[un]ur ki, dava barəsində qəzetdə bir söz belə yazmasın. Qəzetin müştəriləri isə Həsən bəydən müharibəyə dair xəbərlər tələb edib, almadıqda bir tərəfdən mə'yus və digər tərəfdən mühərrirdən narazı və dilgir olmaqlarını ona izhar edirdilər.

Mərhum Hacı Seyid Əzim mühərririn belə müşkül halda əlacsız qalmağına işarə edib, qəzet oxuyanlara nəsihət üzü ilə deyir ki, əgər "Əkinçi" cəngdən sizə xəbər verməsə, onun üzünü qəbul edib müttəhim qılmayın və zinhar qəzet tərkini etməyin.

Amma çifayda, Seyidin nəsihəti də nəticəbəxş olmadı. Haman 1877-ci ilin sentyabr ayında yatdı və bir sayaq yatdı ki, daha bir də durmağa qüdrəti təvanası qalmadı.

Mərhum Hacı Seyid Əzimin "Əkinçi"də təb' olunan məktubati-mənzumələrinin bərgüzidələrindən birisi də tə'limü tərbiyənin insana hüsni-tə'siri babında yazdığıdır ki, burada zikr olunur:

Ey bizə xeyrxah olan Möhsün,
Əhli-ehsanü xoşnişan Möhsün!
Millətin qeyrətin çəkən qardaş,
Töxmi-xoşbəxtlik əkən qardaş,
Sözlərin dün gətirdi şurə məni,
Şad qılsın görüm ilahi səni!
Yazmış idin ki, ey güruhi-bəşər,
Əhli-islamü qövmi-paksiyər,

* İbtilal – baş olmaq; şə'nü şərafət mə'nasında işlənir



Ayılın bircə xabi-qəflətdən,
Geri qaldıq tamam millətdən!
Afərin, ey yeganeyi-dövran!
Pəndinə yoxdu şəkkü reybü güman.
Məsəlin xub, sözlərin mərğub,
Zövq edər guş edəndə əhli-qülub,
Filhəqiqət dirəxti-nakamil,
Tərbiyət feyzinə olur şamil.
Növ'i-insan deyil ağacdan kəm,
Qabili-tərbiyətdi hər adəm.
Daşı tə'siri-afitabi-fələk
Döndərib lə'li-nab edər bişək.
Nafi-ahudə müşk edir qani,
Dürri-nab eylər abi-neysani.
Elm üçün, ari, əhli-hikmətlər
Çəkib aləmdə çox riyazətlər.
Elmsiz kimsənə hünərsizdir,
Elmi-bitərbiyət səmərsizdir.
Tərbiyət mayeyi-səadətdir,
Tərbiyət şəxsə malü dövlətdir.
Elmlə hər o kəs ki, danadır,
Qabili-feyzi-rəbbi-əladır.
Nitq ilə mürdələr qılan əhya
Qaçdı nadandən həzrəti-İsa.
Elmdir baisi-tərəqqiyi-tam,
Alimə tay deyil güruhi-avam.
Bunu da bil ki, ey qərini-şərəf,
Elm ancaq deyil bu "Nəhv" ilə "Sərf".
(Bu deyil ancaq elm, ey dana:
Edəsən bövl vəqti-istibra.)
Hələ qalsın bu rəmzlər bari,
Elmsiz aləmin nə miqdari?
Möhsüna, ey fəda olum sənə mən!
Etdiyin fikri-bikrə səd əhsən!
Bilməyən yoxdu kim, bu mə'nani:
Tərbiyət kamil eylər insani.
Tutalım gəldik əmrə mərdanə,
Baxmadıq tənü lə'ni-nadanə.
Tutalım eylədik bu əmrə tifaq,
Tərbiyət biz gərək ki, kimdən alaq?
Hansı məktəbdə föyci-ətfali
Hansı bir elmdən edək hali?
Məktəbi-tibb ya ki, hikmətdən?
Ya ki, hərbiyyə ya ki, hirfətdən?*

* Hirfət – kəsbi-məaş və rizq üçün işlənən şüğlü sən'ət

Necə kim, ol "Vəkili-namə'lum"*
Eyləmişdi bu nüktəni mərqum.
Əvvəla bizdə yox o məktəblər –
Ki, verə kəsbi-elmi xəlqə səmər.
Nə o günə kitablar əl'an –
Ki, ola öz lisanımızda bəyan.
Bizə hasil nə şey olur yoxdan –
Ki, itibdir kitabımız çoxdan.
Hanı bizdə "Xülasə"nin[100] səməri,
Hanı "Cəbrül-məqabil"in[101] xəbəri?
Səhl dillərdə elmi-hey'ət yox,
Cəm'ü təfriqü zərbü qismət yox.
Nə təqiyyə, budur sözün safi,
Küfrdür bizdə elmi-coğrafi.
Elm evi oldu ol zaman bərbad –
Ketdi** rehlət xəlifeyi-Bağdad.
Hər vilayətdə var beş-on məktəb,
Edirik kəsb onda elmü ədəb.
Məktəbin fərşi altı köhnə həsir,
Neçə ətfali-müztər onda əsir.
Dərsimizdir kitabi -"Gürbəvü muş",[102]
"Nəqli-həmdunə",[103] "Qisseyi-xərguş"[104].
Oxuruq çox tərəqqi etsək əgər
Cümlə "Tarixi-Nadir"i əzbər.
Bixəbər elmi-paki-hikmətdən,
Bisəmər caddeyi***-şəriətdən.
Deyəcəksən ki, ey qərini-ədəb,
Bəs, gəlin tazədən açaq məktəb.
Biz bu əmrə görək ki, ey xoşnam,
Hansı qüdrətlə eyləyək iqdam?
Pulumuz varmı ol sərəncamə,
Ta yetişsin fəqirlər kamə?
Əhli-islam eyləyibdi vəfat,
Dəxi müşkül tapar bu qövm həyat.
Məgər ol Əsgəri-Gorani**** gələ,
Neçə məktəb dəxi gələ əmələ.

* 1877-ci sənədə yanvarın ibtidasında bir şəxs "Milləti-islamın təqdirən vəkilinamə'lumu" imzası ilə Həsən bəyə bir kağız yazıb müsəlmanların əllərində əsbabiməişət və mabeynlərində ittifaq olmadığını bəyan edib deyir ki, nə qüvvət və istitaətlə elmü ədəb kəsb edə bilərik. Bu məktubun barəsində söhbət olunacaqdır.

** Ki, etdi – *red.*

*** Caddə – böyük yola deyilir; şahrah

**** Əsgər ağa Gorani Adıgözəlov[105] ki, sabiqdə Gəncə şəhərində şəhər rəisi idi, iki sənə bundan müqəddəm vəfat edibdir.



Vəzirov* bəlkə eyləyə imdad,
Qıla bu qövmi elm üçün irşad.
Aça onlar da mən kimi məktəb,
Çəkələr ruzü şəb ə'zabü təəb.
Barilaha, behörməti-Qur'an,
Bizə çatdırsın onları sübhan.
Seyyida, hər güruh içində ola,
Daima əhli-halə eylə dua.

Mərhum Seyid bu kəlami-xoşməalında yenə elmü ədəbin fəzilətü şərafətini bəyan edib, əhli-islamı hər ikisinin təhsilinə də'vət qılır və sabiqdə bizim məktəblərimiz necə pərişan halda olduğunu və tə'limi-ətfal üçün iste'mal olunan biməzmun nağıl kitablarını və bilkülliyyə tə'limü tərbiyə işlərimizin bisərü pa olduğunu nəzmə çəkib Əsgər Gorani ilə Nəcəf bəy Vəzirovun Rusiyadan müraciətini arzu eləyir, ta ki, onlar gəlib məktəb işlərini düzəldib, intişari-maarifə rövnəq verələr.

Hacı Seyid Əzimin tərbiyə məsələsinə hansı nöqteyi-nəzər ilə baxması onun aşağıda zikr olunan bir neçə əş'arından mə'lum olunur. Bəzilərin e'tiqadınca hər bir vücud qabili-tərbiyə və tə'lim ola bilməz. Elə bir cövhərsiz, gövdən və fürumayə şəxslər var ki, nə qədər onlara tə'limü tərbiyə olunsa, yenə də avamlıqda və sırf heyvaniyyətdə qalıb, ruhaniyyət və mə'nəviyyat cəhətincə tərəqqi edə bilməzlər. Şairin kəlamından:

Gər qəra daşı qızıl qan ilə əlvan edəsən,
Rəngi təğyir tapar, lə'li-Bədəxşan olmaz[107]

– məalınca çoxları bu əqidədədirlər ki, naəhlü naqabil şəxsə heç bir tərbiyə əsər edə bilməz. Girdəkan günbədə yapışmayan kimi, tərbiyət də naəhlü dənitəb' şəxsə tə'sir edə bilməz.

Amma mərhum Seyid bunun əksincə başqa bir e'tiqadda olub, insanın qabili-tərbiyə olduğunu tə'kid eləyir. "Nəbatat və heyvanata tərbiyə və ədəb tə'sir etdikdə insana etməzmi?" – deyib yazır:

Filhəqiqət, dirəxti-nakamil
Tərbiyət feyzinə olur şamil.
Növ'i-insan deyil ağacdan kəm,
Qabili-tərbiyətdi hər adəm.

* Vəzirov Nəcəf bəy[106] hali-həyatdadır. "Əkinçi" verilən vaxtı Rusiyada darülfünunda təhsildə olub. Hər ikisi "Əkinçi"yə əxbarnəvis olub, ülumü sənayeyə dair müfid məqalələr yazardılar.

Daşı tə'siri-afitabi-fələk
Döndərib lə'li-nab edər bişək.
Nafi-ahudə müşk edər qani,
Dürri-nab eylər abi-neysani.

Belə olan surətdə insan elmü tərbiyət sayəsində əxlaqü adabca tərəqqi tapıb feyzi-rəbbanidən ona ə'ta olunan ülüvvi-dərəcəyə vasil ola bilməzmi? Əlbəttə, olar! Bəs, mayeyi-səadət insan üçün hüsni-tərbiyətdir. Tərbiyətsiz elmin də faydası yoxdur. Necə ki, şair özü deyir:

Elmsiz kimsənə hünərsizdir,
Elmi-bitərbiyət səmərsizdir.
Tərbiyət mayeyi-səadətdir,
Tərbiyət şəxsə malü dövlətdir.

Hacı Seyid Əzim insanın hər bir qövlü fe'li hikmətü mə'rifət yolu ilə olmağını nəzərə alıb, yövmi-aşurada cühəlanın baş çapmasını "Əkinçi" qəzetində bir növ' zəmm etmişdir.

Şairin bu rəftarı Qudyal sakini kapitan Sultanov "Hadi" təxəllüsə nasəza görünüb Seyidi həcv qılmağa vadar etmişdir və Seyidi-mərhuma bunu irad tutmuşdur ki, guya Seyid cəddi-büzürgvarı Məhəmmədəl-Mustafanın övladına tutulan tə'ziyədarlıqdan dilgir olub, aşura günü cənab seyyidüş-şühədanın və sair Kərbəla şəhidlərinin yolunda başlarını çapanları təhsin əvəzinə təzmimü təqbih etmişdir.

Haman həcvin müqabilində şairi-Şirvan bu əş'ari-abdarü xoşgüvarı yazıb Həsən bəyə göndərmişdi ki, "Əkinçi"də onu çap eləsin. Amma səbəb nə olmuşsa da çap olmamışdır:

Ey bizi mədh qılan Hadiyi-dövran əxəvi!
Bu nə zəhmətdir, əya mənbəi-ürfan əxəvi!
Seyyidi eyləmisən mədhi-firavan, əxəvi,
Şad səndən olacaqdır şəhi-Mərdan, əxəvi!

Çəkdi ol gün ki, Sən'an[108] Kərbübəlayə ləşkər,
Qaldı ol ərsədə tənha o şəhi-təşnəcigər,
Sən əgər olsa idin orda, əya paksiyər,
Canını eylər idin ol şəhə qurban, əxəvi!

Çatmayıb çün əlin ol feyzə, əya xoştinət,
İndi övladına bəsdir ki, edirsən hörmət,
Cəddimiz şad olacaq olsa sizin tək ümmət,
Mərhəba, namxuda, sahibi-iman əxəvi!



Məni əfv eylə ki, öz cürmümə iqrar etdim,
Anladım səhvimi, iqrarımı inkar etdim,
Sənə baş çapma dedim, tövbə, stiğfar etdim,
Keç bu təqsirdən, ey mənbəi-ehsan əxəvi!

Olasan eşqdə divanə, məhəbbətdəndir,
Çapasan başını mərdanə, məhəbbətdəndir,
Tökəsən qanını meydanə, məhəbbətdəndir,
Olmuşam eylədiyim zəmmə peşiman, əxəvi!

Leyk gəl indi biz əyri oturaq, düz danışaq,
Elə bil ki, küslüydük, tazədən gəl barışaq,
Şərdə var isə, baş çapmağa biz də qarışaq,
Bir görək varmı buna höccətü bürhan, əxəvi?

Belə fitvanı görək verdi bizə hansı imam?
Ya ki, onlar özü də etdi bu əmrə iqdam?
Bədənin zəhməti gər şərdə olmazsa həram,
Biz də başlar çapıban cari edək qan, əxəvi!

Gərək əvvəl çapa başlarını fövci-üləma,
Çünki onlardı bu işlərdə rəisül-füqəra.
Sonradan baş çapalar xanü əmirül-üməra,
Nə ki, hər bisərü pa, lutiyi-meydan, əxəvi!

Heç eşitdinmi çapıb başın imami-Cəfər?
Ya ki, Musiyü Riza, Əsgəriyi-xəstəcigər,
Bizdən onlar məgər öz cəddini az istərlər?
Niyə bəs vermədilər bu işə fərman, əxəvi?

Bu yəqinimdir əgər olsa özü zində imam,
Hökm edə: çapma başın, nəhydi bu fe'li-həram.
Yenə hər il çapacaq başını bu qövmi-əvam,
Demə kim, tərki-təbiət ola asan, əxəvi!

Qudyal əhli bu işə rağib olur bizdən çox,
Baş çapıb, qıfl taxıb, cismə keçirdərlər ox,
Nə məzəmmət eləyim, onlara bir töhmət yox,
Göz açıb böylə görüb, adət edib can əxəvi!

Doğrudur, baş çapırıq biz dəxi cəm'iyyət ilə,
Bunu lazımdı halal eyləməyə hüccət ilə,
Nə olur bir göz açıb baxsaq işə ibrət ilə,
Bəlkə yoldan çıxarıbdır bizi şeytan, əxəvi!

Ey Həsən bəy ki, gəlib təb'imə mərdanə bu söz,
Bilirəm ki, deyəcək Hadiyi-kaptana bu söz,
Çap qıl, ta dağıla səfheyi-dövranə bu söz,
Qoy məni həcv eləsən həzrəti-kaptan, əxəvi!

Ey bu nadanlar əlindən yetişən canə Həsən,
Səbr qıl təneyi-hər cahilü nadanə, Həsən,
Sən də Seyyid kimi ver pəndi-həkimanə, Həsən,
Bəlkə bir söz qana bu zümreyi-nadan, əxəvi!

Seyidi-mərhumun bu hakimanə və ədibanə cavabı layiqi-təhsin və şayani-diqqətdir. Filhəqiqə, bir əməl ki, şəri-şərifdə haram buyurula, onun fitvası hamiyi-din və sahibi-şəriət iddiasında olan üləmavü füzəla tərəfindən fikrə sığışmayan və əqli-səlimdən bəid bir əmrdir.

Əgər dini-mübini-nəbəvidə hifzi-bədən əmri sadir olmasaydı, onda baş çapmaq fe'lini və bədənə nizə, ox, qıfıl, at nalı, qılınc, gorda və hətta palanduz sünbəsi kimi ağır şeylər taxıb, ona həddən ziyadə cəfalar və təsəvvürə gəlməyən əziyyətlər yetirməyi bir növ' eşqi-ali-əbaya və məhəbbəti-şühədayi-Kərbəlaya isnad qılıb sakit olmaq olardı. Amma bir fe'l ki, şər'ən nəhyü qadağan buyurula və onun icrasına nə övliya tərəfindən və nə üləma firqəsindən iqdam olunmaya, o fe'lə mürtəkib olmaq peyğəmbərin buyuruğuna əməl etməmək və onun əmrini inkar etmək kimidir.

Əgər imam yolunda bədənə cərahət yetirib qan tökmək və divanə halına düşmək cayiz olsaydı və onun dünyavü axirətə bir xeyir və mənfəəti olsaydı, bişəkkü laşübhə hamıdan əvvəl bu işə üləmavü hükəma, ürəfavü nücəba firqələri mayil olardı. Amma hal-hazırda biz bunları tamaşaçı və yalandan ahəstə-ahəstə sinələrinə əllərini döyən və yaşsız gözlərinin nəmini hiyləvü riya dəsmalı ilə silən görürük. Başlarını çapan, arxalarına zəncir vuran və bədənlərinə hər qisim əziyyət yetirən yenə əlsiz-ayaqsızlar, biçarə və sadədil əvamün-nas olur.

Bu qisim vəhşiyana tə'ziyədarlıq bimürüvvət vaizlərin, tamahkar mərsiyəxanaların mərhəmətindən cühəlavü avam arasında o qədər möhkəmləşib, onların bədəninə və ruhuna bir dərəcədə sirişt olubdur ki, əgər sahibi-şəriət və ə'za, necə ki, şair işarə edibdir, təzədən dirilib xalqa onu qadağan buyura, yenə də onun tərkinə əməl olunmaz. Çünki: "Tərke-adət mucebe-mərəzəst"[109].

Hacı Seyid Əzimin sair asari-nəfisələrindən şayani-diqqət olanları onun tə'limi-ətfal üçün nəzm ilə yazdığı gözəl və xoşməzmun təmsilat və hekayətlərdir ki, onlardan bə'zisini fars və rus dillərindən tərcümə edibdir və bir neçələrinin məalını öz məişətimizdən götürüb zərif dona geydirmişdir. Bunlardan əlavə çap olunmuş "Məcmuə"sinə bir neçə hədislər dəxi daxil olubdur ki, şair onları nəzmən şərhü bəyan qılıbdır. Amma çox əfsus ki, şairin bu qisim əsərləri, necə ki, sabiqdə zikr olundu, bə'zi naqabil məzhəkələr və tə'limi-ətfala yaramayan təmsillər ilə bir cildə giribdir və kitabı bilmərrə məlahətü qiymətdən salıbdır. Belə ki, onu uşaq əlinə vermək hər halda cayiz deyil.

Tə'limə dair yazılmış təmsilatdan nümunə üçün bir neçələri burada zikr olunur:



## ASLAN İLƏ ÖKÜZLƏRİN VƏQ'ƏSİ

Bir çəragah içində iki öküz
Otlayırlardı şad gecə-günüz.
Nagəh onlara bir qəvi aslan
Eylədi həmlə səxt, seyhəkönan.
Çün öküzlər görüb bu əhvali,
Fikri-düşməndən oldular hali.
Verdilər dal-dala o heyvanlar,
Qıldı buynuzlarıyla cövlanlar.
İttifaq eyləyib dəlirana,
Durdu onlar müqabil aslanə.
Gördü aslan ki, yox işində zəfər,
Oldu tülkü misal hiylətgər.
Hiylə fikriylə ol qəvisövlət
Öküzün eylədi birin də'vət,
Dedi: – Ey gavi-xoşələf, hərgah
Edəsən ol rəfiqdən ikrah,
Sənə minbə'd etmərəm azar,
Olusan hər çəməndə bərxürdar.
Sənə verrəm hamı ələfzarı,
Görməsən bir dərəndə azarı.
Olusan daima pənahımda,
Dərgəhi-ərşi-iştibahımda.
O qədər vəsf edib özün satdı,
Axır ol binəvanı aldatdı.
Onları bir-birindən etdi cüda,
Oldu aslanə müddəa peyda.
Onların parə qıldı ə'zasın,
Ey gözüm nuru, anla mə'nasın.
Əgər olsaydı ittifaqları,
Gavlər görməz idi bu xətəri.
İttihad ilə ittifaq eylə,
Üzünü hər məkanda ağ eylə.

## MUSA PEYĞƏMBƏR VƏ ÇOBAN

*Mollayi-Rumidən tərcümə*

Bir gün olmuşdu həzrəti-Musa
Canibi-Turi-pakə rəhpeyma.
Nagəhan gördü bir nəfər çuban
Söyləyir: – Ya qəfurü ya rəhman!
Hardasan, ey xudayi-ərzü səma!
Sənə qurban qoyun-quzum yekca!
Bircə gəl bu həqirü zarə qonaq,
Sənə süd-doğrama verim, qursaq.
Eyləyim zülfü kakilin şanə,
Yamayım çarığın zərifanə.
Sirkədən, bitdən eyləyim səni pak,
Başını qırxmağa olum dəllak.
Dedi Musa çobanə, ey əbtər,
Bu nə sözlərdir, olmusan kafər?
Məgər insan idi xudayi-cahan –
Ki, gəlib ta ola sənə mehman?
Əkldən, şürbdən mübərradır,
Zatı məxfi, sifatı peydadır.
Sözlərindən sənin cahan titrər,
Nöh fələk, ərzü asiman titrər.
Ol xəmuş, ey şəqavətin kanı,
Cismə mənsub qılma sübhanı.
Ol çubanı Kəlim eylədi lal.
Verdi üz ol fəqirə dərdü məlal.
Gəldi çün Turə həzrəti-Musa,
Açdı razü niyazə dəsti-dua.
Gəldi nagəh xitab Musayə –
Key Kəlimi-xuda fələkpayə,
Bəndəmi eylədin cüda məndən,
Çox uzaqdır bu macəra səndən,
Arif ol, hər lisanə ol dana,
Halə bax, qalə baxma, ey dana!
Seyyida, gərçi əbdsən şakir,
Hər lisan ilə həqqə ol zakir.
Hər lisan həq yanında zibadır,
Həqq özü hər lisana danadır.

## ƏRƏBİN HƏZRƏT ƏLİDƏN SUALI

Bir ərəb Mürtəzadan etdi sual –
Key sipehri-ülumü bəhri-kəmal,
Əyləşə bir fəqir xəlvətdə,
Gecə-gündüz ola ibadətdə,



Xəlqdən qət' eyləyə ülfət,
Bir kəsə zahir etməyə hacət,
Nə ola sən'əti, nə dükkanı,
Bəs və yerdən gəlir onun nanı?
Ona verdi cavab miri-əcəll,
Dedi: – Ordan gəlir ki, gəldi əcəl.

## BİR ABİD İLƏ CAVAN MƏSTİN VƏQƏSİ

Bir gecə bir cavani-məstü xumar
Bir nəfər parsayə oldu düçar.
Oxuyurdu əlində həm bir saz,
Nəğmeyi-Şur edirdi, gah Şəhnaz.
Görcəyin parsanı ol sərməst
Başını sazı ilə qıldı şikəst.
Dinməyib parsa keçib getdi,
Gəlibən sübh ona ə'ta etdi.
Dedi ki, məst idin gecə, ey oğul,
Bir qədər mən sənə gətirdim pul –
Ki, sınan sazını dürüst eylə,
Xoş deyil ki, ola şikəst belə.
Sağalıbdır mənim başımda yara,
Sən də qıl sazını dürüstnəva.
Çün cavan onda gördü xülqi-həsən,
Eylədi tövbə öz ədasindən.

## VƏSİYYƏTİ-İSKƏNDƏR ZÜLQƏRNEYN

Canı təslim edəndə İskəndər
Eylədi bir vəsiyyət ol sərvət –
Ki, anama deyin bu göftari,
Xəlqə ehsanım eyləsin cari.
Leyk hər kəs çəkibdi dərdü bəla
Yeməsin ol təamdan əsla.
Çünki saz oldu ne'məti-əlvan,
Qıldı anın vəsiyyətini bəyan –
Ki, gərək əkl etsin ol adəm
Çəkməyibdir cahanda möhnətü qəm.
Mütənəbbih olub kəlamından,
Hamı çəkdi əlin təamından.
Çünki çəkmişdi hamı möhnətü qəm,
Çıxmadı hiç bir nəfər xürrəm.
Madəri-əşkbari-İskəndər,
Gərçi olmuşdu zari-İskəndər,
Bildi ki, mərgə yoxdu bir çarə,

Hamının qəlbinə dəyib yarə.
Dilbəra, çox da çəkmə möhnətü qəm,
Könlünü eylə qəm günü xürrəm.
Gərdişi-çərxi-kəcmədar keçər,
Bu qəmü dərdi-ruzigar keçər.

Seyid Şirvaninin bu qisim xoşməzmun və nəticəbəxş qissəvü hekayətləri çoxdur. Onları gözəl bir qayda üzrə tərtib edib çapa vermək mərhumun varislərinin ən müqəddəs və baş vəzifələrindən biridir.

Hacı Seyid Əzimin sair qisim kəlamlarına rücu etdikdə ki, onlar ibarət olsun qəzəliyyat, qəsaidat, mürəbbeat, müxəmməsat, müsəddəsat, tərcibənd, tərkibbənd və qeyrilərindən, demək olur ki, şair ədəbiyyatın bu növlərində dəxi də artıq məharət və qabiliyyət büruz etmişdir. Mərhumun elə gözəl və səlis qəsidələri, elə xoşməzmun müxəmməsləri və qit'ələri, elə ruhpərvər qəzəlləri var ki, Füzuli Bağdadinin kəlamına əvəz ola bilərlər. Onların cümləsini buraya yazmaqla qurtarmaz. Amma yenə də oxucularımıza mərhumun əş'ari-lətifələrinin hər bir növündən bir para nümunələr təqdim etməyi lazım gördük.

Qarabağlı Abdulla bəy "Asi" təxəllüsün mədhində yazdığı qəsidə:

Həzar şükr, könül, mövsümi-bahar olacaq,
Həzar naləsi hər guşədə həzar olacaq.
Hənuz Hutdədir Yunisi-cahanəfruz,
Həməldə zahir olan gündə özgə hal olacaq.
Səba xəbər verəcək mö'cüzati-İsadən,
Nəsim baisi-əhyayi-ruzigar olacaq.
Şükufə xəl'əti-əşcarı nöqrəduz edəcək,
Behişt əlaməti gülşəndə aşikar olacaq.
Dəhani-yar təkin qönçələr olub xəndan,
Səhab dideyi-aşiq tək əşkbar olacaq.
Şükufədən dönəcək bağ ruyi-canana,
Bənəfşə bağda manəndi-zülfi-yar olacaq.
Kənari-səbzə olu pür əbirü ənbərdən,
Dəhani-lalə dolu dürri-şahvar olacaq.
Bənövşə türrəsinə cilvələr qılıb hər dəm,
Dəmi-nəsimi-səhər türfə müşkbar olacaq.
Sədayi-kəbki-xuramanü naleyi-dürrac,
Səfayi-rövnəqi-səhravü kuhsar olacaq.
Həsari-günbədi-firuzə şurlər düşəcək,
Nəvayi-dilkəş ilə əndəlib zar olacaq.
Qürur ilə çıxacaq seyri-bağə gülruxlar.
Gülün lətafəti bülbül gözündə xar olacaq.
Əyaği-laləni şəbnəmlə görcəyin məmlüvv,



Əlində rindlərin cami xoşgüvar olacaq.
Nə yanə əzm edəsən camü şahidü sağər,
Nə səmtə meyl edəsən saqiyü üsar* olacaq.
O qədr şişeyi-mey cəm' olur gülüstanə –
Ki, Şişədən ürəfa dövrinə həsar olacaq.
Kimə bu mövsüm olur vəsli-yar ilə cənnət,
Kimə fəraq ilə gülşən bəsani-nar olacaq.
Düşən həvayi-ruxü zülfi-yarə gün görməz,
Nə yerdə olsa, qara günlərə düçar olacaq.
Xoşa ol aşiqi-xoşbəxtə kim, bu mövsümdə
Onunla seyri-gülüstanda yar yar olacaq.
Yəqindir ki, mənə ol büti-şəkkərləbsiz
Şərabi-nab o mövsümdə zəhrimar olacaq.
Rəqibə eylədi meyldən müşəxxəsdir –
Ki, ənqərib məni-xəstədən kənar olacaq.
Nə kim ki, badə edər rəfi-möhnətü dərdim,
Nə qəmli xatirimə Zöv'i qəmküsar olacaq.
Nə Rağib eyləyəcək halı sormağa rəğbət,
Nə Qafil əmri-əcibimdə huşyar olacaq.
Zühurindən nə edər halıma zühur kərəm,
Nə Didənin gözü bu qəmdə əşkbar olacaq.
Nə bir səfa verəcək xatiri-həzinə Səfa**,
Minayi-eşqdə dil zarü biqərar olacaq.
Vəli bu fikr ilə şadəm ki, dərdi-hicranə,
Hədisi-Asiyi-dilxəstə sazkar olacaq.
Nə Asi, ol ki, dəri-izzətində Seyyidi-zar
Qulamı olmaq ilə sahibixtiyar olacaq.
Nə Asi, ol ki, xəyali-dəri-məhəbbətdən
Könül səraçəsinə şahi-tacdar olacaq.
Səfa ilə gələcək nəzmü nəsri Şirvanə.
Görüb o nəzmləri Zöv'i şərmsar olacaq.

Mə'lum ola ki, mərhum Hacı Seyid Əzim fəqirü biçiz bir şəxs olduğuna görə və çox vaxtlar əlində müəyyən bir şüğlü sən'əti olmadığına binaən, əksəri-övqat ehtiyacü möhnətdə güzəran edərdi.

Bu yoxsulluq və təngdəstlik, dünyada çox bəlalara səbəb olan ehtiyac şairi vadar edərdi bə'zi dövlətmənd və əhli-sərvət mədhində qəsidələr inşa edib, kimisindən buğda, kimisindən düyü, bə'zilərindən pul, xəl'ət, saat və qeyri-zəruri olan əşya tələb etməyə. Şairin haqqında olan bu həqarət və qədirşünassızlıq camaatımıza töhmət gətirən və onu ləkələndirən bir haldır ki, gələcək nəslin nifrət ilə bizi yad etməyinə səbəb olacaqdır.

* Üsar – meyvə və üzüm suyu

** Rağib, Qafil, Zühuri, Didə, Səfa, Zöv'i – mərhum Seyidin müasiri olan Şirvan şüərasının təxəllüsləridir.

Həqiqi şairin və həqiqi ədibin yazmaqdan və şe'r deməkdən başqa bir şüğlü sən'əti gərək olmasın. Əgər şair peşəkar və əhli-sən'ət olsa, o sən'ət və peşə şairin yazmağına, şe'rlər vasitəsilə yoxdan xəlq etməyinə, onun təb'inin açılıb barvər olmağına mane olardı. Şairin sərmayəsi haqqtaala ona bəxşü ə'ta qıldığı təbi-səlimdir ki, ondan nəş'ət edib zühura gələn cəvahirlərin hər birisinin ərbabı nəzərində qədrü qiyməti ziyadədir. Və lakin bizim içimizdə ol dürri-giranmayələrin bahasına pul verən yoxdur.

Şairin hər bir kəlməsi ərbabi-halü mə'rifət nəzərində bir qızıla əvəz olmasına şairin öz kəlamı şəhadət verir:

Pişe-ərbabe-həsəd nist mər ura qədri,
Nəzde-ərbabe-bəsirət həme dorre-Ədənəst[110].

Burada "həsəd" kəlməsinin yerinə "cəhalət" sözü qoyulsaydı, daha da artıcıq halü şə'nimizə münasib olardı.

Mətləbə rücu edək. Mərhum Seyid, necə ki, kəlamının çoxundan anlaşılır, əmri-məaşda böyük sıxıntı və üsrət çəkirmiş və bə'zi övqat şairin güzəranı intəha dərəcədə təng keçirmiş. Belə ki, bir kəlamının ibtidasında zərin mədhində bir neçə sözlər deyib, hər bir mətləbin rəva olmasını, hər qisim müşkülatın həll tapması zər'ə bağlı olmağını bəyan edib, hətta kəlamın bir misrasında şair bir növ' asi düşür. Haman kəlam budur:

Cahan mülkündə zər müşkülgüşadır,
Nə mətləb istəsən ondan rəvadır.

Əgər bir kəsdə olsa mali-dünya,
Tamamən xəlq onunla aşinadır.

Gədani zər qılar aləmdə sultan,
Əgər sultan ola bizər, gədadır.

Bu söz şər'ən əgər küfr olmasaydı,
Deyərdim filhəqiqə zər xudadır.

Desəm gər qaziyül-hacat, həqdir,
Desəm gər kaşifül-qəmdir, rəvadır.

Məhafilllər içində əğniyanın
Kəlamı san kəlami-övliyadır.

Əgər bir kəs mənim tək olsa müflis,
Kəlami kizbdir, qövli xətadır.



Şair kəlamın axırını həzrət Əlinin mədhilə tamam edib deyir:

Könül, qəm çəkmə, müflislər pənahi
Vəliyyül-həqq, Əliyyül-Mürtəzadır.

Yetiş fəryadına, ya şahi-Xeybər –
Ki, Seyyid bir qulami-rusiyadır.*

Başqa bir kəlamında Seyidi-qəmzədə özünün fəqrü ehtiyacını və evinin övza'i-pərişanını şairanə bir səbkdə nəzmə çəkmişdir ki, hər daşbağırlıya onun artıq dərəcədə tə'sir etməyində şübhə yoxdur. Kərəm əhlindən birisinə yazır:

Ə'la, ey sərvəri-nikuxəsail –
Ki, səndəndir fəxarət ruzigarə.
Ə'la, ey sərvəra kim, seyti-fəzlin
Yetib aləmdə gün tək iştiharə.
Keçən gün tifli-çakərzadə ilə –
Ki, həq vermiş onu mən dilfikarə,
Durub qəm kəsrətindən kuçə içrə,
Edirdik əcz ilə hər yan nəzarə.
Nümayan oldu nagəh bir cənazə,
Aparırlardı dəfn üçün məzarə.
Düşüb bir tifl dalınca o nəş'in.
Edib qəmdən yaxasın parə-parə.
Açıb başın, töküb gülrəng yaşın.
Gəlib fəryadə manəndi-həzarə.**
Deyirdi nalə ilə key baba can,
Aparırlar səni bir bəd diyarə:
Nə bir həmdəm, nə bir munis, nə bir yar,
Yetişməz həm əlin bir qəmküsarə.
Lihafın xiştü bəstər qarə torpaq,
Olur tömə vücudin murü marə,
Nə abü nə qəza, nə şəm'ü şərbət,
Misali-bəxti-əhli-şe'r qarə.
Bu halı tifli-çakərzadə görcək
Gəlib fəryadə düşdü ahü zarə –
Ki, vaveyla, məgər ağa, bu nəş'i
Qoyacaqlar bizim evdə məzarə?
Dedim: – Ey nuri-çeşmim, bu nə sözdür,
Bu gunə sözləri eylə kənarə.
Dedi: – Bu vəsflər kim, söylər ol tifl,

---

* Rusiyahdır, yə'ni: üzüqaradır

** Həzarə – bülbül misilli xoşəlhal bir quşun adıdır

Bizim ev halətin getdi şümarə –
Ki, nə abü qida, nə şəm'ü şərbət,
Çəkibdi fəqr odu onda şərarə.
Həqiqəthal, ey fəxri-zəmanə,
Bu halətdir nihanü aşikarə.
Əgər bundan ziyadə kəşf qılsam,
Düşər od xirməni-səbrü qərarə.
Ümidi-Seyyid oldur bu məlalə –
Ki, etsin himmətin lütf ilə çarə.
Behəqqi-Seyyidi-ruzi-qiyamət –
Ki, şafe'dir hami xürdü kibarə.
Nə xahiş eyləsən, olsun müyəssər,
Yetişsin şövkətin ruzi-şümarə*.

Necə ki, yuxarıda zikr olundu, mərhum Hacı Seyid Əzimin bu ilhahü təmənnasını və bu iltimasü təvəqqeini hər kəs oxusa, onun könlü hüznü ələm ilə ləbaləb olacaqdır.

Filhəqiqə, rəvamıdır ki, Seyid kimi xoştəb' və şirinkəlam şairimiz, ürəfavü üdəbanın səramədi, külli-Azərbaycanın bülbüli-xoşnəvası bu qədər yoxsulluğa, bu qədər zil..tü fəlakətlərə düçar olub diləncilik mərtəbəsinə və saillik halına düşsün?

Mərhumun qədrini, əlbəttə, müasirləri bilməyiblər və illa onu bu-ncalın fəqirlik halına qoymazdılar düşsün. Demək olur ki, biz dəxi şairin qədrü qiymətini kamalınca düşünüb anlamamışıq. Əgər anlasaydıq, budur iyirmi ildən ziyadədir ki, onun vəfatından keçibdir, bu vaxta kimi onu azçox yad-bud edərdik, onun əş'ari-nəfisələrini və sair asari-qələmiyyələrini dəfəat ilə təb'ü nəşr qılardıq. Vəli əbnayi-millətdən əksəri, çox ehtimal var ki, heç onun adını da eşitməyibdir. Eşidənlər də yəqin ki, onun yazdığı əsərlərdən bixəbərdirlər.

Mərhumun Mahmud ağaya[111] buğdanın şə'nində yazdığı qəsidə dəxi xeyli zərif və xoşagələsi bir kəlamdır. Oxucuların xatirini şad və qəlblərini güşad etmək üçün və şairin xeyli zərif və baməzə vücud olduğunu bildirməkdən ötrü o qəsidəni burada dərc edirik.

Buğdaya xitab:

Ey edən Adəmi avareyi-cənnət, buğda!
Ey verən həzrəti-Həvvaye xəcalət, buğda!
Səni Adəm yedi cənnətdə, müsibət gördü,
Çəkdi Həvvayi-bəladidə nədamət, buğda!
Adəmi eylədi şeytan səninlə iğva,

---

* R u z i - ş ü m a r – hesab günü, qiyamət günü



Gəldi Həvvayə səninlə dəxi töhmət, buğda!
Baisi-məl'ənətü mə'siyəti-Adəmsən,
Kim ki, aldansa səninlə, ona lə'nət, buğda!
Yeməsəydi səni cənnətdə əgər kim, Adəm,
Qalacaqdı hamı firdovsdə rahət, buğda!
Bаği-firdovsidə axır olacaqdıq rahət,
Səndən oldu bizə bu rəncü məşəqqət, buğda!
Hansı xirməndəsən, ey daneyi-ənduhü bəla,
Hansı məskəndəsən, ey mayeyi-möhnət, buğda!
Bir tapaydım səni, daş ilə əzəydim başını,
Eyləyəydim səni un kimi xəsarət, buğda!
Bişirəydim səni təndirdə, edəydim büryan,
Doğruyaydım səni hər ləhzə, ey afət buğda!
Nə üçün mülki-Şəmaxidə tapılmazsan sən?
Ta edəydim sənə yüz gunə üqubət, buğda!
Tapmışam mənzilini mən sənin, ey töxmi-xəta,
Bilmişəm hardasan, ey daneyi-zəhmət, buğda!
Qaçmısan Mahmud ağanın yenə anbarına sən,
Etmisən onda nihan olmağı adət, buğda!
Yazıb ol kani-səxadən səni xahiş qıllam,
Səni ağa edəcəkdir mənə şəfqət, buğda!
Elə bildin ki, səni Seyyidi-nalan tapmaz.
Qalısan guşeyi-xəlvətdə fəraqət, buğda?

Mahmud ağaya xitab:

Sahiba, Mahmud ağa, lütfü mürüvvət dəmidir,
Eyləyib Seyyidi-miskinə xəyanət buğda.
İndi beş aydı ki, məndən qaçıb ol ruysiyah,
Qoyub avarə məni-zari o nikbət buğda.
Tutmuşam indi sorağın, sizin anbardadır,
Qorxuram ki, qaça ordan dəxi xəlvət buğda.
Babamız Adəmin ol qəlbiqara düşmənidir,
Eləyib həzrəti-Həvvayə ədavət buğda.
Qoyma anbarda qalsın, onu ixrac eylə,
Nə bilir nanü nəmək, rəsmi-məhəbbət buğda.
Ver mənə, un tək onu ta ki, dəyirmanda əzim,
Çox veribdir məni-biçarəyə xiffət buğda.
Sahiba, buğdanın əhvalın əgər şərh eləsəm,
Olar afaqda bir tul hekayət buğda.
Qərəz oldur ki, bu il həm dəxi bildirki kimi,
Edəsən Seyyidi-biyarə inayət buğda.
Bir tağarın ədədi qədri həq etsin ömrün,
O qədər Seyyidə olsun dəxi qismət buğda.

Bundan əlavə Hacı Seyid Əzim güzəranı təng keçməyə binaən, yenə bir xeyli qəsidələrində ərbabi-kərəm və sahibi-ehsandan bə'zi təmənnalar edibdir. Əzancümlə Həsən bəyə öz əhlü əyalının aclıqdan əfsürdəhal olmağını izhar edib, ondan yenə buğda tələb eləyibdir və ona ac uşaqlarının halını bu sayaq yazmışdır:

Evimiz bir, iki, üç həftə çörəksiz qaldı,
Gah bişirdik noxudu, gah yedik lobyani.

Qanını şişəyə tutdu fələk ol tifllərin
Ac qalıb qaçdı uşaqlar dodağından qani.

Gecələr nəql dedim körpə uşaqlaım üçün,
Nisyə sözdən nə yetər, çeynədilər yorğani.

Lakin Hacı Seydil Əzim nə qədər zillətü üsrət çəkibsə də, nanəcib adamların, xəbis və dənitəb' şəxslərin minnətini götürməyibdir və hər naəhlə öz əfsürdədil və pərişanhal olduğunu bəyan etməyibdir.

Şair nanəciblər nəzərində həmişə özünü ağayana saxlayıb, onlara qanad sallamayıbdır, necə ki, haman Həsən bəyə yazdığı qəsidənin axırında deyir:

Gərçi zahirdə fəqirəmsə, qənidir təb'im,
Bu gədalıqda pəsənd eyləmərəm sultani!

Mən ki, ənqa kimi bir qafi-qənaətdi yerim,
Neylirəm cifə, bu mülkü həşəmi-dünyani?

Kişi namərd ətəyin tutmayıb, ölmək xoşdur,
Çünki namərddə yox bəzlü ə'ta imkani.

Şair əhli-kərəm və sahibi-səxanın yer üzündə nadir tapılmasını öz dostlarından birisinə izhar qılıb halidilini ona bu gunə yazır:

Çox etdim dərhdə hər karə xidmət,
Gəhi xanə, gəhi tüccarə xidmət.
Birindən olmadı rəfi-məlalım,
Keçindi möhnətü üsrətdə halım.
Hər ol bir kimsə kim, əhli-səxadır,
O kəs simürğdür, ya kimyadır.
Tapılmaz mülki-imkanda vücudi,
Bərадər can, quru adın nə sudi?



Yetibdir qırxa indi sinnü salım,
Budur ancaq cahan içrə xəyalım –
Ki, ömrümdən əgər var isə baqi,
Həmişə yarım olsun camü saqi...

Mərhum Hacı Seyid Əzimin məktubati-mənzuməsi biri-birindən gözəl və biri-birindən mərğub və mövzundur. Onlardan ziyadə əhəmiyyətli olanların birisi də[112] qubalı "Nalan" təxəllüs şairə yazdığı həcvnüma naməsidir ki, burada onun bə'zi yerlərini yazmağı şairin şərhi-halına münasib gördük.

Mə'lum ola ki, "Əkinçi" qəzetinin 1876-cı ilinin 7-ci nömrəsində qəzetin ən basavad, xoştəhrir və məlumatlı mühərrirlərindən Əhsənül-Qəvaid[113] cənabları şüəra qisinin haqqında bir para şairə xoş gəlməyən və onun təb'inə dəyən iradü e'tirazlar bəyan etmişdir.

Əhsənül-Qəvaidin bu e'tirazları və şüəra silkini bir növ' təzmim etməsi Hacı Seyid Əzimə və onun müasiri olan Şamaxı şüərasından bir neçəsinə və Qarabağ şairlərinin bə'zilərinə bərk toxunmuşdur. Bu şairlərdən çoxları Əhsənül-Qəvaid cənablarını həcv etməyə talib olmuşdular. Onlardan mərhum Hacı Seyid Əzim inşa qıldığı həcvi "Əkinçi"nin müdiri mərhum Həsən bəy qəzetində dərc etməyi rəva görməmişdi. Bundan Hacı Seyid Əzim ziyadə mükəddər olub Əhsənül-Qəvaidin şüəra silkinə tutduğu iradların müqabilində dörd nəfər şair ilə müttəfiq ona "Rədiyyə" yazmışdı ki, haman "Rədiyyə" "Əkinçi"nin 8-ci[114] nömrəsində çap olunmuşdur. Məzkur "Rəddiyyə"ni burada yazmağı münasib gördük, ta ki, oxucular əsil mətləbdən hali olsunlar:

### CƏVABİ-ƏHSƏNÜL-QƏVAİD

Ey Əhsənül-Qəvaid ilə müləqqəb olub, şüəranın əş'ari-abdarında olan mühəssənatü lətafəti dərk etməyib, tə'nəvü tövbixi-zəban açan kimsənə! Mə'lum olur ki, dərki-məzamini-əş'ardə zövqi-səlimü təbi-müstəqiminiz yox isə ki, mədhü qədhi-şüəra pəsəndi-xatiriniz olmayıbdır. Görünür kim, şüəranın şərab mədhi və şahid vəsfi damağınıza dəyibdir.

Əziz, mə'zursunuz ki, o məzaq hələ sizlərdə büruzə gəlməyibdir: "Mən ləm yəzuq və ləm yə'rif"[115]. Cənab Şeyx Bəhai ki, müctəhidini-əzam cümləsindəndir, məşahid vəsfində və eşqbazlıq mədhində buyururlar:

### MƏSNƏVİ

Kullu mən ləm yəşiq əl-vəchəl-həsən,
Qərribəl-cullə ileyhi vər-rəsən.
Hər kera dər sər nəbaşəd eşqe-yar,

Bəhre-u palano əfsari biyar.
Hər ke nəbvəd mobtəlaye-xubruy,
Name-u əz louhe-ensani beşuy[116].

Və Əbuəli Sina ki, "Rəisül-üləma" ləqəbi ilə məşhurdur, şərab vəsfində buyurublar:

**NƏZM**

Ğəzaye-ruh bovəd badeye-rəhiqol-həq –
Ke, rəngo buş konəd rəngo buye-qolra dəq.*
Betəm təlk ço pənde-pedəro leyk mofid,
Benəzde-batel mobtəl, benəzde-dana həq[117].

Və yenə Şeyx Sə'di ki, ə'rəfül-ürəfadır, şahid vəsfində buyurublar:

An nə zolfəsto bənaguş ke, ruzəsto şəbəst,
Van nə balaye-sənubər ke, dərəxte-rotəb'əst**[118].

Və cənab Mövlana Xacə Hafiz ki, "Lisanül-qeyb" namilə hər bir lisanda məzkurdur, buyurublar:

Şeyxəm betənz qoft: həraməst, mey, məxor,
Qoftəm ke, çeşm, kuş behər xər nemikonəm[119].

Və cənab Əmirəl-mö'minin həzrət Əli əleyhissəlam bir nəfərin haqqında buyurublar:

Ləqəd rəbbəytü cərdən taulə dəhri,
Fələmmə sarə kəlbən əddə ricli.

Bəs, sizin fərmayişatınıza görə, bu büzürgvarlar ki, biri şərabı və biri şahidi vəsf ediblər, nəuzübillah, bunlar cümlə bimə'rifət və bikəmal kimsələrdir ki, nə üçün biri şərab və biri şahid vəsfin ediblər və xəlayiqi gümrah edib zəlalətə salırlar.

Əzizim, bəs, gərəkdir siz bu diqqəti və bu nüktəgirliyi xudavəndi-aləmə edəydiniz ki, o, şərab vəsfin və şahid vəsfin Qur'anda belə bəyan edibdir. Şərab vəsfində buyurublar: "Ənharün min xəmrin ləzzətin lişşaribinə"[120] və "əmarid və vildan" xüsusunda buyurublar: "Vildanün

* Dəq – pozmaq və qürub dağıtmaq mə'nasındadır[121]
** Rotəb' – tərü tazə, yaşıl mə'nasındadır[122]



müxəllədün"[123]. Ürfən müşahidə olunur ki, siz xəlayiqə xudavəndi-aləmin hər əmrü nəhyin icra etmişsiniz, ancaq şüəraya nəsihət etmək fəqərəsi qalıbdırmış ki, onu da iblağ ediniz.

Çox sağ olasınız! Allah-taala bu təbliğ əvəzində siz cənaba şərabi-təhurü huri-qüsur kəramət eləsin. Amin, ya müin!

Xatimeyi-kəlamda "əşşüəraü yəttəbiü hümül-ğavün"[124] ayəsinə iktifa etmişdir. Amma "illəlləzinə amənü"[125] istisnasın bilmərrə xatirinizdən məhvü fəramuş etmişdiniz. Bu əmr ona bənzər ki, "lailahə" ki, kəlmeyi-nəfydir, zikr edəsən və kəlmeyi-"illəllah" ki, isbatdır, zikr etməyib xamuş olasan. Ümidvarıq ki minbə'd belə cəsarətləri edib şüəranın həcv lisanların üzərinizə açmayasınız. Zira ki:

Ço şaer berencəd bequyəd heca,
Bemanəd heca ta qiyamət beca[126].
Vəssalamü ə'la mən ittəbə əl-hüda.

*Şüərayi-ərbəeyi-Şirvan"*

Şirvan şairlərinin bu kağızına "Əkinçi"nin 9-cu nömrəsində cənab Əhsənül-Qəvaid Hacı Seyid Əzimə xitabən cavab verib namənin axırında bunu qeyd edir: "Məni həcvi-şüəradan qorxutmuşdunuz. Mən ayinə kimiyəm, hər kəs məndə öz cəmalın görər və bir də kəlam şəxsin ətri və buyidir. Gülün ətri öz lətafətin və mütəəffin şey'in buyi öz xəbasətin zahir edir".

Əhsənül-Qəvaidin cavabı uzun olmağa görə, onun ancaq bu iradı ilə iktifa edib, mərhum Seyidin onun haqqında Nalana yazdığı naməyə müraciət edirik:

Yetir, ey namə, məndən ərzi-səlam,
Dərgəhi-yarə, halım et e'lam.
Söylə bülbüldən ol gülüstanə,
Yəni məndən cənabi-Nalanə.
Ərz qıl, ey güli-riyazi-ədəb,
Dürri-yektayi-bəhri-izzü şərəf,
Ey kəlam əhlinin sərəfrazi,
Təb'də kainat mümtazi,
Xidmətin baisi-kəmalımdır,
Səbəbi-dövlətü cəlalımdır.
Gərçi xidmətdə çox qüsurum var,
Lütfünə var ümidi-xatiri-zar.
Gərçi Şirvanda sən olan günlər
Əhd-peymanlar etdik, ey sərvər,

Etmədim leyk mən ol əhdə vəfa,
Mənə bu işdə eyb edər ürəfa.
Leyk var əldə üzr, mə'zurəm,
Mən qəzeyi-sipehrə mə'murəm.
Var ümidim kim, ol ə'ta kani
Bəndədən əfv edə bu nöqsani.
Xassə kim, çərx kinəbünyandır,
Xatirim dəhrdən pərişandır.
Xassə kim, Əhsənül-Qəvaidi-şum
Şe'r ətvarını bilib məzmum.
Xassə kim, ol müzəvviri-rubah
Şüəra silkini yazıb gümrah.
Zəmmi-əş'arə gör o heyvani
Gətiribdir dəlil Qur'ani.
Bavücudi ki sahibi-Qur'an,
Mustəfa, ol rəsuli-aləmiyan
Vəsf edib şairani-islami,
Xassə Həssani*-xoşsərəncami,
Bir deyən yoxdur, ey füsürdəzəmir,
Edən ayati əksinə təfsir,
Olmayan rasixi-kəlami-mübin,
Xəsmin olsun sənin imami-mübin!
Şairi zəmm edib əgərçi xuda,
Leyk vardır əqəbdə istisna.
Rəmzi-"illəlləzinə" kafidir,
"Əmilüs-salihat" şafidir.
Batil onlardı, ey səfeh kani –
Ki, edib həcv şahi-Bəthani.
Batil ol şəxslərdi kim, hamı
Həcv edərlərdi əhli-islamı.
Leyk onlar ki, gəldi islamə,
Çatdılar izzət ilə ikramə,
Etdilər vəsf şahi-əbrarı,
Qıldılar mədh ali-əthari.
Onların vəsfini rəsuli-xuda
Eyləyibdir hədis ilə ifşa.
Şüəranın lisanını ol şah
Söyləyibdir "kilidi-gəncüllah".
Şüəra vəsfinə yetər bu rümuz:
"İnnə lillahi təhtə ərşi künuz"[127].
Payeyi-şe'ri bundan eylə hesab,
Dedi: – "Əşşe'rü hikmətün"[128] o cənab,

---

* Həssan ibn Sabit Əbülvəlid ərəb şairlərinin məşhurundan və ə'yani-səhabədən olub mədhi-rəsul ilə kəsbi-şöhrət etmişdir. Həssan 120 sənə ömür edib, hicrətin 164-cü[129] tarixində vəfat etmişdir.



Dəxi bu müddəayədir bürhan,
Şə'ni-Əhməddə midhəti-Həssan.
Dəxi oldu Fərəzdəqi*-dana
Mədhi-Zeynülibadə nüktəsəra.
Sibti-Musadə qisseyi-Dibəl
Sənə kafi deyilmi, ey əhvəl**
Bavücudi ki, Dibəli-bədnam,
Şöhrəti var, içərdi badə müdam.
Ona xəz xirqəsin imami-Riza
Sileyi-şe'ri-bikrə etdi ə'ta.
Seyyid İsmail*** idi meyxarə,
Mədh yazmışdı ali-əthara.
Cəfəri-Sadiq, ol səxa kani,
Silədən etdi kamran ani.
Dedi şə'nində ol imami-hüda
Mərhəmətdən ki, "nimə nasirüna"[130].
Ey edən şe'ri zəmm naqabil,
Çox təəccübdü alimi-cahil.
Gərçi biz şairi-xoşətvarıq,
Madehi-əhli-beyti-əthariq,
Abi-kövsərdü badədən mənzur,
Sadədəndir murad hurü qüsur.
Bizə meyxanə bağî-rizvandır,
Saqimiz onda Şahi-mərdandır.
Zatımız eybdən mübərradır,
Şe'rimiz taci-fərqi-Şə'radır[131].
Bizdədir təbi-şe'ri-paki-hünər,
Sinəmiz bəhrü şe'rimiz gövhər.
Olma sərməsti-qəflət, [ol] huşyar,
Nə rəvadır məzəmməti-əş'ar!
Bavücudi ki, sərvəri-dövran[132]
Şe'rdən bağlayıbdı bir divan.
Şüəra olsa idi şey'i-kəsif,
Anı etməzdi övliya təsnif.
Ol nə şeydir cahanda, ey əhvəl –
Ki, ola şe'ri-pakdan əfzəl?
Gövhəri-paki-pürbəhadır söz,
Töhfeyi-dərgəhi-xudadır söz.
Zinəti-bəzmi-Mustəfadır söz,
Madehi-şahi-"həl'əta"dır söz.
Necə kim, ol Nizamiyi-ustad

---

* Fərəzdəq – ərəb şüərasının məşhurlarından olub, həzrət Əli əleyhissəlama və s. əshabi-kirama yetişmişdir və hicrətin 110-cü[133] tarixində Kufədə vəfat etmişdir.

** Əhvəl – çaş mə'nasındadır

*** Dibəl və Seyid İsmail – ali-əthar zamanında yaşayan şairlərdir

Şe'r vəsfində eyləyibdir dad:
"Soxən əz aseman forud aməd,
Soxən əz aləme-kəbud aməd,
Gər bodi gouhəri vərayi-soxən,
An forud amədi becayi-soxən"[134].
Guş qıl ərzi-hali-Mövlana,
Bircə bil şe'rdən nədir mə'na.
Şüəra gərçi vəsfi-badə edər,
Ya ki, tövsifi-şuxü sadə edər,
Qərəz oldur ki, vəcdi-hal olsun,
Xatirə nə'şeyi-kəmal olsun.
Haşəlillah ki, firqeyi-şüəra
Deyə meydir həlal, vaveyla!
Hansı şairdir ol pəlidxisal –
Ki, bilibdir şərabi-nabi həlal?
Hansı şairdi bilsin, ey qafil,
"İnnəməl-xəmrü"[135] ayəsin batil.
Bilmirəm Əhsənül-Qəvaidi-nas –
Ki, qurubdur qəvaid üçün əsas,
Niyə bər'əksinə qılıbdı xəyal,
Götürüb boynuna bu qədr vəbal?
Bənd olub zahiri-kəlamə neçün?
Düşməyibdir kişi nizamə neçün?
Üzrü vardır ki, əhli-zahir imiş,
Cəhl rəsmində xeyli mahir imiş.
Şe'r tə'vilin eyləyib inkar,
Eyləyir çox məzəmməti-əş'ar.
Niyə tə'vilə olmayır qail?
Ləfz tə'vilsiz olur batil.
Hər sözün zahirilə batini var,
Əhli-mə'na olurla bərxurdar.
Əksər ayat olmasa tə'vil.
Qalı mübhəmdə məniyi-tənzil.
Əyyühəl Əhsənül-Qəvaidi-zar,
Bu xəyalından eylə istiğfar!
Miləli-sairə olub vəssaf,
Eyləyirsən bu qədr kim, övsaf,
Əhli-Avropanın fərasətini,
Bəyənirsən tamami-adətini.
Əhli-islamə sərzənişdir işin,
Dönmüsən şahmarə, nişdir işin.
Ari, ari, cənabi-peyğəmbər
Bu hədisi veribdi xəlqə xəbər –
Ki, "gəlir bir zamani-tuli tə'vil,
Əhli-islam olurla xarü zəlil,
Tutar ol vəqt küfr dünyanı,



Xar edər çərx əhli-imanı.
Nə ki, cühhal, bəlkə alimlər
Dinimi, şərimi bəyənməzlər".
Səddəqə, səddəqə rəsulüllah,
Bu haman əsrdir, bil, ey gümrah!
Sən təki şəxslər arayə düşüb,
Xatirin özgə müddəayə düşüb.
İndi vardır məhəbbətin küfrə,
Sən də onlar kimi döşə süfrə.
Ey edən ayinə özünü xitab,
Nəm çəkib ayinəndəki simab.
Filhəqiqət ki, baxdım, ayinəsən,
Etdiyin fikri-bikrə səd əhsən!
Leyk mir'ati-kəcnümasənmiş,
Münkiri-surəti-səfasənmiş!
Ey özün ayinə sanan rüsva,
Bunu da bil ki, səngdir şüəra,
Ehtiyat eylə, ey günü qarə,
Ayinə səngdən olur parə.
Bilmirəm səndə bu nə halətdir,
Şüərayə bu nə ədavətdir?
Belə mə'lum olur ələzzahir –
Seyyida, bəsdi, tul oldu kəlam,
Xətm qıl, vəssəlam, vəlikram.

Əgərçi Hacı Seyid Əzimin bu həcvnüma kəlamında nalayiq föhşlər, çirkin və ürəkbulandırıcı söyüşlər yoxdur, vəli Əhsənül-Qəvaid kimi maarifpərvər və rövşənzəmir bir ədibi bu qədər müttəhim etmək və onun şə'ninə şayəstə olmayan "müzəvvir", "rubah" və "heyvan" kimi əlqab ilə onu müləqqəb etmək hərgiz Seyidə yaramazdı. Bavücudi ki, Əhsənül-Qəvaid cənabları şüəra haqqında və şe'r barəsində ürəyə dəyən və qəlbə toxunan artıq bir söz deməyibdir və bundan əlavə Əhsənül-Qəvaidə bunu eyib tutmaq olmaz ki, guya ol cənab miləli-xaricənin vəsfini edib və filcümlə Avropa əhlinin elmü fərasətini bəyənib, əhli-islama töhmət və sərzəniş edir, hər halda dürüst və səhih deyildir. Əhsənül-Qəvaid həqiqi müsəlmandır və müsəlmanların həqiqi xeyirxahıdır. O, müsəlmanların avamlığı və elmsizliyi ucundan cümlə mə'dəni tayfalardan geridə qalmağını görüb dadü fəryad edir. Onun ürəyi yanıb da, Avropa əhlini tə'rifü tövsif edib deyir ki: "Ey müsəlmanlar, sizin dininiz və Qur'anınız tərəqqi və təali etməyinizə mane olmadığı halda və peyğəmbəriniz sizi beşikdən ləhədə kimi elm tələb etməyə mə'mur qıldıqda bu nə tənbəllik, bu nə qəflət və bətalətdir ki, sizi alıbdır və cümlədən dalda qalıbsınız; ağa olduğunuz halda ikən indi qul və nökər olubsunuz. Utanın, ar edin, mədəniy-

yətli tayfalardan və mə'rifətli millətlərdən ibarət alın, tərəqqi və təməddün yolunda çalışın, ibrət edin, hünər göstərin!.."

Məgər Əhsənül-Qəvaidin bu sözləri haqq deyilmi? Məgər Avropa əhlini mədh etməkdən onun qərəzi bu deyilmi ki, müsəlmanlar da onlara baxıb, elmü mə'rifət kəsbinə qurşansınlar? Məgər Hacı Seyid Əzim özü müsəlmanları qəflətdən oyatmağa və onları elmü kəmal, hünərü mə'rifət kəsb etməyə az də'vət edibdir? Məgər mərhum öz həmməsləki və qələm yoldaşı olan Əhsənül-Qəvaidə bu e'tirazları yazdıqda öz nidalarını, öz naləvü fəryadlarını unutmuşdur?

Dad, fəryad, ey güruhi-izam,
Oldu zaye' bu milləti-islam.
Qeyrilər etdilər tərəqqiyi-tam.
Qaldı zillətdə firqeyi-islam...

Biz mərhum şairin Əhsənül-Qavidə etdiyi iradü e'tirazları özgə bir şeyə həml etməyib, məhz onun ziyadə tündməzac, naziktəb', müdrik olmasına isnad qılırıq.

mə'lumdur ki, həqiqi şairin təb'i ziyadə nazik və sözgötürməyən olur. Cüz'i bir şeydən şairin zəmiri-safı bulanır və ayineyi-qəlbi tutqun və mükəddər olur. Ən rəqiq bir işarədən şairin təb'i dəyişilir, bir haldan başqa bir hala düşür. Bir halda ki, Hacı Seyid Əzimdə şairlikdən masəva seyidlik qanı dəxi varmış və seyid nəsli bir növ' qeyzli və tündməzac olduğu beynən-nas məşhurdur, odur ki, Əhsənul-Qəvaid cənablarının şüəra silkinə bir cüz'i toxunması Seyid kimi səriüt-təb' şairin bəhri-təb'ini təməvvücə gətirmişdir və o da piş-pəsi çəndan mülahizə etməyib, qabağına gələni dalğaları altında boğub tələf edibdir.

Şair sinfi cümlə belə olur. Necə ki, mərhum Qasım bəy Zakir öz əhli-vilayətindən rəncidə olub demişdir:

Budu xahişləri kim, baxmayıb ağü bozuna,
Eləyim həcv tamam bayü gəda, sultani.

Mərhum Seyidin xoşxülq, xoşməzaq, həqiqətşünas və həqiqətbin və ürəfaməsləк bir ədibi-kamil və şairi-binəzir olmasına əş'arü kəlamının çoxusu şəhadət verir. Əgər onun kəlamlarını tamamən burada zikr etsək, çox uzun çəkər və kitabımızda onların hamısına, necə ki, sabiqdə demişdik, yer tapılmaz. Onlardan öz həmşəhrisi olan boyaqçı Əbdüləli nama yazdığı bir qəsideyi-qərranı burada zikr edirik və lakin onun da bə'zi yerlərini yazmaq münasib görülmədi. Qəsidə bu sayaq başlanır:



Gəldi novruz, müzəyyən elədi dövrani,
Gətirir bağə yenə sərvü gülü reyhani

Açılır bağdə gül arizi-dildar kimi,
Ucalır bülbülün əflakə yenə əfğani

Nərgisin camına lalə töküyür badə müdam,
Əlinə lalə alır ol qədəhi-mərcani.

Xani-vəslini açıb bülbülü mehman eylər,
Xoşdu mə'şuqəsinin aşiq ola mehmani.

Zahida, soməədən dışra çıxıb gəl bağə,
Bir təmaşa elə sən kargəhi-sübhani.

Sün'i-məşşateyi-qüdrət gülü eylər zinət,
Bax güli-əhmərə, ol hikmətinin heyrani.

Doldurub lalə meyi-jalə ilə sağərini,
Yəni mey şürbünə təklif qılır pünhani.

Afitab etdi həməldən* bu gün izhari-ziya –
Ki, ziyasından olub cümlə cahan nurani.

Dönəcək bülbüli-xoşləhcə nigəhbanə yenə,
Bəzmi-pərvərdə[136] səfalər verəcək əlhani.

Gələcək seyri-çəmən eyləməyə gülruxlar,
Görən onları behişt içrə görər hurani.

Ey xoş ol aşiqi-şeydayə ki, bu mövsümdə
Həmdəmi-cani-həzini ola öz canani.

Kim ki, cananı onun yoxdu belə mövsümdə,
Elə bilsin ki, onun cismdə yoxdur cani.

Ey xoş ol rindi-qədəhnuşə ki, vardır yarı,
Çəkməyir mən kimi hərgiz ələmi-hicrani.

Bu sifət mən də bu aləmdə zəlil olmaz idim,
Məndə olsaydı əgər malü mə'nal imkani.

Nə evim var, nə otağım, nə pulum, simü zərim,
Nə rübabım, nə kababım, nə meyi-rümmani**.

* Həməl – on iki bürcdən birinin adıdır ki, gün o bürcə mart ayının 9-da[137] daxil olur

** Rümman – nar. Meyi-rüman – yə'ni nar çiçəyinin rəngi kimi qırmızı olan mey

Bundan sonra şair öz yoxsulluğundan danışıb deyir ki, nə təmənna mənzuru ilə və hansı ümid ilə yar gəlib mənə yar olsun ki, acından onun dodaqlarının qanı qaçacaqdır və kisəmə əl vursa, onu simü zərdən xali görəcəkdir və belə olan surətdə şe'rü qəzəlimə dəxi bir həbbəcə qədir-qiymət verməyəcəkdir. Çünki tək şe'rü qəzəldən nə hasil olur? Əgər onun mişkin xəttinin vəsfində bir qəzəl desəm, nifrət edib, vəhşi qəzal kimi məndən qaçacaqdır. Əgər desəm ki, Seyidi-alinəsəbəm, xümsi ver, dəxi də artıcıq acığı tutub deyəcəkdir: hədyan söyləmə, xüms gərəkdir müctəhidi-əsrə çatsın, ta ki, o da həqiqi seyidlərə və müstəhəqqi olan adamlara onu təqsim eləsin. Sən kimi rindi-xərabatiyə xüms ancaq mol-tani verə bilər.

Sonra dedim: Ey sərvboylum, sən mənim gülümsən, mən də sənə bülbüləm. Dedi: Mən gül olsam da, hərgiz sən bülbül deyilsən, sən bay-quşsan. Get, bir viranə məkan tap və onda bayquş kimi ula. Bundan sonra dilbəri-siminbər dəxi də tündləşib Seyidi-biçarəyə çox acı sözlər deyib, onu bihörmət edir və deyir ki, sən nahaq adını Seyid qoyubsan. Sən tərki-sövmü səlat edib uymusan bütlərə və şürbi-şərab ilə övqatını qəflətdə keçirirsən.

Mühəssəli-kəlamda deyir:

Sənə Seyyid desəm, aləmdə dilim lal olsun!
Etmisən tərk bu gün məzhəb ilə ərkani.

Seyid bu xitab-itabdan sonra dilbəri-nazikbədəndən cavaba izn alıb, atını fəsahət meydanına sürür. Şayani-diqqət olan Seyidin cavabıdır:

Dedim: – Ey şahi-bütan, sürmə bu gunə tövsən,
Sakit ol, hər nə dedin, ver mənə bir meydani.

Ta sənə şərh qılım surəti-əhvalımı mən,
Guş qıl huş ilə ərzi-məni-sərgərdani.

Həq təcəllasını hər yerdə görər əhli-nəzər,
Eyş edər zövq ilə, bir haldır ol sübhani.

Büt özü hal ilə təsbih qılır sübhanə,
Get, oxu "səbbəhə lillah"də[138] bu mə'nani.

Kimisi Kə'bədə həqqi, kimi deyr içrə görər,
Hərə bir növ' gəzir, axtarır ol canani.

Gördü çün pərtövünü düxtəri-tərsadə əyan,
Nə məzəmmət eləyim eşqdə mən Sən'ani.



Dağə Fərhad çalıb tişəni şirin-şirin,
Gördü Şirində həq nurini, verdi cani.

Gördü Məcnun əsəri-xaliqini Leyladə,
Düşdü vadilərə, mənzil elədi səhrani.

Gördüm əksi-ruxini ayineyi-camdə mən,
Vacib etdim özümə şürbi-meyi-səhbani.

Bu sifətdə, gözəlim, şəhrdə bir mən deyiləm,
Çoxdu mən tək bu yolun[139] aşiqi-sərgərdani.

Bu şe'rlərdə şairin həqiqət[pərəst], ürəfaməslək və mə'nəvi bir vücud olduğu zahir olunur:

Kimisi Kə'bədə həqqi, kimi deyr içrə görür,
Hərə bir növ' gəzir, axtarır ol canani.

Nə gözəl kəlam, nə dərin əqidə, nə ali fikir, nə pakizə məram və nə müqəddəs niyyət!.. Seyidin bu şe'ri Xacə Hafiz Şirazinin:

Miyane-Kəbevo botxane hiç fərqi nist,
Behər tərəf ke, negəh mikoni bərabəre-ust – [140].

– şe'rinə bərabər deyilmi və türk oğlanlarına Seyidin sözləri daha da artıcıq xoş gəlməzmi?!

Alişan Ağa bəy Sultanzadənin hüzuruna zarafatyana yazdığı qit'ədir:

Sahiba, ey ki, sənin xidmətinə şamü səhər
Məhü xurşidi-fələk əymək üçün baş gəlir.
Bəs ki, yox Çinü Xütən təb'inə həngami-səxa,
Surəti-cudini nəqş etməyə nəqqaş gəlir.
Açmısan dəhrdə Hatəm kimi bir xani-əta,
Ol ə'ta süfrəsinə hər quru, hər yaş gəlir.
Çünki hər taifəyə feyz verirsən gün tək,
Dəri-ehsanına hər sünni, qızılbaş gəlir.
Süfreyi-ruzədə var firnivü dolmavü tərək,
Əsəlü rövğənü nan gülçəvü bozbaş gəlir.
Gündüzün süfrəsi bunlar idi kim, zikr oldu,
Gecələr də otağa bir neçə qab aş gəlir.
Heyf ola ol düyündən, heyf ola ol ətdən kim.
Rövğənindən o aşın nikhəti-kəffaş gəlir.
Gər o yağın düşə bir qətrəsi qəbristanə,

Ölünü soymağa nə düzd, nə nəbbaş gəlir.
O qədər tünd olubdur ki, dönüb zəqqumə,
Buyi-ğisliyn o yağdan, nə nihan, faş gəlir.
Pişxidmət ki, gəlir – yu əlini, aş gəlir,
Mən belə fikr edirəm ki, başıma daş gəlir.
Məni ki, ağlada bilməz neçə yüz mərsiyəxan,
İyi gəlcək o yağın gözlərimə yaş gəlir.
Nə qədər nazirə ərz eyləyirəm əhvali,
O da söz anlamayır, sözləri çaş-baş gəlir,
Tövbə olsun ki, dəxi bir də yeyim öylə aşı,
Məni öldürməyə gər bir neçə fərraş gəlir.
Çarə qıl Seyyidə kim, çakəri-dərgahındır,
Gərçi səndən ləqəbim ləfz ilə "qardaş" gəlir.

Seyyid həqiqi şair olduğu üçün hər bir şey'in tamami sifətlərini yazmaqda bir qüsur qoymamışdır. Burada Ağa bəyə sataşmaq üçün onun bir az köhnəlik acımış yağına o qədər rəngü rövğən vurub, elə bir şairanə onu nəzmə çəkmişdir, daha onun zəmmində başqa bir söz qalmamışdır ki, onu deməmiş olsun. Bir yağda nə qədər nikhət və acılıq gərək olsun ki, mərsiyəxan ağlada bilmədiyi gözlərdən yaş tökdürsün? Bir yağda nə dərəcədə üfunət və mərarət gərək olsun ki, onun bir damcısı qəbiristana düşsə, ölü kəfəni soyan oğru dəxi qəbiristana ayaq basa bilməsin?

Bəli... Güşadədəhən və rəvantəb' şair ağıla gəlməyən şey'i yarada bilir və çirkini də gözəl və müstəhsən tərzdə sözlər vasitəsilə göstərir.

Ağa bəy Sultanzadəyə yazdığı bu zərifanə qit'ə ilə Seyidi-mərhumun əhibbaya və sair kərəmü ehsan sahiblərinə inşad qıldığı məktubatı qurtarıb, onun başqa qisim əsərlərinə keçib, onlardan dəxi müxtəsər nümunələr göstərməyi lazım bildik.

## ŞE'Rİ-MÜSTƏZAD

Aşağıda zikr olunan şe'ri-müstəzadı Hacı Seyid Əzim qürbətdə olduğu halda "Beytüs-Səfa" məclisinin üzvlərinə ki, şairin dost və əhibbaları imiş, əczü inkisar ilə yazıbdır. Şair öz məktubuna xitab edib deyir: Ey namə, ol məclisə kim, ruhül-əmin rüsxətsiz daxil ola bilməz, sən izn almağa bəhanə axtar, torpağa düş və əhli-məclisin əl-ayağın öp, ta ki, sənə daxil olmağa izn versinlər.

Daxil olduqda mənim qürbətdə çəkdiyim zilləti və halidilimi şam kimi şö'lə çəkib bir-bir onlara söylə.

Yaxşısı budur ki, şairi-məhcurun öz lisanilə əhvalı bəyan edək:



Şirvanə səni eylərəm, ey namə, rəvanə,
Dön abi-rəvanə.
Çək şö'lə, tutub bəzmi-əhibbadə zəbanə,
Gəldikdə zəbanə.
Ol məclisə kim, ruhül-əmin almasa rüsxət,
Yox girməyə cür'ət,
Torpağə düşüb əczlə üz qoy o məkanə,
Tap izni-bəhanə.
Zöv'inin ayağından öpüb kəsbi-ziya qıl,
İzhari-səna qıl,
Əhvalımı çək Bixudə rəmz ilə bəyanə,
Şərh eylə fəsanə.
Ol vəqt ki, halım elədin Qafilə izhar,
Bir gizli sözüm var,
Əhbabdə məhrəm odu bu sirri-nihanə,
Kəşf etmişəm anə.
Ol zülfi-pərişanıma ərz eylə səlamım,
Çək əzc ilə namım,
Sərbəstə deyim, yə'ni filan ibni-filanə,
Ol cani-cəhanə.
Ol qaşı kəman, kipriyi ox yarımı görsən,
Dildarımı görsən,
Təqriblə söz aç, məni ol qaşı kəmanə
Ver böylə nişanə –
Kim, sən büti-Leylayə giriftar olan aşiq,
Bimar olan aşiq,
Məcnunə dönüb, aləm ara oldu fəsanə,
Məğlubi-zəmanə.
Şəm'ə dolanıb yad edir ol arizi-alı,
Pərvanə misalı,
İstər səni hər ləhzə, gəzər xanəbəxanə,
Ey dürri-yeganə.
Ey dustlər, ol şux ilə içdikdə şərabı,
Cami-meyi-nabı,
Bir yadə salırsız məni-divanəni, ya nə?
Qaldım yana-yanə.
Siz rahət ilə ləzzət edin Beyti-Səfadə,
Seyyid bu bəladə,
Döndü cigərim firqətinizdən dəxi qanə,
Yox təndə təvanə.

Qəzəliyyati-Seyid:

Vaiz meyin məzəmmətin eylər savab üçün,
Dildə bəhanədir sözü zikri-şərab üçün.

Saqi, gözün fədası olum, cami-mey gətir,
Yandırma odlara məni bir cür'ə ab üçün.

Derlər ki, badədən açılır babi-mə'rifət,
Biz dəxi bir əyaq içəlim fəthi-bab üçün.

Sərf oldu qəsdi sübheyi-övradə ömrümüz,
İndi gərəkdi sərf ola çəngü rübab üçün.

Zahid şərabı kövsər üçün tərk edərsə, mən
Fövt etmərəm bu nəqdi o nisyə hesab üçün.

Olsun cahanda guşeyi-meyxanələr bizim,
Qalsın behişt zahidi-alicənab üçün.

Seyyid, yəqin ki, rəhməti-həqdəndi bixəbər
Ol kim, şərabı tərk edə bimi-əzab üçün.

* * *

Gülşənlər içrə gər açıla səd həzar gül,
Sənsiz, gülüm, gəlir gözümə nişi-xar gül.

Sənsiz, təsəvvür etmə, gedim seyri-bağə mən,
Səhni-çəməndə gər açıla səd həzar gül.

Döndərdi bülbülün ürəyin qanə, aqibət
Öz tutduğu işindən olur şərmsar gül.

Gər kəsməyəydi bülbüli-zarın qərarını,
Olmazdı aqibət özü həm biqərar gül.

Aşiq çəkərdi gülşənə müjgan ilə həsar,
Gər göstərəydi bülbülə bir e'tibar gül.

Gör zülm payəsin ki, şəhi-müstəqil ikən,
Təxtindən oldu beş gün içində kənar gül.

Bir gül'üzar torpağıdır kim, nümüvv edər
Hər xakdən ki, çöhrə qılır aşikar gül.

Zülfü ruxin xəyalı ilə zövqlər edər,
Həmdəm ol eydi Seyyidə leylü nəhar gül.

* * *

Nişimənin ki, sənin buriyadır, ey vaiz!
Qəsəm o xaliqə kim, bu, riyadır, ey vaiz!



Xəlayiqi əməli-xeyrə də'vətin xoşdur,
Özündə yox bir əməl, bu, xətadır, ey vaiz!

Edib cəhənnəmi övsaf, hərdəm ağlarsan,
Bu nə fəsanə, bu nə macəradır, ey vaiz!

Yetim malına göz tikməyin nədir daim,
Halal kəsb məgər narəvadır, ey vaiz?

Yoxundu Kəbeyi-ruxsari-yardən xəbərin,
Bu vəchdəndi sözün bisəfadır, ey vaiz!

Ümidvarsən öz tutduğun əməllərə sən,
Bizim ümidimiz əfvi-xudadır, ey vaiz!

Mey içməyin qıla Seyyid əgər nihan səndən.
Sənin təki o da əhli-riyadır, ey vaiz!

* * *

Derlər ki, içmə badəni ümmül-fəsaddır,
Ari, fəsaddır ona kim, bədnihaddır.

Hər kəsdə hər təbiət ola mey büruz edər,
Ərbabi-halə hal, fəsadə fəsaddır.

Piri-müğan edibdi bizə badəni həlal,
Qurban bu ictihadə, əcəb ictihaddır.

Bir şişə mey qoyun ləhədim içrə dəfn edin –
Kim, bu cahandan mənə zadül-məaddır.

Həqdən şərabxarı o kim, naümid edər,
Seyyid o da sənin kimi bəde'tiqaddır.

Şair özünün şə'nində demişdir:

Gərçi hamıdan səfheyi-dünyadə kəməm mən,
Hər vəqt ki, camım ola dəstimdə, Cəm'əm mən.

Zahid, ramazanda mənə bu tövbəni verdin,
Get, başın üçün, tövbədə sabitqədəməm mən.

Dünyanı tutub təntəneyi-fəzlü kəmalım,
Aləmləri təsxir qılan möhtəşəməm mən.

Yarani-səfa ma'ideyi-təb'imə möhtac,
İxvaneyi-Yusifdə vəliyyün-niəməm mən.

Əmvati-məani olur ehya nəfəsimdən –
Kim, aləm ara Seyyidi-e'cazdəməm mən.

Füzuli Bağdadiyə nəzirə:[141]

Könül, ta var əlində cami-mey sübhəşümar olma,
Riyayi-xəlqdir, billah, namaz əhlinə yar olma.

Eşit sövti-müğənni, sakin ol meyxanə küncündə,
Müəzzin naləsindən məscid üçün biqərar olma.

Qurub təhtül-hənəkdən dam zahid, sübhədən damə,
Həzər, ey mürği-dil, ol danəvü damə şikar olma.

İmamə ixtiyarın vermə, hərgiz uyma təkbirə,
Özün kim, faili-muxtarsən, biixtiyar olma.

Döşənmə buriya tək məscid içrə səcdeyi-səhvə,
Özü bu səhvdir, pamali-xəlqi-ruzigar olma.

Cəhənnəm fikrini salma xəyalə, düşmə təşvişə,
Yanıb nari-qəmə duzəx odundan əşkbar olma.

Könül, meyxanə cənnət, badə kövsər, saqidir qılman,
Gedib vaiz deyən nisyə sözə ümmidvar olma.

Rümuzi-şe'rimin dərk etməmiş mə'nasını, Seyyid,
Gedib meyxanələrdə laübali meyküsar olma.

Zənni-acizanəmizcə ərbabi-hal və sahibi-mə'rifətü kamal nəzərində Seyidin bu qəzəlləri Füzulinin kəlamına gərək bərabər tutulsun. Əgərçi bu qəzəllərdə əksəriyyətən şərabü rübabdan bəhs olunur və zahidi-riyakara şair hərdəm dolaşıb, onun zahiri taatü ibadatına qədrü qiymət vermir və künci-meyxanəni alicənab vaizin behiştinə, badeyi-nabı kövsərinə və saqiyi-sadəni qılmanına tərcih tutur və lakin kim nə bilir meyxanədən, şərabü saqidən murad kimdir və nədir? Əgər türklərin də Seyid Məhəmməd Vəhabisi[142] olsaydı, əsil mə'nanı şərhü bəyan edərdi və zahirbin oxucuların ürəyindən şəkkü şübhə düyününü açardı.

Şair özü axiri-kəlamda oxucuları sui-zənndə olmaqdan və batil xəyala düşməkdən daşındırıb deyir:



Rümuzi-şe'rimin dərk etməmiş mə'nasını, Seyyid,
Gedib meyxanələrdə laübali meyküsar olma.

Şərt rümuzi-şe'ri və ruhi-mə'nanı dərk etməkdir. Seyid bu qisim kəlamlarında Azərbaycan türklərinin Xacə Hafizi mənziləsində ola bilər.

Farslar öz şairlərinin kəlamı ilə fəxr etdiyi kimi, biz də Seyidimizin əş'ari-abdarı ilə iftixar edə bilərik.

Tərcibənd (*İbrahim Həqqiyə*[143] *nəzirə*):

Xoş ol zaman ki, yar mənə həmzəban idi,
Bizmim cəmali-yar ilə rəşgi-cinan idi,
Dövlət qulamdı mənə, bəxtim cəvan idi,
Sultan idim ki, hər yanə hökmüm rəvan idi,
Canı-həzinə həmdəm o arami-can idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Xurşidgun şərabla dolmuş idi canımız,
Ol mah ilə keçirdi bizim sübhü şamımız,
Dövri-fələkdə hasil olurdu məramımız,
Xaki-dərindən özgə yox idi məqamımız,
Bülbüllərə o səhəti-qüds aşiyan idi,
Dəmlər o dəmlər idi, zaman ol idi.

Hicrin əgərçi görmüş idim mübtəlaləri,
Dildən-dilə eşitmiş idim macəraləri,
Bunca təsəvvür etməz idim mən cəfaləri,
Can çəkməmişdi möhnəti-hicran bəlaləri,
Xəlvətsərayi-vəsldə dil kamran idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Könlüm o mahdan açılırdı kərəm görüb,
Bəzmi-vüsaldə yerimi möhtərəm görüb,
Mehrin ziyadə, cövrü cəfasını kəm görüb,
Ol gül mənə açıldığını dəmbədəm görüb,
Rəşk ilə qönçə tək dili-bədxah qan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Ol gül mənimlə həmdəm idi hər baharda,
Gəh daməni-çəməndə, gəhi lalezarda,
Bülbül təki işim yox idi ahü zarda,
Seyyid də məskən etmiş idi kuyi-yarda,
Ezaz ilə bir Adəmi-cənnətməkan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Başqa bir tərcibənd; girizgah növündən:

Ey qəmin bu dili-məhzunə səfa,
Kəbeyi-kuyinə eşq əhli-fəda,
Hər qədər eyləyəsən cövrü cəfa,
Mən sənə eyləmərəm qeyri-vəfa,
Hər nə hökm eylədin, ey mahliqa,
Cümləsi oldu muradınca rəva,
Görəlim şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!

Sərvərim, padşahım, sultanım,
Gülruxum, sərvqədim, reyhanım,
Ey fərəhbəxşi-dili-suzanım,
Bilmədim noldu mənim nöqsanım,
Döndü, ey mah, belə dövranım,
Yan – dedin, hicr ilə yandı canım,
Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!

Söylədin: eşq ilə zar ol, oldum,
Hicr ilə sinəfikar ol, oldum,
Nəzəri-xəlqdə xar ol, oldum,
Qəmü ənduhə düçar ol, oldum,
Zarü kisəbrü qərar ol, oldum.
Dedin əğyar ilə yar ol, oldum.
Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!

Ta gözüm hicr ilə giryan oldu,
Xatirin gül kimi xəndan oldu,
Döndü, vəslin mənə hicran oldu,
İstədin dil ola viran, oldu,
Gənci-eşqin ola pünhan, oldu,
Dedin: – Olsun çigərin qan, oldu,
Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!

Gündə bir şö'bədə ağaz etdin.
Çox olan lütfü bizə az etdin,
Üz verib qeyri sərəfraz etdin,
Bizi qoydun, anı mümtaz etdin,
Hökmü fərmanını ibraz etdin,
Məni hər nakəsə dəmsaz etdin,
Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!



Ey səri'-zülfünə qurban Seyyid,
Oldu divaneyi-dövran Seyyid,
Olub əhvalı pərişan Seyyid –
Ki, qalıb bisərü saman Seyyid,
Ağlayır hicrin ilə qan Seyyid,
Oldu torpaq ilə yeksan Seyyid,
Gözəlim, şimdi nədir fərmanın?
Canı qurban sənə bu nalanın!

Bu əş'ari-abdarü xoşgüvar ilə şairi-fəsahətşüar və şirin-gövtarımız olan Seyid Şirvanının tərcümeyi-halını nümuneyi-kəlamı ilə xətm qıldıq. İnşaallah əcəldən macal olsa, Seyidi-mərhumun barəsində məxsusi bir kitabça tərtib etmək niyyətində varıq.

# ƏLİƏKBƏR NAMAZ OĞLU "QAFİL"

Mərhum Hacı Seyid Əzim Şirvani müasirlərindən və "Beytüs-Səfa" məclisinin üzvlərindən birisi də mərhum Əliəkbər Namaz oğlu "Qafil" təxəllüsdür.

Qafil təvəllüd edibdir şəhri-Şamaxıda tarixi-hicriyyənin 1244-cü sənəsində cəmadiyül-əvvəlin 27-ci günündə[144]. Qafil sinndə Hacı Seyid Əzimdən böyük imiş. Şamaxıda müsəlman məktəbindən başqa bir yerdə təhsil etməyibdir.

Mərhum Qafilin çəndan rəvan təb'i yox imişsə də, amma özü ürəfaməslək və şe'rşünas və qayətdə fəsih bir vücud imiş. Müasirləri arasında təvazö, xoş rəftar və xoş təbiətilə iştihar bulmuşdu.

Sən'əti tərrahlıq olub həmişə Şamaxıda sükunət edərmiş və ürəfa məclisinə ziynət verərmiş. Vəfat edibdir Şamaxıda hicrətin 1309-cu ilində ramazanül-mübarəkin 25-də[145].

Əşarından nümunə üçün bir qəzəli burada dərc olundu:

Mənə ol dilbəri-ahunigəh müddətdi ram olmaz,
Nə bir vəsli mənə məqdur, nə də ömrüm təmam olmaz.

Könül, ol dilbəri-xudkamdan keç kamə yetməkdən,
Neçün nakamlıqdın yaxşı heç aləmdə kam olmaz.

Həbibim, Kəbeyi-kuyində sərgərdan olan aşiq
Dolanıb başına, qurbanın olsa, biməqam olmaz.

Könül, olsa müyəssər vəsli-dilbər, nəqli-candan keç –
Ki, bazari-məhəbbətdə bu sövdalər müdam olmaz.

Həram olmuş əgər qan tökmək, ey məh, leyk üşşaqın,
Gözün qurbanı, tök qanın, halalındır, haram olmaz.

Ola hər mülki-dil kim, ləşgəri-qəmzən güzərgahi,
Düşər rövnəqdən, əsla onda qanunü nizam olmaz.

Verib canana can, Qafil, gəl indi sən də bir ad et –
Ki, əhli-eşq namidən səva aləmdə nam olmaz.



# QAFAR HACI MƏHƏMMƏD ZAYİD OĞLU "RAĞİB"

Bu cənab həmçinin "Beytüs-Səfa"nın xoşbatin, xoşxülq, müəddəb, bakəmal, səlimü samit üzvlərindən birisi olub, həməsrləri arasında gözəl nam və hörmət kəsb etmişdir.

Rağib təvəllüd edibdir Şamaxıda 1234-də məhərrəmül-həram ayının 2-sində,[146] vəfat edibdir haman tarixin 1309-cu sənəsində rəbiül-axirin 27-ci yövmündə[147]. Tə'limü tərbiyəsi Şamaxıda olubdur. təb'i-şe'riyyəsi zərif imişsə də, çəndan səri' deyilmiş. Özündən sonra qalan əş'arü qəzəliyyatı Şamaxının axırıncı zəlzələsində tələf olmuşdur.

Qəzəli-Rağib:

Mənim ruhumdu bir dilbər, vəli cismimə ram olmaz,
Əcəb kim, ruhsuz cism ilə ömrüm həm tamam olmaz.

Yıxar könlüm evin bir məhliqa, qafildir ondan kim,
Mənim könlüm yıxan dünya evində şadkam olmaz.

Görüb rüxsarı üzrə zülfünü bildim qələtdir bu –
Ki, duzəx əhlinə derlərsə gər cənnət məqam olmaz.

Edər sultani-hüsnün çox siyasət, qorxum oldur kim,
Belə sultani-zalim hiç mülk içrə müdam olmaz.

Əgər kuyin bilə müfti behişti-ədndir, billah,
Verir fitva ki, onda badeyi-gülgun həram olmaz.

Könül mülkün müsəxxər eyləyib sultani-eşq, amma
Bu mülk içrə dəxi mundan sora hərgiz nizam olmaz.

Məlamət eyləyən, Rağib, məni şərm eyləməz, bilməz
Təriqi-eşqdə bu rəsmdir kim, nəngü nam olmaz.

## AĞABABA MƏŞHƏDİ ABDULLA OĞLU "ZÜHURİ"

Mərhum Zühuri həmçinin "Beytüs-Səfa" calislərindən ziyadə üftadə və batəvazö bir şəxs imiş. Təvəllüd edibdir hicrətin 1265-də səfər ayının 11-ci günündə[148]. Tə'lim alıbdır Şamaxı məktəbində. Türk lisanından masəva fars dilini və farsların ədəbiyyatını kamil bilirmiş. Sən'əti müdərrislik olubdur. təb'i-şe'riyyəsi səri' isə də, çəndan mövzun deyildir.

Mərhum Zühuri hicrətin 1310-cu[149] ilində Şamaxıdan köçüb Badkubə şəhərinə və orada iki ilə qədər məktəbdarlıq edib, bə'dən vəfat etmişdir. Özündən sonra bir divani-qəzəliyyatı və qəsaidi qalmışdır və lakin o divan ələ düşmədi.

Əşarından nümunə üçün Qarabağ şüərasının nəzəri-tənqidinə göndərilmiş qəzəli burada yazılır:

Nə vəhşi könlüm ol ahunigəhdən qeyrə ram olmaz,
Nə anın hicrinin nöqsan olan ayı tamam olmaz.

Muradım can fəda qılmaqdı yetcək vəsli-canana,
Əgər hasil ola, eşq aləmində böylə kam olmaz.

Səfayi-vəslə yetdin, eyləyib çox sə'ylər, ey dil,
Bəyan et birbəbir hicran qəmin, böylə məqam olmaz.

Vüsali-yarə yetdin, bir əyağ tut, badə qıl hazir,
Dur, ey saqi, başınçün böylə dəm hərgiz müdam olmaz.

Bu bəzmi-vəsl cənnət, saqisi qılmani-tubaqəd,
Məni mən' etmə, zahid, mey behişt içrə həram olmaz.

Gözün mən' etməyə mülki-ruxindən ləşkəri-xətti
Edib müjganların səf-səf ki, də'va binizam olmaz.

Gədalıq rəsmini tut kim, dəri-canana yetməkçün,
Zühuri, nəng qılma, aşiq üçün nəngü nam olmaz.



## MƏHƏMMƏD MƏŞHƏDİ HÜSEYN OĞLU "SƏFA"

Mərhum Səfa təvəllüd edibdir Şamaxı şəhərində hicrətin 1268-ci sənəsində şəvval ayının ibtidasında[150]. Tə'lim alıbdır Şamaxıda müsəlman məktəbində. Sən'əti bəzzazlıq olubdur. təb'i-şe'riyyəsi dəxi var imiş. Mütəfərriq kəlamları olubsa da, özündən sonra tələf olubdur. Artıq bir əsəri qalmamışdır.

Mə'lum ola ki, bu haman Səfadır ki, Şamaxı şüərası onun adına bir mənzil bina edib "Beytüs-Səfa" adı ilə onu təsmim qılmışdı. Şüəra və ürəfa oraya cəm' olub, şe'rü qəzəl deməklə və ruhani söhbətlə sərfi-övqat edərlərmiş.

Səfa özü qayətdə gözəl, nazənin və qəyur bir oğlanmış. Ona "Qara" ləqəbi qoyulmuşdu, necə ki, əfsəhi-şüəra Hacı Seyid Əzim əksəri-kəlamında ona nisbətən imavü işarələr yazıbdır. O cümlədən:

Qadan alım, ay qaragöz, sənə bu ə'da neçündür?
Nə üzüqaralıq etdim, mənə bu cəfa neçündür?

Yanağındı lalə nisbət, dodağın əqiq manənd,
Bədənin səfidi-safi, bəs adın Qara neçündür?

Mənə ad Qara gərəkdir ki, mənim günümdü qara,
Bu adı, vəfalı dilbər, de görüm sana neçündür?

Və dəxi Seyidi-mərhum bir qəzəlində Səfanın haqqında deyibdir:

Sənsən bu əsrin, ey büti-ziba, Məhəmmədi,
Seyyid həm astanına kəmtər Bilaldır[151]

Və lakin bu biçarə Səfanın xasiyyəti tünd və təb'i çəndan mülayim deyilmiş. Şamaxı əhlindən bir nəfər Hüseyn nam ilə sözləşib, aralarında münaziə vüqua gəlmişdi. Bu Hüseyn nam gecə vaxtı onların darvazasına gəlib Məhəmmədi evdən eşiyə çağırıb qətlə yetirmişdir. Bu faciə hicrətin 1293-cü sənəsi məhərrəmül-həramın 3-cü günündə[152] olmuşdu və Hacı Seyid Əzim əziz dostunun qətlindən ziyadə mütəssir olub demişdi:

Səfa bərəft dekər came'-eşrətəm beşkəst,
Məgər bəraye-mən, ey pi, bəd doa kərdi?![153]

Qəzəli-Səfa:

Bu ahugözlülər aləmdə hər səyyadə ram olmaz,
Və gər xud olsa da, kami-dili-aşiq tamam olmaz.

Bu nə kam istəməkdir yardən hər ləhzə, ey aşiq,
Məhəbbət əhlinə nakamlıqdan qeyri kam olmaz.

Səfayi-kuyini hasil qılıb sə'y ilə qurban ol,
Minayi-eşqdə üşşaq üçün böylə məqam olmaz.

Bu gün ki, ol məhi-namehriban vəslilə xürrəmsən,
Dolan başına, qurban ol ki, bu fürsət müdam olmaz.

Sən ey piri-müğan, mey sağərin gərçi halal etdin,
Məgər kim, yarsız eşq əhlinə sağər haram olmaz?!

Siyasət eyləsə məhrulər,[154] incinmin, müşəxxəsdir,
Siyasət olmayınca eşq mülkündə nizam olmaz.

Edər mə'şuqi rüsva, tə'nədən ar etməsə aşiq,
Əbəsdir, ey Səfa kim, əhli-eşqə nəngü nam olmaz.



## MOLLA MƏHƏMMƏD "ZÖV'İ"

Şamaxının hali-həyatda olan şüərasından Molla Məhəmməd "Zöv'i" təxəllüs mərhum Hacı Seyid Əzimlə müasir olubdur[155]. Zöv'inin xatiri Seyidin yanında əziz olmağı onun öz kəlamından anlaşılır. Necə ki, şair özünün bir naməsinə xitabən deyir:

Zöv'inin ayağından öpüb kəsbi-ziya qıl,
İzhari-səna qıl...

Molla Məhəmməd cənabları Muğanda – Nəbatinin vətənində – Xanlıq kəndində məktəbdarlıq edir. Əşarından nümunə olaraq bir neçə qəzəlləri burada yazılır:

Cəzbə nədəndi hüsni-dilaradə bilmədim,
Nəş'ə nədəndi badeyi-həmradə bilmədim.

Xaliq deyil ki, bir şeyə möhtac xəlqdən,
Nə rəmz var bu xilqəti-əşyadə bilmədim.

Bimə'rifət qənidi, fəqir əhli-mə'rifət,
Fəqü qina nədəndi bu dünyadə bilmədim.

Xab içrə hər nə görsə, yəqindir oyanmamış,
Nə sir var bu aləmi-rö'yadə bilmədim.

Nə gəldiyim məqamımı, nə getdiyim yerim,
Gəlmək bu getməyə nə var ortadə bilmədim.

Ağzında söz deyib danışan şəxsi qanmadım,
Kimdir baxan bu dideyi-bünyadə, bilmədim.

Can özgə, cism özgədi ya müttəhiddilər,
Can hansı cüzvdür tənü ə'zadə bilmədim.

Göz görməyən cavahiri mən necə dərk edim,
Zahirdə çün nə var bu mərayada bilmədim.

Öz kəsbidirmi, Zöv'i, cahan içrə nikü bəd,
Ya həq veribdi aləmi-mə'nada bilmədim[156].

Əyzən qəzəli-Zöv'i:

Xoş ol ki, meykədədə aşiyanəmiz vardı,[157]
Müdam qülqüli-meydən təranəmiz vardı.

Edəndə məsciddə də'vət bizi müəzzinlər,
Sualı rəddinə yüz min bəhanəmiz vardı.

Xərabə mülki zürufü füruş əbavü qəba,
Şərabə sərf elədik hər təvanəmiz vardı.

Əgərçi olmuşuq indi əsiri-qeydi-əyal,
Deyildi böylə, bizim də zəmanəmiz vardı.

Əgərçi Zöv'i kimi indi xanəbərduşəm,
Xoş ol ki, meykədə küncündə xanəmiz vardı[158].

Əhibbalarından cənab Ağaəli bəy "Naseh" təxəllüsə yazdığı bir namədə Muğanın xarü xaşakından şikayət edib, vətəni-mə'lufu olan Şirvanın gülü gülzarını həsrətlə arzu edir:

Olu, ya rəb, bu ki, mən rövzeyi-rizvanə gedəm?
Rahəti-canım üçün xidməti-cananə gedəm?

Qurtarıb məhbəsi-səhrayi-Muğan cövründən
Rəşki-firdovsi-bərin sahəti-Şirvanə gedəm?

Xarü[159] xaşakü qarağani-Muğandan qutarıb,
Gülü gülzari-Şəmaxidə gülüstanə gedəm?

Qurtarıb[160] sübhəşümar olmaqdan məsciddə,
Səhni-meyxanədə nuş etməyə peymanə gedəm?

Təngə gəldim bu riyaməslək olan zahiddən,
Ey xoş ol bəzmi-səfa, məşribi-rindanə gedəm?

Məscid əhlində ki, yox zövq, xudaya, nolu bir
Guşeyi-meykədədə məclisi-ürfanə gedəm?

Zöv'i tək banki-müəzzindən olub asudə,
Nəğmeyi-tarü dəfü bərbəti-xoşxanə gedəm[161].

Bunlardan səva Zöv'inin qəzəlləri çoxdur və lakin cümləsini yazmağa ehtiyac olmadığından yuxarıda zikr olanlara iktifa elədik.



# AĞAƏLİ BƏY ƏFƏNDİZADƏ "NASEH"

Ağaəli bəy Naseh təvəllüd edibdir Şamaxıda 1273-cü ildə məhərrəm ayının onuncu günündə – yövmi-aşura[162]. Təhsili Şamaxı məktəb'lərində üsuli-qədim üzrə olubdur. Atasının ondan başqa köməkçisi olmadığı cəhətinə, məktəbdə oxuyan zaman ticarət işlərilə dəxi məşğul olarmış. 16 sinnə çatdıqda məhz türk və fars dillərinin təhsilinə kifayətlənməyib, rusca oxumağa şövqü həvəs göstəribdir və lakin bu vaxtlarda müşarileyhin atası həmişə səfərdə olmaq cəhətilə ev və bazar işləri dəxi ona mühəvvəl olubdur. Belə ki, oxumağa və elm təhsil etməyə çəndan vaxtı olmayıbdır. Bununla belə rusca oxumağı hər şeydən əlzəm bilib, onun təhsilinə canü dil ilə müdavimət etmişdir. Ələlxüsus, o vaxtlarda rusca oxumaq xalq arasında bid'ət, bəlkə daha ziyadə bir əmri-şəni' kimi sayıldığı halda və valideyninin mümaniəti ilə bərabər bir az vaxtın müddətində şəhər məktəbinin üç klass dərslərini ikmal etmişdir.

Naseh cənabları ziyadə xoşxülq, bavüqarü təmkin və əzmində sabit bir zat olduğu üçün öz həmşəhərlərinin və sair onu tanıyanların hörmət və məhəbbətini kəsb etmişdir. Xüsusən Ağaəli bəyin haqqı bizim boynumuzda artıq dərəcədədir ki, Şamaxı şüərasının tərcümeyi-hallarına dair bir çox məlumat bizə cəm' edib göndərmişdi. Bu barədə ol cənaba səmim-qəlbdən razılıq izhar edib, cənab həqqdən ona xoşbəxtlik və tuli-ömr mərhəmət olunmasını təmənna edirik[163].

Naseh Şirvan şairlərindən Bahari-mərhumun xidmətini dərk etmişdir və Seyid, Zöv'i, Bixud və Qafil kimi ürəfa və şüəra ilə ənisü həmcəlis olmuşdur.

Cənab Ağaəli bəy hal-hazırda Şamaxının müslih divanxanasında (mirovoy sudda) sərkatiblik (sekretarlıq) mənsəbində qulluq edir. Ərəb lisanından dəxi bibəhrə deyil. Sərf-nəhvü məntiq və qeyrilərinə lazım olan dərəcədə bələdiyyati vardır. Qulluqdan asudə vaxt tapanda ədəbiyyata dair əsərlərin mütaliəsinə məşğul olur. təb'i-şe'riyyəsi olmağına görə, xeyli mərğub şe'r və qəzəlləri vardır ki, onlardan nümunə üçün bir neçəsi burada yazılır.

Qəzəli-Naseh:

Görüm, ey zülfi-girehgir, pərişan olasan,
Mən tək aşüftələnib bisərü saman olasan!

Əridib könlümü gözdən tökən, ey çeşmi-ğəzal,
Müttəsil dideyi-aşiq kimi giryan olasan!

Ey ləbi-lə'l, dodağım kimi qanın qaçsın,
Qanə dönmüş cigərim tək dönəsən qan olasan!

Düşəsən atəşə, ey xal, olasan xakistər,
Məcməri-sinədə bağrım[164] kimi büryan olasan!

Ey səri'-kuy, görüm zövqü səfasız qalasan,
Gülşəni-nüzhət ikən külbeyi-ehsan olasan!

Mənzil oldu mənə düzəx, görüm, ey gülşəni-hüsn,
Sərsəri-hadiseyi-dəhr ilə viran olasan!

Ey qədü qaməti-mövzun, əyilib incələsən
Atəşi-eşqdə cismim kimi suzan olasan!

Ey dili-sadə, bu sövdadə sənindir təqsir,
Yanasan, odlanasan, xak ilə yeksan olasan!

Naseha, sən də fəğan eyləmə, canın çıxsın,
Kim dedi aşiq olub, hicrdə nalan olasan!

## Əyzən qəzəli-Naseh:

Nə meylim bağə, nə camü səbuyə ehtiyacım var,
Cəmalın gülşənindən rəngü buyə ehtiyacım var.

Həvayi-zülf ilə dil mürği tərki-aşiyan etmiş,
Səbadən sormaq ilə cüstücuyə ehtiyacım var.

Hədisi-ləblərin tə'vizi-can etmək dilər könlüm,
O zülfi-pürxəmindən tari-muyə ehtiyacım var.

Nigarım bivəfa oldu, fənadən qeyri yox çarəm,
Ə'laci-dərd üçün ol tündxuyə ehtiyacım var.

Şəhidi-navəki-müjkanın olmaqçün kəfənləndim,
Könül qanilə təğsilü vüzuyə ehtiyacım var.

Rəhi-eşqində pamal olmadım, bie'tibar oldum,
Qübari-məqdəmindən abruyə ehtiyacım var.

Məni mən' etmə, Naseh, gər qılam dilbər tamaşasın,
Nedim, hal əhliyəm, ruhi-nikuyə ehtiyacım var.



## Əyzən qəzəli-Naseh:

Varımdı sinədə dərdü qəmi-nihan, ölürəm,
Bu sirri eyləmədim kimsəyə bəyan, ölürəm.

Bacardığımca qəmi-eşqi gizlədim, axır
Kəsildi taqətü səbrü qərari-can, ölürəm.

Səfayi-vəsldir[165] aləmdə gərçi məqsudim
Bəlayi-hicrin ilə bağrım oldu qan, ölürəm.

Açılmamış gül idim gülşəni-nəzakətdə,
Bahari-ömrümü eşq eylədi xəzan ölürəm.

Başım bənəfşə kimi qəm dizində çox qaldı,
Vüsalın olmadı üstümdə sayəban, ölürəm.

Şikayət eyləmədim möhnəti-fəraqından,
Zəlilü xarü diləfkarü bizəban ölürəm.

Ümid idim çəkərəm dərdi-eşqi Naseh tək,
Qırıldı rişteyi-ümmid nagəhan, ölürəm[166].

## Mürəbbe:

Gözüm qurbani, ah etmə, qəmi-hicranə səbr eylə!
Əgər könlün dönə hicran əlindən qanə, səbr eylə!
Qəmi-eşq eyləyibdir çoxları divanə, səbr eylə!
Məhəbbət əhlisən, yan atəşi-suzanə, səbr eylə!

Qərar et, gözlərin yadi-vüsal ilə pürab etmə!
Mükəddər xatirinlə ağlama, qəlbim kəbab etmə!
Yetərsən aqibət məqsudə, bunca iztirab etmə!
Olar kamınca axır gərdişi-dövranə səbr eylə!

Məhəbbət aləmində aşiqə daim vüsal olmaz,
Bu yolda aşiqi-biçarə hərgiz biməlal olmaz,
Fəraqə düşməyincə vəsli-dildarə məcal olmaz,
Sitəmlər çəkməyə mö'tad olub mərdanə səbr eylə!

Gözüm, əhli-vəfalar yarın hicranından incinməz,
Əgər min niş vursa, nuki-müjganından incinməz,
Qəmi-firqətlə canın versə, cananından incinməz,
Bəlayi-eşqi çək, bu dərdi-bidərmanə səbr eylə!

Dağıtma arizi-nəsrininə zülfi-mütərrani!
Dürəfşan eyləmə, ağlatma bunca çəşmi-şəhlani!
O şahla çəşminə olsun fəda min nərgisi-cani!
Gəlir, əlbəttə, bir gün dərdü qəm payanə, səbr eylə!

Məhəbbət əhli, Naseh, təneyi-əğyardən qaçmaz,
Cəfalər gəlsə güldən bülbülə, gülzardən qaçmaz,
Yanar hicran ilə, pərvanələr tək, nardən qaçmaz,
Vəfa göstər, nisar et canını canana, səbr eylə!

Naseh cənablarının burada yazılan qəzəllərindən başqa hər qisim kəlamları vardır. Bir müxəmməsində Naseh dünyanın işləri öz qaydasınca getmədiyindən söz açıb, haqqın yerini nahaq tutmağından, ədalət və mürüvvət əvəzinə zülm və şərarətin, sədaqət və dəyanət yerinə həsəd və büğzün, məhəbbət və ülfət yerinə ədavət, föhş və qiybətin işlənməsini nəzmə çəkib deyir:

Basıb aləmləri bidadü ədalət yoxdur*,
Qövllər kizb, əməl ləğv, sədaqət yoxdur,
Həsədü büğzdən özgə dəxi adət yoxdur,
Hiç bir kəsdə vəfa, sidqü dəyanət yoxdur,
Nasəza föhş iza, qeybətü böhtan görürəm.

Şəri-nəbinin mənsux olmasından və üləma zümrəsinin hörmətdən düşməsindən bəhs edib deyir:

### MÜXƏMMƏS

Oldu mənsux əcəb şəri-nəbi, fiqhi-üsul,
Üləma zümrəsinə mənzil olub künci-xəmul**,
Olub avarə hər işdən, oturub zarü məlul,
Bunların yoxdu bahasına verən bir qara pul,
Çəkilib hər biri bir guşəyə pünhan görürəm.

Rəvişi-əqlü hünər dəhrdə məfqud olmuş,
Zöhdü təqvavü əməl məsləki-nabud olmuş,
Sədə nəhs ad qoyub, nəhsdə məs'ud olmuş,
Dindən söz danışan kimsənə mərdud olmuş,
Əhli-dinin işini bisərü saman görürəm.

Nücəbanın və ərbabi-kəmalü mə'rifətin dəxi hörmətdən düşməsindən danışıb deyir:

* Molla Pənahı xatırlatmırmı?
** Xəmul – gümnam olub unudulmaq, addan və sandan düşmək



### MÜXƏMMƏS

Çəkilib hər biri bir guşəyə ərbabi-ədəb,
Matü heyran dayanıb, qönçə kimi açmaz ləb,
İtib ortadə nəcabət, yox olub əslü nəsəb,
Kim ki, bir şapka geyib, gördü də üç gün məktəb,
İddiasında onu saniyə-Loğman görürəm.

Təzəyetmə şairlərin haqqında deyibdir:

### MÜXƏMMƏS

Təzə şairlər ilə dolu cahan malamal,
Sözləri hərzəvü hədyan, danışırlar naqqal,
Şair olmaq diləsən bir neçə gün get qəzet al,
Ağzına hər nə gəlirsə yazılan qazetə sal,
Qazet övraqların hərzəvü hədyan görürəm.

Ağaəli bəy cənablarının səlimün-nəfs və dini-islamda sabitqədəm bir vücud olması aşağıda yazılan münacatından görünür:

Xudavənda, yazarkən nəzmü nəsrü dəftəri-inşa,
Zəbanü fikrü təb'ü nitqim öz həmdinlə qıl guya.

Dəhan içrə zəbani, dildə təb'i, başda övhami,
Hürufi-ləfzü mə'nani edibdir qüdrətin peyda.

Zəban gər həmd söylərsə, olur Məhmuddən tövfiq,
Kəlamı təb' tövlid etsə təb'in xaliqi mövla.

Əgər olmazsa feyzin rəhnüma, daniş cəhalətdir,
Vücudi-elmü fəhmü əql verməz mənfəət əsla,

İnayətlər edib qıldın ədəmdən zatımı icad,
Gətirdin aləmi-nasutə batəşrif "kərrəmna"[167].

Təcəlla etdi nurin mə'tləi-qeybi-hüviyyətdən,
Bu nurin məzhəri olmaqla etdin cismimi əhya.

Cəhalətdən çıxıb kəsbi-kəmal etməkdə imdadım,
İlahi, səndən oldu, eylədin sən vaqifi-mə'na.

Bəşər növündən etdin, əhli-islam oldu əcdadım,
Lisanü qəlbimə nuri-hidayət eylədin ilqa.

Edib təftiş ədyanı, götürdüm dini-islamı,
Qəbuli-hökmi-Qur'an ilə tapdım ne'məti-üzma.

Şüur ilə müsəlmanəm, nə təqlidən əbü ümmə,
Dəlili-əqlü nəql ilə tutub qəlbimdə iman ca.

Könüldə şəkkü şübhəm yox, yəqinən əhli-tövhidəm,
Həmişə söylərəm sidq ilə "amənna"vü "səddəqna".

Übudiyyətdə, qəffara, əgərçi çox qüsurum var,
Vəli göz yaşım ilə eylərəm qüfranın istid'a.

Kərima, rusiyahəm, acizəm, asi, günəhkarəm,
Məni rədd etmə dərgahindən, eylə məğfirət ə'ta.

Mənə qəlbi-səlim ənan edib taətdə sai qıl,
Sirati-müstəqim üzrə edim ehkami-din icra.

Kəlami-ləğvdən hifz et zəbanü təb'imi, ya rəb,
Məni ətba'i-ğavun etmə, çəşmi-qəlbimi ə'ma.

Bu, rövşəndir ki, təb'i-şair, əlbəttə, fəsad eylər,
Məni bu zümrədən öz lütfün ilə eylə istisna.

Muradım çün nəsihətdir, kəlamım dilpəzir eylə,
Süluki-şe'rdə Nasehliyimdir məqsədi-əqsa.



# ABDULLA BƏY "ASİ"

Abdulla bəy Qarabağın nücəbalarından ən zərif, xoşxülqü xoşsima və nazənin bir cavan idi ki, bütün Qarabağ ürəfavü üdəbası onun vücudu ilə iftixar edərdi. Abdulla bəy mərhum Qasım bəy Zakirin nəvəsidir. Atasının adı Əli bəydir. Əsli Qarabağ mahalından isə də, Şuşa qalasında təvəllüd tapıbdır 1256-cı[168] tarixdə. Tə'limü tərbiyəsi dəxi haman məkanda olubdur. Filhəqiqə keşmişdəki şüəra, zürəfa və ürəfa beşiyi mənzələsində olubdur.

Abdulla bəyin yaxşı savadı olub, fars və ərəb lisanlarını kamil bilirdi və cığatayi türklərinin müəzzəm şairi Əlişir Nəvainin əş'arü kəlamına o qədər şövqü həvəsi vardı ki, onlardan çoxunu əzbər bilirdi və cığatay lisanını bir dərəcədə öyrənmişdi ki, o dildə gözəl qəzəllər yazıbdır ki, onlardan bə'zi Nəvainin kəlamına bərabər ola bilir.

Təb'i-şe'riyyəsinə gəldikdə, demək olur ki, ceddi-büzürgvarı Qasım bəy Zakirin təb'inə bərabər onun təb'i vardı və lakin Asinin təb'i Zakirinkindən xeyli səri' və yeyin idi. Qələmi əlinə aldıqda bilatəəmmül və təfəkkür yazardı və yazdığı kəlamın vəznü qafiyəsində bir qüsur nəzərə gəlməzdi, bəşərti ki, şe'r yazdıqda şərabi-nabdan bir az dadıb, onun tə'sirindən ayinəsi açıq və zehni güşadə olmuş olaydı.

Əksəri-şüəra meyi-gülfamı naçəşidə öz asarü əş'arında tə'rifü təhsin ediblərsə də və saqiyi-sadərudan nadidə imdadü himmət istəyiblərsə də və rindi-xərabatini əsla ondan xəbəri olmayaraq yad edib onun ruhuna salam göndəriblərsə də, bunu ümumi bir üslub və qayda üzərindən öz təb'lərinin cuşü hərəkətə gəlib güşadə və rəvan olmaq arzu və təmənnasilə ediblər.

Amma Azərbaycan şüəralarından Asi, mərhum Hacı Seyid Əzim Şirvani və bir para qeyriləri Xacə Hafiz və Şeyx Xəyyam kimi ustadikəlama peyrəvilik edib və dünya qeydindən bilmərrə xilas olmaq üçün şərabi-lə'li-naba fe'lən meylü rəğbət göstəriblər.

Asinin təb'i-şe'riyyəsinin sədası hər yerə yayılıb, öz əsrində kəlam əhlinin sərəfrazı, şe'rü qəzəl deməkdə udəbalar mümtazı olub, onun namü şöhrəti Şəki, Şirvan, Gəncə və Qazax mahalına yayılmışdı. Hər tərəfdən ona namələr yazılıb, şe'rü mənzumə göndərib, rə'yini arardılar və təşviqatı ilə iftixar edərdilər və tənqidati-fazilanələri sayəsində öz əş'arü kəlamlarına təb'dil verib həkkü islah edərdilər.

Mərhum Asinin şöhrəti və hörməti xüsusən Şirvan şüəravü ürəfası mabeynində intişar bulmuşdu. Belə ki, Hacı Seyid Əzim kimi müqtədir bir

şairi-dövran və ədibi-süxəndan Asinin məliki-şüəra məqamına tutub özünü ona nisbət bir kəmtərin qulam hesab edir. Necə ki, deyibdir:

Nə Asi, ol ki, dəri-izzətində Seyyidi-zar
Qulamı olmaq ilə sahibixtiyar olacaq...

Asinin vaxtında Qarabağ şüəravü ürəfaları "Beyti-xamuşan"[169] ismində bir məclis tərtib edib, orada şe'rü qəzəl inşad qılardılar və üdəbayi-salifənin asari-cəlilələrini mütaliə etməklə və həkimanə söhbətlər ilə övqatlarını keçirərdilər.

"Beyti-xamuşan" məclisinin ruhu, əlbəttə, Abdulla hesab olunurdu və məclisə ziynət və rövnəq verən onun özü idi. Bir belə ürəfa məclisi də Şamaxıda bina "Beytüs-Səfa" adı ilə məşhur idi. Bu iki məclisin arasında hər vaxt irsal-mərsul var idi. O namələrdən birisini ki, "Beytüs-Səfa" "Beyti-xamuşan"a göndərmişdir, burada təbərrükən zikr edirik:

### ŞAMAXI ŞÜƏRALARINDAN ƏRİZEYİ-ƏCZÜ İNKİSAR

Calisani-"Beyti-xamüşani"i-məsərrətbünyan hüzurlarına əshabi-"Beytüs-Səfa"dan ol xüsusda ki, bu günlərdə biz şüərayi-Şirvan mabeynində qüvveyi-şe'rə mətanəti-nəzm barəsində müşairə vaqe olmuşdu. Mövlana Füzulidən bir qəzəli-fəsahətməşhun və bəlağətməzmunu intixab etdik ki, mütabiqi-qafiyə onun müqabilin deməyə iqdam edək və ol qəzəllər bir-birindən mafövq olmağın imtiyaz etməkdə biz şüərayi-Şirvan arasında mübahiseyi-külli və mücadileyi-əzim vaqe olmuşdur. Ona binaən haman qəzəlləri tamamən yazıb, hüzuri-bahirün-nurlərinizə pişnəhad etdik. Ümid ki, əshabi-firdovsnişan, xüsusən ol sərəmədi-dövran və qibleyi-ürfan Mövlana Abdulla bəy Asi və Novrəsi-əvvəl və tamami əhli-məclis ol qəzəllərin biri-birindən ə'la və pabəst olmağın tərtibən imtiyaz edib, e'lam buyuralar ki, ta bu qəzəllərin hansı hansından ə'la olduğu mə'lum və müşəxxəs ola. Məsələn, bu qəzəl əvvəlincidir, bu, ikincidir, bu, üçüncüdür ilaxır.

Müxlisi-şüma: Hacı Seyid Əzim, Qafil, Rağib, Bixud, Salik, Səfa, Zöv'i və Zühuri.

Füzulinin divanından nəzirə üçün intixab olunan bu qəzəldir:

Təriqi-fəqr tutsam, təb' tabe, nəfs ram olmaz,
Qina qılsam tələb, əsbabi-cəm'iyyət təmam olmaz.

Dəhanından əsər görməm, miyanından nişan, vəh kim,
Məni-nakamə ömrümdən müyəssər hiç kam olmaz.



Müqimi-kuyi-dərd eylər məni ahi-cigərsuzim,
Bu ahəngi-məlaləfzayə bundan xoş məqam olmaz.

Müridi-saqiyəm kim, lütfü əhli-eşqə daimdir,
Nə hasil əhli-zöhdün şəfqətindən kim, müdam[170] olmaz.

Dedim: – Üşşaqə cövr etmə, dedi ol xublar şahi:
Siyasət olmayınca eşq mülkündə nizam olmaz.

Ləbindən qətrə-qətrə qan içər könlüm kərahətsiz,
Şəkərdən olıcaq mey qətrəsi guya həram olmaz.

Füzulini məlamət eyləyən bidərd bilməzmi –
Ki, bazari-cünun rüsvalarında nəngü nam olmaz".

Qarabağ şüəraları kamali-diqqətlə "Beytüs-Səfa" əshabının göndərdikləri qəzəllərə baxıb, onlardan əvvəlinci dərəcədə Bixud həzrətlərinin, ikinci dərəcədə Hacı Seyid Əzimin, üçüncü dərəcədə Zöv'inin, dördüncüdə Səfa ilə Salikin, beşincidə Qafilin, altıncıda Zühurinin, yeddincidə Rağibin qəzəllərini qoyublar. Bu qəzəllər hər biri öz məqamında, yə'ni onları inşad edən şüəranın tərcümeyi-halından bəhs olunduqda eynilə dərc qılınacaqdır.

Şirvan şüəralarının rəqəmi-bəlağətsənclərindən vüqua gələn qəzəllərin dərəceyi-əhəmiyyət və şə'nlərini göstərib, Qarabağ şairləri dəxi şe'rü qəzəl deməkdə öz qüvvələrini bildirmək üçün onlara cavab olaraq haman bəhrü qafiyədə hər birisi bir qəzəl tənzim edib Şirvana göndəriblər və bu qəzəllər dəxi öz mövqeyində yazılacaqdır.

Asi əleyhirrəhmanin qəzəli budur:

Fəna mülkünə aşiq girməyincə nəfsi ram olmaz,
Məqami-"liməəllah" sirri anınçun təmam olmaz.

Könül, piri-müğanın feyzü lütfi gər ola şamil,
Meyi-vəhdət əyağın al ələ, bu mey həram olmaz.

Əzəl şəmsinə ol talib həqiqi hüsn ondandır,
Məcazi dilrübalər hüsni aləmdə müdam olmaz.

Hərimi-Kə'bə, səhni-deyr yeksandır, könül,[171] billah,
Əgər mə'lumə talibsən sənə fərqi-məqam olmaz.

Məqami-qürbi-yarə vasil ola aşiqi-sadiq,
Rizayi-dustdən özgə ona aləmdə kam olmaz.

Necə vasil olum ol şahə kim, gər olmasa nəzmi,
Məhü mehrü büruci-nəcm seyrində nizam olmaz.

Təriqi-eşqə, Asi, laübali qoy qədəm bir dəm –
Ki, əhli-eşqdə pərvayi-canü nəngü nam olmaz.

Abdulla bəyin bu kəlami-xoşməalı həm mə'nən və həm fəsahətcə cəm'ii-müasirinin əsərlərindən mümtaz olub, bəlkə Füzuli əleyhirrəhmənin qəzəlindən dəxi bir az artıq ola. "Məqami-liməəllah" sirrini anlamaq istəyən və nəfsi-əmmarəni özünə tabe etmək fikrinə düşən şəxs gərəkdir özünü fəna dəryasına atıb, dünyadan iman'i-nəzər etsin.

Həqiqi hüsnə və mə'rifətüllahə vasil olmaq istəyən adam əzəl şəmsini gərək axtarıb bulsun, çünki məcazi dilrüba və məhvəşlərin hüsnü lətafəti daimi deyil, müvəqqəti, boş bir şeydir. Ona mübtəla olmaq layiq və şayəstə deyil və insan üçün kəsri-şəndir. Əsil həqiqətə və mə'nəviyyətə talib olan kəs gərəkdir hərimi-Kə'bə ilə səhni-deyrdə bir təfavüt gör[mə]sin və bu müqəddəs məqamlara da bir nəzər ilə baxsın.

Şair əsl hürriyyətpərəst olub, azadeyi-əfkar və hürriyyəti-dinü e'tiqad onun baş arzularından birisi idi. Şair üçün məscid, kəlisa, künişt və deyr arasında əsla təfavüt yoxdur. Bunların cümləsi Allahın evi mənzələsində müqəddəs və pak məqamlardır ki, ibadət və mə'rifətüllah üçün bina olunubdur. Bu ali fikri Asi özgə kəlamlarında dəxi izhar qılıbdır.

Qarabağın münafiqləri və riyai zöhdü təqvaları ilə məşhur olan zahiri dindarları mərhum Abdulla bəyə şürbi-xəmrdən tövbə, cəbrən tövbə vermək xəbərini Şirvan şairləri eşidib və onun bilaixtiyar tərki-şərab etdiyni bilib, bu barədə şairə tərcibənd səbkində gözəl bir namə yazıb göndəriblər ki, onu burada tamamən yazıb, qarelərin nəzərlərinə təqdim edirik.

Tərcibənd ki, Hacı Seyid Əzim və sair Şirvan şüərası Asiyə onun şərab içməkdən tövbə etməyi babında yazıbdırlar:

İlahi, məscidə meyxanə dönsün!
Tökülsün bədəsi peymanə dönsün!
Ola meyxanə bayquşlar yatağı,
Uçub bir mənzili-viranə dönsün!
Nə güldən ötrü bülbül nalə etsin,
Nə dövri-şəm'ə bir pərvanə dönsün!
Çəmən səhnində olsun dağ lalə,
Yanıb, bir ateş-suzanə dönsün!
Pozulsun rövnəqi-ordibehişti,
Gülüstani-cəhan neyranə dönsün!



Səfayi-kainat bulsun küdurət,
Bu aləm xəlq üçün zindanə dönsün!
Sənin minbə'd, ey piri-xərabat,
Şərabi-lə'li-nabın qanə dönsün!

Neçün kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Edib tə'sir ona zahid kəlami,
Salıb gözdən şərabi-ləlfami,
Çəkib ol xublər zülfü ruxindən,
İbadətlə keçibdir sübhü şami.
Dili-aşiq tək ol səngindil etmiş
Şikəstə sağərü minavü cami.
Təhi-xümdə Fəlatun kimi badə
Qalıb zillətdə, yoxdur ehtirami.
Pozuldu Kəbeyi-ərbabi-hacət.
Səfadən düşdü meykeşlər məqami.
Ola xak ilə yeksan, barilaha,
Nə kim, meyxanə var, səqf ilə bami.

Neçün kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Əgər mey olsa kövsərdən ibarət,
Dəxi Seyyiddə yoxdur hiç rəğbət.
Meyi-gülfamdən əstəğfürullah,
Meyü səccadəvü künci-ibadət.
Şikəst et, Bixuda, cami-şərabi,
Dürüst et, Zöv'iya, əsbabi-taət!
Oyan, Qafil, götür əl cami-meydən,
Səni məst etməsin bu xabi-qəflət!
Gözün yum, Didə, ruyi-dilsitandan,
Şərabi-nabə, Rağib, etmə rəğbət!
Səfa, düşsün səfadən təb'i-pakın,
Zühur etsin Zühuridən küdurət!
Pozun, ey dustan, divani-şe'ri,
Meyü məhbubdən etmək rəvayət!

Neçün kim, Asiyi-zarü fitadə
Edibdir Şişə içrə tərki-badə.

Filhəqiqə, bu kəlami-dürfişan elə bir naleyi-cigərsuz ilə nəzmə çəkilibdir, elə bir həqiqi və təbii hissiyyatdan doğubdur ki, nə qədər bihiss və bicövhər bir vücud olsa dəxi, onun tə'sirindən eymən və salamat qala bilməz.

Bu kəlam nəinki bir şüəraya və sair ərbabi-zövqü səfaya hüznü məlal gətirir, hətta zövqü səfadan bilmərrə xəbəri olmayan və quru zöhd və bimə'rifət taat ilə gününü keçirən ridapuşlara da tə'sir edə bilir.

Burada bizim mətləbimiz bu deyil şərabxarları safa çıxardıb, bir növ' onun eybinə pərdə çəkmək və çaxır içməklə övqatını keçirən bir şairin şərabdan tövbə istəməsini təəssüflə bəyan etmək ola, haşa və kəlla!

Asi əleyhirrəhmə özü dəxi öz əməlindən razı deyildi. O, həmişə əhibbaları arasında özünün günahkar, xar və zəlil olmağını kəmali-nədamət və peşmançılıq ilə bəyan edirdi və tövbə, inabə yoluna üz çöndərməyə amadə idi və mə'siyət dəryasına qərq olmağından naşi "Asi" təxəllüsünü halü şə'ninə ən münasib bilib, onu intixab etmişdi.

Bizim yuxarıda zikr olunan tərcibəndi tə'rif etməkdən [məqsədimiz] ancaq o kəlamın mövzun, rəvan və sadə olmağını göstərməkdir. Və nə qədər bir kəlam açıq, mövzun və həqiqi hissiyyatdan vüqua gəlmiş olsa, bir o qədər onun tə'siri dəxi qeyrilərə artıq olur, saxta hissiyyatdan naşi kəlamın oxuyanlara tə'siri olmaz və bəlkə xiffət və kəsalət gətirər.

Bu təəssüfnamə Abdulla bəyə artıq dərəcədə tə'sir elədi. Şirvan şairlərinin belə iltifatü xülusiyyəti, bu qədər məhəbbətü məvəddəti onu atidə zikr olunan cavaba vadar etdi ki, cığatay və türk dilində artıq məharət və fəsahətlə rişteyi-nəzmə çəkilibdir.

Abdulla bəy Asinin Hacı Seyid Əzimə və sair şüərayi-Şirvana göndərdiyi cavab:

Ə'la, ey saqiyi-məqbuli-sadə,
Yerüt meyxarlərğə cami-badə.
Peyapey son şərabi-kəhrübayın,
Olubmin gahi yüz birlə fitadə.
Bəla tufanı tuş-tuşdan qopubdur,
Qalıbmin zarü sərgərdan aradə.
Fəlatun minmasa xum kəştisiğə,
Onu ox qərq edərdi işbu adə.
Məni siyrab etmək mümkün irmas,
Əgər dur eyləsən məndən ziyadə.
Mənə əhbab itar tə'nə neçün min,
İtaydır Şişə içrə tərki-badə.
Bu zəmmin dəf'inə bir cami-mey dut,
Ki, ta seyr eyləyim kuyi-fənadə.
Salay bu dövri-çərxə bir ələla,
Ki, bolsun Zöhrə xiynagər səmadə.
Məqami-liməəllah əzmin edib,
Bu fərdi eyləyüm hər dəm iadə;

Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.



O meydən son, koni* işgac Məsiha,
Quyaş həmxanəligni etdi mə'va.
Olubdin aşina ərni onunla
Ölüklər durquzurdu eylab əhya.
Xəlil etgac onun bir cür'əsin nuş,
Ona gülşən bulub odlar sərapa.
Onun tə'siri Yusif surətidə
Olubdur hadiyi-qürbi-Zəlixa.
Rəvanbəxş eyləgac,[172] saqi, kərəm qıl,
Til eylab rəbbikül-əlayə quya,
Əlimğa cam uzat fəxric yəduk deb –
Ki, əlimdən toğa ənvari-beyza.
. . . . . . . . . . . . . . . . . . . . . . . . .
Fəna deyrin itam bir ləhzei ca.
Əlayiqnin cünudi quzğalaşmış,
Etür bu tilbə dil şəhrini yəğma.
Yerit bir tamcı mey kim, səhl bulsun,
Vücudim tamcısiyə vəsl dərya.

Meyi-vəhdət məsəllün ğəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Məni derlər ki, tövbə kar imiştüm,
Muğan piriğə bədkirdar imiştüm,
Mənə pir altida mənlik bulub məhv,
Məgər min xod aradə bar imiştüm.
Ki, tövbə eyləgay, ya eyləmaymin,
Bu işdə guyiya muxtar imiştüm.
Əzəl ustadidin alsam ni tə'lim,
Edib əzbər anı aytar imiştüm.
Nidər bu zərreyi-əhqərğə cür'ət –
Ki, mehr altida ziənvar imiştüm.
Məniyyətdən neçün mənlik uray kim,
Düşüb təhtüşşüaə xar imiştüm.
Bulub qafil həqiqət mənzilidən,
Dəriğa, maili-zünnar imiştüm.
Künіştü Kə'bə yeksandır əgərçi,
Çü min xod talibi-didar imiştüm.
Degil çün zöhdü üsyan biməşiyyət,
Neçün bilməm mən üsyankar imiştüm.

Meyi-vəhdət məsəllün qəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

* Ki, onu – *red.*

Müjənnin yadidin olmam kənarə,
Edibdür, saqiya, köksümi parə
Çıxar hər sağbədən min novi əfğan,
Bu dərdə istəsən gər bir də çarə.
Töküb ol cami-zərğə badeyi-nab,
Sölə ta mütrib olsun zəxmə tarə.
Nola gər olsa nabi ney tililə.
Dəmi məşğul həmidi-giridigarə.
Məni qafil deyən rəğmiğə[173] saqi.
Kim özni əhli-hal idər şümarə.
O odluq abdan bir cam tut kim,
Ura ol xərməni-canğə şərarə.

Meyi-vəhdət məsəllün qəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Dəxi tərk eyləgil, Asi, fəsanə,
Səlamət eylə Şirvanə rəvanə.
Səvadi-didədən yaz bir rəqəm kim,
Görərma Didəni bulsun bəhanə.
Zühuri birlə Bixud həzrətiğə
Yetür ixlasi-ərzin bixodanə.
Mən aşrü rağibəm Rağib yüziğə,
Səfadən ğaib olmam ğaibanə.
Səba, etgil mənə sən hər bir imdad –
Ki, imdadın kəsib məndən zəmanə.
Əlin öp Seyyidin ondan son ərz et –
Ki, Həcc əzmilə tüşgandin cəhanə,
Künişti-Rumda, ya kim hərəmdə,
Bulubmu mətləbindən bir nişanə?!
Və ya mən dək o da məhrum qalmış,
Arayıb gərçi düşmüş xanə-xanə.
İrişdirmiş əgər mə'lum üçün elm,
Xoşa hali şərikdir cavidanə.

Meyi-vəhdət məsəllün qəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Əcnəbi lisanında belə fəsahət və bəlağətlə şe'r demək hər adamın hünəri deyil. Meydani-süxəndə, əlhəqq, Asi dəxi türk şüərası beynində binəzir, alitəb' və zərif bir vücuddur ki, onunla fəxr etməyə haqqımız var.

Tərki-mey barəsində Abdulla bəyə olunan tənü zəmmin müqabilində ol cənab dərdisər və xumar gətirən və xanələr xərab edən badədən meyi-vəhdətə meylü rəğbət göstərməyini və hətta irişmək üçün onun kimi başqa bir rəhnüma olmadığını zəbani-fəsahətlə şərhü bəyan edib, saqiyi-məqbuli-sadəyə xitab edib deyir:



Bu zəmmin dəf'inə bir cami-mey dut –
Ki, ta seyr eyləyüm kuyi-fənadə.
Salay bu dövri-çərxə bir əlala –
Ki, bolsun Zöhrə xiynagər səmadə.
Məqami-liməəllah əzmin edib,
Bu fərdi eyləyüm daim iadə.

Meyi-vəhdət məsəllün qəmzida yox,
Fəna mülkiğə böylə rəhnüma yox.

Vəhdət meyinin həyatbəxş nəş'əvü tə'sirindən şairin qəlbi məhəbbəti-ilahilə ləbaləb olub, ali fikirlər, müqəddəs hisslər onu uca məqamlarda gəzdirir. Saqiyi-sadədən Asinin təmənna etdiyi haman bu meydir ki, onu Məryəm oğlu İsa içgəc quyaş həmxanəliyini özünə mə'va etdi və həzrəti-Musa ondan daddıqda haqqla dostluq binası qoyub "rəbbi ərni" deməyə cür'ət elədi və İbrahim Xəlilullah onun bir cür'əsini nuş etgəc atəşlər sərapa ona bir gülşən olubdur və onun tə'siri həzrət Yusif camalında hadiyi-qürbi-Züleyxa olubdur və sair ənbiyalar və övliyalar o meyin bərəkətindən ülüvvi-məqama yetişib, mə'siyət və zəlalətdən xilas olublar. O meydən şair dəxi bir damcı da olsa saqidən ilhah və iltica edib, istəyir ki, onu içməklə zərreyi-vücudu vəsl dəryasına irişməyə yol tapsın.

Tövbə məsələsinə gəldikdə, şair piri-müğana bədkirdar olmağını bəyan edib deyir ki, mən öz fe'lü kirdarımda muxtar olmayıb, əzəl ustadımdan nə tə'lim almışamsa, ona mütabeət göstərirəm.

Özünü bir zərreyi-əhqər yerində tutub deyir ki, məndə nə qüdrət və ixtiyar var ki, cür'ət edib söyləyə biləm ki, onu edəcəyəm, ya etməyəcəyəm:

Ki, tövbə eyləgay, ya eyləmaymin,
Bu işdə guyiya muxtar imiştüm.
Əzəl ustadidin alsam ni tə'lim,
Edib əzbər anı aytar imiştüm.

Çün bu dünyada heç bir şey və heç bir əməl məşiyyəti-ilahisiz deyil, belə olan surətdə meyə meyl etməkdə və ya onu tərk qılmaqda şairdə nə təqsir var və onun özü bilmir ki, o, günah əhlidir yoxsa əhli-savabdır. Necə ki, deyir:

Degil çün zöhdü üsyan biməşiyyət,
Neçün bilməm mən üsyankar imiştüm.

Ol səbəbdəndir ki, əzəldə meyə və eyş-işrətə məşğul olduğu ibtidai-şəbabında zahidi-bizövqə xitabən deyibdir:

Zahida, guşeyi-məsciddə nəyim var mənim,
Bərbətü çəngü dəf'ü nay, neyim var mənim.

Kövsəri vədə edirsən mənə gərçi nisyə,
Nəqd dəstimdə bu gün cami-meyim var mənim.

Hurü qılmanını çox vəsf eləmə minbərdə,
Gör necə saqiyi-fərxündəpeyim var mənim.

Yığılıb müğbəçələr piri-müğan dövrünə,
Düxtəri-nəş arasında Cüdeyim var mənim[174].

Asiya, meykədə küncün özünə məskən edib,
Nüsrəti-mülki-Kəyavusi-Keyim var mənim.

Kəlami-Asi, vəfalı aşiq barəsində:

Nəsibim gərçi eşqində bəladır,
Bəla üşşaqə eyni-müddəadır.

Xoşam hər cövr ilə qılsa nəvaziş,
Cəfasın çəkməmək, billah, cəfadır.

Cəfa gəlməz pərivəş mahlərdən,
Sanır qafil cəfa, lakin vəfadır.

Ləbi-şirinin ər düşnamə açsa,
Cavabı-aşiqi-sadiq duadır.

Neçün lafi-"ələst" urmazsan, ey məh,
Bilirsən ki, cavabında "bəla"dır.

Şərabi-lə'li-nabın firqətində
Könül rənci-xumarə mübtəladır.

Neçün hicrandan Asi şikvə qılsın,
Rizayi-dust isə, ol həm səfadır.

Təcnisi-Asi:

Rəhm qıl, dəymə, səba, zülfi-kəci-dildarə,
Nə rəva kim, düşə vüs'ətdə ikən dil darə.

Eşq ruyində urub lafi- "ənəlhəq" guya,
Çəkilib zülfdə Mənsur kimi dil darə.



Qoyma kim, şanə dəyə zülfə, özün məhrəmsən,
Şərhə-şərhə ol onun tək, onu, ey dil, darə.

Hər xədəngin səfi-müjgandan əgər kəm bolsa,
Kimsəyə etmə güman zülfü ara dildarə.

Asiya, çini-səri-zülfdə kim, oldu könül,
Zülməti-şəb tanımaq qüdrəti yox dildarə.

Qəzəli-türki, zülf barəsində:

Ey gənci-hüsn üstə yatan şahmar zülf!
Bir ləhzə, tarı xatirinə, ol kənar, zülf!

Aşüftəhaldır sitəmindən Xitavü Şam,
Maçinü Çin, Hindü Həbəş, Zəngbar, zülf!

Ey şanə, mubəmu gəzibən eylə cüstücu,
Gör handa eyləyib dili-miskini zar zülf.

Mərdümlük eyləyir yenə filcümlə gözlərin,
Lakin üzüqaralıq edibdir şüar zülf.

Üz vermə, sal ayağına, al intiqamımı –
Kim, könlümü bəlalərə qılmış düçar zülf.

Ləşkər çəkibdi xalü xətü çeşm qəmzədən,
Dil kişvərin yəqin edəcək tarmar zülf.

Rüsva nə növ'i olmasın Asi cahan ara,
Razi-nihanını eləmiş aşikar zülf.

Qara gözlər barəsində:

Edər sehr ilə daim bu xəta kani qara gözlər,
Könül şəhrini yəğma türki-türkani qara gözlər.

Yenə sultani-hindu tək sipahi-xəttə hökm etmiş –
Ki, tutsun dövri-lə'lində Bədəxşani qara gözlər.

Qəzali-Çinə bənzətdim bu caduni, xəta etdim –
Ki, onda kəcnigahın şivəsi hani qara gözlər.

Könül məcmu' ikən zülfi-pərişanda edər dərhəm,
Nə təqsir eyləyib bilməm bu zindani qara gözlər.

Verib baş-başə, Asi, qətlinə daim müsəmməmdir,
Bu yektalıqda yoxdur onlara sani qara gözlər.

Əyzən qəzəli-türki:

Könül, hər dəm baxanda ol pərinin lə'li-nabinə,
Olur meyli füzuntər saqinin cami-şərabinə.

Kənari-cudə bağ içrə vətən tut kim, görən kəslər
Desin: təhvil edib xurşid çərxin, bürcn-abinə[175].

Sənə yüz gəz dedim ki, mayil olma zülfi-pürçinə,
Nəsihət tutmadın, səbr eylə kaş, ey dil, əzabinə.

Səba, tənha cəfayi-şanə bəsdir bu dili-zarə,
Tərəhhüm eylə sən, həm bais olma iztirabinə.

Üzün təfsiri-safidir, ona sübhan rəhmanın,
Nə qədri ayeyi-rəhmət yazılmış dörd kitabinə.

Xəyali-arizin çıxarsa könlümdən nola, ey gül,
Urar şəh xiyməgəh tə'mir üçün mülki-xərabinə.

Nə qədri kim, sorar Asi, ləbi-lə'lindən almaz söz,
Yapışmışdır həlavətdən, açılmaz söz cavabinə.

* * *

Olmuş məqami zülfi-pərişanı könlümün,
Bir dəm kəsilməz ah ilə əfğanı könlümün.

Rəhm eylə, səxt dəymə, səba, tari-muyinə,
Ol piçü tabə tabı görüm hanı könlümün.

Mö'tad olub qara günə zülfündə xoş keçər,
Min zülm yetsə, şami-qəribanı könlümün.

Zünnar zülfünə uyuban küfrə uğradı,
Salim qalır və növ' bəs iman'i könlümün.

Kuyində, Asiya, bu qədər nalə eylərəm,
Tə'sir edərmi ol məhə əfğani könlümün?

Qəzəli-cığatayi:

Səbağə itsam əhvalimni şərh imdad qılğaymu?
Pəyamım giltürüb biçarə dilni şad qılğaymu?

Sifariş eyləsəm şahimğə viran mülk dil şərhin,
Sipahi-dərdü qəmni göndərib abad qılğaymu?



Məni içgan rəqibi-rusiyəh birlə ol şol bimehr,
Fərağından bənüm qan yutmağımni yad qılğaymu?

Fərağiğə belə xugər edibdür xəstə könlümni,
Vüsaliğə genə bilməm oni mö'tad qılğaymu?

İki çeşmin neçin seyd eyləğay avarə könlümnü,
Zəif olğay keyik qəsdin iki səyyad qılğaymu?

Oşol kafirğə köp yalparma, ey dil, mürğini səyyad
Tuzağdin nalə qılmağlıq bilə azad qılğaymu?

Quyaş rüxsarlardin zərrəcə mehr ummağay Asi,
Ədalət görmağan kəs şahlərğə dad qılğaymu?

Müxəmməsi-bəhri-tə'vil:

Ey zülməti-zülf içrə yüzü mehri-münəvvər, vey bağı-rəşadətdə qədi sərvü sənubər, məqbul yaratmış səni ol xaliqi-əkbər, vermiş sənə zinət, məşşateyi-qüdrət, yox sən kimi lö'bət, bu nazü nəzakət, bu lütfü lətafət, bu qədd, bu qamət, həm hüsnü məlahət, ey ayeyi-rəhmət, yox kimsədə əsla, ey dilbəri-ziba, olmaz sənə həmta Şirinü Züleyxa, layiqdi ki, Yusif ola sən sərvərə çakər, ey qaməti ər-ər, dodağı qənd mükərrər.

Ruyin çəməni-hüsndə ta qaldıri beydəğ, gül urdu müqabildə məgər lafi-"ənəlhəq", gülbün qurubən dar özünü asdı müəlləq, kim, batma vəbalə, düşmə bu xəyalə, olmaz güli lalə həmta o camalə, xurşid misalə, ol arizi-alə, bu çəşmi-qəzalə, bu xəttü bu xalə, bilməm bu nə gisu, nə silsileyi-mu, nə nərgisi-cadu kim, canım alıb bu, əbru necə əbru kim, olub bir-birə mülhəq, qan tökməyə amadə olub tiği-düpeykər.

Sən simbədən, zülfü rəsən, qönçədəhənsən, aşubi-zaman, sərvi-çəmən, babi-fitənsən, sən sibzəqən, ruysəmən, vəchi-həsənsən, ey ruhirəvanım, qarətgəri-canım, ey qönçədəhanım, əbrusi kəmanım, vey muymiyanım, qılmani-cinanım, ey tutizəbanım, Məhmudi-zamanım, şəm'sü qəmər üzlüm, şirin sözü duzlum, tuti kimi sözlüm, süzgün alagözlüm, ahuyi-Xütən, sərvi-çəmən, dürri-Ədənsən, çatmaz ləbinə abi-bəqa, çeşmeyi-kövsər.

Qan yaşım axar nərgisi-caduni görəndə kim, tifl təki div edər ahuni görəndə, divanə könül silsileyi-muni görəndə dərdim olu pabənd, yüz mərdi-xirədmənd ta urmayalar bəndi-müşəkkəl, eşidər pənd, ey dilbəri-dilbənd, hicran qəmi ta çənd, verdim sənə sövgənd, bir et məni xürsənd, ver buseyi-pünhan, canım sənə qurban kim, möhnətü hicran bağrım

eləyib qan, kafir də yanar hali-digərguni görəndə, sən həm mənə bir rəhm qıl, ey şuxi-sitəmgər!

Sənsən güli-baği və ləqəd kərrəmül-insan, "mazaqə bəşər"[176] çəşmi-xumarında nümayan, vəşşəmsi-züha zülfü ruxin vəsfinə tibyan, ey dilbəri-ziba, sün'i-şəhi-yekta, ruyində hüveyda gər etsə təcəlla ol arizi-həmra, mədhuş olu Musa, olmaz yədi-beyza ol nur ilə həmta, ey sevgili yarım vey çəşmi-xumarım, gör haləti-zarım, yox səbrü qərarım, zünnar səri'-zülfə olub Asiyi-nalan, az qaldı rəhi-eşqdə, ey büt, ola kafər.

Bundan səva Asinin yenə xeyli mövzun və rəvan bəhri-tə'villəri və müxəmməsləri vardır. Cümləsini yazmağa ehtiyac yoxdur: Moşt nomuneye-xərvarəst.

Abdulla bəy ilə Hacı Seyid Əzimin arasında hər vaxt irsal-mərsul olub, hər iki şair bir-birini artıq dost və əziz tutarlarmış. Heyfa ki, Abdulla bəyin Şirvan şairinə yazdığı namələrdən ələ gətirmək məqdur olmadı. Ancaq Hacı Seyid Əzimin əsərlərindən Abdulla bəy Asinin mədhü şə'nində yazdığı gözəl bir qəsidə ələ keçdi. Haman qəsidə budur[177].

Bu qəsideyi-dilfəribdə şairi-rövşənzəmir, yə'ni Hacı Seyid Əzimi-əzimşə'n həzrətləri elə bir məharət və fəsahətlə bahar fəslinin yavuqlaşmağını və o fəsildə nə böyük büsatü əlamətlərin vüqua gələcəyini bir-bir yad edib, ərbabi-zövqü səfanın qəlbini və ruhunu təzələndirib, onlara yenidən həyat və səfa bəxş edir. Dəmi-İsa tək baharın lətif və gözəl nəsimi ruzigarı əhya edəcək:

Şükufə xəl'əti-əşcarı nöqrəduz edəcək,
Behişt əlaməti gülşəndə aşikar olacaq.
Dəhani-yar təkin qönçələr olur xəndan,
Səhab dideyi-aşiq tək əşkbar olacaq.
Şükufədən dönəcək bağ ruyi-cananə,
Bənəfşə bağdə manəndi-zülfi-yar olacaq.

Mərhum Seyid Əzim habelə nazikanə və şivəli tədbirlər ilə, ahəngdar ibarələr və canlı timsallar ilə bahar mövsümünü vəsf edib, onda bir qüsur qoymur və kəlamın axırını Şirvan şüərasına çöndərib, ah-zar və təəssüflə [deyir ki,] onlar şairlərdən üz döndərib kəmiltifatlıq göstərəcəklər və onun qəmli tərəfinə qəmküsar olmayacaqlar. Vəli şairin könlü bu fikir ilə açılıb şad olur ki, Asiya-dilxəstənin nəzmü nəsri Səfa ilə Şirvana gəlib onu şadü xürrəm edəcəkdir.

Tarixi-hicriyyənin 1280-ci[178] illərində Abdulla bəy Qarabağ hakimi Mehdiqulu xanın kəriməsi Xurşidbanu həzrətlərinin şairə xoş gəlməyən bə'zi işlərindən, xüsusən Seyid Hüseyn ağanın[179] o dərgəhə müqərrəb



olmağından rəncidəxatir olub, babası Qasım bəy mədhü tə'rif etdiyi dürriyektanı həcvə layiq bilib, onun şə'nində bir para föhşü latayil[180] söyləmişdi.

Əgərçi şair öz əməlindən axırda nadim və peşman olmuş isə də, lakin ağızlara düşən həcvi geri alıb xalqın ağzını qapamaq onun qüvvə və ixtiyarından xaric bir işdir və həcv nəinki tək Qarabağ mahalında, hətta sair vilayətlərdə dəxi artıq sürətlə intişar tapıb, Asi kimi məşhur və alitəb' şairdən belə qəbih, naşayəstə əməlin baş verməsi cümləni heyrət və təəccübə saldı və hər yerdən ona cavab yazılıb, şairi bədnam və bihörmət etdilər. Şairə cavab yazan Gəncədən Mirzə Mehdi "Naci" təxəllüs, Qazaxdan İskəndər ağa "Şair" təxəllüs və hətta Şirvandan Hacı Seyid Əzim ki, Asinin həqiqi [dostu] və onun təb'i-şe'riyyəsinə mədhü təhsin oxuyanlardan birisiydi, bu həcvin müqabilində ona cavab verməyi özünə borc bildi.

Belə rəvayət olunur ki, məzkur həcv yazılandan sonra xanlıq imarətində yuva tikmiş göyərçinlərdən birisinin ayağına bağlanıb buraxılıbdır və xanlıq qapısında göyərçinin ayağında bağlanmış kağızı görüb və onu tutub, kağızı açıb Xurşidbanu həzrətlərinin huzuruna gətiriblər.

Əvvəlcə haman həcvi Qarabağın özgə şairlərinə isnad veriblər, çünki Abdulla bəydən belə naqabil və çirkin əməl gözləməzdi, bir halda ki, şair özü də o qapıda müəzzəz və möhtərəm şəxslərdən birisi hesab olunurdu. Amma Xurşidbanu özü şe'rü mə'rifət sahibəsi olmağa görə, üslubi-kəlamdan və şiveyi-lisandan anladı ki, belə mövzun və abdar sözlər, həcv də olsa, ancaq Abdulla bəyin hünərindən naşidir.

"Bu nə tavus, nə bulvar, nə İsa bulağı" misrasını oxuduqda onda şəkk qalmayıb deyibdir ki, əlbəttə, bu, Asinin əsəridir və bu şe'r onun babası mərhum Qasım bəyin babilər haqqında yazdığı həcvdəki bir fərdə nəzirə misalındadır ki, deyibdir:

Bu nə Şiraz, nə Zəngan fücurü fisqin –
Hər tərəf kim, baxasan yoxdu hədü payani...

Həcvin ibtidası ki, müqəddimə tərzindədir, yarı farsi və yarı türki dilində artıq fəsahətlə nəzmə çəkilibdir. Burada şair öz könlünə rücu edib deyir:

Beşno, ey del, soxənəm tohfeye-hər əncomənəst,
Uyma dünyayə, bu dünyayi-dəni........ əst.
Çon cəvanane-Siyavuşsefəte-Zale-fələk,
Xuneşan rixte karəş həme məkresto fənəst.

Sağəre-badeye-qolqun bekəfə-meyxuran,
Kaseye-fərqe-Fəramərzo ləbe-Təhəmtənəst.
Dad əz dəste-qəzavo qədəre-bədhərəkat –
Ke, konun qədre-xəzəf beh ze əqiqe-Yəmənəst.
Becəhan nist kəs əz serre-zəmirəm vaqef,
Çare yox dərdimə bu dərd məni öldürənəst.
Ruzo şəb xune-cegər mixorəm Allah bilir,
Hasilin şəhri-Qarabağda dərdü məhənəst.
Şekveye-del beke quyəm ke, betəng amədeəm,
Çünki bilməz bu qəmi kimsə, əgər kuhkənəst.
Xofte rubahmesalan bekoname-şiran,
Qafe-Simorğ siyahətgəhe-zağo zəğənəst.
Xastəm şəmmei zənduhe-xodəm şərh konəm,
Del bemən xəndezanan qoft ke, ....... əst.
Guş qıl ta ki, yüzündən birini şərh qılım,
Zin soxənhast məra baese-ənduhe-mənəst[181].

Asinin həcvinə verilən cavablardan şayani-diqqət olanı, əlbəttə, Hacı Seyid Əzimin cavabıdır. Sairlərinki başdan-ayağa nalayiq föhşlərdir, cavab deyil.

Hacı Seyid Əzim isə Asinin təb'ini, elmü kamalını, nəzmü əş'arını tə'rif edib, izhari-təəccüb və təəssüf qılır ki, o öz təb'i-şe'rini ki, dövrana şöhrət salıb, həcvü əfsanə deməyə sərf eləyir və halanki:

Şaira, həcv demək izzətə bir maye deyil,
Şe'rdir, yaxşı-yamanı olu, bu, ayə deyil.
Həcvə adət eləmək şairə bir payə deyil,
Kişilik mayəsi ancaq ... deyil,
Var elə zən ki, biri əlli min oğlanə dəyər.

Sonra Seyid bir növ' töhmət və zəmm dilini açıb, Asiyə irad edir ki, biz Qarabağ əhlini qəyur və təəssüfkeş eşitmişdik ki, bir-birinin qeyrət və namusunu çəkir. Səndə bunun əksi görünmək, öz əhlinizi, xüsusən xan qızı kimi vəliyyün-niəminizi həcv etmək bir əmri-əcibdir ki, bizim cümləmizi heyrətə salıbdır.

Biz eşitmişdik olur əhli-Qarabağ qəyur,
Gözləyir bir-birini işdə bəqədri-məqdur,
Səndə bər'əksinə bu əmri-əcib etdi zühur,
Edib öz əhlinizi həcv, həm etmək məşhur,
Arif ol kim, bu raviş məşrəbi-ürfanə dəyər.

Hacı Seyid Əzimin yazdığı cavab ki, gözəl bir müxəmməsdir, bu sayaq başlanır:



Asiya, sözlərinin hər biri min canə dəyər,
Bir sözün qədrdə yüz min düri-qəltanə dəyər,
Nəzminin hər biri yüz lə'li- Bədəxşanə dəyər,
Bəhri-təb'in ki, göhər kanıdı, min kanə dəyər,
Xatirin gülşəni yüz rövzeyi-rizvanə dəyər.

Gərçi tifli-süxənə çoxlar olublar dayə,
Leyk bihudə salıbdır başını qövğayə,
Dəstrəs olmadı bir kəs göhəri-mə'nayə,
Gərçi çoxlar bu ərusi eləyir pirayə,
Sanma xamən kimi zülfi-süxənə şanə dəyər.

Şişə içrə səni ol kimsə ki, etmiş icad,
Hər pərizadə vüsalilə edibdir dilşad,
Xatirin xoş meyi-gülgun ilə, təb'in mö'tad,
Fərəhin çox, kədərin yox, dəxi mülkün abad,
Bu şərəf qədr ilə yüz mənsəbi-sultanə dəyər.

Bu da bir lütf ki, aləmdə xudavəndi-kərim
Lütf edibdir kəremindən sənə bir təb'i-səlim,
Olu viranə bu mə'murədə hər mülki-qədim,
Leyk itməz əsərin, şe'r ilə, ey dürri-yetim,
Bu fərəh, həqqi ki, yüz mülki-Süleymanə dəyər.

Təb'i-şe'rin ki, sənin şöhrət edib dövranə,
Leyk əfsanəyə sərf eyləməyin əfsanə,
Gəldi bir həcv bu günlərdə yenə Şirvanə –
Ki, demişdüz onu bir nəsli-əzimüş-şənə –
Ki, dəri-dövləti yüz dərgəhi-xaqanə dəyər.

Tapmısuz eyb bunu ol göhəri-yektadə –
Ki, gedib seyyidə, namusunu vermiş badə,
Bu deyil eyb, təfərrüc eləsən mə'nadə.
Gər bu xanzadə isə, ol biridir şəhzadə,
Həqqi ki, aləmi-mə'nadə bu iş canə dəyər...

Hacı Seyid Əzimin cavabı iki-üç benddən başqa tamamən Abdulla bəyə tənbeh və tövsiyədir və onun təb'i-gövhərsəncinin əfsanəvü hədyana sərf olunmasına pürməlalü ənduh bir təəssüfdür. Ol səbəbdəndir ki, Qarabağ şüərası mərhum Seyidin belə tənbehamiz cavabının müqabilində bir söz də deməyib, sair Asiyə həcv yazan şairlərin hörmət və abrusunu töküb dürlər. Xüsusən Mirzə Mehdiyə onun cavabı sərt olubdur. Və cavab yazanlardan məşhuru Mirzə Əli Əsğər Novrəs və Xarrat Qulu "Yusifi" təxəllüs olublar.

1291-ci tarixdə şəbanın qürrəsində[182] Abdulla bəy ömrünün hənuz cavan sinnində Şuşa şəhərində Allah rəhmətinə vasil olubdur və müasiri olan şüəravü üdəbavü zürəfaları böyük bir yasa mübtəla edibdir. Və bu vaqeeyi-pürməlal cümlədən artıq Qarabağ şairlərinə tə'sir edib. Onlar Şamaxı şairlərinə Asinin vəfatını belə xəbər veriblər:

Xəzan olsun görüm fəsli-bəhari,
Dəmadəm tirə bulsun ruzigari!
İlahi, yetməsin bülbül muradə,
Çəkə gülşəndə daim rənci-xari.
Dəxi baş çəkməyib düşsün həvadən
Cahan bağında sərvi-cuybari.
Təravət tapmasın gül, qönçə qalsın,
Ola sünbüllərin aşüftə, tari!
Solub düşsün görüm mərdüm gözündən
Dəmadəm nərgisi-məsti-xumari!
Axar sular görüm al qanə dönsün,
Qurusun nəhr içində abi-cari.
Təəyyüş məhv ola səhni-çəməndə,
Tuta xaşak tərfi-keştizari.
Bahar olcaq əzəl çəksin xəcalət,
Bənövşə, qasidi-fəsli-bahari.

Neçün kim, Asiyi-zarü fitadə
Əcəl peymanəsindən içdi badə[183].

Ola eşq əhlinin eşqi məcazi,
Həqiqət birlə yoxdur imtiyazi.
Neçün ağaz qılsın dildən aşiq
Nəvadi-dilkəşü suzü güdazi.
Olub sakit, deməz Məcnun üçün el
Dəxi əfsaneyi-tulü dirazi.
Bəli, Mahmud şahın var həqqi,
Fəramuş eyləsə mehri-Əyazi.

Sanır Fərhadi-məhzun təlx kamın,
Edə Şirin ona gər işvə, nazi.
Züleyxa vəslini tərk etdi, bolmuş
Məhi-Kə'nanə töhmət eşqbazi.
Dəxi bundan sora əhli-məhəbbət
Edərmi şövq ilə razü niyazi?!

Neçün kim, Asiya-zarü fitadə
Əcəl peymanəsindən içdi badə.



Şəhid olsun şəhidi-kuyi-canan,
Tapa bəlkə təriqi-kamrani.
Bu şəhr içrə həsari-ümdə Salar
Büłənd etsin gərək suzi-nihani.
Qaranın ruzigarı tirə bolsun,
Pərişan könlü olsun zülfi-sani.
Qılıb Məxfi fəğanın aşikara,
Yanıb bu qüssədən cism ilə cani.
Qaradaği[184] bu dağ içrə yanıbdır,
Ola bərhəm bu dövri-asimani.
Fəna seyr eyləsin rahi-fənani,
Odur vaqedə ömri-cavdani.
Qurtarmaz Yusifi çahi-bəladən
Görə gər vəsləti-Yusifliqani.
Olub bu qüssədən Agəh xəbərdar,
Dəmadəm künci-qəmdir aşiyani.
İlahi, Novrəsi-məğmumü məhzun
Görərmi bir də ruyi-şadimani?

Neçün kim, Asiyi-zarü fitadə
Əcəl peymanəsindən içdi badə.

Bəzi nüsxədə tərci olunan bəndin ikinci misrası "Əcəl saqisindən nuş etdi badə" yazılıbdır.

Abdulla bəyin təxminən min beş yüzə qədər əfradı vardır ki, ibarətdir müxəmməsat, müstəzad, tərcibənd, qəzəliyyat, təcnis və növhəcatdan. Heyfa ki, bu əsərlərdən çoxusunu ələ gətirməkdə aciz qaldıq. Növhələrindən nümunə üçün birisini ki, İmam Hüseyn əleyhissəlamın rəşid və gözəl oğlu Əli Əkbərin qətli barəsində tənzim olunubdur, burada dərc olunur:

Yıxdılar atdan çü Əli Əkbəri,
Səslədi Abbasi-ələmpərvəri:
Nadə Əliyyən, Əliyyən, ya Əli!
Gül bədənin Xuliyü Şimrü Sən'an

Etdilər amaci*-xədəngü sinan.
Zərrəcə rəhm eyləməyib kufiyan,
Qətlinə məcmu'isi oldu cəri,
Nadə Əliyyən, Əliyyən, ya Əli![185]

* A m a c – nişan

Xiyməgəhə üz tutub ol məhliqa,
Ərz elədi key şəhi-Kərbübəla,
Gəl, başımı al dizinə, ya əba,
Payinə isar eləyim bu səri',
Nadə Əliyyən, Əliyən, ya Əli!

Almamışam mən bu cahan içrə kam,
Etməmişəm toy otağında məqam,
Xeymədə yol gözlər o bikəs anam,
Yox bu qərib ölkədə bir yavəri,
Nadə Əliyyən, Əliyyən, ya Əli!

Qoyma, baba, bikəsü biyavərəm,
Hüsndə mən saniyi-peyğəmbərəm,
Bir nəzər et, axır Əli Əkbərəm,
Qoyma dəxi kim, uralar xəncəri,
Nadə Əliyyən, Əliyən, yə Əli!

Gəl, özünü Əkbəri-zarə yetür,
İstidi qum, başımı yerdən götür,
Leyk gələndə anamı həm gətür,
Sağ görə bəlkə Əliyi-Əkbəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Çünki eşitdi bu sədanı Hüseyn,
Qoydu belinə əlin ol şahi-din,
Günbədi-çərxə yetirib şurişin,
Eylədi piçidə o dəm ləşgəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Ta ki, başı üstə yetirdi özin,
Eylədi balış başı altda dizin,
Pak elədi qandan o şəhla gözin,
Aldı qucağına o məhpeykəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Ərz elədi Əkbəri-gülgünkəfən,
Ya əbəta, həqqi-imami-Həsən,
Mən gedirəm, lütf elə Leylayə sən,
Zeynəbə tapşırgilən ol müztəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Hansı cəfalar ki, o qövmi-dəğa,
Görmədilər şahi-şəhidə rəva?!
Qoydular ol Qasimə qandan həna,
Tirə hədəf eylədilər Əsğəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!



Ləşkəri-küffar çü səf qurdular,
Ol şəhin ənsarini öldürdülər,
Xiymeyi-peyğəmbərə od vurdular,
Etmədilər yad şəhi-kövsəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Ziynəti-əhli-hərəmi hər nə var
Qarət edib ləşkəri-kin aldılar,
Etdilər üryan dəvə üstə səvar
Zeynəbi-biçarəvü qəmpərvəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Fatimə, ol düxtəri-sibti-rəsul
Gərçi murad almayıban qaldı dul,
Qeyrəti-Qasim necə eylər qəbul,
Şamə gedə, olmaya bir məcəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Qıl nəzər, ey padşahi-məşriqeyn,
Yekkə qalıb Kərbübəladə Hüseyn,
Hanı o əl eylədi fəthi-Hüneyn,
Götürdü şirvar dəri-Xeybəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

Lütf elə, ey novgüli-bağı-Xəlil,
Asiyi-miskin sənə olmuş dəxil,
Qoyma ki, məhşər günü olsun zəlil,
Rövzeyi-rizvanə sən ol rəhbəri,
Nadə Əliyyən, Əliyən, ya Əli!

# İBRAHİM BƏY "AZƏR"

Mərhum Abdulla bəy Asinin müasirlərindən Qarabağda məşhur olanları: Bunlardan Abdulla bəyin öz qardaşı İbrahim bəy Əli bəy oğlu Fuladov "Azər" təxəllüs çox zərif, bakəmal və xoşxülq bir adam idi. Sinndə qardaşı Abdulla bəydən böyük idi. Rusca dəxi yaxşı savadı var idi. Vəkillik edərdi. Təb'i-şe'riyyəsi dəxi var idi, amma bu qədər rəvan deyildi, necə ki, Abdulla bəyin təb'i səri' idi. Vəfatı ittifaq düşübdür tarixi-hicriyyənin indiki on dördüncü əsrinin ibtidalarında – min üç yüz birdə və ya ikidə[186]. Yaxşı və mövzun qəzəlləri var, türk və fars dilində.

Qəzəli-türki:

Ahu kimi baxanda o məstanə gözlərin,
Baxdıqca eyləyir məni divanə gözlərin.

Fərhad kimi mən kimiyə dağ çapdırır
Şirin baxışlı xosrovi-xubanə gözlərin.

Hər dəm ki, istəsə baxa bir gəc nigah ilə,
Yüz min könül yıxar yenə cananə gözlərin.

Zənciri-eşqini salıban boynuma mənim,
Bak etməyib çəkər məni hər yanə gözlərin.

Eşqin edibdir Azəri-dilxəstəni cünun,
Məcnun sifət salıbdı biyabanə gözlərin.

Qəzəli-digər:

Arizin göstər gülə gülşəndə həmralənməsin,
Qəddi-rən'a qarşısında sərv balalənməsin.

Zülfi-mişkini-müsəlsəldə xəcil qıl sünbülü,
Çeşmi-məstin nərgisə göstər ki, şəhlalənməsin...[187]

Mahi-nov kimdir günəş puxsarın ilə bəhs edə,
Bir kəsinti dırnağınla hiç qürralənməsin.

Çün könül məhbusdur zülfündə, gəl bir rəhm qıl,
Vurma əl zəncirə zindan əhli qövğalənməsin.

Gər sənin eşqində Azər olsa rüsva, eybi yox,
Kuhkən Şirindən ötrü necə rüsvalənməsin?!



# MİRZƏ ƏBÜLHƏSƏN İBN KƏRBƏLAYI QASIM QARABAĞİ "ŞƏHİD"[188]

Mərhum Molla Zeynalabdin Sağəri ilə bir əsrin adamıdır[189].
Qəzəli-Şəhid:

Vahəsrəta ki, tərki-vəfa qıldı yarlər,
Əfğan ki, keçdi həsrət ilə ruzigarlər.

Dərda ki, yarsız qəmi-hicr aldı canımı,
Qaldı könüldə məhşərə çox intizarlər.

Sövdayi-zülfü xəttini başdan çıxarmazam,
Gər başım içrə məskən edə mur, marlər.

Künci-qəfəsdə bülbüli-miskin edər fəğan,
Tutmuş məqam səhni-gülüstanda xarlər.

Əfsus, gül eşitmədi bülbül nəvalərin,
Yetdi xəzan gülşənə, keçdi baharlər.

Ömrüm əziz saxla, Şəhid, olsa gər nəsib,
Əyyami-vəsl lazım olur çox nisarlər.

Qəzəli-farsiyi-Şəhid:

Ey an ke, şure-eşqe-to oftade bər sərəm,
Qeyr əz to nist dər do cəhan kame-digərəm.

Ta dər deləm həmişe xəyalət mosəvvərəst,
Dər dide nist coz to behər ca ke, bengərəm.

Şouqe-roxe-to pirəhəne-səbre-mən dərid,
Digər mən əz kocə ke təhəmmol bər avərəm?

Peyvəste zekre-name-to verde-zəbane-mən,
Peyvəste nəqşe-ruye-to dər del mosəvvərəm.

Nəzzareye-cəmale-to yekdəm bekame-del
Xoştər bovəd ze məmləkəte-həftkeşvərəm.

Ba hər çe dər cəhan beteqabol nəzər konəm,
Zibatər əz to nist digər pişe-mənzərəm[190].

Qəzəli-digər:

Toi konun ke bexubi boləndmərtəb'e şahi,
Qətile-tiğe-to şəhri, nə ləşkəri, nə sepahi.

Betələti ke, to dari məra nəmand qərari,
Nədanəmət beçe mani nə aftabo nə mahi.

To dər moqabele-çeşmi vəli məra ze təhəyyor
Nə qodrəti betəkəllom nə corəti benegahi.

Çe xanəmət ke, to şirintəri zehər çe bequi,
Çe quyəmət ke, zibatəri ze hər çe bexahi.

Məra ze padşəhi beh nəzər beruye-to kərdən,
Beğeyre-qorb nəxahəm mənsəbiyo nə cahi.

Hezar bar betiğ ər zənənd əz to nəgərdəm,
Ze meyle-kahroba exteyar nist bekahi.

Be şouqe-anke mənəm əz to dide baz nəpuşəm, –
Ke, məne-nəxl koca əz əsəl təvand sepahi.

Beezterar ke darəd zedidəne-məhe-ruyət,
Şəhide-eşq nədarəd beruze-həşr qonahi[191].



## MİRZƏ HÜSEYN BƏY "SALAR"

Abdulla bəy Asinin müasiri, əhli-kəmal və sahibi-təb'i-səlim olan şairlərdən birisi də Mirzə Hüseyn bəy vələdi-Məhəmməd ağa "Salar" təxəllüs idi[192]. Çox pürməzmun fars qəzəlləri vardır və gözəl türk qəzəlləri çoxdur. Onlardan birisini nümunə üçün məcmuəyə daxil edirik:

Mari-siyahi-zülfün edər xanə könlümü,
Qıldı məhəlli-gənc bu viranə könlümü.

Tiri-bəlayə etdi hədəf aqibət məni,
Ya rəb, görüm ki, seydvəş oxlanə könlümü.

Qəmzən çəkib xədəng, qaşın tir ilə kəman,
Qanlı kimi çəkər hərə bir yanə könlümü.

Qoyma ki, şanə dil uzada tari-zülfünə,
Allah üçün batırmagilən qanə könlümü.

Xalın həvası ilə könül qondu zülfünə,
Axır əsiri-dam elədi danə könlümü.

Hər sübhlər bu xəstə dili xəstə eyləyir
Gahi nəsimi-sübh, gəhi şanə könlümü.

Salarını qoyub qəmi-hicranda mübtəla,
Rəhm eyləməz, edər yenə viranə könlümü.

# MİRZƏ HAQVERDİ "SƏFA"

Mərhum Mirzə Əlinin oğludur ki, sabiqdə Şuşa qazisi idi[193]. Mirzə Haqverdi ziyadə dəqiq və zərif bir vücud idi və əş'arü kəlamından belə anlaşır ki, Şeyx Əttar və Şəms Təbrizi kimi böyük və fazil ədiblərin asari-cəlilələrindən feyzü kamalat əxz edib, onların tutduğu təriqü məsləkdə müdavimət edib şe'r deyərmiş və əş'arının çoxusu fars dilində yazılıbdır.

Qəzəli-Səfa:

Ətəş fekəndə bər çəmən aho fəğane-ma
Çon suxt bağban beçəmən aşeyane-ma.

Tarac kərd zağe-siyəh busetane-ma,
Bərçide şod ze bade-xəzan qolsetane-ma.

Zağe-siyəh ço kərd neşimən beşaxe-qol,
Xamuş gəşt bolbole-xoşnəğmexane-ma.

Ğeyr əz rəğib bər dəre-to dadxah nist,
Key miresəd beguşe-to raze-nehane ma.

Səhləst gər hezar cəfa bər Səfa resəd,
Ğeyr əz bəla nədide təne-natəvane-ma[194].

Məsnəviye-Mirzə Haqverdi:

An ke, dur oftade əz Hendustan
An məne-qamdideəm, ey dustan!
An ke, dur oftad əz bostane-ons,
An mənəm, ey tayerane-bağe-qods!
Baz seyre-aləme-can kərde del,
Baz yade-əhde-canan kərde del.
Balfekən gəşt morğe-ruhe-mən,
Dər həvaye-bağo rağo əncomən,
Darəd əndər sər həvaye-əndəlib,
Bəhre-qol darəd nəvahaye-ğərib,
Aşeqe-məhcur yade-vəsl kərd,
Bin ke-Məcnun meyle-suye-əsl gərd.
Naleye-del huşəm əz sər bord baz,
Yad əz yaro diyar avərd baz.
Canebe-qolşən məgər darəd həvəs,
Rəxnəəfkən gəşte morğ əndər qəfəs.
Movtəne-əsli beyade-del fetad,
Kare-del bare-degər moşkel fetad.



Ey dəriğa, şod bəharo qol qozəşt,
Şod çəmən əfsordevo bolbol qozəşt.
Gər cərəsvarəm ze del xizəd fəğan,
Ney əcəb vamandei əz karvan.
Ey xoş an bəzmi ke, vəcde-hal bud,
Məcməi-ruhaniyan əhval bud.
Məhfe'le-qodsi kəlaməş məşqe-yar,
Məclese-onsiyo şinəş eşqe-yar.
Ey xoş an dərsi ke, Eşraqi bovəd,
Ey xoş an şərhi ke, Moştaqi bovəd!
Rəft xorşido məhe-ənvər kocast?
Xoşk şod dərya, vəli qouhər kocast.
Gərçe məhcubəst əz rox ruye-yar,
Leyk surət darəm əz vey yadeqar.
Gər besurət durəm əz an delroba,
Leyk darəm dər del əz vey kəhroba.
Suye- mə'na mikeşəd cane-məra,
Minəmayəd rahe-canane-məra.
Ey ze dərya mande qouhər yadeqar,
Vey qolabe-qolsetane-ətre-yar,
Zan qohər bəxşa ziyai çon çerağ,
Zin qolabəm ətrpərvər kon dəmağ.
Qah-qahi yade-in məhcur kon,
Ture-delra əz təcəlli nur kon.
Qah-qahi nafehai əz tətar,
Qah-qahi namehai meşkbar.
Suye-in oftade dur əz an hərəm,
Cane-mən, befrest əz rahe-kərəm
Namei kan əz diyare-yare-mast,
Behcətəfzaye'-dele-bimare-mast.
Hər nəsimi kəz diyare-yar xast,
Cane-aşeqra bəsi rahət fəzast.
Bər gereftaran hədise-yar xoş,
Pişe-bolbol söhbəte-qolzar xoş.
Mən ke, dur oftadəm əz yaro vətən,
Bər şoma xoş bad, ey yarane-mən!
Bənd-bəndəm çon bər aməd dər fəğan,
Əlaman, əz dərde-hecran, əlaman[195]

# KƏRBƏLAYİ QULU XARRAT VƏLƏDİ-MƏHƏMMƏD PƏRİ NAZZADƏ "YUSİFİ"

Kərbəlayi Qulunun sən'əti xarratlıq idi. Çox dəqiq və əhli-zövq, şirinkəlam bir şəxs idi ki, cümlə Şuşa əhli onu əziz və mehriban tutardı. Öz sən'ətində artıq məharəti olduğu kimi, elmi-musiqidən dəxi baxəbər idi və Qarabağın məşhur xanəndələri ki, ibarət[dir] Hacı Hüsidən, Məşhədi İsadan, Çətənə Məhəmmədin oğlu Əsəddən, Əbdülbaqi və qeyrilərindən, onun dəstpərvərdələridir.

Kərbəla faciəsinin şəbihini göstərməkdə onun misli yox idi. Belə ki, şəbihgərdanlığın binasını və ziyadə şükuh dəstgah ilə bu hüznavər keyfiyyətin macərasını tə'sis və təşkil etməkdə onun yədi-beyzası vardı.

Belə rəvayət olunur ki, bir dəfə bir işdən ötrü Kərbəlayi Qulu Tiflisə gəlibmiş. Öz dəstpərvərdəsi olan Əbdülbaqidən kəme'tinalıq izhar edibdir və Kərbəlayi Qulu bunun səbəbini bilmək istədikdə cavan xanəndə onun cavabında sərt sözlər ilə deyildir ki: "Mənim nişəst-bərxast etdiyim adamlar Tiflisin nücəbası və gürcü knyazlarıdır. Səninlə mənim nə əlaqə və rəf'-rücuum ola bilər?" Kərbəlayi Qulu onun müqabilində cavab verib ki: "Sən sövtünlə məğrurlanıb ustadına kəc baxırsansa, əlimdəki sən'ətim dəxi mənim üçün mayeyi-fəxrdir və məni sənə hərgiz möhtac etməz". Bu göftügudən sonra Xarrat Qulu bir zərif qəlyan səri' qayırıb və onun üstünə bu şe'ri yazıb, o vaxtdakı Qafqaz canişini veliki knyaz Mixail Nikolayeviçə[196] təqdim edibdir:

Çube-zəifra əgərəş tərbiyət dəhi,
Cayi rəsəd ke busəgəhe-xosrovan bovəd[197].

Xarrat Qulunun belə zərif işi sərdara xoş gəlib, ona hədiyyələr ə'ta edibdir və Əbdülbaqi öz işindən xəcalət çəkibdir.

Mərhum Abdulla bəy yazdığı həcvə cavab verənlərdən, necə ki, sabiqdə zikr olundu, birisi də Mirzə Mehdi Gəncəvi idi – "Naci" təxəllüs. Çün Naci cümlə Qarabağ əhlinin irzü namusuna toxunub, İbrahim xanın hər gecə bir düxtəri-bakirə almağına işarə qılmışdı, ol səbəbdən şüərayi-Qarabağ ona cavab verməyi özlərinə borc bilib, bu əmri Xarrat Quluya həvalə etmişdilər ki, həcvguluqda onun misli yoxdu. Və Xarrat Qulu dəxi dörd həcv dalbadal Naciyə göndərmişdi. Əvvəlki həcvin axırını bu şe'rlər ilə qurtarır:

Çöp uzatmaz arının deşiyinə bir əhməq,
Çünki niştər kimi var nişi onun, niş uranəst.



Təmə'i-xəl'ət ilə özünü saldın tələyə,
Bəli, quyruq görə tülkü tələ içrə düşənəst.

Mehdiya, məhdi-təfəkkürdə idi tifli-xəyal,
Oyadıbsan yuxudan, eylə yəqin yatmayanəst.

Dəxi bundan sora tab eyləgilən, gör ki, sənin
Həcvinə rağib olanlar nə qədər əhli-fənəst.

Yusifi, Asivü Novrəs, biri Mahmud, Fəna,
Biri Salar, biri Sadiqi-gürgi-köhənəst.

Dəxi Agahü Qara, Nazimü Məhzun, Şəhid,
Fənni-əş'ardə hər birisi bir əhrimənəst.

Katibü Aşiqü Məxfiyyü Həkimü Müznib,
Azərü Sabitü Hicriyyü Vəfara hünərəst.

Şüəra əllərinə düşdü əcəb dəstaviz,
Etməyincə səni rüsvayi-cahan əl çəkənəst?

Ol xəbərdar yəqin "Beyti-xəmuşan" əhli
Hər biri həcv yazıb qulluğuna göndərənəst.

Şiri-dərrəndələrin saxlamışam zəncirin,
Yoxsa rubah şikar etməyə cümlə gedənəst.

Müntəzirdir şüəra Gəncə ara ta görələr
Bəyü xanzadə nə gunə sənə tənbeh edənəst.

Qəzəli-Yusifi:

Baz dər Mesre-çəmən Yusefe-qol peyda şod,
Əndəliban ço Zoleyxa besəre-ğoyğa şod.

Həmço Fərhad bər aməd befəğan morğe-çəmən,
Qonçe əz bade-səhər çon ləbe-Şirin va şod.

Bər dele-lale əyan gəşt ço Məcnun dağı,
Nərges əndər çəmən əz eşvəgəri Leyla şod.

Gəşte çon Vameqe-bidel beqolestan bolbol,
Dər qolestan qole-əhmər ço roxe-Əzra şod.

Ləblərin bir abi-heyvandır, xətin zülmət ona,
Böylə zülmət içrə Xızrın çeşmeyi-heyvanı yox.

Hər ay olduqda müdəvvər var bir nöqsanı, leyk
Bədrlənmiş aydır, ol arizin[in] nöqsanı yox.

Zülfünə eşq əhli iman verməyin zahid əgər
Küfr söylərsə, nola ol kafirin imanı yox.

Hər qəm olsa dəhrdə derlər ki, bir payanı var,
Gör nə qəmdir dərdi-hicrin kim, onun payanı yox,

Yar cövrü təndə mehman olsa, xoşdur könlümə,
Tarmar olsun o evlər kim, onun mehmanı yox.

Hər vüsalın aqibət aləmdə bir hicranı var.
Talibəm mən ol vüsalə kim, onun hicranı yox.

Dərdimin tədbirini sordum Fəlatundan, dedi:
Məxfi, dərdin eşq dərdidir, onun dərmanı yox.

Bu qəzəldə xeyli xoşməzmun şe'rlər vardır ki, möhtərəm oxucuların onlara ətfi-diqqət etmələri məmuldur. Məsələn:

Yar cövrü təndə mehman olsa, xoşdur könlümə,
Tarmar olsun o evlər kim, onun mehmanı yox.

Əyzən qəzəli-Məxfi:

Müsəlsəl türreyi-tərrar gahi rast, gahi kəc,
Tökülmüş qamətə, oynar gahi rast, gahi kəc.

Düşər gəh rast zülfün qamətə, gəh kəc, bu, adətdir.
Çıxar sərv üstünə şəhmar gahi rast, gahi kəc.

Yenə qan etmək istərmi, baxır çox xəşm ilə çeşmin,
Misali-mərdümi-xunxar gahi rast, gahi kəc.

Vüsalın gəh qılır qismət mənə, gah hicrini dövran,
Dolanır çərxi-kəcrəftar gahi rast, gahi kəc.

Baxır çeşmin rəqibə düz, mənə kəc, bir məsəldir bu,
Gedər yol mərdümi-xummar gahi rast, gahi kəc.



Dolanma müddəilər xatirin xoşnud etməkçün
Bəzm, ey yari-mahruxsar, gahi rast, gahi kəc.

Qaşın tağına səcdə etmək üçün ruzü şəb, ey məh,
Olur hər zahidi-dindar gahi rast, gahi kəc.

Görüm bərbad ola ol nöh rəvaqın, ey fələk, yeksər –
Ki, bəxtimlə mənim oynar gahi rast, gahi kəc.

Qalıb sövdayi-zülfün içrə Məxfi zarü sərgərdan,
Dolanır hər tərəf naçar gahi rast, gahi kəc.

## HƏSƏN BƏY RZAQULU BƏY OĞLU "HƏSƏN QARA" VƏ "HADİ"

"Beyti-xamuşan" üzvlərinin müqtədirlərindən birisi də Rzaqulu bəy oğlu Həsən bəy idi ki, "Həsən Qara" və "Hadi" təxəllüsü ilə məşhur idi. Onun türk və fars əş'arü qəzəliyyatı çoxdur. Nümunə üçün bir türk qəzəli bu məcmuəyə daxil olundu:

Şəbi-zülməti-zülfündə fəğanü ahü zarım var,
Vüsali-sübhi-ruyin feyzinə çox intizarım var.

Kəsilmiş taqətü tabü təvanım, tarı şahiddir,
Nə yol bullam vüsalə, hicrə və səbrü qərarım var.

Nigara, məhcəbina, qəddi-sərvin iştiyaqında
Edən hər ləhzə cari çeşmə çeşmi-əşkbarım var.

Sənə birəhmlik bunca nədəndir bilməzəm, zalim,
Gətirməzsən xəyalə kim, mənim bir dilfikarım var.

Hüzurunda, əzizim, zərrəcə hərçənd qədrim yox,
Vəli qəmlər yanında şaxisəm, çox e'tibarım var.

Sənin əqdi-sürəyya tək cəb'inində ərəq mənzum,
Mənim də xab görməz dideyi-əncümşümarım var.

Açar müjgan oxu, Hadi, xəyalımdan neçə rövzən,
Xəyalə girməyə, vəh-vəh, nə bəxti-huşyarım var.

Bəzi rəvayətə görə bu Həsən Qara haman Hadiyül-Müzəllindir ki, "Əkinçi" qəzetinin banisi Həsən bəy Məlikov və "Əkinçi"nin müqtədir mühərrirlərindən Əhsənül-Qəvaid cənabları aşura günü baş çapmağın qəbahətini və şəriəti-qərraya ziddü bər'əks olmasını yazdıqları üçün Həsən bəyi həcv etmişdi. Həsən bəy isə qəzetə əlavə olunan qit'ələrdən birisində Hadiyül-Müzəllinin həcvini atidə zikr olunan irad ilə məən dərc etmişdi: "Cənab Hadiyül-Müzəllin Qarabağinin aşağıda zikr olunan həcvini, onun xahişinə müvafiq tamam çap etməyə izn olmadı. Ona binaən onların bir para nalayiq və hədyan sözləri qaldı. Amma ol cənab və onu fitləyən əşxaslar mə'yus olmasın ki, belə kamallı sözlər pünhan qalacaq. Fikrim budur ki, bizim Zərdab kəndində Qarabağın sərhəddində bir daş qoydurub, onun üstə zikr olunan həcvi tamam qazıdım ki, gələcəkdə bizim övlad o yadigara baxıb bilsinlər ki, mən bu zəhmət ilə milləti islamı qəflətdən ayıltmaq istəyən vaxtda necə nadanlara rast gəlmişəm".



Hadinin həcvi bu sayaq başlanır:

Ey edən fisqini aləmdə nümayan Həsən!
Dadmayan dəhrdə bir ləzzəti-iman Həsən!
Şəri-qərrayə vuran qəsd ilə nöqsan Həsən!
Eyləyən öz-özünü bisərü saman Həsən!

Qarabağ əhli artıq dindar və övladi-Mustafaya dustdar olduqlarından "ağköynək məsələsi"nə[201] irad tutmaq onlarda dinə toxunan və naşayəstə əməllərdən biri hesab olunurdu. Cənab Həsən bəyin bu məsələni araya qoymağı, xüsusən ibtidayi-karda, qırx il bundan əqdəm ki, indiki halımıza nisbət camaatımız cəhalət və avamlıq halında idilər, əlbəttə, böyük bir səhv idi və "Əkinçi"nin bir nömrəsində Qarabağ əhlindən bir nəfəri Həsən bəyə kağız yazıb, ona mə'lum etmişdi ki, aşura barəsində qəzetdə çap olunan hadisə cümləmizi mükəddər etdi və bə'zilərini sizin qətlinizə dəxi mühəyya edibdir.

Hadiyül-Müzəllin Qarabağinin cavabı ki, mərhum Hacı Seyid Əzim tərəfindən yazılmışdı. "Əkinçi"nin 10-cu nömrəsində 1294-cü ildə ki, tarixi-məsihiyyənin 1877-ci ilinə mütabiqdir, çap olunmuşdu. Haman cavabı bir para həcvmanənd bəndlərindən savayı eynilə burada zikr etməyi münasib gördük:

Ey olan hadiyi-ərbabi-zəlalət Hadi,
Ey Müzəllini edən həqqə hidayət Hadi,
Eylədin sən ki, bu mehdiliyə adət, Hadi,
Elə bəs aləmə təbliği-risalət, Hadi!

Leyk peyğəmbər olan həcv eləməz ümmətini,
Kişi lazımdı çəkə ümmətinin qeyrətini,
Gərçi həcv eyləyənin yoxdu kəsən sünnətini,
Sənə bu həcv nə fərz idi, nə sünnət, Hadi!

"Əhsənül-Qaidə"nin sahibi, yaxud özü bəg,
Yazmış idi: nə rəva xəlq olur ağköynək?
Sən, oba aşrı, əzizim, nəyə lazım hürmək,
Nə üçün eylədin izhari-ədavət, Hadi?!

İnşaallah saba-birgün yetişir mahi-əza,
Gey kəfən, yar başını, tök yaşını, bağla qara,
Səni meydanda görən kimsə desin: namxuda
Eləyibdir yenə aləmdə qiyamət Hadi.

Əlini tutmadı bir kimsə ki, qardaş, sənin,
Can sənin, cism sənin, tiğ sənin, baş sənin,
Cəm' ola baxmağına sünni, qızılbaş sənin,
Baxıban onlara sən eylə fəxarət, Hadi!

Kim deyər ağlama sən Kərbübəla sərvərinə,
Canımız cümlə fəda olsun onun Əkbərinə,
Ağladı ərzü səma təşnə ölən Əsğərinə,
Onu inkar edənin zatına, lə'nət, Hadi!

Leyk siz bir para bid'ətlər edibsiz icad,
Qoymusuz adını siz tə'ziyə, ey əhli-fəsad!
Sizə bu tə'ziyədən özgə həvəslərdi murad,
Mən ölüm, sən bir özün eylə mürüvvət, Hadi!

Bu deyilmi qərəzin başını sən çapmaqdan,
Yəni ki, canımı canana edərdim qurban,
Malını bəs nə üçün eyləməyirsən ehsan,
Quru baş çapmağa sən etmisən adət, Hadi!

Xatirin cəm' elə kim, gər bu isə rəsmi-əza,
Sənə nifrin edəcək padşahi-Kərbübəla,
Bədənin zəhmətinə şərdə yoxdur fitva,
Yoxsa var sizdə, görək, tazə şəriət, Hadi?

Xaçpərəstlər hamısı açdı gözün düşdü qabaq,
Dalda qaldıq tökülüb cəhl ilə biz, ay sarsaq!
Bəs nə vaxtı bizə qismət olacaq göz açmaq?
Əqlə gəl, tarıya bax, bəsdi bu qəflət, Hadi!

Bu hədisi nə zaman zikr qılıb peyğəmbər –
Ki, olur rus diliylə oxuyan kəs kafər?
Allah, Allah, bu nə böhtandır, ey hiylətgər,
İxtilafati-lisandır bizə ne'mət, Hadi!

Kim ki, bir dil bilə bir ne'mətə ol vasildir,
Kim ki, çox bilsə, o çox ne'mətə bəs şamildir,
Leyk aləmdə hər ol kimsə ki, naqabildir,
Edəcək qeyr lisanı o, məzəmmət, Hadi!

Biz də müddət "Zərəbə Zeyd" kitabın oxuduq,
Rişteyi-ömrümüzü nəhv ilə sərfə toxuduq,
Barı biz taifə əzzəldə yenə bir ...,
Olmuşuq indi dəxi eyni-nəcasət, Hadi!



Tut, Həsən bəy, bizə tə'lim eləyir dərsi-zəlal,
Götürüb boynuna ol kafər olub vizrü vəbal,
Niyə tə'limə siz ətfal qılırsız irsal,
Bilməyirsiz niyə bəs eybü qəbahət, Hadi?

Oxudur cümlə uşaqlarını xanü bəyiniz,
Ne'məti-rus ilə pərvərdə olub cəmdəyiniz,
Bilməyən rus dilini bəlkə ola tək-təkiniz,
Sizdədir hamıdan artıq ona rəğbət, Hadi!

Mərhəba mülki-Qarabağ ə'zadarları,
Tarı əfzun eləsin siz təki dindarları,
Seyyida, bəsdi, əgər görsə bu əş'arları,
Çəkəcək tutduğu kirdarə xəcalət Hadi!

Haman sənə "Əkinçi"nin 12-ci nömrəsində Hadiyül-Müzəllinin əfzəli-şüəra Hacı Seyid Əzim Şirvaninin cavabında yazdığı əş'ar dərc olunmuşdu. O kəlamı-mövzunu dəxi burada zikr edirik:

Ey bizi həcv qılan şairi-dövran Əzim,
Seyyidü sərvərü sərdari-süxəndan Əzim,
Dəhr gülzarı ara bülbüli-xoşxan Əzim,
Əzizim, ikki gözüm, cəddinə qurban, Əzim!

Şə'nin üzmadı əgər biz deyilik əzmi-rəmim,
Abi-heyvan dəkisən, biz dəxi qəssaq, həmim,
Seyyidin təb'i kəramətli olur, nəfsi səlim,
Nə rəvadır deyəsən hərzəvü hədyan, Əzim?

Sən əgər ali-Əlisən, hanı qeyrət, de görüm!
Haşimisən, qürəşisən, hanı qeyrət, de görüm!
Allah, Allah, nədi bir böylə qəsavət, de görüm!
Sakit ol, samit otur, sındımı peyman, Əzim?!

Cəddini mədh edən vəqtdə, əya alicənab,
Niyə qarnına düşüb sancı, edirsən təb'ü tab?
Sən də mən kimi gözün yaşını tök, başını çap,
Cəddini yaxşı tanı, mərtəbəsin qan, Əzim!

Aç bəsirət gözünü şahi-şəhidanə tərəf,
Baxgilən Kərbübəla səmtinə meydanə tərəf,
Məhliqa canları gör, tiği-cəfa ilə tələf,
Gör ki, sən də olusan qanına qəltan, Əzim!

Şur başında əgər olsa, bilirsən ki, nə var,
Eşq gülzarına gəl, seyr elə bir, keçdi bahar,
Qumriyü bülbülü cüğdü necə görə zarü fikar
Eşq sultanına olmuşlar ə'zaxan, Əzim!

Gər desəm həcv sənə, cümlə müsəlmanə dəyər,
Zəmm daşın gər atam, şişeyi-imanə dəyər,
Bədənə hadis olan sədmə yəqin canə dəyər,
Nə edim, çarə nədir, cuş qılır qan, Əzim!

Hüsni-xülqi bizə mə'lumdu Mirzə Həsənin,
Yox lüzumu o cənabə dəxi iqrar sənin,
Mənbəi-feyzdir aləmlərə kani-kərəmin,
Mə'dəni-elmü ədəb, məlcəi-ürfan Əzim!

Kim deyir rus dili bid'ətdir aləm ara,
Cahili əlsinələr xiclətdir aləm ara,
Hər dilin mə'rifəti izzətdir aləm ara,
Mə'rifət elmini kim eylədi ketman, Əzim!

Dəxi bihudə danışma sən, əya paknihad,
Nəfsi-əmmarə ilə Hadi kimi eylə cəhad.
Hüzn ilə qan yaş axıt, eyləgilən ceddini yad,
Nariza olmaya ta şahi-şəhidan, Əzim!

Hadiyül-Müzəllinin Hacı Seyid Əzimə verdiyi ədəbiyyata cavabından aşikarən görünür ki, Şirvan şairinin Qarabağda artıq hörmət və ehtiramı var imiş və Qarabağ şairləri ol cənabı özlərinə fünuni-şe'rdə ustadi-mahir və mürşidi-kamil mənzələsində tutarlarmış. Hadinin cavabı onun özünün dəxi sahibi-təb'i-səlim olmasını göstərir.

"Əkinçi"nin 1294-cü sənəsində çap olunan 9-cu nömrəsindən belə mə'lum olur ki, Hadi sabiqdə Həsən bəyin zəmmində yazdığı həcvmanənd şe'rlərindən bir növ' peşman olub, mühərrir əfəndidən üzrxahlıq eləyir və "ağköynək məsələsi"ndən təqsiri Əhsənül-Qəvaidin üstə həvalə edib deyir:

Biya ke, noubəte-solhəsto aştiyo inayət,
Beşərte-an ke, nəquyim əz ançe rəft hekayət[202].

Bu barışıqdan sonra Hadinin nəzm və nəsr ilə yazılmış bə'zi asari-qələmiyyəsi "Əkinçi"nin səhifələrində görünür.



## MƏŞHƏDİ ƏBDÜL "ŞAHİN"

Qarabağın xoş[təb'] və əhli-zövq şüəralarından birisi də Əbdül ibn Hüseynəli ibn Məşhədi Muraddır. Amma mərhum Əbdül anasının adı ilə məşhur idi. Belə ki, cəm'i Qarabağ əhli ona Fatıoğlu Əbdül deyərdi.

Təvəllüdü və həmçinin tə'limü tərbiyəsi Şuşa qalasında olubdur. İyirmi il bundan əqdəm köçüb Petrovskiyə orada alış-veriş ilə [məşğul] olurdu. Bir neçə sənə bundan irəli vəfat edibdir[203]. Sinni əlli beşdən altmışa kimi çatmışdı.

Əbdül artıq hazırcavab, xoşsöhbət və baməzə bir vücud idi. Ona binaən ürəfa və üdəbalar indində onun xatiri əziz və möhtərəm idi.

Əbdülün əvvəlcə təxəllüsü "Rəhzən" idi, sonralardan "Rəhzən"i "Şahin" təxəllüsü ilə təb'dil etdi. Mərhumun artıq mövzun təb'i vardı və xeyli gözəl qəzəllər inşad edibdir. Onlardan bir neçəsi burada zikr olunur.

Qəzəli-türkiyi-Rəhzən:

Salıb məni qəmi-eşqin bir elə halə, balam,
Göz ilə görməyəsən, gəlməzəm xəyalə, balam!

Şikayəti-şəbi-hicrani birbəbir edərəm,
Yetişsə bir də əlim daməni-vüsalə, balam!

Qaşın şəbahəti tiği-Əliyyi-İmrandır,
Üzün Məhəmmədə bənzər, qaşın hilalə, balam!

Siyahpuş olub gizlənibdi zülfündə,
Yəqin kəmində yatıb arizində xalə, balam!

Tamami-xəlq edər Kəbeyi-xudayə sücud,
Əgibdi qibleyi-qaşın məni şimalə, balam!

Yenə xummar gözün ox çəkib kəman tutmuş,
Yəqin veribdir ona ləblərin piyalə, balam!

Olur günah edən mərd davərə Rəhzən,
Sənə məhaldır üsyan gələ xəyalə, balam!

* * *

Ya rəb, nə oldu bülbülə gülzarə gəlmədi,
Şaxi-gül üstə gəlməyə göftarə, gəlmədi?!

Ya mümkün olmadı keçə seyli-sirişkimi,
Ya kim, düşüb yüzündə gözü qarə, gəlmədi.

Müjgan oxun o qaşı kaman vurdu sinəmə,
Səyyadə bax ki, seydə vurub yarə, gəlmədi.

Can riştəsi əlimdə bəha tari-zülfünə,
Gözlər gözün o Yusifi, bazarə gəlmədi.

Hər qədr dəydi səngi-məlamət bu cismimə,
Bir dəm hədisi-eşqini inkarə gəlmədi.

Qəddim kəman olub qaşı tək intizardən,
Bəxtim kimi o türrələri qarə gəlmədi.

Şahin, səbu su üstə sınar, şanə zülfdə,
Yoxsa çəkildi zülfdə dil darə, gəlmədi?!

* * *

Bülbüli-dil meyl edib gülzar içində bir gülə,
Tutiyi-can arizumənd oldu bir şirin dilə.

Qönçeyi-lə'li-ləbi-cananə meyl eylər könül,
Qanə dönmüş tazədən təng olmaq istər hövsələ.

Mahi-gərduni müqabil tutmazam ruxsarına,
Gərçi ürf içrə olur təşbih naqis kamilə.

Bağban gər həşrə dək şümşadü ər-ər bəsləsə,
Nəxli-qəddi tək sənubər daxi gəlməz hasilə.

Mürği-dil bir gülbün üstə aşiyan etmək sevər,
Yalvarır gah bağbana, gahi gülə, gah bülbülə.

Şami-eydi-vəsl üçün yandırmağa cismim nədir,
Min belə xaşakım olsa, yandırıb verrəm yelə.

Cəbrəili-dil gətirmiş kuyinə bu Şahini,
Ta verə qurban Minayi-eşqdə İsmailə.



## HACI MİRHƏMZƏ ƏFƏNDİ "NİGARİ"

Qarabağın elmü kamalı ilə mərufü məşhur olan şairlərindən biri də mərhum Hacı Mirhəmzə əfəndi ibn Mirpaşadır ki, mərhumun təvəllüdü keçən on üçüncü əsrin otuzuncu illərində və vəfatı haman əsrin axırlarında Osmanlı torpağında ittifaq düşübdür[204].

Şeyx Mirhəmzə əfəndinin vətəni-əslisi Qarabağ mahalında Zəngəzur uyezdində Çəjimli adlanan qəryədəndir ki, burada Çəjimli seyidlərinə mütəəlliq mö'təbər və möhtərəm bir ocaq var ki, qudurmuş heyvan tutan mərizlərə və sair naxoşluqda ondan çarə olunur və bu Çəjimli seyidləri dəxi çox nəcib və cümlənin indində möhtərəm sayılan kəslərdir.

Hacı Mirhəmzə əfəndinin seyidliyinə və Çəjimlidən olmağına onun şə'nində deyilmiş bu şe'r dəxi şəhadət verir:

Ze qolzare-nobovvət rost səbze,
Çəjimlu ibn Paşa Mirhəmze[205].

Şair özü alinəsəb seyidlərdən olmağına şəhadət verib bir şe'rində deyir:

Ali-əl'anəsəbəm, rindiyü şeydahəsəbəm,
Bəndeyi-ali-əba, Mirhəmzə adımdır.

Hacı Mirhəmzə əfəndini görən şəxslərdən cənabi-fəzail-məab Hacı Mirzə Əbdülkərim axund ki, əl'an Şuşa uyezdində Ağcabədi və Xələfəddin qəryələrində mollalıq edir, belə rəvayət edir ki, mərhum şeyx uca boylu, xoşsima və xoşətvar, mülayim bir şəxs imiş. Nə qədər ki, təbii və adəti halında şikəstəxatir, həlim və üftadə nəzərə gəlirmişsə də, bir o qədər də ibadət vaxtında və səlata durduğu əsnada təbii halətdən dəyişdirilib başqa bir halətə düşərmiş. Bu halətdə olduqda onun simasından nuraniyyət ləmə edərmiş və müqəddəs bir hey'ətdə nəzərə gələrmiş. Belə ki, kənardan onun bu haləti-əcibəsinə mütəvəcceh olanları heyrət və əndişəyə salarmış.

Məşhur qövlə görə, Mirhəmzə əfəndinin təriqət ustadı kürdəmirli İsmayıl əfəndi olubdur ki, o dəxi İstanbulda öz şagirdlərinə üsuli-təriqəti tə'lim edibdir.

Hacı Mirzə Əbdülkərim axundun rəvayətinə görə, Mirhəmzə əfəndi təriqət götürənə kimi şe'r yazmağa meylü rəğbət göstərməzmiş. Təb'i-şe'riyyəsi təriqət götürəndən sonra açılıbdır və şair öz yazdığı şe'rlərinin tamamını sevgilisi Nigar adlı bir qız mədhində yazıbdır və Şeyx Nigari Qarabağ mahalında Qarapirim kəndində sakin olurmuş ki, haman yerdə

vəfat edib, dəfn olunubdur. İndi onun məzarı əhli-təsənni arasında ocaq və ziyarətgah hesab olunur. Hər yerdən onun ziyarətinə gəlirlər.

Şeyx Mirhəmzə əfəndi Osmanlı məmləkətinə azim olmaqdan qabaq bir neçə vaxt Qazax mahalında Xanlıqlar qəryəsində məksü iqamət edib, orada özünə xeyli müridlər cəm' edibdir və Xanlıqlar ağalarının içində özünə çox dost və aşina və həmrə'y əhibba tapıbdır. Onlardan məşhuru Allahyar ağa Dilbazzadə olubdur ki, məşhur Hacı Rəhim ağa "Vəhidi"[206] təxəllüsün atasıdır. Mirhəmzə əfəndinin Vəhidiyə və şairə Nigar xanım Rəncurəyə artıq tə'siri keçibdir.

Hicrətin 1276-cı[207] sənəsində Hacı Rəhim ağa Həcci-şərifə azim olduqda İstanbulda Mirhəmzə əfəndi ilə görüşüb, öz mürşidinin füyuzatimə'nəviyyəsindən bəhrədar olubdur. Hacı Rəhim ağa Vəhidinin tərcümeyi-halı yazılanda bu barədə danışılacaqdır.

Mirhəmzə əfəndinin asari-mənzumələri ki, ibarət olsun qəzəliyyat, müqəttəat, qəsaid, rübaiyyat, müxəmməsat, əş'ari-müstəzad və sairlərdən, bir yerə hürufi-heca qaydası ilə cəm' olub "Divani-Nigari" ilə məşhurdur. Bu divan dəfələrlə çap olunubdur və eşitdiyimizə görə, hal-hazırda yenə "Qeyrət" mətbəəsində Tiflisdə təzədən çap olunmaqdadır[208].

Hacı Mirhəmzə əfəndinin yazdığı əş'ari-mütənəvveənin cümləsi eşqi-həqiqiyə, məhəbbəti-ilahiyə, hüsni-təbiiyə, mədhi-mövlaya, mə'rifəti-xudaya, eşq yolunda sədaqət və dəyanətə və sair övsafi-həmidələrin mədhinə şamil kəlamlardır. Şeyx Nigarinin gözəl və xoşa gələn kəlamları az deyilsə də, amma şe'rlərində çəndan sələsət və mövzuniyyət yoxdur və əksərində bir mə'na haman bir əlfaz və ibarələr ilə tedad və təkrar olunur və oxuyanları tezcə yorub xiffət və kəsalət gətirir. şe'rlərinin tamamı açıq türk dilində, bir azacıq osmanlı şivəsində inşa olunubdur.

Şair hürufi-hecadan hər birisinə keçdikdən qabaq saqiyi-dilnəvaza rücu edib, ondan himmət və kərəm diləyir. Nigarinin şe'r və qəzəlləri onun müridləri arasında mütədavil olub, əzbərdən və məclislərində cəzm olunana qədər oxunur. Müridlər oxuduqları əş'ardan nümunə üçün birisi burada tərqim olunur:

Əlhəmdülillah, fikrimdir[209] Allah,
Fikrimdə Allah, əlhəmdülillah.
Könlümdə, vallah, dildari-dilxah,
Dildari-dilxah könlümdə vallah.
Zikrimdir Allah hər bir məhəldə,
Hər bir məhəldə zikrimdir Allah.
Tövbətü lillah ücbü riyadən,



Ücbü riyadən tövbətü lillah.
Əstəğfirüllah birahlıqdan,
Birahlıqdan əstəğfirüllah.
Keçməzəm, billah, bəzmi-sima'dən,
Bəzmi-sima'dən keçməzəm, billah.
Virdimdir Allah, Seyyid Nigari,
Seyyid Nigari, virdimdir Allah[210].

Mirhəmzə əfəndinin əş'arından bə'zilərini nümunə üçün burada zikr edirik. Eşqin mədhində yazıbdır:

Ey eşqi-ləzizi-hüsn zadə,
Səndən qamu nəsrü nəzm həsna.

Ey eşqi cahana qülqüləndaz,
Səndən qamu huyü hayi-şeyda.

Ey eşqi fərəhdəhü tərəbsaz,
Səndən qamu nəğmeyi-dilara.

Ey eşqi şərabi-həlqpərəstan,
Səndən çəkilir sədayi-Mina.

Ey eşqi kilidü qifli-əsrar,
Səndən açılır qamu müəmma.

Ey eşqi dəlilü piri-salik,
Səndən umulur vüsali-mövla.

Ey eşqi-xuda, xuda sevərsən,
Ver dəstimə dəsti-cami-səhba.

Ey eşq, Nigari dağdarın
Çıx, başına çax əyaği-sövda[211].

Yenə eşqi-həqiqi nədən ibarət olmağı barəsində yazmışdır:

Anlagil eşq nədir, dinlə, nə mə'nadır bu!
Badeyi-lütfi-xuda, bəxşişi-mövladır bu!

İçəlim şamü səhər içrə və lakin bicam,
Camə hacətmi olur, badeyi-mə'nadır bu!

Hərfsiz aşiqi-şeydalərə tə'lim eylər,
Dərsi-əsrarı nə xoş, dərsi-dilaradır bu!

Məxfidir, eşq xəfiyyatı hüveyda eylər,
Söylərəm böylə, vəli gör nə müəmmadır bu!

Söyləyin aləmi-əş'ardə şirin-şirin,
Madehi-eşqi-xuda, təb'i-şəkərxadır bu!

Qasid, ey Mirnigari, görünür xəndəzənan,
Var bir xeyr xəbər aləmə büşradır bu![212]

Eşqdən şair sövdaya təvəccöh edib, onun vəsfində yazır:

Əcəb nəqşü əcəb nəqqaş, əcəb pərgardır sevda,
Əcəb məşqü əcəb məşşaq, əcəb xoşkardır sevda.

Əcəb biyarü biyavər, əcəb bitirü bixəncər,
Bahadır,[213] şiri-cəngavər, əcəb sərdardır sevda.

Əcəb halət ki, bialət, əcəb hikmət ki, bizəhmət,
Məşəqqətsiz dili-viranəni əmmardır sevda.

Açılmaz bir müəmmadır, bilinməz elmi-kimyadır,
Mücərrəd qeybdir, düşvartər əsrardır sevda.

Dəlili-rahi-leyla, məhrəmi-əsrardır, əmma,
Əbülüşşaqdır[214] fərzəndi-hüsni-yardır sevda.

Miyani-aşiqü mə'şuqə dair bir peyəmbərdir,
Nəbiyyül-aşiqandır Cəbrail, dildardır sevda.

Ədibi-kudəkani-məktəbi-elmü maarifdir –
Ki, rəbbül-arifandır, pərvərişkirdardır sevda.

Sirati-müstəqim, rahi-qəvim, me'raci-bitadır,
Hidayətdir, təriqi-Əhmədi-Muxtardır sevda.

Nigari, damənin tut, xaki-payin öp ki, mərdanə
Yədi-Xeybərgüşadır, fatehi-didardır sevda[215].

Mə'lum ola ki, Osmanlı ədiblərindən Əhməd Rüfət əfəndi "Təsvirül-əxlaq" adlı əsərində "sevda" sözünün mə'nasını şərh etdikdə onu təbiətin pərişan və dağınıq halından mütəvəllid və cənnətə qərib bir dəruni mərəzə isnad verir[216].

Əgər əqli-səlim tərəfindən sevdanın müdaxilatü təərrüzatına müdafiə olunmasa, sevda insanın kişvəri-dərunini istila edib, salamat qəlbi təhdid



və sahibini təhlükəyə salar. Asayişi-ruha hücum edən bu sevda, Əhməd Rüfət əfəndinin bəyanına görə, üç qisimdir: biri ifrati-eşqü məhəbbətdən təvəllüd edir, digəri zərurət və məcburiyyətdən doğur və üçüncüsü ehtiyacdan zühura gəlir. İki axırıncısı biri-birinə qəribdir.

Hacı Mirhəmzə əfəndi burada tövsif qıldığı sevda ifrati-eşqü məhəbbətdən nəş'ət edən sevdaya işarə isə də, vəli mərhum bu sevdanı başqa tərzdə izah buyurmuşdur. Belə ki, sevda həqiqətdə insanın batini aləminə dəxlü təsərrüf etdikdə qəlbi-səlimə xələl yetirməyi, könlü bulandırmağı və asayişi-dərunu pozuntu bir hala salmağı vazeh ikən Şeyx Nigari ona başqa sifətlər mənsub qılır.

Sevda cin kimi dağıdıcı, xarab və viran edici bir qüvvə ikən Şeyx Nigari onu "sirati-müstəqim, "me'raci-bita", "hidayət", "təriqi-Əhmədi-Muxtar" ibarələri ilə tövsif qılır və dili-viranəni məşəqqətsiz əmmar qılır. Və vazehdir ki, bu sevdadan Şeyx Nigarinin məramı yenə məhəbbəti-ilahinin dərəcəsini göstərməkdir.

Sevdanın tövsifindən sonra Mirnigari hüsnə üz çöndərib, onun mədhində bir-iki qəzəl deyibdir. Şair gözəlliyi tə'rif edib, iki aləmdə onun mislü manəndini bulmayır:

Ey hüsn, sənə həmta yoxdur ikki aləmdə,
Aləm sənədir heyran, zira sənə yoxdur ta.

Ey hüsni-fərəhəfza, səndən nə doğar ataş,
Əmma ki, məzaqəfza eşq, ləqəbi sevda.

Ey hüsni-şirintər an hər kim sənə vermiş can,
Sər ta bəqədəm candır, biləfzdir ol mə'na.

Ey hüsni-tərəbəndaz, eşqinlə tərənnümsaz
Bu Mirnigaridir, zira sənədir şeyda[217].

Candan əziz və istəkli peyğəmbərimiz Məhəmmədəl-Mustafaya xitabən yazıbdır:

Ey həbibi-kibriya, ey şahi-cümlə ənbiya,
Kimdi səndən özgə bir sərdar, bir sahibliva?

Ey hidayət şəmsi, ey nuranilər sərhəlqəsi,
Kimdi səndən özgə xurşid, kimdi mahi-rəhnüma?

Kimdi səndən özgə şəhbazəm deyən aləmdə, kim
Səndən özgə bir təzərvi-nazənin, ey dilrüba?

Kimdi səndən qeyri kamil, kimdi bu sahibcamal,
Kimdi səndən özgə fateh, kimdi bir müşkülgüşa?

Səndən özgə bəldeyi-icadi bir fatehmi var?
Səndən özgə bir səbəb aləmdə yoxdur intiha!

Səndən ey məh, maəda xubəm deyib laf etməsin,
Səndə xətm olmuş gözəllik, səndə xətm olmuş bəha.

Ey şəfi'ül-müznibin, ey rəhmətən lilaləmin,
Şəfqətin sübhü məsa istər Nigari binəva,[218]

Bundan əlavə yenə çox yerlərdə fəxri-kainatın şə'nində gözəl qəzəllər inşad etmişdir. Eşq yolunda mətanət və dəyanət göstərib, hər qisim cəfavü bəlaları eyni-səfa və rahəti-can hesab edib, Mirhəmzə əfəndi özünü əhmədiyül-məşrəblər silkinə daxil qılır və Füzuli Bağdadi kimi zövqü səfanı[219] cövrü cəfada görüb deyir:

Tirlər qövsi-qəzadan kim, yağar yağmur tək,
Hər biri mehrü vəfa, şəhdü şəfalərdir mənə.

Dəmbədəm zövqü səfa, cövrü cəfalərdən gəlir,
Nazü istiğnayi-dilbər dilrübalərdir mənə.

Talibi-didarəm əmma həmdəmimdir iştiyaq,
Ahü fəryadım dəmadəm rəhnümalərdir mənə.

Simü zərdən fariqəm kim, guşeyi-viranədə
Göftüguyi-dilrübalər kimyələrdir mənə.

Dəmbədəm durmaz, dönər könlüm əsiri-zülfdür,
Ünsirümdən qaliba qalib həvalərdir mənə.

Əskik olmaz badələr peymanəmizdən kim, müdam
Badəkeşlərdən gələn xeyr-dualərdir mənə.

Etməzəm, Mirnigari, iştika, ikrah kim,
Ol cəfalər kim, gəlir həqdən, səfalərdir mənə[220].

Və yenə bu babda deyibdir:

Möhnətin artıqdı səfadən mənə,
Gör ki, nə hasildi cəfadən mənə.

Ərseyi-eşqindən sərəfrazlıq
Xaki-peyi-ali-əbadən mənə.



Lazım isə canımı irsal edim,
Bir xəbər et badi-səbadən mənə.

Mirnigari, bu fədakarlıq,
Qəmzeyi-əltafi-xudadən mənə[221].

Və yenə eşq sevdasına düşdükdə səbrü səbat göstərməyi və hər qisim cəfavü bəlalara mütəhəmmil olmağı şair tövsiyə edib deyir:

Səbr qıl, ey dili-şuridə, nədir munca qılu,
Bir gün olur açılır üzümüzə bağlı qapu.

Nədürür munca ələmlər, yemə qəm, axiri-kar
İrişir bir yerə, səbr eylə ki, qalmaz qəyqu.

Açılar xurşidi-iqbal, doğar mahi-murad,
Nay tək qılma nəva, çəng tək açma gisu.

Yanasan atəşə pərvanə kimi, ah etmə,
Olma bülbül kimi aşüftəvü qılma hayü hu.

Dərdsər istəməsən guşeyi-viranə gərək
Mənzilin kim, nədi baş ağrısı bilməz bayqu.

Talibi cilveyi-didar gərəkdir heyran,
Ərni-ərni deyərək söylə: ya hu, ya hu[222].

Mirhəmzə əfəndinin gözəl qəzəllərindən birisi də atidə təhrir olunandır:

Nəzər qıl, ey qəzalım, aşiqin gör kim, nə məftundur,
Tutubdur kuhü səhranı, gəzər avarə, Məcnundur.

Dəmadəm ah edər canım, tökər qan çeşmi-giryanım,
Ləbi-lə'li təmənnasilə çünki bağrı pürxundur.

Sorub hali-pərişanım, nigarım, bir dəm ehsan et
Şərabi-şəhdi-lə'lindən şəfa kim, dərdim əfzundur.

Giriftarü əsirəm, mübtəlavü zarü məftunəm[223] –
Ki, zülfün damdır, qəmzən bəladır, çəşmin əfsundur.

Üzüldüm qeyrilərdən, həmdülilləh rəğbətim kəsdim,
Xəyaləndərxəyalın ta dəruni-dildə məhzundur.

Şərabi-feyzi-lə'lindən sızılmış şe'ri-şirinim,
Həvayi-sərvi-mövzununla təb'im böylə mövzundur.

Nə anlar çəkməyən qəm, olmayan sevda giriftarı
Nigarini ki, ol kənzi-xəfidir, dürri-məknundur[224].

* * *

Dili-üşşaq tək oynar telin, sanma səbadəndir,
Nəvayi-nayi-dildən hasil olmuş bir həvadəndir.

Könül qoymuşlar adın bir bəlanın, mənə vermişlər,
Bəlalar çəkdiyim hər dəm mənim ol mübtəladəndir.

Məzaqım dəmbədəm artar, xədəngin canə dəydikcə,
Məgər kim, tiri-dilduzin qamu zövqü səfadəndir.

Dəmadəm hiddəti-eynim peyapey rəhgüzarından
Gözümdə, ey həbibim, hasil olmuş tutiyadəndir.

Səhər-şam oynasın, gəzsin, səri'-kuyində bir yer ver
Səfalər eyləsin kəlbinlə könlüm aşinadəndir.

Yazıb xuni-cigərlə sərgüzəştin xaki-dərgahə,
Gözüm, gör kim, bu ol mabeynimizdə macəradəndir.

Verər ləzzət dəmadəm artırar zövqüm ziyad eylər
Ol əş'ari-şirintər kim, Nigari binəvadəndir.

Şəhidi-navəki-dilduz olursam nola zira kim,
Mənə bu irs ol şahi-şəhidi-Kərbəladəndir[225].

Mürşidi şə'nində yazmışdır:

Şəm'i-ruxsarınla oynar dəmbədəm pərvanələr,
Şövqi-lə'linlə dönər şamü səhər peymanələr.

Gəh dərü divarə üz sürtər, gəhi eylər sücud,
Başqa halə girmiş indi başqadır məstanələr[226].

Qıl təmaşayi-kəmalın, seyr qılgil sübhü şam,
Gör nə hal ilə sevər, istər səni divanələr.

Sərxoş olmuş badeyi-lə'linlə, çalmış daşlara
Tişələr eşqin yolunda can verən mərdanələr.



Var bihəd yarələr bağrımda, fəryad eylərəm,
Sancılıb hər bir telindən dəmbədəm səd şanələr.

Öylə xoşhaləm ki, halımdan bulub keyfiyyətin,
Badədən keçmiş qamu kim, boş qalıb meyxanələr.

Xahişin miqdarı, ey ərbabi-dil, cəm' eylə kim,
Mə'dəni-əsrardır təb'im saçar dürdanələr[227].

Sənsən, ey Seyyid Nigari, şöhreyi-şəhri-cünun,
Ruyi-aləmdə ki, səndən başqa yox əfsanələr[228].

Bu qəzəllər misalı Seyid Nigarinin daha çox mövzun və dilpəsənd kəlamları vardır ki, tamamisini yazmaqla qurtarmaz. Bir yerdə dilbəri-zibası olan Nigarı mədh qıldıqda deyir:

Xəyali-xalü zülfün, ey qəzali-ənbərəfşanım,
Dəmadəm tavusum, kəbkim, təzərvim, zərnigarımdır.

Sözündür nə'şeyi-canım, səri'-kuyin gülüstanım,
Qədin sərvim, ləbin qönçəm, üzarın laləzarımdır.

Əgər kim, simü zərsiz aşiqi-biçarəyəm, əmma,
Bihəmdilləh ki, can tək, ey əzizim, nəqd varımdır.

Dolanım xalın ətrafın peyapey çərxasa, ta
Ölüncə dönməzəm, zira ki, ol mərkəz mədarımdır.

Nigari, baği-sövda içrə ol gisuyi-zərəfşan
Əbirim, qaliyəm, müşküm, qəzalım, gülnisarımdır[229].

Nəfsi-şuma aldanıb, dünyagir və həvapərəst olmaqdan xalqı mən' edib deyir:

Nəfsi-nafərman ilə uğraşma, yar əldən gedər,
Kəlbi-tənpərvər həvasilə şikar əldən gedər.

Meyli-dünyayi-dənidəndir məzəllət hasili,
Etməgil Qafi-qənaətdən vüqar, əldən gedər.

Tifl ikən qılgil ziyarət Kəbeyi-üşşaqı kim,
İxtiyar olduqda, əlbət, ixtiyar əldən gedər.

Tövbədən keçmək xətadır gərçi, əmma neyləyim,
Gərdişi-peymanədən qövlü qərar əldən gedər.

Seyyidül-ehkamdır sülh gərəkdir inqiyad,
Bir qarış torpaqdan ötrü bir diyar əldən gedər[230].

Aşağıda zikr olunan qəzəldə Mirnigari Şeyx Sə'dini və Xacə Hafizi yad edib, onlardan mədəd tələb edir:

Ey saqi, cəm' olmuş dəri-meyxanənə qəmlu,
Lütf eylə də hər dəm yeridir kaseyi-məmlu[231].

Müştaqi-cəmalındı məgər, ey büti-ziba,
Hər dəm görünür eynimə, canım, gözü nəmlu.

Əğyarə nəzər eyləməz aşureyi-çəşmin,
Aşüftlərin sinəsi dağlu, gözü bağlu.

Yad eyləmədin aşiqi-zarın, nədi bais,
Bir sormadın əhvalını, ey dilbəri dilcu?

Fəryadım ilə ağrıdı başın, demədin bir
Ahın nə üçün, söylə görüm, ey dili-dağlu?!

Yoxdur həvəsim, badeyi-təb'im tükənibdir,
İmdad elə, ey piri-xərabati-kərəmxu!

Bir dəm mədəd[232], ey Sə'diyi-sultani-bəlağət,
Bir dəm nəzər, ey Hafizi-xoştəb'ü şəkərgu.

Əşar ilə dəstimdə olur mülki-firavan,
Böylə mənə açmış ki, ələm taleyi-niku.

Fərhad savub növbətin, ey Mirnigari,
İndi mənəm aşüfteyi-Şirin Qarabağlu[233].

Mirhəmzə əfəndi, demək olur ki, Seyid Əbülqasım Nəbati ilə müasir imiş. Nəbati şayəd sinndə bir az Mirnigaridən böyük olaymış. Hər halda Nəbatinin Mirhəmzə əfəndiyə artıq tə'siri keçibdir və əş'arü kəlamının çoxusunda ustadının səbkü qaydası müşahidə olunur. Nümunə üçün onlardan Nəbatinin çarparasına ki, bu sayaq başlanıbdır:

Get dolangilən, xamsən hənuz,
Püxtə olmağa çox səfər gərək...



– yazdığı nəzirəmanənd kəlamın bir neçə bəndlərini burada təhrir qıldıq.
Çarpareyi-Mirnigari:

Dərdü möhnətin, ey sənəm, sənəm,
Eşq ilə çəkən, bir mənəm, mənəm.
Arü varını rahi-mehrdə
Tarümar edən bir mənəm, mənəm.

Çəkmişəm cəfa, eylə bir vəfa,
Sən də ələta, can sənə fəda,
Rahi-mehrdə zarü binəva,
Tarikül-vətən bir mənəm, mənəm.

Yari-nazənin, hüsni-biqərin,
Şahrahdə intizarkeş,
Qəm çəkib həmin eyləyən bina
Xaneyi-həzin bir mənəm, mənəm.

Eyləgil xitab, verməgil əzab,
Üzdən al niqab, eyləgil səvab,
Töxmi-mehrini rəşki-afitab
Sinəyə əkən bir mənəm, mənəm.

Cismi pürhəva, könlü pürnəva,
Badiyənişin, fərdi-binəva,
Kəndi-kəndinə göftgu edib,
Ağlayan, gülən bir mənəm, mənəm.

Dəstü pafişan çəngü tarsız,
Ahü naləzən gül'üzarsız,
Məsti-sərmədi nəngü arsız,
Rindiyi-köhən bir mənəm, mənəm.

Eylədim, dila, öylə bir səda,
Qopdu Bisütun, oldu kim, həba,
Dedi rəhnüma "afərin" mana,
Böylə kuhkən bir mənəm, mənəm.

Ərşə vəlvələ, fərşə zəlzələ
Saldı seyheyi-nayi-şöhrətim,
Babi-eşqdə indi sübhü şam
Kusü təb'lzən bir mənəm, mənəm.

Eylədim nida, vermədi səda,
Kimsə gəlmədi, qaçdı əhrimən,
Kar-zarda şirü divgir,
Mərdi-filfikən bir mənəm, mənəm.

Ey sitəmzədə, nəfsə mübtəla,
Gəl əmanıma eyli iltica,
Dari-əmndir ziri-damənim,
Dafeül-fitən bir mənəm, mənəm.

Ləfzi canfəza, təb'i xoşədə,
Nəzmi dilrüba, hərfi dürnüma,
Sözü kimya, simü zər, göhər,
Dəmbədəm tökən bir mənəm, mənəm.

Qovli bibədəl, ləhcəsi gözəl,
Rindiyi-əzəl, nazənin qəzəl,
Söyləməz həzəl, xubgöftgu,
Söhbəti həsən bir mənəm, mənəm.

Ləm'eyi-hüzur eylədi zühur,
Ey Nigari, yar aldı üqdəni,
İndi xoşzəban Turi-mehrdə
Kəlimi-süxən bir mənəm, mənəm[234].

Bundan əlavə Mirhəmzə əfəndinin Nəbatinin kəlamına bənzər bir neçə əş'ari-müstəzadı vardır və lakin bu əsərlərin bə'zi yerlərində şe'r ya səqil və ya xəfif olduğuna görə, nümunə yazılmadı.

Hacı Mirhəmzə əfəndinin sufiməslək olub dünya qeydindən və hübbi-cah, talibi-malü mə'naldan azadə və hürr olmağına dəlalət edən bu gözəl şe'rlər ilə onun tərcümeyi-halını və nümuneyi-əş'arını xətm edirik:

Ey xacə ki, biz bəndeyi-mərdani-xudayiz,
Mə'nadə şəhiz gərçi ki, zahirdə gədayiz.

Biqeydi-cəhaniz, bizə hökm eyləməz alam,
Əhrarləriz, bəndeyi-sultani-Bəhayiz.

Sərgəşteyi-kuhiz, gəhi avareyi-səhra,
Hərcayiləriz, çünki tələbkari-liqayiz.



Övsafi-dəruni-dili izharə və hacət,
Mə'lumdur əhvalımız, əshabi-səfayiz.

Sərməsti-müdamiz, vəli əsrarə xəbiriz,
Ta zülfi-girehgir ilə biz üqdəgüşayiz.

Düşdü yerə hər kim ki, bizə qıldı ədavət –
Kim, dərdkeşiz, tiri-qəzayiz, füqərayiz.

Ruxsareyi-məhvəşlərə dil vermişiz, amma
Zənn etmə ki, müstəqrəqi-dəryayi-xətayiz[235].

Bu gözəl şe'rlər Mirhəmzə əfəndinin alitəb' və hürriyyətpərəst olmağına şəhadət edici xoşməzmun bir əsərdir.

# XURŞİDBANU "NATƏVAN"

Qarabağ mahalı, şəhri-Şişə Qafqaz qit'əsinin Şirazı mənzələsində olduğu cəhətə, onun torpağı və ab-havası hər qisim əhli-kəmal və sahibi-elmü hünər və xüsusən xoştəb', və şirinzəban ədiblər və şairlər yetirib ki, cümləsini zikr etməklə qurtarmaz.

Bəlkə hər əhli-savad böyük ədiblərə peyrəvilik edib, şüəralıq iddiasına düşübdür və dərəceyi-təb'lərinə görə şe'rü qəzəl yazıbdır. Fünuni-şe'rə o qədər meylü rəğbətləri olub ki, çox vaxt irsal-mərsullarını da nəzm ilə yazıblar və Qarabağın ünas əhli dəxi şe'r deməklə öz qüvvələrini sınayıb imtahan ediblər və bu yolda çox şairələr zühur edibdir. Onlardan məşhur olanları Aşıq Pəri Maralyani idi. Sabiqdə onun barəsində mümkün olan qədəri məlumat verildi. Aşıq Pəridən sonra cənab Xurşidbanu bəyim "Natəvan" təxəllüs və Fatimə xanım "Kəminə" təxəllüs olublar.

Cənabi-meymənətməab mələkeyi-müəzzəmeyi-əliyyeyi-mükərrəmə Xurşidbanu bəyim qüfranpənah Mehdiqulu xanın qızı və İbrahimxəlil xan Cavanşirin nəvəsidir. Təvəllüd edibdir tarixi-hicrinin 1253-[cü] sənəsində və cəmadiyül-əvvəl ayının 15-ci günündə[236]. 1315-[ci][237] tarixdə Şuşa qalasında daiyi-rəbbaniyə ləbbeyk deyib, bu dari-fənadan aləmi-bəqaya rehlət buyurublar.

Mərhumeyi-məğfurə validi-əmcədinin vəfatından sonra atasının yerində əyləşib, bir müddət artıq təntənə ilə atası kimi cəm'i Qarabağa xanlıq elədi. Əvvəlcə Dağıstan nücəbalarından knyaz Xasay cənablarına ərə gedib və ondan iki nəfər övladı olubdur: biri Mehdiqulu xan sani və biri Xanbikə ki, Naxçıvan xanlarından İsmayıl xanın oğlu Aman xana verilmişdi.

Xasay xanın vəfatından sonra Xurşid bəyim Qarabağın nəcib seyidlərindən Ağaseyid Hüseynə əqdi-nikah etdirib və ondan dəxi neçə nəfər oğlan və qız övladları olubdur.

Seyid Hüseyn həzrətlərinin hali-həyatında və onun tədbir və səlahdidi ilə xeyli ehsanatlar edib ki, ə'zancümlə Xurşidbikə cənablarının asari-cəmilələrindən birisi də Şuşa qalasına ətraf bulaqlardan külli xərclər töküb su çıxartmaq olubdur və bu xeyir iş ittifaq düşübdür. 1290-cı[238] sənələrdə. Heyfa ki, Seyid Hüseynin vəfatından sonra xanlıq işlərinə sərkeşlik və nəzarət edən olmayıb, xanlığın irəliki övza'vü dəstgahı pozulmağa üz qoydu.

Ol vaxtlarda cavan Mehdiqulu xan rus qulluğunda olurdu və bir də ol cənab alitəb' bir vücud olduğundan çəndan dünya ümuratü səlahına mə-



həlgüzar olmazdı və hübbi-cahü riyasət onun təbiətinə müqayir olduğuna görə, övqatını Tiflisdə və sair qərib şəhərlərdə, vilayətlərdə keçirərdi.

Xurşidbanu bəyim dəxi müsinn bir hala çatmışdı ki, əmlak işlərinə nəzarət etməyə qüdrəti yox idi və tamami mülki dövləti həris və tamahkar darğa və vəkillərin ixtiyarında qalıb, az vaxtdan sonra sabiqdə cahü cəlal və malü dövlətdən ağır borclardan başqa bir əsərü nişanə qalmadı.

Xurşidbanu elmü mə'rifət sahibəsi olmağa [görə], əksəri-övqatı ürəfa, şüəra və üdəba dairəsində keçirərdi. şe'r və qəzəli sevib, özü dəxi gözəl və zərif təb' sahibəsi idi.

Mərhum Qasım bəy Zakir və sonralardan Abdulla bəy Asi və onun müasirləri və xüsusən hali-həyatda olan Mirzə Rəhim Fəna cənabları ol gövhəri-pakın iltifatü inayətləri sayəsində təb'lərinə vüs'ətü qüvvət verdilər.

Xurşidbanunun kəlamlarından nümunə. Öz fərzəndi-əzizi Mehdiqulu xanın müfariqətində deyibdir:

Varımdı sinədə dərdü qəmi-nihan, ölürəm,
Fəda olum sənə, gəl eylə imtəhan, ölürəm.

Fəraqdən gecələr yatmaram səbahə kimi,
Xəyali-zülfünə bağlı gedibdi can, ölürəm.

Bahari-hüsnün ara gör necə xəzanəm mən,
Bahar qönçəsi tək bağrım oldu qan, ölürəm.

Vərəq-vərəq dilü can hicrin ilə odlaşdı,
Misali-gəncəfə səd parə oldu can, ölürəm.

O xaki-payini mən aşiyan etmiş idim,
Vətəndən ayrı düşüb indi laməkan ölürəm.

Dedin ki, çək əlini damənimdən, əl çəkdim,
Tərəhhüm eyləmədin axır, ey cavan, ölürəm.

Fəda o qamətinə kim, qəza nə xoş çəkmiş,
Qədr büküb belimi, eyləyib kəman, ölürəm.

Fəraqdən tükənib tabü taqətim, billah,
Vüsalə yetməz əlim, zarü Natəvan ölürəm.

Əyzən qəzəli-Xurşid bəyim düxtəri-Mehdiqulu xan Qarabaği:

Olmuşam dəhri-bəla içrə bu gün divanə mən,
Varmadım meyxanəyə, sındırmadım peymanə mən.

Əhdlərdən keçmədim, peymanələr sındırmadım,
Lacərəm bimehrlər tək olmuşam əfsanə mən.

Tərki-gülzar etmişəm bülbül kimi mən, ey rəqib,
Aqibət bir guşə içrə gəlmişəm əfganə mən.

Eşqi-ruxsarında bir dəm vəsl ilə şad olmadım,
Hər tərəf seyr eylədim, düşdüm əcəb hicranə mən.

Qəm yükün çəkməkdən, ey dil, bir dəm azad olmadım,
Hərçi cəhd etdim, nə hasil, yetmədim canana mən.

Duş gördüm kim, gəlibən külbeyi-əhzanıma,
Ol zaman nəzr eylədim canü dilim qurbanə mən.

Yoxu varımdan qalan ancaq mənim bir can idi,
Natəvan, daxi nedim, sərf eyləyim mehmanə mən.

Görməyim düşvardır, billah, səni mən, ey rəqib,
Zülfə bağlı qoy gedim axır düşüm zindanə mən.

Dövrü dönmüş dövr dövran etmədi kamımca, ah,
Düşmənimdir, bilməzəm kim, netmişəm dövranə mən.

Əyzən qəzəli-Xurşidbanu bəyim:

Dilbəra, dərdi-dilimdən belə ünvan etdim –
Ki, qəmi-hicrdə dil mülkünü viran etdim.

Mümkün olmaz mənə vəslin bilirəm həşrə kimi,
Ol səbəb məskənimi kuhü biyaban etdim.

Eşq sultanı mənim qətlimə fərman gətirib,
Etmədim tərki-vəfa, taəti-fərman etdim.

Səri-kuyində qoyub başımı bir uf demədim,
Səri-sidq ilə dilü canımı fərman etdim.

Yoxdu bir kimsə məgər dərdimi bilsin, ya rəb –
Ki, mən öz qanım ilə dərdimə dərman etdim.

Dərdi-hicrində gözüm yaşı tutub dünyanı,
Nuh tufanı kimi gör ki, nə tufan etdim.

Natəvan, etmədi ol səngdilə naləm əsər,
Gecə-gündüz bu qədər naləvü əfğan etdim.



Əyzən qəzəli-Xurşidbanu bəyim:

Rəqib töhməti etdi məni cüda, ey dust,
Bu zülfü gördü rəva, görmə sən rəva, ey dust!

Əgər ki, tiğ çəkib öz əlinlə öldürsən,
Deyil cəfa bu mənə, bilməzəm cəfa, ey dust!

Kənardən baxaram mən həqir həsrət ilə,
Bu, yaxşı şivə deyil, olma bivəfa, ey dust!

Sənin bu hüsnünə layiq heyf ki, əhdin yox,
Nə qədər sə'y elədim, tapmadım də'va, ey dust!

Bəli, bu hicrin ilə mən həmişə xoşhaləm,
Görək ki, neyləyəcək axırı qəza, ey dust!

Rəqibə xoşdu həmişə məni kənar etsin,
Fəda o himmətinə, olasan riza, ey dust!

Çağırram Allahı mən hali-Natəvan ilə,
Məgər ki, tez verə həq düşmənə cəza, ey dust!

Bu iki beytlər dəxi ol cənabın kəlamıdır:

Əgərçi xoşdu mənə ətri, həm səfası gülün,
Cəfası çoxdu, nə hasil ki, yox vəfası gülün.

Cəfayi-xarı görüb köçdü bağdən bülbül,
Görən kim oldu bu gülşəndə aşinası gülün?!

Qasım bəy Zakir Xurşidbanu bəyimin əyyami-mərəzində ona yazdığı xeyir-duadan belə mə'lum olur ki, ol vaxtı istəməab Xurşidbanunun bir müddət övladı olmayıbdır və bu barədə ol nəcibə qəmü xiffət edib, övlad ümidi ilə özünə bir para müalicələr etdiribdir və xəstə olubdur. Zakirin atidə dərc olunan qafiyələri bu hala aşikarən dəlalət eləyir:

Sipehri-bərinin hilalı sənsən,
Şərafətdə mələk misalı sənsən,
Gülşəni-Xəlilin nihalı sənsən,
Barbər istərəm xudadən səni.

Məsihi çıxardan ərşi-əlayə,
Salan üftadələr başına sayə,
Yetmişdə İshaqı verən Sarayə
Qurtarsın bu rəncü inadən səni.

Mərhum Mirzə Fətəli Axundzadə dəxi bu barədə Zakirə yazdığı məktubdan aşikarən mə'lum olur ki, Xurşidbanu bəyim övlad ucundan bəstəri-möhnətdə bir müddət rəncü təəb çəkibdir. Mirzə Fətəli Zakirə belə yazıbdır:

Rəvadırmı çəkə bixürdü bixab
Bəstəri-möhnətdə bu qədər əzab?!
Duayi-xeyrinə eyləyin şitab
Siz də mənim kimi hər leylü nəhar.

Belə pəriruyin, heç səni tarı,
Rəvadırmı qəmdən sola üzarı,
Həm xələfdən xali ola kənarı?
Olsun ona mövlam yavərü qəmxar...

Mirzə Fətəli Axundzadənin Zakirə yazdığı bu məktubu öz məqamında tamamən zikr olunacaqdır. Haman bu məktub yazılıbdır məhərrəmülhəramın ibtidasında 1-ci[239] tarixdə ki, haman vaxta mərhumeyi-məğfurə Xurşidbanunun xəstə və naçaq olmağı ittifaq düşübdür. Mərhum Cəfərqulu xanın təsnifi olan bu beyt Xurşidbanu bəyimin möhüründə həkk olunmuşdu:

Neşinəd ba mələk zanubezanu,
Kənize-Fateme Xurşidbanu[240].



## FATİMƏ XANIM "KƏMİNƏ"

Qarabağın üçüncü şaireyi-möhtərəməsi ismətməab Fatimə xanım "Kəminə" təxəllüsdür ki, səbiyyeyi-Mirzə Bəybaba vələdi-Əliyar bəydir[241].

Mirzə Fatimə xanım təvəllüd edibdir Şuşa qalasında 1257-ci[242] tarixdə. Tə'lim və tərbiyəsi dəxi Şuşa qalasında olubdur.

Mirzə Bəybaba Fənanın övladı xilqətdən sahibi-fəhmü kiyasət və əhlizövqü fərasət olduğu cəhətə, Fatimə xanım dəxi əyyami-tüfuliyyətdən öz fitri kamalati-zehnü fərasətilə çoxlarını heyrətə gətirərdi və müasirləri içində özünə artıq şöhrət və hörmət kəsb etmişdi.

Mirzə Fatimə xanım türk və fars dilində yaxşı savad əxz edib, hər iki lisanda gözəl şe'rlər yazırdı. Təxminən dörd-beş yüz əfradi-şe'rü qəzəlləri vardır. Onlardan bə'zisini təyəmmünən [buraya] daxil qıldıq.

Qəzəli-farsiyi-Kəminə:

Dər rəhe-eşqe-to, ey dust, çenan naşadəm,
Çon qobare-rəhe-to dade fələk bər badəm.

Morğe-bibalo pəri budəmo dər qeyde-qəza,
Dam qostərdo gerefto behiyəl səyyadəm.

Ahuyi-budəmo rəm kərde bekuhe-ommid,
Heyrət arəm bekemənde-to ke, çon oftadəm.

Ze ahe-sərde-dele-pordərd nətərsi səhləst,
Zatəşe qəhre-xoda tərso bekon azadəm.

Təlxkaməm bekonəd şure-to çon Şirini,
Kuhe-səbri bemoje bər konəm əz Fərhadəm.

Dər həmə omr ço pərgar beğəm gərdidəm,
Vəh-vəh əz gərdeşe-çərxe-fələk estadəm.

Çon Kəmine nəkonəd ğeyre-to bər kəs elhaq,
Ey xoda, dəste-məra gir, ze pa oftadəm[243].

Qəzəli-türki:

Düşər könlüm, əzizim, qane sənsiz,
Gəlir şamü səhər əfğanə sənsiz.

Səninlə duzəxin narına yannam,
Behiştdə baxmazam qılmanə sənsiz.

Edən abad me'mari-vüsalın
Olubdur hicrdə viranə sənsiz.

Müsəddər bəzmi-vəslində olan dil
Neçün hicran çölündə yanə sənsiz?!

Gülüstani-vüsalə həsrət oldum,
Dönüb aləm mənə zindanə sənsiz.

Ənis olmuşdu dil ol şəm'i-qəddə,
Yanar, billah, necə pərvanə sənsiz.

Nə sənsiz qəm əyağına əl urram,
Nə də nuş eylərəm peymanə sənsiz.

Olur bərhəm, pərişan qanə dönmüş,
Könül zülfə çəkəndə şanə sənsiz.

Dilimdə zikrsən, könlümdə fikrim,
İki aləm dəxi əfsanə sənsiz.

Kəminə, ey hərifi-bimürüvvət,
Ola, qorxum budur, divanə sənsiz.

* * *

Cövri-rəqib, sərzənişi-əhli-ruzigar
Qoymaz qılam bu dərdi-dili yarə aşikar.

İşrətsərayi-könlümü, ey yari-tündxu,
Hər dəm cəfavü qəhr ilə gəl etmə tarmar.

Hicrində dürri-əşk, vüsalında nəqdi-can
Bilməm, hüzurü qeybətdə eylərəm nisar.

Gülşəndə gör nə şur ilə bülbül fəğan edir,
Guya ki, şax üzrə gülə həmdəm oldu xar.

Dil intizari-vəsldə pamali-fikr olub,
Tən atəşi-fərağdə çün muy biqərar.

Gər feyzi-cami-eşqi-həqiqətdə məstsən,
Əhsənt xoş məqamdəsən, olma huşyar.

Dövran ki, saqiyi-qəmə olmuş həvalə, gör,
Bu dövrdə Kəminə kimi kimdi kamgar.



* * *

Ey dil, rəva deyil ki, mən əğyarə yalvarım,
Sən rəhnümalıq eylə, gedim yarə yalvarım.

Murü mələxü mö'minü asidi mütməin,
Lütfi-xuday qadiri-qəffarə yalvarım.

Rumü firəng, özbəkü hində nə ehtiyac,
Qeyr əz xuda gedim necə tatarə yalvarım.

Hər vəqt təngə düşsən, əlindən tutar Əli,
Müşkülgüşadı, Heydəri-Kərrarə yalvarım.

Hər dəm qılır cəfa mənə çün tən ilə rəqib,
Şahi-qəyurü qolsuz ələmdarə yalvarım.

Kani-vəfavü qeyrəti-Abbasi-namvər
Görməz rəva xəbisü xətakarə yalvarım.

Mənsur tək çəkibdi məni darə zülfi-yar,
Yad eyləyim "ənəlhəqini" darə yalvarım.

Bülbül sifət nəvayə gətirdin Kəminəni,
Sevdayi-gül başımda, necə xarə yalvarım?!

* * *

Rəhi-eşq içrə mənzurum mənim ol tacdarımdır,
Könül mülkündə sultanım, xücəstə şəhriyarımdır.

Əgərçi guşeyi-qəmdə şikəstəxatirəm, lakin
Səri-kuyində dövr edən xəyali-biqərarımdır.

Kəməndi-eşqinə bağlı gedib könlüm, inanmazsan,
Yoluna göz dikən şahid dü çeşmi-əşkbarımdır.

Şikənci-zülfdən könlüm mütəvvəl arizu eylər
Səri-zülfün kimi bərhəm pərişan ruzigarımdır.

Sənin əğyar ilə könlüm əgərçi şadü xürrəmdir,
Həmişə naləvü əfğan mənim də şüğlü karımdır.

Sənin gər var isə bu qaməti-mövzun, ruxi-gülgun,
Mənim də dövlətü cahım bu eşqi-paydarımdır.

Kəminə bivəfa görsə səni, vallahı incinməz,
Səni məndən iraq edən bu bəxti-kəcmədarımdır.

Mirzə Fatimə xanımın qəzəlləri biri-birindən gözəldir. Cümləsini buraya daxil etmək olmaz. Fatimə xanımın Mirzə Rəhim Fəna cənablarına ki, onun seyyidüş-şühəda İmam Hüseyn həzrətlərinə təkyə saxlamağı barəsində həcv təriqi ilə yazdığı şe'rə verdiyi cavab dəxi şayani-diqqət şe'rlər isə də, burada çap olunması münasib görülmədi. Amma Gəncə sakini "Fani" təxəllüs şair Kəminə kəlamını Fəna kəlamına üç beyt ilə belə tərcih veribdir:

Yazmış Kəminə şe'ri-Fənayə əcəb cavab,
Verməz cavab şe'r ilə bu növ' hiç kəs.

Düşdü nəzər kəmali-Fənavü Kəminəyə,
Tərçihi-əql qoydu bu əş'arə pişü pəs.

şe'ri-Kəminə çün əsəli-şəhdi-xoşgüvar,
Durmuş Fəna kəlamı müqabildə çün məkəs.

Və Axund Molla Hüseyn Qazaxi "Sabit" təxəllüs ki, "Ağbaş" ləqəbi ilə məşhurdur, Kəminənin kəlamını Fənanın əş'arına tərcih tutub, belə yazıbdır:

Söy yox Kəminə sözləri novqönçə bikrdir,
Öz gülbüni-vüsalına yox gərçi dəstrəs.

Hər sətri rast sərvə vurar tə'nə dur ki, dur,
Hər ləhnü hənəgi kəbki edər süxrə kəs ki, kəs.

Eyhami-rəmzi hüqqeyi-pünhanı tək nihan,
Çatmaz ona təsəvvüri-idraki-hiç kəs.

Şe'ri-Kəminə ləhceyi-Məryəmcə ruhə zad,
Şe'ri-Fəna məaniyə atdan gələn nəfəs.

Şe'ri-Kəminə Rəxşi-səbükseyri-mə'rifət,
Hər bir qədəmdə şe'ri-Fənadən salıbdı təs.

Şe'ri-Kəminə xatiri-əhbab tək əziz,
Şe'ri-Fəna vəsavəsi-şeytan kimi nəhəs.

Sabit, Fəna iş əhlidi, məğrur edər səni,
Qövğa günündə məst olu "köhlən" ləqəb fərəs.

Burada, bizim zənnimizə görə, hər iki şair Kəminənin kəlamını Fəna əş'arına tərcih tutmaqda və Fənanı bir növ' təhqir və xəcil etməkdə mübaliğə ediblər, zira Mirzə Rəhim Fəna cənabları ziyadə müəddəb və sahibi-mə'rifət bir vücud olduğundan bir kəsin qəlbinə toxunmaz. Onun Kəminəyə tutduğu bir para iradlar haqq deyilsə də, elə bir böyük xəta da deyil ki, şairə ondan artıq töhmət gəlsin. Şair ancaq zərifanə şairənin gözəlliyini, əhli-hal və sahibi-dil olmasını və batindən ona meylü rəğbət bağlamasını izhar edibdir. Qareini-giramı şəkkdən çıxarmaq üçün Fənanın inşa etdiyi kəlamın axır beytlərindən bir neçəsini burada zikr etməyi lazım gördük:



Huriyü-şəni-Şişə olub cəm' bəzminə,
Guya pəridi, Şişə ara yoxdu bir nəfəs.

Şəkkər ləbin nabat, vəcahətdə çox əziz,
Olmaz cahanda hüsnünə manənd hiç kəs.

Müddətdi könlümün sənə gizlin nigahı var,
Daim xəyal onunla edər nalə çün cərəs.

Dərd əhlisən, çifaydə həmdərdin olmadı,
Bidərdlər olurmu sənin ilə həmnəfəs?

Sahibdil olmağın var imiş cana möhnəti,
Sahibdil oldu gərçi Fəna, yoxdu dadrəs.

Fatimə xanım həqiqətdə çox gözəl və zərif bir can idi və zahiri gözəlliyinə müvafiq batini və mə'nəvi tərəfdən dəxi əxlaqi-həsənə sahibəsi olub, ziyadə xoşxülq, mülayimə və xoşrəftar bir nadireyi-zəmanə idi ki, onun vəfatı cümlə şüəravü ürəfayi-Qarabağa böyük bir yas oldu.

Fatimə xanım vəfat edibdir Şuşa qalasında 1316-[cı][244] tarixdə, payız mövsümünün ibtidasında ki, tarixi-məsihiyyənin 1898-ci ilinə və sentyabrın əvvəlinə müvafiqdir.

# MİRZƏ ƏLİƏSĞƏR "NOVRƏS"

Mirzə Əliəsğər ibn Hacı Abidin xoştəb' və bir şairi-kühənsaldır ki, Asinin və mərhum Hacı Seyid Əzimin müasiri və sair şüəraların mümtazıdır. Təvəllüd edibdir Şuşa şəhərində hicrətin 1263-cü[245] ilində və haman şəhərdə nəşvü nüma tapıb, müsəlmanca təhsil alıbdır. Rus dilini Xan kəndində hərbi işkollada öyrənib və təhsili-elm etdikdə bir sənə yunkerlik edibdir.

Hər qisim şe'rü kəlamı vardır və qəvaidi-şe'riyyədən kəmalınca baxəbərdir. təb'i rəvan və mövzundur. Lakin cavanlıq sinnində yazdığı əş'arü kəlamlarda zövqü məlahət bu halda yazdıqlarından artıqdır.

İki mini mütəcaviz beyti vardır. Lakin tamamisi övraqü pərişan haldadır. Heyfa ki, şair ömrünün axırında bə'zi nasəza ə'davü hərəkətlər ilə özünü bir növ' hörmətdən salıb, əqvamı arasında bisikkə olubdur və buna da ümdə səbəb yoxsulluq və əliaşağılıqdır və mə'lumdur ki, fəqrü ehtiyac şirləri rubəhməzac edən kimi, şairləri gədatəb' və rəzil qılır.

Mirzə Əliəsğər Novrəsin həqiqi şair və əhli-hal olmağına mərhum Hacı Seyid Əzimin onun haqqında şikayət təriqi ilə yazdığı qəsidə dəlalət eləyir. Çün bu qəsidə sərvəri-şüəramız olan mərhum Seyid öz həmdərdlərindən bə'zilərinin gülşəni-bəqaya vaxtsız pərvaz edib, onu məhzunü mə'yus qoymalarını zikr edib hali-dildən söyləyir, onu burada eyni ilə zikr etməyi lazım gördük:

Səlam olsun sənə, ey Kəbeyi-əhli-səfa, Novrəs!  
Minayi-kuyinə olsun dilü canım fəda, Novrəs!  
Mənə [biganədən] biganə oldun aqibət, ey şəh,  
Səninlə olmayaydım kaş əzəldən aşina, Novrəs!  
Məgər yox mehribanlıq Şişənin abü həvasında,  
Dönübdür daşə könlüm, ey rəfiqi-bivəfa, Novrəs!  
Nə bir peyğam göndərdin bu müddətdə, nə bir qasid.  
Məgər böylə olurmuş aşinalıq, mərhəba, Novrəs?!  
Əgərçi dəhrü-dunun inqilabından pərişanəm,  
Olub cəm'iyyətim bərhəm, fələk etmiş cəfa, Novrəs!  
Dağıldı yarü ənsarım başımdan, fərd qaldım mən,  
Əlimdən getdi Asi, ol rəfiqi-xoşədə, Novrəs!  
Səfa düşdü səfadən, Zəmzəmi-əşkim rəvan oldu,  
Bu qəmdən xaneyi-dil Kə'bə tək geydi qəra, Novrəs!  
Nə Agah agah oldu haləti-pürixtilalımdan,  
Nə rəf' etdi məlalım səfheyi-dildən Fəna, Novrəs!  
Məgər böylə olurmuş aşinalıq, ey gözüm nuri,  
Cəmali-bakəmalından gözüm görməz ziya, Novrəs!  
Biz axır bir gülüstanın gülüydük ruzi-əzəldə,



Həvadis sərsəri saldı bizi axır cüda, Novrəs!  
Ol ustadı-mükərrəm Yusifi, ol mürşidi-kamil  
Onu gürgi-əcəl seyd etdi, heyf ol müqtəda, Novrəs!  
Həyati-müstəari-dəhrdən mətləb deyil hasil,  
Gərək kəsb eyləmək yüz sə'y ilə feyzi-bəqa, Novrəs!  
Əgər azadəsən, eylə hesab [et] kuhi-Şəhlandır,  
Düşərsə başına gər sayeyi-bali-hüma, Novrəs!  
Şikəsti-üstüxanə səbr qıl səngi-həvadisdən,  
Təmənna etmə əbnayi-zamandan mumiya, Novrəs!  
Ə'la, ey əndəlibi-gülşəni-rizvan, qəbul etmə,  
Əgər versə sənə buyi-güli-cənnət səba, Novrəs!  
Əgər qəsri-müşəyyəd versə qeysər, imtinan etmə,  
Qüsurun var əgər etsən qəbul, [ey] pişva Novrəs!  
Çəkil, ənqayi-Qaf ol bir qənaət içrə Seyyid tək,  
Verər məqsudini ol xaliqi-ərzü səma, Novrəs!

Bu qəsidədə mərhum Hacı Seyid Əzim Novrəsdən şikvəvü gilayə edib, onun dostluq və sədaqətdə bivəfavü dəyanətsiz olmağını rişteyi-nəzmə çəkib, soyuqluğunu və namehribanlığını Qarabağın ab-havasından görür:

Məgər yox mehribanlıq Şişənin abü həvasında,  
Dönübdür daşə könlüm, ey rəfiqi-bivəfa Novrəs?!

Sonradan şair dəhri-dunun inqilabından pərişanhal olmağını, cəm'iyyəti-əhibbasını və zövqü səfasını gərdişi-fələk bərhəm qılmasını və yarü ənsarının dağılıb təfriqə düşməsini bir-bir zikr edib, rəfiqi-xoşədası Asinin və ustadi-mükərrəmi Yusifinin gürgi-əcəlin yədi-qəddaranəsində seyd olmağını naleyi-cansuz ilə yad qılır.

İntihayi-kəlamda Novrəsə öz tərəfindən nəsihət üzü ilə deyir ki, sənin həvadisdən sümüklərin şikəst olsa, əbnayi-zəmanədən mumiya təmənna eləmə; gülşəni-rizvandan badi-səba sənə buyi-cənnət yetirsə, qəbul etmə; əgər qəsri-müşəyyəd qeysəri-Rum təklif qılsa, ona meylü rəğbət göstərmə; Seyid tək çəkil qənaət guşəsinin birində ənqayi-Qaf kimi qərar tut; qadir rəzzaq sənin qismini göndərəsidir, həyati-müstəar eyni-mətləb deyil, eyni-mətləb yüz sə'yü ehtimam ilə feyzi-bəqanı arayıb bulmaqdır.

Mərhum Abdulla bəy Asi dəxi bu məsləkdə olub, arzu etdiyi meyivəhdət bu feyzi-bəqadan ibarətdir.

Novrəsin kəlamlarından bə'ziləri burada nəzəri-ərbabi-kəmala təqdim olunur. Novrəsin Hacı Seyid Əzimə yazdığı məktub:

Fələk rəsmi budur, Seyyid, məni səndən cüda qılsın,
Əsiri-hicr edib, yüz ahü dərdə mübtəla qılsın.

Mədari-çərxi-dunpərvər budur, ey arifi-salik –
Ki, dil əhlinə ruzi günbəgün dərdü bəla qılsın.

Vəfasız çərx zülmündən hanı asudədil aşiq,
Onun dövründə kimdir yar ilə bir dəm səfa qılsın?!

Dolanır naqisin dünyayi-dun hə dəmdə kamınca,
Hanı bir əhli-dil kim, kam ilə xeyri-dua qılsın?

Olub mehrü məhəbbət məhv dünyadan, yəqinimdir,
Hanı dərd əhli, Novrəs, dərdinə bir dəm də'va qılsın?

Müşairə:

Könül ta xu tutubdur eşqin ilə, qeyrə ram olmaz,
Yetib həddi-kəmalə, nəqs bulmaz, natəmam olmaz.

Qədəm qoyduqca eşq içrə muradi-dil olur hasil,
Təriqi-eşqdə kimdir deyən ümmid kam olmaz?!

Mənəm kim, "səmmə vəchüllah"[246] zövqilə fəna buldum,
Sənə, zahid ki, xudbinsən fəna fillah məqam olmaz.

Olub könlüm mübərra aləmi-mənidə kəsrətdən,
Meyi-vəhdət gətir, saqi, o bir meydir həram olmaz.

Qəriqi-bəhri-eşq ol, nəfs əlində qalma avarə –
Kim, ol bədgövhərin mizani-hökmündə nizam olmaz.

Təmənna qılmayan sə'yi-dil ilə Kəbeyi-kuyin,
Səfayi-ömr görməz, xoşdilü xürrəm müdam olmaz.

Qılıbdır cəzbeyi-eşqin məni min küfr ilə rüsva,
Bəli, məczub olan adəmdə, Novrəs, nəngü nam olmaz.

* * *

Könlüm elə pünhandır gisulər arasında,
Şanə gəzübən tapmaz yüz mulər arasında.

İstər ki, çəkə Mani tərhin qaşının, bilməz
Peyvəstə kəşakeşdir əbrulər arasında.

Məstanə xumar gözlər hər dəm mənə al eylər,
Qaldım nə yaman yerdə cadulər arasında.



Bimar gözün, cana, salmış məni bir halə,
Səhrayə düşüb gəzdim ahulər arasında,

Ta mən ki, cüda düşdüm ol yar vüsalından,
Varmı görəsən söhbət bədgulər arasında?!

Əğyarə vəfa etmək, üşşaqə cəfa, Novrəs,
Bilməm bu nə adətdir məhrulər arasında?!

Müşairə:

Zülfün kəmənd könlüm üçün, danə xal olur,
Olmaq xilas könlümə əmri-məhal olur.

Vəchi budur ki, ayə üzün nisbət etməzəm,
Gəh bədr olur o mahi-fələk, gəh hilal olur.

Yox özgə rəmzi sirri-ləbin, sormuşam əzəl,
"Lam"i misali-lə'l bolur, "ba"yi bal olur.

Seyr etmişəm Xitavü Xütən mülkünü təmam,
Bu gözdə, bu baxışda demə kim, qəzal olur.

Ya rəb, nə sirrdir ki, cahan içrə yarını.
Qafil görəndə aşiq üçün özgə hal olur?

Novrəs, o qara gözlərə dil verme, xövf qıl,
Gözdən nəticə mərdüm üçün məkrü al olur.

* * *

Əya nəfs, bəsdir həvavü həvəs,
Bu dünya bəqasından ümmid kəs!

Eşit kim, vurar nəreyi-ərrəhil,
Əcəl karvanında hər dəm cərəs.

Qara torpaq altında zarü nizar
Olur məskənim təngnayi-qəfəs.

Nə yarü nə yavər, və xişü təb'ar,
Nə munis, nə həmdəm, nə bir həmnəfəs.

Yəqin eylə, Novrəs ki, əmali-xeyr
Olur qəbr evində sənə dadrəs.

* * *

Ta qaldı könül zülfşikən pürşikən içrə,Asudəlik olmuş o qəribə vətən içrə.

Ol xali-siyəh arizə guya ki, düşübdür
Bir daneyi-əngur şərabi-köhən içrə.

Abi-dəhənin şərbəti-şirindimi, yoxsa
Məxlut olub qənd mükərrər süxən içrə.

Naz ilə əzəl şir verəndə sənə dayə,
Məmzuc qılıb mayeyi-nazi ləbən içrə.

Xaki-səri-kuyindi mənə türbəti-xalis,
Qoynumda onu qəbrə aparram kəfən içrə.

Bilməm nə xəta eylədim, ey dilbəri-tərsa,
Səhhar gözün saldı məni məkrü fən içrə.

Mən Novrəsi-zarəm, adıma Qeys deyərlər,
Məşhurdu divanəliyim mərdü zən içrə.

Novrəsin bu qəzəli Asəf Şirvaninin qəzəlinə nəzirədir ki, o da öz məqamında zikr olunacaqdır[247]. Nə qədər Asəfin qəzəli xoşməzmundur, bir o qədər də Novrəsin müşairəsi lətifdir.

Qazi Osman paşanın kərimeyi-nəcibəsi Nigar xanım yazdığı fəryadların təxmisi:

Təhsili-maarif nədən irşad edəcək yox,
Xoş ad qoyub elm ilə mö'tad edəcək yox,
Dil mülkü xərab olsa da, bünyad edəcək yox,
Fəryad ki, fəryadıma imdad edəcək yox,
Əfsus ki, qəmdən məni azad edəcək yox.

Axır belə təqdir qılıb xaliqi-yekta,
Dəryayi-sədaqət yetirə gövhəri-mə'na,
Mir'ati-məvəddətdə ola surəti-ziba,
Tə'siri-məhəbbətlə yığılmış gözəl, əmma
Viranə dili bir dəxi abad edəcək yox.

Yandırdı məni atəşə bu dərdi-dərunum,
Bir kövkəbi-nəhsə düşüb iqbali-zəbunum,
Bu mərhələdə olmadı həm rahnümunum,
Kəs, varsa əlaqən mənə, ey taleyi-dunum,
Sən var ikən aləmdə məni yad edəcək yox.



Hər bülhəvəs adəm nə bilir ləzzəti-eşqi,
Mehrabi-vəfadə edibən taəti-eşqi,
Sidq ilə qəbul eyləmişəm hacəti-eşqi,
Həqq ilə bilir zar könül haləti-eşqi,
Mahirdir o fəndə, onu isnad edəcək yox.

Tarı, yaşasın ali təb'ari bu cahanda,
Xahanları xoşnud ola bari bu cahanda,
Öldürdü bu qəm Novrəsi-zari bu cahanda,
Ya rəb, nə üçün zar Nigari bu cahanda
Naşad edəcək yoxsa da, bir şad edəcək yox.

Təxmisi-qəzəli-Knyaz Mehdiqulu xan Vəfa:

Dela, boqzər əz nəfse-xod zin sepəs,
Əgər aqeli, baş fəryadrəs,
Çe xoş qoft Knyaze-meskinnəfəs:
"Məyazar əz xod dele-hiç kəs,
Təriqe-səadət həminəst, bəs".

Təb'əh bad viraneyi-əngəbut,
Bovəd tar kaşaneye-əngəbut,
Şəvəd sərnegun laneye-əngəbut,
"Besuzəd şəbi xaneyi-əngəbut,
Deləş gər nəsuzəd behale-məgəs".

Biya mərhəmi bər dele-xəste nəh,
Kelide-qoşayeş dəre-bəste nəh,
Bedamən ze qol sobhdəm dəste nəh,
"Befərşe-çəmən paye-ahəste nəh,
Məbada berəncəd ze to xaro xəs".

Qədər seydra çon bedam əfkənəd,
Həm bixe-omrəş ze bon bərkənəd,
Beqeyde-bəla dəst pa mizənəd,
"Qəza dəste-səyyadra beşkənəd,
Gərəş rəhm nəayəd bemorğe-qəfəs".

Əgər padşahi və gər bəndei,
Betəxte-şəhamət bəra zenden,
Nəbini degər omre-payəndei,
"Nekuyi kon, ey dust, ta zendei,
Degər bar bazət nəgərdəd nəfəs".

Ço ğonçe beqol həmzəban baş xod,
Həmana qole-qolsetan baş xod,
Dər əxlaqe-niku əyan baş xod,
"To ba hər kəsi mehreban baş xod,
Təmənna məkon mehrebani ze kəs".

Məcu məkre-şeytan əgər adəmi,
Nə bəzme-neşato nə konce-qəmi,
Bexane-qənaət çe bişo kəmi,
"Xoşa an ke, azad gərdəd həmi,
Ze təhrike-nəfso ze keyde-həvəs".

Cəsarət nəmud ozre-Novrəs pəzir,
Gəda pişe-şahan nəgərdəd dəlir,
Mənəm mostəhəqqe-zəlilo fəqir,
"Vəfa, rahe-ensafra piş gir,
Təriqe-səadət həminəsto bəs"[248].

Novrəsin fəsih və mövzun kəlamlarından birisi də ali-Osmanın [tarixi-məsihiyyənin] 1898-ci sənəsində yunanlar ilə dava edib, onlara qalib gəlməsinin mədhü tə'rifidir ki, tərcibənd səbkində təhrirü tənzim olunubdur. Bu kəlamda da şair Osmanlının rəşid və şəci' əskərləri tə'rifini və tövsifini unudub, cənab Sultan Əbdülhəmid[249] həzrətlərini bipayan mədh etməsi fəthnaməni bir növ' əhəmiyyətsiz eləyir.

Bu fəthnamə beş bənddən ibarətdir ki, hər bəndin axırkı beytləri bunlardır:

Röyəti-iqbalına olsun kətib:
Nəsrü minəllahi və fəthün qərib[250].

Fəthnamənin axırıncı bəndini nümunə üçün məcmuəyə daxil etməyi lazım bildik:

Yarın ola, ey şəhi gərdunvüqar,
Kaşifi-ayati-xudavəndikar!
Ruzi-əzəl tutdu, bu məşhurdur,
Kongereyi-ərş onunla qərar.
Ərsəgəhi-qəzvədə tövhid üçün
Oldu səbəb qaimeyi-Zülfüqar.
Yarın ola sidq ilə siddiqi-pak,
Oldu o, peyğəmbər üçün yari-ğar.
Həqqlə batil üzə Faruq fürəq



Qoydu, edib dini-mübin aşikar.
Aləmi-əsrar odu Zünnureyn[251]
Katibi-ayati-xudavəndikar.
Min yaşasın dəhrdə Osman paşam,
Oldu əcəb baniyi-tədbiri-kar.
Kəbeyi-məqsudə yetib şövq ilə
Ədhəmi-alinəsəbi-namdar.
Cümləsi çün həmleyi-şiri-qərin,
Rəzmgəhə qoydu qədəm üstüvar.
Cümlə sərəskərlərə səd mərhəba,
Eylədilər hishəsini[252] tarmar.
Səngəri xali qoyuban cümləsi
Rahi-əzimət tutub etdi fərar.
Qəlbi-sipəh tapdı pərakəndəlik,
Qövmi-ədu qətlə yetib bişümar.
Novrəsi-biçarə bunu zikr edər,
Sultana nüsrət verə pərvərdigar.
Röyəti-iqbalına olsun kətib:
"Nəsrü minəllahi və fəthün qərib".

Bundan əlavə Mirzə Əliəsğərin çox tə'sirli növhələri və münacatü rübaiyyatları və gözəl təcnisləri vardır ki, cümləsinin buraya küncayişi yoxdur və yenə də nümunə üçün bə'ziləri təhrir qılındı:

Növhə:

Ta Şamə tərəf oldu rəvan məhmili-Zeynəb
Afaqə əsər eylədi ahi-dili-Zeynəb.

Üryan dəvə üstə yetişib küçəvü bamə,
Şam içrə tamaşagəh olub xas ilə amə,
Şad oldu cəfa əhli, o gün yetdi mərамə,
Bir məscidi-viranə olub mənzili-Zeynəb.

Dil təngə gəlib sinədə nalə əsərindən,
Həm xərməni-ömrü yanıb ahi şərərindən,
Ey çərxi-cəfapişə, bu dünya səmərindən
Olmuş ələmü möhnətü qəm hasili-Zeynəb.

Zülm ilə düşüb ali-Əli dərbədər, ey çərx,
Şərm eylə ki, ta olmaya xunin cigər, ey çərx,
Qıldın bu qədər cövrü cəfanı məgər, ey çərx,
Ah ilə müxəmmər olub abi-güli-Zeynəb.

Əyləşdi Yəzidi-səki-dun təxmi-qürurə,
Büğz ilə inadin necə gör gətdi zühurə,
Qıldı üseranı o dəm ehzar hüzurə,
Naməhrəm içində qurulub məhfili-Zeynəb.

Hökm eylədi ta kim, çəkələr pərdeyi-zərrin,
Verdi o zaman məclisinə rövnəqü təzyin,
Baş istədi bir-bir gətirib Şimri-bədayin,
Tain ki, füzun ola qəmü niskili-Zeynəb.

Qəlbində o gün cuşə gəlib büğzü ədavət,
Qarşıda Hüseyn başına çox qıldı şəmatət,
Çub əldə kəsik başə vurub dedi: Cəmaət,
Bundan sora asan olumu müşkili-Zeynəb?

Novrəs bu əzadə yetirib göylərə ahin,
Sürtəydi Hüseyn qəbrinə bu ruyi-siyahin,
Bağışla hamu şiələrin cürmü günahin,
Ya rəb, bəhəqi-möhnəti-dərdi-dili-Zeynəb!

## Təxmisi-qəzəli-Füzuli:

Azimi-rəzm olub Əkbəri-xurşidliqa,
Ola ta şövq ilə meydani-məhəbbətdə fəda,
Söylədi bir-birinə ləşgəri-mərdudü dəğa,
"Əşrəqət min fələkil-behcəti şəmsün və biha,
Mələəl-aləmə nurən və sürurən və bəha."

Mənəm, ey qövm, gülüstani-Əlidən bir gül,
Xəlq olubdur babamın vasitəsilə cüzü kül.
Qəddi-bisayəsidir aləm üçün sayəvü zül.
"Çıxdı bir gün ki, ziyasında təmamiyyi-rüsul
Oldu məhv öylə ki, xurşid şüasinə Süha"*.

Ərşə zinət verilib şövqi-vüsalinə görə,
Qaldı zülmatdə xurşid cəmalinə görə,
Asiman tapdı şərəf izzü cəlalinə görə,
"Rütbeyi-hikməti-me'raci-kəmalinə görə,
Hükəma firqeyi-dun, fəlsəfə cəm'i-süfəha".

Mustəfa oldu gecə qaimü gündüz saim,
Xəşyətüllahə görə olmadı hərgiz naim,
Ləngəri-qaimeyi-ərş onunla qaim,
"Müntəha mə'rifəti-hali-dil ilə daim
Qılır əhli-həqə əsrari-həqiqət inha".

Səbəbi oldu belə mə'rifətüllahın kim,
Oldu bəs rəhbəri firqeyi-gümrahın kim,
Şəqq edib cürmini səbbabə ilə mahın kim,
"Necə təqirir eləyim vəsfini bir şahın kim –
Ona övsaf ola "Yasin"ü müərrif "Taha".

* Süha – ulduz ismidir



Yandıra sizləri, ey qövmi-cəfa, nari-cəhim,
Lən edə sizlər üçün qadiri qəhhari-qəvim,
Müctəba könlü olub matəmi-Qasimdə dü nim,
"Oldu bavari-cəhan rövnəqi bir dürri-yetim –
Ki, deyil iki cahan hasili ol dürrə bəha".

Eşidib Novrəsi-miskin bu müsibət xəbərin,
Təb'dən sərf qılır lö'lövü dürrü göhərin,
Tə'ziyəxanı olubdur şəhi-cinnü bəşərin,
"Ey Füzuli, rəhi-şərini tut ol rəhbərin,
Bu təriq ilə zəlalətdən özün eylə rəha!"

* * *

Ya Əli, dil türreyi-tərrarın eylər arizu,
Zülmət içrə mətləül-ənvarın eylər arizu,
Dəmbədəm ol məxzəni-əsrarın eylər arizu,
"Bülbuli-dil gülşəni-rüxsarın eylər arizu,
Tutiyi-can lə'li-şəkkərbarın eylər arizu".

Ruzigarın sübhü şamilə xoş olmaz xatirim,
Hər cəlalü ehtişamilə xoş olmaz xatirim,
Yüz behiştasa məqam ilə xoş olmaz xatirim,
"Naməvü qasid pəyamilə xoş olmaz xatirim,
Öz ləbindən ləhceyi-göftarın eylər arizu".

Sən kimi canan yolunda nəqdi-can isar ola,
Xəstə könlüm çün ğəza xuni-dili-əfkar ola,
Göz xəyalında gərəkdir sübhədək bidar ola,
"Arizu eylər ki, mən tək müttəsil bimar ola,
Kim ki, vəsli-nərgisi-bimarın eylər arizu".

Qıldı vəslindən məni məhrum çərxi-bədşiyəm,
Olmuşam mən qürbət içrə mübtəlayi-dərdü qəm,
Etmədin, qardaş, neçün məktub inşavü rəqəm?
"Hicr bimarı tənim badi-səbadən dəmbədəm,
Səhhət üçün səhhəti-əxbarın eylər arizu".

Arizə qan yaşı gözdən cari eylər müttəsil,
Növhəxandır Novrəsi-məhzuni-müztər ilbəil,
Ya Əli, ruzi-cəzadə qoyma qalsın münfəil,
"Arizuməndi-vüsalındır Füzuli xəstədil,
Vəslin istər, dövləti-didarın eylər arizu".

Bunlardan əlavə Novrəs Füzulinin xeyli qəzəllərini təxmis qılıbdır və bə'zi təxmislərində o qədər fəsahət və bəlağət izhar edib ki, Füzuli ilə

onun kəlamına çətinlik ilə fərq qoyulur və xeyli dəqiq və nazik anlayan ədib istər ki, Füzulinin kəlamını ona tərcih qılıb, mümtaz olunan məqamü nüktələrini göstərsin.

Təcnisi-Novrəs:

Açılmış çəməndə gülü yasəmən,
Açılmaz könül, batmışam yasə mən.

Gətir, saqiya, cür'eyi-badə ver,
Könül qəmlərin bir zaman badə ver.

Tutub, saqi, qəm ləşkəri meymənə,
Xilas eylə qəmdən, yetir mey mənə.

Süfufi-ələm tutsa gər meysərə,
Nə qəm, vursa bu nə'şeyi-mey sərə.

Verib könlü zar etməyə bari qəm,
Əlif qamətim xəm qılıb bari-qəm.

Müqəyyəd könül ol sari-muyədir,
Dəmadəm işim şur ilə muyədir.

Düşüb yüzə zülf ənbəri-tər kimi,
Sərasər qılıbdır mənim tərkimi.

Özü şuxü sərməst cananədir,
Həmişə fəda cismi-cananədir.

Kəramətdir, ey qönçələb, bu sənə,
Veribdir qəza gül kimi busənə.

Qara zülfü məmzuc olub müşk ilə,
Salıb könlümü yeksərə müşkilə.

Ayaqdan salıbdır il ahim mənim,
Qurtarsın bu qəmdən ilahim mənim.

Deyirlər, gözəl, rəşki-ahu sənə,
Bu sözdür həqiqətdə ahu sənə.

Əgər qoysan ox qaşların yayına,
Kəman etmə onda gözüm yayına.

Dönüb kəc baxanda mənə alagöz,
Xəyalı budur canımı ala göz.



O sərvi-qədindən başə sayə sal,
Məni barı əğyardən sayə sal.

Vəfasız deyir bilmirəm kim sənə –
Ki, bilməz sənin qədrini kimsənə.

Görən bir nəfər əhli-dil varımı,
Ona bəzl edim can ilə varımı?!

Vəfalı ola dəhrdə yar odu,
Nə kim, Novrəsi yandıra yar odu.

Novrəsin cümlə asarü kəlamından çap olunan ancaq bir "Pəndi-ətfal" nam kitabçasıdır ki, o da Badkubə nücəbasından cənab Bəşir bəy Hacı Məhəmmədhüseyn bəy oğlu Aşurbəyovun xərci-ehtimamı ilə Tiflisdə Kamal əfəndi Ünsizadənin mətbəəsində 1318-[ci][253] tarixdə təb' olunubdur. Bu kitabçanın tərtibü tənzim olunmasına bais ədibi-məşhurumuz Soltan Məcid Qənizadə[254] olubdur ki, Novrəsə təzə məsləkdə iş görməyi və sərfi-himmət etməyi eyni-səlah görübdür. Bu barədə şair özü kitabçanın dibaçəsində səbəbi-təlifi-kitab babında kəşfi-məqal edib deyir:

O zaman bir cavani-xoştinət,
Xahişi-qəlbi rövnəqi-millət,
Adı Soltan, "Məcid"dir ləqəbi,
Qənizadə, o xeyirlər səbəbi
Dedi: – Ey Novrəsi-səfadidə,
Bəzmi-eyşi sən etmisən çidə.
Sən idin arifi-xərabati,
Keçirirdin səfadə övqati.
Aşiqi-vəchi-ruyi-dilbər idin,
Mayili-türreyi-müənbər idin.
Fikri-çəşmi-xummardə sərməst,
Yadi-zülfi-siyahdə pabəst.
Görməyən dəmdə sərvqəd yari,
Görünürdü qiyamət asari.
Yetməsəydin vüsali-dildarə,
Əcz ilə yalvarardın əğyarə...
Tapmısan nəzmü nəsrdə şöhrət,
Heyfsən, tazə halə qıl rəğbət.
Bəsdir, eylə təriqi-pəndə übur,
İndi kim, vəqt iqtizası budur.
Eylə təhriri-pəndi-ətfali,
Xeyrdən məktəb olmasın xali.

Məni ol şəxs eylədi tərğib,
Bu kitabı mən eylədim tərtib.
İltimasım budur ki, əhli-savad
Tutmasın Novrəsə dəxi irad.
Bəs ki, bu əsrdə pərişanəm,
Dilşikəstə əsiri-hirmanəm.
Məni-zarə tapılmadı cansuz,
Şişə şəhrində qalmışam yalquz[255].

Bu kitabçada rəvan şe'rlər ilə Novrəsi-həzin oğluna xitabən bir para gözəl nəsihətlər və pəndlər yazıb, elmü mə'rifətin insana lazım olmağını və ondan yetişən şirin, ləziz səmərələri bə'zi timsallar ilə sübuta yetirir və bundan əlavə o, əmrü mə'nahiyi-şərriyyələri birbəbir zikr edib, bu barədə dəxi münasib timsallar gətirir. Timsalların bir parası rusların timsalnəvisi Krılovdan tərcümə olunubdur. Kitabçadan atidə yazılan xitab ürəfa diqqətinə pişnəhad olunur:

Əyyühənnas məşər'ül-ürəfa,
Salikani-təriqi-sidqü vəfa,
Məsləhət birlə eyləyin imdad,
Ta ki, bu qüssədən olaq azad.
Susuz ağac kimi quru olduq,
Tə'nədən qeyri nə səmər bulduq?
Türfə əmrə biz etmədik iqdam,
Olmadıq elm üzilə nikunam.
Qalmışıq zülmət içrə, binuruz,
Gözümüz var, leyk biz koruz.
Hərzə-hərzə nə növ' söhbətdir,
Fikr qıl, axırı küdurətdir.
Haçana dək bu qiybətü böhtan,
Bəsdi bu iftira, xudadən utan.
Belə olmaz rüsumi-insanlıq,
Adəmə hərgiz etmə şeytanlıq.
Mərdümazar üçün nicat olmaz,
Dari-dünyada xoş sifat olmaz.
Sənə, guş et, edim nəsihət mən,
Ey gözüm nuru, olma qəlbşikən!
Olmagil hiç kimsəyə bədgu,
Öz əlinlə dəxi qazanma ədu!
Etmə hərgiz şəhadətnahəq,
Olma dünyada kazibi-mütləq.
Ta bəkey göftüguyi-bihudə,
Ola canlar tələf bu qəyqudə?!



Kişi, bəsdir, qutar mərarətdən,
Etgilən söhbəti-elm, sən'ətdən.
Bizə əmr etdi müxbiri-sadiq
Olaq əmri-ilahiyə şayiq.
Hökmünə gər verilsə rast rəvac,
Olmarıq qeyri söhbətə möhtac.
Buyurubdur kəlami-müstəhsən:
"Məhddən ləhdə kimi elm öyrən".
Eyləməz əhli-elm qilü qal,
Nədi salmaq araya cəngü cidal?!
Getsə gər bu sayaq nadanlıq,
Məhv olur yeksərə müsəlmanlıq.
Bizlərə vay, vay, müsəlmanlar!
Bəri başdan haray, müsəlmanlar!
Gecələr sübhədək xəyal edərəm,
Bu dili-zarə şərhi-hal edərəm.
Bir deyil batin ilə zahirimiz,
Nə olur, ey ilahi, axirimiz...[256]

Mirzə Əliəsğərin "Pəndi-ətfal"ə daxil olan bə'zi timsalları ilə tə'limə dair məcmuələrimizi zinətləndirməyi öz tərəfimizdən tə'lim kitabları tərtib edənlərə məsləhət görürük.

## MƏŞHƏDİ MİRZƏ CƏFƏR HACI SEYİD QASIM OĞLU "CƏFƏR"

Məşhədi Mirzə Cəfər Hacı Seyid Qasım oğlu dəxi Qarabağ şüəralarından olub, fars, türk dillərində xeyli banəmək şe'rü kəlamları vardır.

Mirzə Cəfərin xasiyyətində hərdəm bə'zi xariqüladə müşahidə olunurdu ki, adamı heyrətə salırdı və onun başının bir növ' salamat olmamağına dəlalət edirdi. Bəni-növ'i-bəşərdən bilümum, Qarabağ əhlindən bilxüsus özünü rəncidə və mütənəbbeh hesab edib, həmişə onlardan dur və kənar gəzərdi və ehtiyat edərdi ki, Adəm övladından ona bir nişü zərər toxunmasın. Necə ki, bir kəlamında adam nə olduğunu yazıb bəyan edir:

Adəmizad bədtər əz marəst,
Qəlbeşan daema dər azarəst.

Batene-mərdoman kəsifo xəbis,
Zahere-mar nərmo həmvarəst.

Dəst bər poşte-mar malidən
Pişe-mən behtəro səzavarəst.

Dəst bər dəste-adəmizade
Baz dadən nə kare-hoşyarəst.

Migəzəd mar gəhbegəh mərdom,
Adəmizad bədtər əz marəst.

Beh şəvəd nişe-mare-bədəxlaq,
Nişe-adəm mozerro doşvarəst.

Monkerane-nəsayehe-Cəfər
Həm palido şəriro mordarəst.

Çeşme-Cəfər ze didəne-nadan,
Həmço nərges modam bimarəst[257].

Mərhum Mirzə Cəfərin kəsbi libasfüruşluq idi. Moskvadan təzə və köhnə əlbisə alıb, Şuşa qalasında xərid-füruş edərdi. Ziyadə xoşsöhbət və baməzə olduğuna görə, həqir dəxi düşəndə bir onun dükanına gedib, söhbətilə feyzyab olardım. Mərhumun hər yerdən və hər elmdən ittilaatı var idi və özü də çox xoşsöhbət idi və bir kəs ilə meyli olsaydı, ondan canını və malını əsirgəməzdi.



Bəzi vaxt ondan elə bir təəccüblü fe'lü hərəkətlər sadir olardı ki, mən təəccüb edərdim. Məsələn, müştərilərdən xoşuna gəlməyənləri bə'zi eyham və işarələr ilə şey'i almaqdan məhrum və mə'yus edib, bir manata dəyən şeyə on manat qiymət qoyub geri qaytarırdı. Səbəbini soruşanda deyirdi ki: Filankəs, sən onları tanımırsan, amma mən sima və hərəkətlərindən görürəm ki, onlar nə yuvanın quşlarıdır. Mən mən' etdiyim adamların cümləsi mühil, kəzzab və mərdümazardırlar. Onların pulu zəhrimardan acı və donuz ətindən haramdır. Mənə nə olubdur ki, halal malımı harama dəyişdirim?!

Mərhum Mirzə Cəfər nəinki qeyri adamlardan, hətta öz əcdadü övladından dəxi yaxşılıq gözləməzdi və onların haqqında dəxi xeyir və səlahı və yaxşılığı ağıldan kənar əməllərdən hesab edərdi və kəlamının birisində onların barəsində deyibdir:

Nikukari məkon oulade-xodra,
Nikuxahi məkon əcdade-xodra,
Nikukari əgər sudi bebəxşid,
Çera adəm nəkərd oulade-xodra[258].

Mirzə Cəfərin türk və fars əş'arından bir neçəsini nümunə üçün burada nəzəri-ərbabi-kəmala təqdim qılırıq.

Qəzəli-türki:

Ümmandan xövf eyləməz, bəhrində qərqi-abdır,
Təşnə demək olmaz ona, çün eşqdən sirabdır.

Qaşın təriqi-zahidə bir qiblədir Kə'bə kimi,
Göstərməyə hacət yolun min məscidə mehrabdır.

Nuri-cəmalın sərbəsər olmuş ümumə rahbər.
Hər mücrimü hər müşrikə simaların əhbabdır.

Yelda kimi zülfün siyəh, hüsni-cəmalın mehri məh,
Yerdə özün insansan, göydə üzün məhtabdır.

Şəhdi-ləbin abi-səfa, mürdə dilə ruhi-bəqa,
Təlx gəlü bimar üçün çün kuzeyi-cüllabdır.

Qönçə ləbin lə'li-Yəmən mövcud isə yoxdur dəhən,
Çox cüstücu etdim onu, Ənqa kimi nayabdır.

Məhbubi-yari-dilgüşa canbəxşdir sübhü məsa,
Sirkəruxin bədmənzəri əhli-dilə mizrabdır.

Qəlbü dilim əhli-dilin hər zülmünə möhkəmdi çox,
Nazikdi pərrü pəşşədən, naəhlə çox bitabdır.

Çəşmi-xumari-dilbərə sübhü məsa qıldım nəzər,
Dəydi gözə kim, guyiya mən tək o da bixabdır.

Cəfər, qiyami-qamətin kim görməsə nadim olur,
Məhşər günü virdi onun "ya leytəni türab"dır[259].

Qövli-sərihi-Cəfərə mədhin desə, kazib demə,
Cəfər əgər kəzzab isə, sən söyləmə kəzzabdır.

Əyzən qəzəli-türki:

Saqi, mənə, Allaha bax, dur badeyi-əhmər gətir,
Canü dilə od salmağa, bir şöleyi-azər gətir.

Şuri-sərim şurə düşüb, piri-təriqət axtarır,
Mən gümrəhi-eşq olmuşam, bir saliki-rəhbər gətir!

Bir cür'ə ver sərgərm olum, məxmurü həm dilnərm olum,
Çünki mənəm piri-köhən, meydən mənə kəmtər gətir!

İbriqi-mey al dəstinə, doldur onu, ləbriz elə,
Peymanəvü rətli-giran, həm camü həm sağər gətir!

Xum xumm ola yoxdur qəmim, sərşarlıq xoşdur mənə,
Mehrü məhi yığ başıma, həm xosrovi-xavər gətir!

Ver mey içim, dövr eyləyim nahəqqdən həqqə tərəf,
Yoxdur pərim dövr etməyə, balü pərü şəhpər gətir!

Mey ver mənə pakü həlal, məmzuc ola şadi, məlal,
Bu tinəti pak etməyə bir badeyi-əthər gətir.

Mən Kə'bədən əl çəkmişəm, məbəd mənə meyxanədir,
Mən tək hanı həqqi tapan, bir pakdil kafər gətir.

Meyxanədə carub olam, sübhü məsa fəxr eylərəm,
Bu dərgəhə mən tək hanı bir müxlisi-çakər, gətir!

Çox sərddir təb'ü məcaz, mey vergilən tapsın rəvac,
Gər istəsən sərgərm olum, həm udü həm məcmər gətir!

Mən cəfəriqövl olmuşam, dinimdi dini-cəfəri,
Ney Cəfəri kəzb etməyən, yüz kəzb edən Cəfər gətir!



Mirzə Cəfər sair qəzəllərində dəxi öz müasir[lər]indən və xüsusən din qardaşlarından şikayət eləyib və riyayi zöhdü təqvanı təzmim qılıb, saxta və yalançı vaizlər və fəqihlərin eyblərindən danışır və bir qəzəlində yenə vaizə xitabü itabla deyir:

Necə mümkündür, ey vaiz, müsəlmanda nizam olsun,
Həmi əhli-kəlam olsun, həmi əhli-səlam olsun?!

Necə insafdır şeytan gəlib görsün bizim əhli,
Atıb şə'nü cəlalini, müsəlmana qulam olsun?!

Əgər hacı yola gəlsə, əgər vaiz desə doğru,
Bəli, lazım tutar onda gərək dünya tamam olsun.

Bular hər bir müsəlmanı edər qarət elə düşsə,
Belə fe'lü belə tinət görüm, ya rəb, həram olsun!

Məni yar eyləmə, ya rəb, qiyamətdə bular ilə,
Mənə qismət cəhim olsun, ona cənnət məqam olsun!

Mənə, vaiz, qəmiş qoyma, yeri, rişə həna bağla,
Mənə meyxanə yer olsun, sənə mənzil həmam olsun!

Cəfər, ləğvin təbil etmə, gecə keçdi tamam oldu,
Gecə yoxdur bu Məskoda, hekayətin tamam olsun!

Bu şe'rləri mərhumun Moskvada yazmağı axırkı sözlərindən anlaşır. Onun qəzəliyyatından xeylisi Moskva şəhərində yazılıbdır ki, orada alış-veriş eləyirdi və bir neçə baməzə qəzəllər Xeyransa xanım Məhəmmədbəyovanın haqqında söyləyibdir. Xeyransa xanım, görünür ki, kamilə və cövhərli xatunlardan birisi imiş və özü də ləzgi bəylərindən Şeyx Şamilin[260] həmşirəzadəsidir.

Bir qəzəlində deyir:

Duş üzümdən öpüb şövq ilə Xeyrənnisa
Söylədi: – Ey Cəfərim, mən səni şah eylədim.

Pərdənin açma üzün, ay əmi, ağrın alım,
Sən də günah eylədin, mən də günah eylədim.

Burada Xeyransa xanımın ona yaxın olmağını bildirirsə də, özgə bir qəzəlində şikayət dililə ondan gilayə edib deyir:

Səngdil olduğunu mən əzəli bilmişdim,
Vəsfini etmək üçün bu qəzəli bilmişdim.

Əməli-xeyr varındı nə mənə, qeyrilərə,
Səndəki zahir olan xoş əməli bilmişdim.

Dilbərin baxma dilinə, sözünə aldanma,
Başına yağ çəkən çox keçəli bilmişdim.

Cəfəra, yarı burax, söhbət elə ruhani,
Mən səni şair ilən çox məzəli bilmişdim.

Çək ayağın, geri dur, xeyr sənə xeyr deyil,
Xeyrdən sənə tərəf yox məhəli bilmişdim.

Yeri, əhestə, yeri, alma belə bari-giran,
Eşqə iqdam edəni çox şələ'li bilmişdim.

Mali-xalis hanı ki, tikdirəlim tazə libas,
Satdığım köhnələri mən bədəli bilmişdim.*

Cəfəra, əcz nədir kim, edəsən canana,
Xeyri tək səngdili mən əzəli bilmişdim.

Zahirdə Mirzə Cəfər nə qədər xoşsöhbət və baməzə adam görünürsə də, batində həmişə fikrü əndişədə idi və axır vaxtlarda onun ünas övladı bədbəxt və zükur övladının bişüur və bir növ' divanəvar olmağı, xüsusən böyük oğlu Qasım ki, Qori darülmüəllimini tamam etmişdi və bir neçə müddət müəllimlik edib, sonradan dəli olmağı ona artıq dərəcədə tə'sir etmişdi və bu qədər fikrü təəmmülə davam gətirə bilməyib, hicrətin 1320-ci sənəsi ramazanül-mübarək ayında[261] dəllək onun evində başını qırxdığı halda fürsət tapıb onun ülgücü ilə öz qarnını yarıb, bağırsaqlarını parə-parə etmişdi və ondan sonra filfövr vəfat eləmişdi. Təəccüb etməli budur ki, guya şairin qarnını yırtmaq fikri çoxdan onun başında varmış. Çünki bu faciədən xeyli müqəddəm şair bir qəzəlində müftəxorları (əngəlləri) təzmim edib, qəzəlin axırında deyir:

Bəsdi, həya eyləgilən, Cəfəra,
Qeyrət edib çək ayağa zəngəli.

Parə edərdim şikəmi-parəmi,
Olsa idi məndə əgər nəng əli.

Mirzə Cəfərin böyük bir məcmuəsi var ki, öz xətti il yazılıbdır, amma sair şüəranın əsərləri kimi təb' olunmayıbdır.

* Burada şair özünün köhnəfüruş olmağına işarə edir.



## MİRZƏ MEHDİ "NACİ"

Gəncə şairlərinin ən müqtədiri və rəvantəb'lisi mərhum Mirzə Mehdi "Naci" təxəllüsdür. Heyfa ki, onun tərcümeyi-halına dair lazimeyi-məlumat cəm' etmək mümkün olmadı. Ancaq mərhumun başdaşında yazılan maddeyi-tarixdən belə mə'lum oldu ki, Mirzə Mehdi hicrətin 1300-cü sənəsində cəmadiyüs-saninin 20-ci günündə[262] dari-bəqaya rehlət edibdir.

Müasirlərinin söylədiyinə görə, sinni təxminən yetmişə çatmışdı[263]. Şüğlü əfkarını nəqqaşkarlıqda, təbiblikdə və şe'r deməkdə işlətmişdir. Nacinin hər qisim əş'arü kəlamları mövcuddur. Məcmuəsi varmışsa da, dağılıb tələf olubdur[264]. Mərhum Mirzə Mehdi qarabağlı Abdulla bəy Asinin, Xarrat Qulu Yusifinin, Şamaxı şairi Hacı Seyid Əzimin və Qazax şairləri Mustafa ağa Nasirin və İskəndər ağa "Şair" təxəllüsün müasiri olduğundan onlar ilə irsal-mərsulu və aşinalığı var imiş.

Abdulla bəy Asi Mehdiqulu xanın qızı Xurşidbanu həzrətlərinə yazdığı həcvə nəzm ilə cavab verənlərin birisi də mərhum Mirzə Mehdi Naci olubdur ki, bu barədə qarabağlı Yusifinin tərcümeyi-halında bə'zi məlumat verilibdir. Mirzə Mehdinin yaxşı savadı varmış, təb'i-şe'riyyəsi dəxi ziyadə rəvan, zərif və güşadə imiş. Fikri səlim və düzgün olduğundan bə'ziləri onu sufi və qeyri məzhəb deyib müttəhim edirlərmiş. Asari-qələmiyyəsindən bacardığımız qədər toplayıb, bir neçələrini burada dərc edirik.

Qəzəli-Mirzə Mehdi Naci:

Könül mürği səri'-kuyindən özgə bir məkan tutmaz,
Bu sirri xəlqdən kim, eşq asari nihan tutmaz.

Nigəhbanlar kimi xalisiyəhlər tutdu damanim,
Deyil adət qulami-xanəzadı pasiban tutmaz.

Tüyurin bəççəsi öz aşiyanində bulur rahət,
Onunçun mürği-dil zülfündən özgə aşiyan tutmaz.

Könül şəhbazi meyli-kəbkü türacü təzərv eylər,
Əzizim, meyl edib hərgiz o, mürği-makiyan tutmaz.

Verən can nəqdini bazari-eşqi-dilrübalərdə
Əyandır hiç tacir böylə sövdadən ziyan tutmaz.

Olub viranə dil mülkü, çıx ondan, yığ büsat, ey dil,
Xərab olmuş məkanda hiç aqil xaniman tutmaz.

Qulamın olmasa mövlasına ixlası kamiltər,
Bu rövşəndir, onu mövlası bir dəm kamran tutmaz.

Əgər tökdünsə qanım qəhr ilə, bir cür'ə nuş eylə –
Ki, derlər böylə olsa qanlını, əlbəttə, qan tutmaz.

Mənə derlər ki, tərki-eşqi-yar et, özgə yarı tut,
Şikari-rubəhi, haşa, gedib şiri-jəyan tutmaz.

Deyir xəlqə həmişə zahidi-zahirpərəst iman,
Özü fail olan fe'li, əzizim, rahban tutmaz.

Təriqi-eşqdə, Naci, ayağın kəsmə qəflətdən,
Xilafi-rahi-eşqi, bigüman, bir nüktədan tutmaz.

Nacinin bu gözəl qəzəli mərhum Qasım bəy Zakirin:

Könül mürği səri'-kuyində, ey gül, aşiyan tutmuş,
Əcəb naəmn mənzildə məkan ol natəvan tutmuş.

– beyti ilə başlanan qəzəlinə çox oxşayır. Fəsahət və lətafətdə dəxi Zakirin kəlamından əskik deyil və lakin mə'naya gəldikdə, demək olur ki, Zakirin qəzəlinin buna tərcihi var, xüsusən zeyldə yazılan beytlərdə ki, Nacinin qəzəlində onların misli yoxdur:

Olub huşyar bəzmi-badədən ol gün əyağ çəkdim –
Ki, gördüm lə'li-nabınla qılır də'va o qantutmuş.

Dəhən sirrin eşitdim xürdədandır, qönçədən sordum,
Dedilər bilməzik, bu sirri həq bizdən nihan tutmuş.

Qəmü möhnət yükün aləmdə yoxdur çəkməyən, əmma
Şikəstə Zakirin çərxi-fələk barın giran tutmuş.

Əyzən qəzəli-Naci:

Dila, hər bir cəfa kim, yardəndir, eyni-rahətdir,
Gədayə hər nə gəlsə şahdən, eyni-inayətdir.

Cigər qanı gözümdən gəldiyiçün dəmbədəm artar,
Əgər olsaydı dərya, qurtarardı bu nə hikmətdir?!

Hədisi-Qeysü Fərhadü Züleyxa, Vamiqü Əzra
Mənim hali-pərişanım yanında bir hekayətdir.

Qoyanda – yaxşı saxla – dedilər – təndə dilü canı –
Ki, təndə nəqd canın bir pərinindir, əmanətdir.



Soruşdum: – Ey büti-şirinləbü şəkkərdəhən, aya
Bu istiğnalı olmaq xubrulərdə nə adətdir?

Dedi: – Aşiq olan lazımdı tab etsin qəmi-yarə –
Ki, mə'şuq aşiqə hər nə rəva görsə, inayətdir.

Dedim: – Dilbər, müəmmayi-dəhanın aşikar eylə!
Dedi: – İma əgər əbrudən etsəm çox kifayətdir.

Dedim: – Məqsudin, ey, can isə minnətdir dilü canə,
Dedi: – Məhvəşlərin sevdası əvvəldən xəsarətdir.

Dedim: – Pərvanə tək, cana, sərasər cismimi narə
Əgər yaxsan, məni-dilxəstəyə lütfü səadətdir.

Züleyxa başinə gör kim, nə işlər gəldi Yusifdən,
Əgər peyğəmbəri-həqq isə, həqqa, bidəyanətdir.

Qərəz kim, məqsədi-məqsudə yetmək istəsən, Naci,
Fəna sərmənzilin istə ki, ol, möhkəm imarətdir.

Mərhum Nacinin bu[265] qəzəli dəxi hər bir barədə Zakirin və Həsən Qarabağinin[266] və Seyid Şirvaninin qəzəllərinə bərabər olub, onun həqiqi şair olmağına dəlalət edir.

Nacinin atidə yazılan fars dilində inşa qıldığı bahariyyatı onun qüvveyi-şe'riyyəsini göstərir. Anladığımıza görə, türk şüərasından mərhum Qüdsi[267] və cənnətməkan Vəfadan qeyri bir kəs fars dilində bu fəsahət və bəlağətdə kəlam söyləməyibdir.

Nacinin bu kəlamı onun qüvveyi-şe'riyyəsinin ziyadə mətin, ötkən və güşadə olmağını göstərir.

Bahariyyati-Naci:

Saqi, biyar bade bəhar aşekar şod,
Bəste-bosate-məclese-mey bərqərar şod.
Bidar şod ze xab ço ətfal səbzeha,
Fərşe-zəmin ze lalevo qol lalezar şod.
Çon bəççehaye-səbze ze pestane-əbrha,
Ba əmre-zolcəlal həme şirxar şod.
Əzhar çon ze xake-siyəh sərbedər nəmud,
Sone-xoda bebin ke, ze qodrət çekar şod.
Abe-rəvan ze əbre-səma bər zəmin fetad,
Əz zire-paye-sərve-rəvan cuybar şod.
Nisan bebareş amede əz hokme-kerdeqar,
Dər bətne-hər sədəf ke dorre-şahvar şod.
Peyda ze şaxha şode hər qesm miyveha,

Əz şaxe-xoşke-sibo beho həm ənar şod.
Çon bid did an həme əşcare-barvər,
Əfkənde sər bezir bəsi şərmsar şod.
Əz bəhre-nuşe-badəpərəstane-laubal,
Dər çube-tak doxtəre-rəz xuşedar şod.
Kəbkane-kuhsar xoraman behər tərəf,
Tihu bedəst pənceye-şahin şekar şod.
Əz hər tərəf şekufe betərfe-çəmən dəmid,
Rounəq gereft bəzme-çəmən ostovar şod.
Qol dər neşəst əz həme bala besəd ğorur,
Fərmanrəvaye-padşəhe-kamqar şod.
Arayeşe-təmam bedadənd cəşira,
Fərmude saqiyane-çəmən dər mədar şod.
Hər kəs beqədre-housələye-xiş nuş kərd,
Besyar xord nərges əz an bəs xomər xod.
Ba yekdigər neşəste besəd ləzzəto sorur,
Bolbol beaho nale, qol həmrahe-xar şod.
Çon əndəlib buye-vəfara zeqol nədid,
Del xun şode ze didevo del əşkbar şod.
Lale keşid dağe-həsəd bər deləş çera,
Nəsrino bənəfşe dər kəfe-əhle-kobar şod.
Rəft əz miyan comleye-qolha bedəşto kuh,
İn baesəst məskəne-vey kuhsar şod.
Çon adəte-zəmane həminəst daima,
Əz doure-ruzeqar zəlilo nezar şod.
Vəqte-bəhar, mouseme-qol çon təmam gəşt,
Aməd xəzan ruye-çəmən porqobar şod.
Came'-neşat, qolşəne-qol gəşt sərnequn,
Qolqun qəba zeqaməte-qol tarmar şod.
Xamuş gəşt comleye-morğane-bağha,
Biçare əndəlib ze qolşən fərar şod.
Naci, ço eyşo ləzzəte-donya bekəs nəmand,
Key bovəd dər cəhan ke kəsi paydar şod[268].

Çün hər əhli-səfavü hal və hər ərbabi-məanivü kəmal bu kəlamı mütəliə edib, onda olan lətafət və məziyyəti hissü dərk edəcəkdir, ona binaən bu barədə artıq söz söyləməyi lazım görmədik.

Bu qəzəl dəxi mərhum Mirzə Mehdi Gəncəvi Nacinin kəlamları cümləsindəndir ki, Divaninin bir qəzəli[nin] bəhrü vəznində yazılıbdır:

Şanə hər dəmdə ki, ol zülfi-pərişanə dəyər,
Tari-mulər dağılıb hər biri bir yanə dəyər.

Şövkətü şan ilə cahın sənin, ey şahənşah,
Rif'əti-dəbdəbeyi-cahi-Sülemyanə dəyər.



Atma qəmzən oxunu, xövf elə zülm etməkdən –
Ki, atan dəmdə gəlib hər biri bir canə dəyər.

Könlümə vurdu cəfa oxlarını müjganın,
Afəti-dəhr dəxi bir gün o müjganə dəyər.

Zahida, olma məlul əldəki peymanəmdən,
Ədəmi-sidqin ilə səndəki peymanə dəyər.

Dili-zarımda bəsi sancılıdır peykanın,
Atasan yüz kərə peykanını peykanə dəyər.

Daneyi-xali-ruxi-yarə nəzər qıl, zahid,
Billah ol sübhcyi-səddanənə bir danə dəyər.

Naciya, salma nəzər mahliqalər yüzünə,
Atəşi-mə'siyətin pənbeyi-imanə dəyər.

Divaninin qəzəli bu sayaq başlanır:

Şanədən zülfi-siyəh ol ruxi-cananə düşər,
Necə kim, gün tutulub, sayə gülüstanə düşər.

## HACI MOLLA ABBAS "ŞÖ'LƏ"

Mərhum Hacı Molla Abbas Hacı Abdulla oğlu əslən isfahanlı imişsə də, yenə Gəncə şüərasının zümrəsindən hesab olunur.

Hacı Molla Abbas "Şö'lə" təxəllüs təxminən qırx beş sənə bundan müqəddəm Gəncəyə gəlib, orada evlənibdir və lakin övladı olmayıbdır. Şö'lə Hindistanı, İranın çox yerlərini, Ərəbistanı və Misiri seyrü səyahət edib xeyli bilik və təcrübə kəsb etmiş bir vücud idi. Qafqaziyanın dəxi çox yerlərini gəzib, onda olan müxtəlif əqvamü miləlin abadü ayini ilə bələd olmuşdu.

Mərhum Şö'lə təvəllüdü zamanından ömrünün müsinn çağına qədər xəstə olmadığını və hətta baş və diş ağrısı nə olduğunu bilmədiyini öz dost və tanışları yanında iddia edərmiş. Şö'lə fars və türk dillərini kamil vəchdə bilirmiş. Amma əş'arü kəlamının çoxusu türk dilindədir. Yazdığı əş'arın əksəri, demək olur ki, Gəncə şəhərinin xüsusi vüquatına və onda vaxtbəvaxt zühur edən əlamata, vüqua gələn təğyirata və Gəncə əhlinin əxlaqü adatına dairdir. Şö'lənin dili açıq və sadə olduğuna binaən, onun kəlamları hər kəsə, hətta kəmsavad adamlara da xoş gəlir.

Məcmuəsi var, amma çap olunmayıbdır[269]. Şö'lə vəfat edibdir Gəncədə 1899-cu ildə, təxminən yetmiş yaşında.

Əsərlərindən nümunə üçün Gəncənin vəsfində yazdığı şe'rləri burada gətiririk:

Gəl, ey aləm ara qəmxanə Gəncə,
Dönübsən məhbəsü zindanə, Gəncə!
Əgərçi zahirən abad olubsan,
Olubsan batinən viranə Gəncə!
Sənin üstündə çox qanlar tökülmüş,
Binayi-dəhrdən piranə Gəncə!
Gəhi Osmanlının, gəh Rusun oldun,
Nəsib oldun gəhi İranə, Gəncə!
Bu çərxin qafil olma gərdişindən,
Olur dövran yenə dolanə, Gəncə!
Yəqin et, səndə heç bir qəlb açılmaz,
Gedə gər bağ ilə bostanə, Gəncə!
Olur şad ol zamanda kim, ayağın
Qoyar bir məscidə, meydanə, Gəncə!
Bina tutmaz birisi səndə yayda,
Atarsan hər birin bir yanə, Gəncə!
Ədəb, hörmət aradan oldu nabud,
Çü fayton gəldi bu meydanə, Gəncə!
Keçənlər öldü qurtardı, yerindən –



Ki, biz gəldik yaman dövranə, Gəncə!
Həqiqət Qafqazda şəm' idin sən,
Cəm'ii-şəhrlər pərvanə, Gəncə!
Sədaqətlə rəfaqət itdi, getdi,
Dönüb işlər hamı yalanə, Gəncə!
Lisanlar cümləsi təğyir olundu:
"Pajaluysta" olub qurbanə, Gəncə!
Məqamı kəfşkən kəslər keçərlər
Necə gör sədrə bir şahanə, Gəncə!
Olar kim, beş qruşa yalvarırdı
Deməzlər indi pul milyonə, Gəncə!
Nə günlər səndə gördüm bundan əqdəm,
Həzaran heyf ol dövranə, Gəncə!
Ağardı baş, dişim səndə töküldü,
Məni həsrət qoyubsan nanə, Gəncə!
Olar kim, tülküdən eylərdilər xövf,
Dönüblər şir ilə aslanə, Gəncə!
Tamam iftardə paprus çəkərlər,
Olubdur çün əvəz qəlyanə, Gəncə!
Əcəb iftar, əcəb ruzə, əcəb rəsm,
Şəriət düşdü çox nöqsanə, Gəncə!
Gözüm yaşı bu ruxsarə rəvandır
Gedəndə səmti-qəbristanə, Gəncə!
Çəkər meydanü məscid iştiyaqi,
Gedəndə Şö'lə Hayestanə, Gəncə!

Şö'lə bu şe'rlərində Gəncənin özünü və həm əhalisini təzmimü təyib edib, onu bir məhbəsü zindanə oxşadır ki, ol qəmxana zahirdə abad görünürsə də, batində viranədir. Onun üstündə çox qanlar tökülüb, canlar fövt olubdur; gah Osmanlıya tabe olubdur, gah Rusa və gah da İran qoşunu onu təsxir edibdir.

Gəncədə yüz bağ və bostana seyr üçün gedilsə də, bir kəsin könlü açılıb, ürəyi şad olmaz. Burada ancaq qəlbi şad edən bir məsciddir, bir də Gəncənin gen və vəsi' meydanı. Keçmişdə sair şəhərlərə nisbət Gəncə şəhəri şam imişsə də və sair şəhərlər pərvanə misal onun başına dolanarmışsa da, indi onun rövnəqi dönüb və övraqı pozulubdur. Əhali arasında adabü ərkan götürülübdür. Xüsusən fayton çıxandan bəri xalqın əxlaqı xarab olub, dillərini də dəyişiblər. İndi hər bir şey bir "pajalustaya" münhəsrdir. Ədna şəxslər və kəfşkəndə məqamı olanlar sədri-məclisə keçiblər və beş qruşa möhtac olan adamlar indi milyona da pul demirlər və bu pulun və dövlətin səbəbinə tülküməzac və qorxaq vücudlar indi aslanə dönüblər. İftarda qəlyan əvəzinə papiros çəkirlər.

Xülasə, sabiqdəki rəsmü qayda götürülüb, dinə rəxnə və şəriətə nöqsan yetişibdir. Bu şe'rlərdən görünür ki, mərhum Şö'lə köhnəməslək və bir növ' fanatik adamlardan birisi imiş ki, şəriətin nöqsana düşməyini ramazan ayında qəlyan əvəzinə papiros çəkilməkdə və camış arabasının əvəzində fayton minməkdə görür. Bu məsləkdə davam edən köhnəpərəstlər indi də içimizdə az deyil. Şair keçmiş vaxtları ki, onda Avropa rəsm adətindən bir əsər yox idi, həsrətlə yad edib deyir:

Nə günlər səndə gördüm bundan əqdəm,
Həzaran heyf ol dövranə, Gəncə!
Ağardı baş, dişim səndə töküldü,
Məni həsrət qoyubsan nanə, Gəncə!

Yuxarıda zikr olunan mənzumata bər'əks olaraq mərhum Şö'lə özgə bir kəlamında Gəncəni bu sayaq tə'rif qılır:

Gəldi bahar, oldu əcəb çağı Gəncənin,
Bazarə gəldi süd ilə qaymaği Gəncənin.

Bir vaxt var o şəhrdə çox-çox fəsadlər
Yapraq açanda çubi-çinaranı Gəncənin.

Qış fəsli səbzəcat,[270] ələf, sairə nəbat,
Əltafi-həqqdir Ərəbistanı Gəncənin.

Artmazla xəlqi, bilmirəm aya səbəb nədir,
Ya rəb, məgər ki, vəqfdi torpağı Gəncənin.

Hər kim ki, getməyibdi, yəqiqən gedən bilər,
Guya ki, bir behişti yaylaği Gəncənin.

Çox yerdə vardı məscidi-came' zəmanədə,
Heç yerdə yoxdu məscidinin tayı Gəncənin.

Çöl əhlinin müəzzini çaqqallar olur,
Qiblə olubdu Haçaqaya dağı* Gəncənin.

Etmə güman ki, xəlq qoyub ehtiyatını,
Pünhan olub yapıncı da, çomağı Gəncənin.

Şö'lə bu qədri vəsf eləmə, əlqərəz budur,
Yoxdur cahanda tay ilə ortağı Gəncənin.

---

* Haçaqaya adlanan dağ Kəpəz dağıdır ki, Gəncənin cənub səmtində vaqe olduğu üçün avam xalq qibləsini onunla tə'yin edir.



Şö'lənin hər iki şe'rləri ki, burada təhrir olundu, Gəncənin keçmişindəki övza'vü əhvalına dair məlumat verməyi ilə layiqi-diqqətdir və şe'rlərdən onun sahibi-təb' olması anlaşır. Və lakin ikinci və üçüncü beytlərdə "çinaranı" və "Ərəbistanı" sözləri rədif olaraq qeyrilərlə mütabiq gəlmir. Bu isə tamami kəlama bir növ' nöqsan gətirir.

Aşağıda yazılan beytlər dəxi Şö'lənin kəlamlarındandır. Bunlardan başqası ələ düşmədi:

Əcəb divanədir, yaran, görün bu mərdümi-aləm,
Bəla zəncirinin adın qoyublar türreyi-pürxəm.

* * *

Mənə bir navəki-peykan vurubdur ol kəmanəbru –
Ki, hərgiz Əşkbusi vurmayıb bu şəstlə Rüstəm.

* * *

Gərçi çox müşkül olur darü diyar ayrılığı,
Hamıdan müşkül olur sevgili yar ayrılığı.

# MƏŞHƏDİ HİDAYƏT BƏY "XAKİ"

Məşhədi Hidayət bəy Molla Abdulla oğlu Mirzəyev Gəncə şairlərindən birisi hesab olunur. Türkcə və farsca yaxşı savadlı var imiş, rusca da bilirmiş.

Mərhum Məşhədi Hidayət bəy cavanlığında Gəncə vilayət idarəsində (qubernski upravleniyedə) mütərcim olub, çox sənələr bu mənsəbdə qulluq edibdir. Sonraları qocalıq halında istefa verib xanənişin olubdur. Məşhədi Hidayət bəyin təxəllüsü "Xaki" olub, bəzən "Hidayət" dəxi yazarmış.

Yetmiş yaşı olduğu halda 1903-cü ilin oktyabr ayının 14-cü günündə Gəncə şəhərində vəfat edibdir.

Mərhum Xaki çox mö'min, mütədəyyin, sadiq, əmin və düzgün bir zat imiş ki, Gəncə əhli indi də onu zikri-xeyir və rəhmətə yad edir. Xaki mütəəddid övlad müsibətinə düçar olduğu üçün yazdıqları əş'arın bir çoxu növhə misallı hüznavər kəlamlardır. şe'r məcmuəsi varsa da, hənuz çap olunmayıbdır; öz övladındadır.

şe'rlərindən nümunə:

Ey cövri-yardən cigəri qan olan könül!
Mətlubə yetməyib belə giryan olan könül!

Bu qəm günündə bircə mədədkarı olmayan,
Zərdü zəif, xəstəvü nalan olan könül!

Mən çox dedim, eşitmədin əsla nəsihətim,
Ey eşq əlində valehü heyran olan könül!

Gördün səni nə günlərə saldı bəlayi-eşq,
Divanəvar gündə hərasan olan könül!

Müşküldür indi qurtarasan eşqi-yardən,
Xaki kimi cigərləri büryan olan könül!

Dam altında qalıb vəfat edən 8-9 yaşında oğlu Abbasa xitabən yazmışdır:

Sübh oldu gəlmədin, bala, barı nahara gəl!
Çox yatma qəbr evində, amandır, kənarə gəl!
Nəmdir yerin, qışın günü yatmaq rəva deyil,
Gir qoynuma, bala, barı dübarə gəl!
Olmur könül riza yatasan sən məzardə,



Qoy mən girim, qocalmışam, ol məzarə, gəl!
Baran misal göz yaşım olmuş rəvan mənim,
Rəhm eylə, qoyma çox da məni intizarə, gəl!
Vallahı, gündə min kərə mən mərgə şayiqəm,
Mümkün olursa, eylə, oğul, sən də çarə, gəl!
Hicrin qəmilə öylə yəqin mən gərək düşəm
Məcnun sifət həmişə dəxi kuhsarə, gəl!
Bir vaxt tapdılar səni, çıxsın gözüm mənim,
Olmuşdu gül kimi bədənin parə-parə, gəl!
Qurban olum solan yüzünə, laxta qanına,
Dolmuşdu qoynuna sənin, ey mahparə, gəl!
Səbr eləyim nə növ' ilə səndən sora, bala,
Qəddim dönüb kəmanə, nedim, yoxdu çarə, gəl!
Ömrüm nə qədri var səni yaddan çıxarmazam,
Gəlləm müdam sübhü məsa ah-zarə, gəl!
Dünyada toy tutub səni mən rahət etmədim,
Qaldım, oğul, ölüncə dəxi intizarə, gəl!
Ya rəb, nolur ki, tapşırasan xakə Xakini,
Qəmdən dönüb kamanə qəddi, bəxti qarə, gəl!

Mərhum Xakinin bu hər iki növhə misal, şikvə və nalə-amiz şe'rlərində, doğrusu ki, bir lətafət görmədik. Həm mə'na və həm ləfzən bunlarda bir ləyaqət əsəri yoxdur. Şiveyi-lisan və səbki-kəlama gəldikdə bunlarda qüsur az deyil. Rədif və qafiyələrin bə'zisi təkrar olunur. Məsələn, "çarə", "kənarə", "intizarə". "İntizarə" sözü qafiyə üçün iste'mal olmağa görə, şe'rdə mə'na vermir. Məsələn, "qoyma məni intizarə, gəl!" və həmçinin "qaldım, oğul, ölüncə dəxi intizarə, gəl!" Hər iki məqamda "intizarə, gəl!" demək dürüst deyil. "İntizarə" əvəzində "intizar" və yainki "intizarda" yazılmaq lazım gəlir.

Bütün növbədə xoşməzmun və mövzun bir beyt və ya misra tapılmaz ki, şair kəlamına bənzəsin və yainki bənzəri olsa da, qeyrilərdən götürülmüş olmasın. Kəlamın özü də xeyli binəmək və xoşa gəlməyən tərzdə başlanır: "Sübh oldu gəlmədin, bala, barı nahara gəl!" Ölən adamı nahara çağırmaq qulağa əcibü qərib gəlir. Bu kəlamın bir para qüsurunu özümüz düzəldib, bir beytini əsla daxil etmədik. Haman beyt budur:

Qanlı mənəm, apardım, oğul, səni [haraya?]
Qoydum dam altında, gör necə qaçdım kənarə, gəl!

Bəli... bu da Mollaşənbə şe'rinə bənzər bir şeydir.

# MOLLA HÜSEYN SABİT "AĞBAŞ"

Molla Hüseyn Hacı İsmayıl oğlu "Sabit" təxəllüs əslən xoylu olduğu halda təxminən otuz yaşlarında Gəncə vilayətinə gəlibdir. Burada elm, zəkavət və fitrəti ucundan Qazax qəzasında Həsənsu kəndində təqribən otuz il mollalıq ilə sükunət etmiş və orda təəhhül eyləmiş, indi beş il var ki, öz vətəninə övdət qılıbdır və əl'an hali-həyatda olmağı və olmamağı mə'lum deyil. Molla Hüseyn Sabit xoşkəlam, şirinzəban və hazırcavab bir şair olmağı Qazax və Gəncə əhlinə mə'lumdur. Farsca və türkcə yaxşı kəlamları vardır. Amma türkcə yazdığı kəlamlar fars dilində yazdıqlarından daha səlis və daha gözəldir. Məcmuəsi varsa da, çap olunmayıbdır.

Cənab Fani* ilə bir çox həkimanə təatiyi-əfkarda olub, əfkarının cümləsini türkcə mənzum yazmış. Sabit cənabları "Ağbaş" əlqabi ilə məşhurdur. Qazax şairəsi Şahnigar xanım "Rəncur" təxəllüslə dəxi onun mabeynində mübadileyi-əfkar olunurmuş.

Şahnigar xanıma yazdığı bir qəzəl:

Hər səhərgəh naləvü əfğanımız bica deyil,
Şam vəqti ahi-dilsuzanımız bica deyil.

Biz həkimi-əsriz, əşki bilmişiz təfrihi-təb'.
Hər ətibba tək bizim dərmanımız bica deyil.

Ya yetiş fəryadə, ya ver nəqd əşkim qiymətin,
Müft sanma, bu düri-qəltanımız bica deyil.

Daneyi-əşkmi verir hər dəmdə bir qəm meyvəsin,
Bağban, bu çeşmi-xunəfşanımız bica deyil.

Şurumuz, ə'malımız, səb'ül-məsanimiz qəzəl,
Övliyayiz, çoxdurur xahanımız, bica deyil.

Suzi-şamü ahi-sübhü dərdü-zöhrü hüzni-əsr,
Ünsürü tərkibi-çarərkanımız bica deyil.

Sabita, xamuş, yoxdur sirri-hikmətdən sual,
Hər nə kim, mənzur edər sultanımız, bicə deyil.

Rəncur xanım Sabitin qəzəli-pürməzmunu cavabında belə yazmış:

* Ola bilər ki, Fani olmaya Fəna ola.



Ey deyən "ahi-dili-suzanımız bica deyil".
Nəqd ömrün badə verme, canımız bica deyil.

Qıl nəzər bir dəm, bizi bu dərdi-istiğna ilə.
Ey həkim, öldürmə kim, hirmanımız bica deyil.

Ehtiraz et dəmbədəm yarin qiyamətdən saqın,
Dinlə, gəl gör ayeyi-Qur'anımız bica deyil.

Həm saqın cürmi-kəbirindən, edib bir ehtiraz,
Ruzi-məhşər duzəxü divanımız bica deyil.

Candadır, ey çəşmi-giryanım, xəridarın sənin,
Dürri-əşkü daneyi-mərcanımız bica deyil.

Zəxmi-hicrandan keçər ruxsarımız qan yaş ilə,
Saqiya, xunabeyi-əlvanımız bica deyil.

Sorsalar, ey dil, əgər razi-nihanından xəbər,
Söylə kim, dərdi-dili-pünhanımız bica deyil.

Xəstə Rəncurəm, cahanda aləmi seylab edən
Abi-əşkim Qülzəmü Ümmanımız bica deyil.

Ağbaş mollanın haqqında qabaqda dəxi az-çox məlumat verilibdir. Mə'lum deyil ki, Sabit cənablarını hansı yerin şüəravü üdəbası silkinə daxil etmək: Qazaxmı, Gəncəmi və yaxud Azərbaycan İraqı?[272]

# MİRZƏ SADIQ "FANİ"

Mirzə Sadıq Molla Əsədulla oğlu "Fani" təxəllüs əslən təbrizlidir. Bu halda qırx ildən ziyadədir ki, Gəncədə iqamət edir. Elmi Təbrizdə öz atasından təhsil edibdir. Hicrətin 1255-ci ili zilhiccə ayının 18-ci günü[272] anadan olubdur. Əlan Gəncədə məktəbdarlıq ilə iştiğal edir və lakin məktəbin qaydası və üsuli-tə'limi əski qayda üzrədir.

Fani cənabları farsca və türkcə yaxşı bilir və özünün də qüvveyi-şe'riyyəsi fövqəladədir. Hər iki dildə çox gözəl şe'rləri var. Faninin yazdığı şe'rlər ələlümum tərbiyəyə, əxlaqa və hekəmiyyata dairdir. Divanı var və lakin çap olunmayıbdır. Haman divan "Divani-Fani" adlanır. Faninin gözəl hüsnxətti var.

Şairin öz iddiasınca yeddinci babası məşhuri-afaq Şeyx Bəhai əleyhir-rəhmədir. Gəncədə evlənibdir və iki oğlu var. Fani müsinn bir şəxs ikən yenə zövqü şövqdən düşməyibdir. Məktəb şagirdləri üçün "Xəmseyi-ədəbiyyə" adlı bir məcmuə tərtib qılıbdır. Bu məcmuə beş cüzdən ibarətdir: 1) Lazımdır, 2) Ədəbiyyə, 3) Təmsilat, 4) İqbaliyyə və idbariyyə, 5) Əxlaqiyyədir. Üç əvvəlinci mətbudur. Bundan əlavə cənab Faninin "Ağıl, bəxt və dövlət" ünvanlı mənzum bir əsəri də var. Məzkur əsərdə bu üç şey'in hansı birisinin qeyrilərinə tərcihi var isə, mə'lum olur.

Fani əl'an sağdır və sinni yetmişə baliğdir. Vəhdət və üzlətin yaxşılığı xüsusunda Fani cənablarına yazılan bir məktuba qarşı yazır:

Cana, sənə bu yazdığım əsrar nihandır,
Hər fərdi öz əhvalıma bir kəşfi-bəyandır.

Üns atəşi can olduğunu mən də bilirdim,
Atəşzənəvü səng haman ünsi-cahandır.

Fulad yetər daşə, çıxar atəşi-suzan,
Keyfiyyəti-üşşaqə bu nə türfə nişandır.

Sayidə olur müşk, yanar ud, çıxar ətr,
Əsbabi-kəmalati-cahan kəsrəti-candır.

Vəhdət nə odur kim, çəkəsən cismi kənarə,
Təcrid haman təzkiyəvü tibi-cinandır.

Kəsrətdə olan vəhdəti tap, kəsbi-kəmal et,
Tövhidi-xuda kəsrəti-cəm' ilə əyandır.

Məcnun kimi yığ başına həm vəhşü tüyuri,
Kəsrətdə olan vəhdətü təcrid hamandır.



Yekrəngdi zahirdə əgər beyzə yəqinən,
Aç pərdəsini, gör iki rəng ilə nihandır.

Pendar ilə mən həm özümü fərd görürdüm,
Güzguyə baxıb gördüm onu məhz yalandır.

Düzlük diləsən, kəclər ilə eyləmə ülfət,
Əyrilə düşən keyfiyyəti-tirü kəmandır.

İstəsən əgər kəsb edəsən eşqi-həqiqi,
Bazari-məcaz içrə bu kalayi-girandır.

İsbati-vücud etməyə ifnayi-vücud et,
Can feyzi əbəd almağa tüğrayi-əmandır.

Fani sənə göndərdi dua şe'rü qəzəldən,
Beynəş-şüəra şe'rü qəzəl lövheyi-candır.

# HACIAĞA "FƏQİR" ORDUBADİ

Azərbaycan şüərasının məşhurlarından biri də mərhum Hacıağa ibn Məhəmməd "Fəqir" təxəllüsdür. Fəqirin şərhi-halı və sirəti-əhvalı Naxçıvan, Ordubad tərəfdə və İranın bə'zi şəhərlərində cümlə üdəbaya mə'lumdur. Hacıağa təvəllüd edibdir Ordubad şəhərində təxminən hicrə-tin 1252-ci[273] sənəsində. Ordubad Naxçıvan nahiyəsində İrəvan quberni-yasında qədim qəsəbələrdən birisi hesab olunur. Əhalisi müsəlmandır. Ordubad əl'an İran ilə Rusiyanın sərhəddində vaqe və Rus dövlətinə mütəəlliqdir.

Ordubadın ab-havası mötədildir, özü də bağat içində bir basəfa yerdə vaqe olubdur. Ordubadın meyvəcatı və məhsulatı az yerdə tapılar.

Çün Fəqirin atası İranda alış-veriş edərmiş, ona binaən Fəqir dəxi uşaqlıqdan İrana düşüb, onun üçün Təbriz və Şiraz kimi səvadi-əzəmdə nəşvü nüma edib, mərtəbeyi-kəmalata qədəm qoymuşdu.

Məşhur rəvayətə görə, xaki-paki-Şirazda təhsili-ülum edib, ərəb və fars dillərini kamil vəchdə bilirmiş və öz ana dilinə dəxi artıq meyli olma-ğa görə, dara imiş.

İyirmi beş sinnində ərseyi-şe'rdə cövlan edərkən "hübbül-vətəni minəl-iman'i"[274] hədisi-şərifini unutmayıb, vətəni-mə'lufuna övdət etmişdi. Az müddətin mürurunda şüəralar silkində şöhrət kəsb edib "Gülşəni-ürfan" adında bir məcmuə sahibi sayılırdı.

Hacıağa Fəqir tizfəhm, fəsih və hazırcavab bir şəxs ikən artıq rəvan təb' sahibi imiş. Əksəri-ömrünü tədrisü tə'dibi-əbnayi-vətən ilə keçiribdir.

Hicrəti-nəbəviyyənin 1303-cü[275] sənəsində rəcəbül-mürəccəbin onuncu günü qırx beş sinninə yetişdikdə nidayi-həqqə ləbbeyk deyib və də'vəti-həqqi icabət edib haqq-təala rəhmətinə vasil olubdur.

Fəqirin məcmuəsi üç sənə bundan əqdəm fərzəndi-möhtərəmi Kərbəlayi Məmməd Səid Ordubadi[276] [tərəfindən] Təbrizdə çap olunma-ğa göndərilmişdi və lakin bu hala dək onun çap olunması və ya olunma-ması bizə mə'lum olmadı. Səid cənabları o vaxtı bizə işarə etmişdi ki, Təbriz çapı namərğub olduğuna görə, məcmuəni istəyir gətirdib Badkubə-də çapa verdirsin. Badkubədə dəxi onun çap olunmadığı bizə mə'lumdur.

Burada onun əsərlərindən bə'ziləri ki, cənab Səid lütf üzü ilə bizə göndəribdir, dərc olunur. Məcmueyi-məzkurənin dibaçəsindən bir neçə şe'rlər:

Sipasi-şükrü həmdi-fərdi-yekta,
Xudayi-biməsəl, həyyü təvana,
Qiyasi-əqli-küll zatında qasir,
Deyən şə'nində əhməd "maərəfna".



Təmamən masiva etsə kitabət,
Yazanmaz vəsfinə bir sətri-tuğra.
Olan vəssaflər vəsfində aciz,
Zəhi sübhani-bieybü mübərra.
Fərəhza, qəmzüda kəlmati-paki
Tapılmaz elminə övladü üxra.
Edən məxluqi min şey'i icad,
Vücud ondan tapıb əczayi-əşya.
Zəhi qadir ki, bu növ' taqi-çərxi
Ucaldıb sün' binəccarü bənna.
Kəvakiblə verən əflakə zivər,
Bürucati-bənat, əqdi-sürəyya.
Yaratdı cümləsin yeksər ədəmdən,
Hamana "kaf"i etcək "nun"ə ilqa.
Qılıb bir qətrədə cəm'i-əvalim,
Mürəkkəb eyləyib əczavü ə'za.
Fəlasif cümlə aciz hikmətində.
Ümumən ləğvdir hökmi-ətibba.
Olub ondan müvafiq dörd məxalif,
Qılar dörd zidd bir yerdə müdara.

Dibaçənin axırında yazılıbdır:

Fəqira, yetməz hərgiz intihayə,
Məlayik ta qiyamət olsa guya.

Dibaçənin bə'zi yerlərini oxuya bilmədik, çünki əlimizdə olan nüsxə imlasız və dolaşıq xətt ilə yazılmışdır.

Fəqirin gözəl əsərlərindən birisi onun dünyanın bivəfalığı xüsusunda yazdığı ibrətnamədir ki, burada eyni ilə dərc olunur:

Qan ağla, ey gözüm, yenə fəsli-bahar olur,
Bülbül bahar olanda işi ahü zar olur.
Gül mövsümündə naleyi-bülbül əbəs deyil,
Fəsli-xəzanı yadə salır, biqərar olur.
Baği-cahanda qönçəni neylim olur bir ay,
Xarı çəkir kənarına, bie'tibar olur.
Novrəs cavanların qədidir ziri-xakdə,
Eylər nömüvv sərv ləbi-cuybar olur.
Baxsan bəsirət ilə əgər zülfi sünbülə,
Müşkül sənə ki, bir neçəsi aşikar olur.
Sünbül deyil çəməndəki, susən deyil, nədir,
Yarın şikənci-zülfüdü yerdən kənar olur.
Topraqdən çıxan xəti-səbzi-nigardır,
Reyhan odur ki, üzdə həmişə qubar olur.

Gülşəndə bülbülə dedilər: – Badə nuş bad!
Verdi cavab ki, axırı rənci-xumar olur.
İbrətlə bax qızıl gülə, gör çərxi-kəcmədar
Əvvəl onu əziz edər, axır nə xar olur.
Gəh qönçə pərdəsində qoyar, bağrı qan edər,
Gahi çəkər gülabın atar, tarmar olur.
Lalə deyil çıxıb qızaran Bisütundə,
Fərhad qəlbidir ki, hər il dağdar olur.
Çəşmin vurar şükufə, əgərçi beş-altı gün
Axır fələk qəbasin alır uri-ar olur.
Böylə xəyal etmə çəməndə bənəfşədir,
Nakam əruslar qaşıdır vəsmədar olur.
Dünya birini ağladıban, güldürür birin,
Əbrin sirişki xəndəgəhi-laləzar olur.
Tərk etgilən bu dəhri-dəni pirə zalımı,
Hər gün bir ayrı şövhərə çün ixtiyar olur.
Bie'tibardır bu göhən çərxi-bibina,
Aqil kişi nə yatmış olur, huşyar olur.
Çoxları tərk edibdi fələk, yox nişanəsi.
İnsan üçün onun əməli yadigar olur.
Bəhram Guri gör necə kurə çəkib fələk,
Rubahi-çərxə şir olan axır şikar olur.
Bizdən sora o qədr baharü xəzan gəlir,
Hər il şübatü azəri neysan əyar olur.
Badi-səba keçər, sora badi-şimal əsər*,
Daim bu ordu rüusi-şəhrü xar olur[277].
Biz görmədik, görən görəcəkdir zəmanəni,
Gəh yaz olanda gül olu, gəh qışda qar olur.
Kəsrani get Mədainə al Tağdən xəbər,
Taci-Kəyan qoyan yenə dəfni-məzar olur.
İskəndəriyyə şəhrinə get, gör Skəndəri,
Biçarə o cəlal ilə gör nə fikar olur.
Çoxları çəkdi təxteyi-tabutə təxtdən.
Cümlə şəhənşəhin yeri ol qəbri-dar[278] olur.
Ey nəfsi-şum, axır olubdur nədir bu cəhd,
Vizrü vəbalı boynuna yığma ki, bar olur.
Beş gündən ötrü dövlətü malü imarəti
Gəl istəmə, gedəndə ki, bir intizar olur.
Fitnə dolub cəhanə, xəlayiq olub şərir.
Yoxdur cahanda xeyir, əcəb ruzigar olur.
Mərdüm bulur halalı həramü həramı pak,
Nahaq şəhadət onlara daim şüar olur.
İmanların satarla çilov, çayü qəhvəyə,
Çoxdur bu şəxs yarləri yadxar olur.

* Əvvəlki nüsxə: ... gəlü badi-şimal əsər



Şəri-nəbi qiyamini eylərlə məsxərə,
Hər yerdə əmrü nəhy ola, onlar fərar olur.
Ya-rəb, Əliyyü ali-Əli hörmətinə sən
Fəryadə yet o gündə ki, ruzi-şümar olur.
Artır mənə nəbiyyü vəlinin məhəbbətin,
Gər böylə olsa, nəxli-ümidimdə bar olur.
Fəryadıma Əlini o gündə yetir mənim,
Ruhum gedər, bədən qalı biqəmküsar olur.
Yarü rəfiqü qövmü bəradər qoyar gedər
Əndamımı sıxar, mənə çün qəbr dar olur.
Ey dil, ötürmə daməni-ali-Məhəmmədi,
Qəm etmə, yavərin, şəhi-Düldül[279]-səvar olur.
Artır, Fəqir, dildə Əlinin məhəbbətin,
Hər kəs qulam ola o şahə, tacdar olur.

Fəqirin bu ibrətnaməsinə hikmət nəzərilə baxılsa, həqiqətdə bir para sirlər aşkar olur. Ruzigari-sitəmkarın pənceyii-qəddarında giriftar olub, ömürlərinin bahar çağında əcəl badəsini nuş edən cavan oğlanların, ziba sənəmlərin məzarları üstə bitən gül və lalələrin və ənva'yi-çiçəklərin hər birisi onların hüsni-məlahətlərindən nişanə deyillərmi? Ləbi-cuybarda bitən sərvlər ziri-xakdə dəfn olunan novcavanların qəddi-mövzunu deyilmi? Çəməndə bitən sünbül, susən özgə bir şey deyil, "yarın şikənci-zülfüdü yerdən kənar olur".

Torpaqdan göyərib yengi çıxan təzə-tər, xırdaca otlar novcavanların gül üzarları üstə bitən bu xətlərdir. Reyhanın üstə müşahidə olunan qubar üzdəki qəm qubarıdır. Bisütunda çıxıb qızaran lalələr Fərhad misallı namurad cavanların dağdar olmuş ürəkləridir. Çəməni müzəyyən edən bənəfşələr və çiçəklər nakamərusların pərişan zülfləridir.

Dünyanın işi belədir. Bir kəsi başa kimi xoşhal və kamyab etməyibdir. Birisini ağladanda, o birisini güldürür. Necə ki, buludu ağladıb çəməni-laləzarı xəndə qılır. Birisinin müsibəti qeyrisinin fərəhü şadlığına səbəb olur.

"Kürdün çul satmağı" təmsili dəxi Fəqirin ibrət götürüləsi əsərlərindən birisi olmağa görə burada çap olunur:

Guş edin ərzimə yeksar, siz əya pirü cəvan,
Bircə təmsil gəlib xatirimə, eylüm əyan,
Nəql ediblər bu keçən il var idi bircə kişi,
Sahibi-xeylü rəmə, əhli-məhali-İrəvan.
Toxunmuşdu Fatısı əsl fayiq bir çuli-əsb,
Xeyli mətbuü dilavizü giran, qədri giran.
İşləmişdi onun üstündə Fatı düz iki ay,

Tar-pudunda onun bənd eləyib rişteyi-can.
Şamova verdi çulu, söylədi ki: – Həmsəri-mən,
Sübhdən sal çulu, min yabını, ol şəhrə rəvan.
Aparıb bu çulu sən şəhrdə sat qırx manata,
Beş qəpik əksiyə satma ki, olur bəs ərzan.
Satıb, al Dilpəriyə, Gülpəriyə nimtənəlik,
Yırtılıb, Dilpərinin yoxdu ayağında tuman.
Əti-əndamı çıxıbdır eşiyə Nazpərinin,
Köynək al əyninə, həm başına şali-Şirvan.
Səni tarı, a kişi, al mənə də bir yalavuc,
Fəsli-yaylaqda tiküm nimtənə şali-Kirman.
Saqquz al Mahpəriyə, Şahpəriyə güzgü, daraq,
Algilə cəhrəmə ig, bir tikə qır, çit, kətan,
Qədri zərnix, ahəg al gətir tənvir eləyək,
Tük basıb canımızı, sirkə-bitə oldu məkan.
Süuva bircə düdük, al Əlüvə bircə lülük,
Məmova bircə papaq al, verəyüm həqqi-çoban.
Əyn-başın tökülüb, al özünə bircə geyim,
Madyana noxta alıb, eşşəyə də bircə palan.
Müxtəsər, götdü çulu, şəhrə rəvan oldu o kürd,
Çiyninə saldı gəzib çarsuyi-bazar, dükkan.
Qırx manat söylədi, bir kimsə onu almadılar,
Şəhri üç gün dolanıb mat-məəttəl, heyran.
Dedi: – Bu töhfədi, qət'ən alır əşxas bunu,
Gər qubernata verəm, çox mənə eylər ehsan.
Müxtəsər götdü çulu, sildi tozu torpağın,
Gətirib verdi qubernatə haman dəmdə nişan.
Ta qubernat görüb söylədi işto-mişto,
Dedi: – Bir töhfə gətirdim sənə canım qurban.
Yaranal aldı çulu, verdi qulamına o dəm,
Şamovun qəlbi açıb gül kimi oldu xəndan.
Yaranal söylədi üç yol "xaraşo", bir "malades",
Daxil oldu evinə, qıldı Şamo dadü fəğan:
– Nə qələtdir elədim öz nənə-babamla mən,
Bilirəm Fatı yolur yalımı bişəkkü güman.
Müxtəsər, kəndə gəlib, ta Fatı gördü ərini,
Üzü qara, əli boş, zurna çalır, həm balaban.
Şamama söylədi Fatı: – Çulu satdın neçəyə?
Hanı çul? Yağlığımız noldu məgər? Eylə bəyan!
Dedi ər: – Fatı, çula üç "xaraşo", bir "malades"
Yaranal verdi, əgər sud ola, ya inki ziyan.
Eşidib Fatı, vurub kürdə ikiəlli qapaz.
Kürd salıb möhrə tasa, çəşminə tar oldu cahan.
Durdu övrət ayağa, geydi çarıq, sonra dolaq,
Şamovu götdü, minib yabını çün şiri-jəyan.
Girdi ta şəhrə, qubernat qapısın etdi tələb,



Dışra çıxdı yaranal, gördü gəlir dad, aman.
Dedi: – Zaçem tı sidiş, dlya çevo stroqo?
Baş əyib övrəti-biçarə çəkib ahi-nihan.
Ərz qıldı yaranala: – Mən Şamovun Fatısıyam,
Niyə zülm eyləyə bilməm ümənayi-divan?
Vermisən o çula sən üç "xaraşo", bir "malades",
Veririk hər kəsə, verməzlə bizə bircə soğan.
Ya pulu, ya çulu ver, istəmirik biz xaraşo,
Malades qarnımızı sir eləməz, istər nan.
Eşidib bu sözü çox güldü qubernat ol dəm.
Xoşuna gəldi, gəlib nitqə, deyib xəndəkönan:
– A patom, tı niboysya, istiroqa, istiroqa,
Lütfi-bihəd qılaram mən sizə hər saətü an.

## MƏNZUMƏ

Ey əzizim, sənə ibrətdi bu söz, eylə qəbul,
Xəlqdən çəkməgilən gərdənə çox bari-giran.
Yox səxavət əsəri xəlqdə, yum çəşmi-təmə',
Nədi hər ləhzə qubernat qapısı, xitmədi-xan.
Ey Fəqir, çəkməgilən çox da dəni minnətini,
Söyləmə cifədən ötrü dəxi həcvü hədyan!

Fəqir bu kəlamda dənitəb'lərin minnətinin bari-giran olmasını türfə timsali-ədibanə ilə nəzmə çəkib, sahibmən-səblərdən və ümənayi-dövlətdən səxavət və ehsanat diləməyin bihudə xəyal və əbəs sə'y olmasını göstərir. Bundan əlavə ülumü mə'rifətdən bibəhrə qalmış və yarı insaniyyət və yarı vəhşiyyət halətində güzəran edən kürdlərin məişətindən bir parça nümunə göstərir. Heyfa ki, Fəqirin sair əsərlərinə bələdiyyət yetirə bilmədik. "Moşt nomuneyə-xərvarəst" heysindən bu məcmuəyə daxil olanlar dəxi onun müqtədir şair və zərif ədib olmasına dəlili-kafidir.

# İRƏVAN ŞAİRLƏRİ

İrəvan qədim şəhər[lər]dən birisi hesab olunur. Bu şəhərin binası və tə'miratı Zəngi adlanan çayın sol kənarında vaqe olubdur. Şəhərin bir hissəsi Zəngi çayının kənarında ucalmış təpə üstündə, digər bir hissəsi çuxurda düşübdür. Şimali-qərbi və şimali-şərqi tərəflərdən şəhər əhatə olunubdur uca təpələr ilə, amma cənub və qərbi-cənub tərəfləri açıq və düz yerlərdir ki, onda gözəl bağ, bağça və məzrə'ələr vardır. Zəngibasarda xeyli böyük və abad dehat və şenliklər[280] vardır. Bu yerlərin əhalisi öz torpaqlarından pambıq, çəltik, buğda əkməklə və bağ becərməklə yaxşı məhsulat götürürlər. Və lakin müsəlman tayfası elmü mə'rifətdən bibəhrə olmağına görə, nə qədər artıcıq kəsbü qazanc edirlərsə də, yenə fəqirdirlər ki, fəqirdirlər. Qazandıqları mədaxilin əksəri özgələrin cibinə girib, yerdə qalanı öz məaşlarına kifayət eləmir və borca düşüb, zillət və üsrətdə güzəran etməkdədirlər. İrəvan şəhərindən cənub və qərbi-şimal tərəfə baxdıqda göz önündə qəribə bir mənzərə açılır, cənub səmtində bir cüt piramid şəklində gözəl, başı qarlı dağlar – Ağrı dağları göy səmtinə tərəf gərdənkeş olub, buluddan başlarına əmmamə sarıyıblar və guya zəbanihal ilə xəlayiqi asiman tərəfə – ülviyyət aləminə də'vət edirlər. Böyük Ağrının təpəsi həmişə qar ilə örtülü olur, amma Balaca Ağrının başı yay fəslində qardan xilas olub, onun üstündə ağaclar və hər qisim çiçəklər və ələfiyyat bitib göyərir. Bəzi rəvayətə görə, Nuh nəbinin gəmisi tufandan sonra Ağrı dağının qülləsində dayanıbdır və "ya ərz übləʼi maəki"[281] hökmü sadir olduqdan sonra yer üzündən tezlikdə sular çəkilib, ətrafü əknaf səbzəzar olubdur və Nuh peyğəmbər gəmidən çıxıb, qadiri-zülcəlala səcdə edib, şükrü sənaları yerinə yetirdikdən sonra haman yeri xoşlayıb, orada məskən salıbdır.

İrəvan dörd əsrin müddətində İran[282] hökuməti ilə Osmanlı dövlətinin mabeynində illəti-nizavü dava olub, gah İrana və gah Osmanlıya tabe olubdur. Tarixi-miladın 1582-ci ilində Osmanlı dövləti İrəvan mahalına malik olub, şəhərin cənub səmtində Zəngi çayının üstündə bürc və hasar tə'mir etdilər. Bu qalanın asarı indi də baqidir. Sonradan səfəvilər əyyamında İrəvan yenə İran dövlətinin ixtiyarına keçib. Şah Abbas 1604-cü səneyi-miladidə şəhərin ətrafına yenə təzədən uca və möhkəm bir sədd çəkdirdi. 1804-cü ildə knyaz Sisianov ki, "Şpexqor"* ləqəbi ilə Zaqafqaz türkləri arasında məşhurdur və 1808-ci sənədə qraf Qudoviç İrəvanın

* İnspektor deməkdir



üstünə rus qoşunu ilə gəlib kərrat ilə hücum etdilərsə də, onu təsxir etməkdə aciz qalıb geri qayıtdılar.

Ancaq keçən əsrin 1827-ci ilində Paskeviç İrəvanı mühasirə edib az müddətin içində (sentyabrın 25-dən oktyabrın əvvəlinə kimi) şəhərin Rus dövlətinə tabe olmasına xalqı məcbur qıldı (şəhəri fəth etdikdə 49 top, 4 beydəq və 4 minə kimi əsir sərbaz alınmışdır). Paskeviç İrəvanı fəth etməyə görə, ona "Paskeviç-İrəvanski" deyilir.

Şəhri-İrəvan keçmişdə mərkəzi-üləma, füzəla və şüəra olub, Axund Molla Məhəmməd İrəvani kimi böyük alim və müctəhidlər yetiribsə də, axır vaxtlarda belə fazil və alim şəxslərdən və dəqiq ədiblərdən və xoştəb' şairlərdən məhrum qalıbdır. Elm və mə'rifət əshabı varsa da, onların ədədi avama nisbətən çox azdır, yoxluq mənzələsindədir. İrəvan şairlərindən məşhuru Məşhədi İsmayıl Hacı Kazımzadə "Bəzmi" təxəllüsdür.

# MƏŞHƏDİ İSMAYIL HACI KAZIMZADƏ "BƏZMİ"

Mərhum Məşhədi İsmayıl İrəvanın sahibi-sərvət tüccarzadələrindən zərif və xoştəb' bir vücud idi. Təvəllüd edibdir İrəvan şəhərində hicrətin 1262-ci[283] ilində. Rüşd məqamına çatınca ev tərbiyəsi alıb, sonradan ədibi-kamil Mirzə Məhəmmədtağı Naxçıvaninin[284] məktəbində tə'lim almağa başlayıb və öz iste'dadi-fitrisi sayəsində az vaxtda fars və türk lisanını təkmilən öyrənibdir.

Mərhum Bəzmi ömrünün çox zamanını ticarət işlərində keçiribdir və bu əsnada xoştəb' və şirinzəban olmağına binaən, müasiri olan əyanü əşraf içində məruf və xüsusən şüəra silkində əziz və möhtərəm bir vücud olubdur. Ömrünün axırına iyirmi sənə qalmış ticarət işləri yaxşı getmədiyi üçün ondan əl çəkib, müəllimlik işinə mübaşir olmuşdur və İrəvan şəhər məktəbində elmi-ilahi və lisani-türki müəllimi tə'yin olunmuşdur və bundan əlavə özünün əlavə məktəbi var idi.

Bu həqir bəndə İrəvan gimnaziyasına yeni müəllim tə'yin olunan vaxtlarda[285] Mirzə İsmayıl ilə tanış olub və bə'zi vaxtlar onun üsul-tədrisi ilə aşna olmaq üçün məktəbinə gedərdim və onun artıq şövq ilə tə'limi-ətfalə məşğul olmağını görüb, dəxi də artıq onunla yaxınlanmağa və dostluq əlaqəsini bağlamağa sə'y edərdim. Çifayda, əcəl fürsət verməyib, ol cənabın dostluğundan bizi məhrum qıldı və hicrətin 1305-ci[286] sənəsində şərbəti-mərgi içirtdi.

Məşhədi İsmayıl bizim məktəblərdə babadan bəri işlənən köhnə qayda üzrə dərs verməyin qüsurunu anlayıb, üsuli-sövti ilə tə'lim vermək üçün özü təzə bir əlifba tərtib etmişdi. Amma mərhumun bu işi nə qədər əhəmiyyətli və xeyirli idisə də, köhnə qaydanı sevən və işıqdan bixəbər olan avamlara o, xoş gəlmədi. Mərhumun təzə əlifbası avam və əhliqərəz lisanında gülünc və istehza üçün bir alət oldu. Amma möhtərəm müəllim bu istehza və kinayələrə əsla mültəfit olmayıb, öz işində sabitqədəm və möhkəm dururdu.

Mərhum Bəzminin farsi və türki əş'arı bir məcəllə qədəri olardı. Amma mütəfərriq qalmağa görə, asari-qələmiyyəsini bir yerə cəm' edən olmayıbdır. Əşarının çoxusu qəzəliyyat, rübaiyyat və müxəmməsat qismindəndir. Bəzi qəsidələri də vardır. Onlardan nümunə üçün bir neçə qəzəliyyat burada yazılır.

Qəzəli-Bəzmi:

Hər kimsənin ki, sən kimi bir nazlı yarı var,
Dünyada eyşü işrəti, xoş ruzigarı var.



Çəkmə o tari-zülfdə darə bu könlümü,
Zalım, tərəhhüm eylə, usan, bəsdi tarı var.

Hər ləhzə qan tökər sənin ol fitnə gözlərin,
Guya ki, məst gözlərinin Zülfüqarı var.

Dövri-ruxində zülfi-siyahın görən deyir:
Gənci-ruxində yarın iki şahmarı var.

Gəzmə rəqiblə ki, görən qorxuram deyər:
Bir yaxşı güldü, təzə açılıb, heyf xarı var.

Pərvanə tək gəl indi sənin başına dönüm,
Bak etmərəm bu şəm'in əgər nurü narı var.

Bəzmi əsiri-dami-səri-zülfi-yardır,
Öldürsə də, bağışlasa da ixtiyarı var.

Əyzən qəzəli-Bəzmi:

Qanım tökən qaşındı, gözün gördü danmasın,
Müşküldü qonşu əyriliyin qonşu qanmasın.

Ahəstə, ey könül, elə get kuyi-dilbərə,
Yatmış qapı dalında rəqibi, oyanmasın.

Tök qanımı, vüsalə yetir, çün görülməyib
Aşiq əli vüsalə yetəndə boyanmasın.

Xalın üzündə mö'cüzədir, kimsə görməyib
Düşsün sipənd atəşi-suzanə, yanmasın.

Səbr eylə, ey könül, yetər hər cövr yardən,
Aşiq gərək cəfavü sitəmdən usanmasın.

Heyfa ki, bu qəzəlin axırıncı fərdləri ələ düşmədi.

O tari-türrəni, ey nazənin, yavaş darə –
Ki, bağlıdır neçə yüz min könül o bir tarə.

Könül həmişə sənin bəstəri-qəmində yatır,
Bu rəsmdir ki, əyadət edərlə bimarə.

Vüsalının gecəsi sübh tək olur rövşən,
Fərağının günü zülfün kimi mənə qarə.

Bu qanə dönmüş olan könlümün günahı nədir –
Ki, qara zülfünə hökm eylədin çəkə darə?

Könül onun səri' kuyində oldu min parə,
Yarın məhəlləsinə sağ gedən gəlir parə.

O tari-zülfünü könlüm kimi edər dorhəm,
Qarışsa naleyi-ahım nəsimi əsharə.

Gülün cəmalına şəbnəm səpər çəməndə gülab,
Neçün ki, qəşş eyləyirsən çıxanda gülzarə.

Fəraqi-yar ilə nakam[287] can verib gedirəm,
Əya, səba, de sevinsin o bivəfa yarə.

* * *

Salıb o gül üzünü şövqü gör nə halə məni,
O qaşların ələmi döndərib hilalə məni.

Görüb o qaşlarını mən dedim göründü hilal,
Salıbdı xalq bu bayramda qilü qalə məni.

Nə var sürahiyə meylim, nə saqiyə sənsiz,
Bu bəzm içində deyirsən içər piyalə məni.

Hədisdir ki, təsəddüq bəlanı dəf' eylər,
Dolandırıb başə, qurban elə o xalə məni.

Nədir bu candan əlavə cənabına borcum –
Ki, məst gözlərinə eylədin həvalə məni?

Bəzmi bə'zi vaxt "Əndəlib" təxəllüsü ilə dəxi şe'r deyərdi. Aşağıda yazılan müxəmməs dəxi Məşhədi İsmayılın kəlamındandır ki, burada "Bəzmi" əvəzinə "Əndəlib" zikr olunubdur:

**MÜXƏMMƏS**

Vermiş şikəst sərvə onun qəddü qaməti,
Etmiş qiyami-qaməti bərpa qiyaməti,
İsadə yoxdu ol ləbi-lə'lin kəraməti,
Çox tuldur bu zülflə kakil hekayəti,
Tövsifinə dəlildi "vəlleyl" ayəti.



Zülfün dağıtdı gül üzünə, eylədi niqab,
Düşdü səhab gün üzünə muydən[288] hicab,
Guya küsufə girdi o dəm nuri-afitab,
Ol türrə tək könüllərə üz verdi piç-tab,
Vird etdilər kəlami-ruxindən bir ayəti.

Səhv eyləmiş o arizini oxşadan gülə,
Yox zülfünün şəbahəti gülşəndə sünbülə,
Bir şanə etsə zülfünü bar şükr gülə,
Gülzarü gülşən içrə salır şurü qülqülə,
Ol məst gözlərin bu sözə var şəhadəti.

Bir gün ki, çıxdı seyr ilə gülzarə ol nigar,
Fərşi-zümürrüdün döşədi bağə səbzəzar,
Nərgis göz açdı, görməyinə qaldı intizar,
Müştaqdır o gül üzünə Əndəlibi-zar,
Var bülbülün camalına güldən şikayəti.

Burada yazılan şe'rlərdən səva Bəzminin dəxi də bir para əsərləri əlimizdə vardır və lakin onlar həcviyyat və həzliyyata dair olduğundan kitaba yazılmadı.

# MİRZƏ KAZIM QAZİ ƏSGƏRZADƏ AXUND ƏHMƏDOV"MÜTTƏLE"

Mərhum Mirzə Kazım müddəti-mütəmadi İrəvanda sakin olub və orada dəxi vəfat edibsə də, əslən İrandan gəlmədir. Onun vətəni Bərağuşdur ki, Təbriz mahalından Səraba yaxın bir qəsəbədir. Müttəle təvəllüd edibdir hicrətin 1248-ci[289] ilində. Tə'lim alıbdır Təbrizdə. hənuz cavan ikən İrəvana gəlib, ibtidada İran dövlətinin vis-konsulluğunda münşilik işlərinə baxırmış. Amma sonradan buradan çıxıb, tə'limi-ətfala artıq meyli olmağa görə, məxsusi məktəb açıb müəllimlik edərdi və məktəb işlərini artıq səliqə və qayda üzrə aparıb mübtədilərə üsuli-sövti ilə tə'lim edərdi. Mirzə Kazımın məktəbi cümlə İrəvan əhlinin rəğbətini kəsb etmişdir və əlhəq ol cənab öz şüğlü sən'ətində bir qüsur qoymayıb canü dildən tə'limi ətfala qurşanmışdı.

Mirzə Kazım cənabları ilə biz yaxın aşina idik və tez-tez onunla görüşüb, tə'lim və tədris məsələlərindən bəhs və söhbət edərdik. Mərhumun tə'lim-tərbiyə məsələlərindən səva fikrü zikri yox idi.

Üsuli-tə'limdə daha da artıq bilik və məharət kəsb etmək üçün gimnaziya müdiri cənab Brajnikovun iznü icazəsi ilə həqirin və priqotovitelni sinfin müəllimi Çistyakovun ki, xeyli qabil və mahir müəllim idi, dərslərinə qulaq asardı.

Mirzə Kazım ilə bərabər Axund Mirzə Əli cənabları dəxi ol vaxtlarda İrəvanda məktəb açmışdı. Bu cənab artıq qeyrətmənd və çalışqan cavan bir müəllim idi.

Üsuli-cə'did ilə aşina olmaq üçün mütəvəffa Çistyakovun gah evinə və gah klasına tez-tez gəlib, lazım olan məlumatı ondan əxz edərdi. Çistyakov isə hər iki müəllimlərə artıq mehribançılıq və iltifat göstərib, əldən gələn köməyi müzayiqə etməzdi və özü məktəbdarların məktəbini ziyarət edib, nəzərə gələn qüsurların islahına bəzli-himmət edərdi.

Cənab Mirzə Abbas Məhəmmədovun ki, sabiqdə o da İrəvanda məktəbdar idi və əhli-mə'rifətlərdən birisi hesab olunur, yazmağına görə, mərhum Mirzə Kazımın beş cild kitabı qalıbdır ki, onlardan dördünü mərhum tə'limi-ətfal üçün tərtib etmişdir. Amma onlardan heç biri bu hala kimi çap olunmayıbdır:1) "Elmi-hesab", 2) "Sərfü nəhvi-farsi", 3) "Elmibəlağət", 4) "Vacibati-şəriyyə", 5) "Teatr hekayəsi".

Nə qədər əş'arı varsa, tamami farscadır. Mirzə Kazımın bu əsərlərindən heç birini biz görməmişik. Ona binaən onlar nə dərəcədə layiqi-təhsin və ya tənqid olması haqqında söz danışmaqda aciz varıq. Amma bunu təsdiq edə bilirik ki, Mirzə Kazım ziyadə qabil və gözüaçıq adam idi və öz



əsərində məktəblərdə tə'lim üçün iste'mal olunan kitab və risalələrin qüsurunu görüb, onların hər cəhətdən namünasib və hətta müzirr olmaqlarını kəmalınca anlayırdı. Ona görə söz yoxdur ki, onun "Vacibati-şəriyyə"si ol zaman bizim məktəblərdə mütədavil olan "Came'i-Abbasi"[290] kitabından gərək artıq və düzgünraq olsun, habelə də özgə əsərləri.

Mərhumun əş'ari-farsisindən nümunə olaraq üçüncü kitabın sərlövhəsində qələmə xitabən yazdığı şe'rlər burada zikr olunur:

Ey qələm, ey munese-mən ruzo şəb,  
Sər borun avər, dəmi boqşay ləb.  
Şod təmam an louhe-dovvom əz ketab,  
Ba çe zəhməthaye-birun əz hesab.  
Nəğmei əz louhe-seyyom saz kon,  
Şəmmei dər pərde kəşfe-raz kon!  
Sər məkeş əz hokme-ənqoştane-mən,  
Pişe-naməhrəm məqu bə'zi soxən.  
Mişəvəd qahi ke, toğyan mikoni,  
Kəşf əz hər raze-penhan mikoni.  
Hər çe miquyəm gəluyət ta məgər,  
Əz dəhanət raze-del nayəd bedər.  
Ser borun dari ze xətte-rə'ye-mən,  
Pay boqzari xelafe-paye-mən.  
Dad Mənsur əz dəhən serri-ziyad,  
Əz gəlu avixte ura həm bedar.  
Gerde-sərfe-eşq hərgez bir məgərd,  
Kin soxən besyar kəsra xar kərd.  
Del bemən deh, del mədeh bər hiç kəs,  
Corme-Sən'an eşqe-Sən'anəsto bəs.  
Hərfe-eşqo eşqbazira məqu,  
Afiyət əz atəşe-suzan məcu.  
Eşq kari-binəhayət mikonəd,  
"Beşno əz ney çon hekayət mikonəd..."[291]

Mərhum Mirzə Kazım fövqdə zikr olunan əsərlərdən əlavə türk lisanında mübtədilərə tə'lim etmək üçün nəsrən və nəzmən bir kitabça dəxi tərtib qılmışdı. Onun mündəricatı isə xırda-para hekayətlərdən, nağıllardan və düzgülərdən ibarət idi. Düzgülərin çoxusunu Mirzə Kazım özü yazmışdı. Bu düzgülər uşaqlar ağızda söylədiyi "Üşüdüm ha üşüdüm, dağdan alma daşıdım" vəzn və bəhrində tərtib olunmuş mə'nən bir-birinə münasibəti olmayan sözlərə bənzəyir.

Mirzə Kazımın bu düzgüləri yazmaqdan qəsdi uşaqları oxumağa həvəsləndirmək idi. Əzbəs ki, belə yüngül vəzndə yazılan şe'rlərə uşaq-

ların meyli və həvəsi artıq olur və bunları oxumaq da asandır. Necə ki, sabiqdə zikr olundu, mərhum Əhməd bəy Cavanşir dəxi öz övladını oxuyub yazmağa həvəsləndirmək üçün bu vəzndə qisim-qisim hekayətlər tərtib etmişdir.

Mirzə Kazım düzgülərində xırdaca oğluna xitabən bə'zi gülməli sözlər ilə belə oğluna ədəbə dair nəsihət də söyləyir. Düzgüləri bu sayaq başlayır:

**DÜZGÜ**

Ay afərin, gül oğlum,
Gül oğlum, bülbül oğlum,
Dərsin oxu rəvanla,
Sonra danış, gül oğlum!
Gedirdim harda gördüm,
Guya divarda gördüm,
Evdə siçan çox idi,
Pişik evdə yox idi.
Siçan çıxdı divara,
Əynində xaki xara.
Birdən pişiyi gördü,
Döndü baxdı qurudu.
Siçanlar at çapırdı,
Pişik durub baxırdı.
Tülkü giribdir bağa,
Hanı bəs bağban ağa?
Tülkü yedi üzümü,
Eşitmədi sözümü,
Pıs-pısa sürmə çəkdi,
Çarqadın əyri bükdi.
Tısbağanın yoldaşı
Bişirdi yarma aşı.
Yarmanı dana-dana
Çıxartdılar meydana.
Quzular mələşdilər,
Torpağa bələşdilər.
Quzu məni görəndə,
Yerdən çiçək dərəndə
Pəri inək sağardı,
İnək bala doğardı.
İnəyin balası var,
Başında alası var.

Bu qisim ordan-burdan danışıb, yenə oğluna rücu edib deyir:



Oğlum, oğlum, naz oğlum,
Dərsindən qalmaz oğlum.
Bülbül kimi dərs oxur,
İstər çox, ya az oğlum.
Qələmin al əlinə,
Bir yaxşı zad yaz, oğlum!
Oğlum gedər məktəbə,
Oxur, çatar mətləbə.
Dərsin oxur, rəvanlar,
Nə oxuyubdur, anlar.
Daş üstə çiçək qazar,
Məşqini göyçək yazar.
Mənim oğlum candı, can,
Dərslərin oxur rəvan.
Gümüşdəndir də'vatı,
Qələmi var beş-altı.
Qələmdanı şəkilli,
Qələmi xalli-mülli.
Dəftəri var tər-təmiz,
Kitabı ondan əziz.
Kağızları rəngbərəng,
Oğlum, gətir, yaz, görək.

Bu düzgülərin təmamisi özgə bir kitabımıza daxil olacaqdır ki, onda lisani ədəbiyyatımıza dair ənva'ü əqsami-nəqlü hekayətlər dərc olunacaqdır.

Mərhum Mirzə Kazım əsnayi-tə'lim və təəllümdə əlifbamızda olan qüsuratın və onlardan təvəllüd edən müşkülatın cümləsini görüb, hürufatımızın təb'dilü təhsilinə çalışan adamlardan birisi olmağa görə, özü məxsusi əlifba tərtib etmək fikrinə düşmüşdü və hürufatımızda olan qüsuratı göstərmək üçün bir məqalə yazıb bizə vermişdi ki, ol vaxt Tiflisdə nəşr olunan "Kəşnül"[292] qəzetində onu çap etdirək. Biz də həmin məqaləni "Kəşkül"ə göndərib təb'ini ilhahü təmənna etmişdiksə də, dərc olunmamışdı. O məqalənin müsəvvədəsi indi də bizdə durur. Mərhum onu öz gözəl xətti ilə yazıbdır. Çün mirzənin yazdığı mətləb bu halda da təzə və şayani-diqqət mətləblərdən birsidir, ona binaən o məqaləni eyni ilə burada dərc edirik: "Bu zamanda səfheyi-cahanda ülumü fünun təhsili hər bir nəfs üçün əhəmm və hər əmələ müqəddəm sayılıb, onun təhsili və təkmili üçün əsbab fərahəm etməyə hər kəs himməti qədərincə sə'yü təlaş etməkdir. O cümlədən dərki-qiraət və kitabəti-xütutdur (yəni oxuyub yazmaqdır) ki, insaniyyət ləvazimi və mədəniyyət asayişi ümdəsi min heysəl-həqiq ona mənut və mərbutdur. Hər tayfa öz adətlərincə

hərəkə və e'rabi ki, əcsadi-hürufa ərvah nayibi-mə'nabidirlər, hüruf cinsindən mürəttəb və təhrir vəqti hürufat ilə mürəkkəb edirlər. Bir növ' ilə ki, hər kəs üçün bir həftə zərfində onu təhsil eləmək məqdur və kitabları dəxi haman erab irşadı və imdadilə qələtsiz oxumaq müyəssərdir.

Bulunur isə bir ya iki firqeyi-gümnamdaır və bir də xütuti-milləti-islam ə'la sahibiha əlfüt-təhiyyə vəssalamdır ki, onda işbu üç hüruf: "əlif", "vav" və "ya"dan maəda hürufat ilə mürəkkəb erab yox. Şu səbəbə tə'lim və təəllümlə işkal və zəhmət çox çox. Hər bir ləfzin öyrənilməsinə gərratu mərrat müzakirə və simaə və sabiq və lahiqin mülahizəsinə ehtiyac artıqdır. Ərəb lisanı ki, fəzilət və ədəb kanı, əlsinə sultanı, fəsahət və bəlağət farisinə rəşadət və cəladət meydanıdır, onun üçün məxsus bir kitab erab babında və hərəkat iste'malı 'adabında təlif olunubdur və lakin əlamatü əsər məqamı ilə, nə hürufat surəti və nizamı ilə. Halbuki Qur'ani-məciddən qeyrisində iste'mal olunmur. Müddətlər lazımdır ki, insan ömri-giranmayəsini hər nəhv ilənsə sərfü nəhv təhsilinə sərf edib, ta bir ərəbi ibarəti səhih oxuya bilsin. Vəli farsidən "oxu, baxayım!" – söylərsən, acizdir. Yəqinən əgər bir növ' erab ki, mətlubdur vəz' oluna və bu işkalatı dəf'ü rəf' eyləyə, farsizəbanlar farsidə və türkilisanlar türkidə bir az müddətdə hürufatın surətin və şəklin və erub ilə tərkibin kəsb etdikdən sonra asan vəch ilə hər məktubu və kitabı oxuyub fəhm edərlər. Çox olmuş ki, hər şəxs ləfzin mə'nasını bilirkən erabını qələt oxumuş, ya bir kimsənə mədid müddət şədid zəhmət çəkib təhsildə payeyi-təkmilə olub, bir məşhur kəlməni ki, ona məsmu' olmamış, erab heysiyyətindən qələt oxuyub, əgərçi mə'nasını ibarət münasibəti və künhü fərasətü zəkavəti ilə muvafiq və mütabiq deyibdir.

Ziyadəsi ilə təəssüf məqamı işbu əcibə mətləbdir; heyrət əndərheyrət və əcəb əndərəcəbdir. Deyirlər ki, köhnə xəttin təğyiri və təzə erabın ehdası və tə'yini hə hürufat içində dərci və təzmini isyana və xətaya, küfrana və bəlaya səbəbdir, nə üçün ki, sərasər ömrünü fənaya verib rəsmxətti-alidə ustadi-mahir olmuş zəvati-giramın zəhəmatı hədər və xəzaini-şahanədə zəbt olunmuş xoşnəvişlərin nə abü tab ilə yazdığı kitablardan bilmərrə səlbi-nəzər olur. Kəlamüllah[293] başqa xətt ilə təhrir olunurmu? Qur'an xəttinə heç bir təğyir verilirmi? Əcəba, keçmiş mərhum xoşnəvislərin xətti sənə və mənə və bizim övladımıza nə fayda verir və sərasər ömrün zəhməti az müddətə təb'dil ola nə zərər hasil olur? Rəsmi-təhrir üçün bir qərar qoyula ki, xətt vazeh və hürufat sün' və surəti-əsliyyəsində yazıla, hüsn və qübhünə həddi-müəyyən ola, nə eyib varid gəlir? "Bir azacıq yazıda tulü tə'til olur" – deyib irad olunsa, cavab bu olur ki, "belə artıq işkalın rəfi, şübhə və tərdidi-xəyalın dəf'i və ömri-



giranmayənin zəhəmati-daimisinin bir neçə aya mübəddəl olmağı böyük ne'mət və qənimət deyilmi?" Eşitmişəm deyibdirlər: "Filan xoşnəvisdən tirmə kağız üzərində bir yazı gördüm. Çox əski zamanın xətti. Laciverd və şə'ncərf ilə ətrafına cədvəl çəkib, məzəmmət dəxi etmişdilər. Gərək səfəviyyə padşahlarının zamanının Şiraz yaxud İsfəhan ustadlarının işi olaydı. Hər kim baxardı, heyran olardı. Qaç sətri elə cəli idi ki, iki barmaq enində olurdu, qaç sətri elə xəfi idi ki, guya qıl idi və göz dərk eləməzdi. Həqiqətdə sehr etmişdi. Cəlisi nəstə'liq və xəfisi şikəstə və xətt kağızdan xeylicə bərcəstə idi. Deyərsən qalıbla çalıb, ya qurquşunla basılıbdır. Xəttin sətri və sətrbəndliyi bir tərh və başqa qərar və elə ücubeyi-ruzigar idi, hər kəs hər qədri baxdı, bir sətrini tamam oxuya bilmədi" – deyə mədh edibdilər. Dəxi eşitmişəm: "Filan adam bir xətt ki, çocuqlar dəxi onu oxumağa qadirdir" – deyə qədh edirlər. Padşahlar xəzinələrində olan kitablardan bizlərə nə nəf' aiddir. Əgər məqsudi-əcayib və qərayibə tamaşadır, aləm sərasər bədayeyi-sənayei-həzrəti-təaladır. Xoşnəvislərin ömrü bu yolda tələf olub, çoxunun meyli elm təhsilinə tərəf olmayıbdır. Eləcə ziba və müşk-əfşan xətt imlada sərasər xətavü xəbtdir və o ənbərbar qələmdən çıxan ibarət inşada cümləsi qələt və birəbtdir. Və bə'zi çox yazmaqdan qüvveyi-basirədən aciz və ya bir mərəzə düçar olublar. Qur'ani-məcid əvvəlin kufi xətti ilə yazılıbdır, bədha nəsx xətti ilə. Bu zamanda nəstə'liq və şikəstə xətti ilə yazılsa günahı nədir? Məktəblərdə natəmiz ətfala verilir, nə biehtiramlıqlar zühura gəlir, heç bir günah sayılmaz. İslam millətinin xətt və kitabəti və yazı aləti o qədər dolaşıq və çətindir ki, tifl üçün onu öyrənməkdən ağır bir şey bulunmaz.

Onun üçün gecə və gündüz atanın etdiyi üqubət və şikəncə bir saat müəllim yanında əlifba deməkdən nuşican və guvaradır. Tifli-zəlili altı-yeddi il məktəb yolu teyy etdikdən sonra yenə aşinalıq olmadığı kitabı oxumaqdan bilmərrə aciz və biganədir və bir ayeyi-kitab vafi hədayədən qələtsiz oxumağa qadir deyildir. halbuki bu müddətdə müqəddimati-ülumda bir təriq ilə ki, mütədavildir, dərəceyi-kamala yetişmək lazımdır. Çün xəlayiqin əksəri iki ildən səkkiz il müddətinə ömrünü Qur'an dərsi oxumağa sərf edib və ömrünün axırına dək çox zaman xassə mahi-mübarəki-ramazan Qur'an tilavət edər, onlara Qur'an oxudub və yaxşıca diqqət edib bu mətləbin imtahanı və bədül-imtahan insafca təhqiq və təsdiq imkanı hər kəs üçün müyəssərdir. [Mərhum Mirzə Kazım burada o mətləbi bəyan etmək istəyir ki, Qur'an mütaliəsində ömürlər çürüdən kəslər yenə də onu dürüst və qələtsiz tilavət etməkdə acizdirlər və buna da səbəb hürufatımızın qüsurudur – F.K.], bəs gərək əvvəla təbibi-haziq kimi kəmali-lütfü məhəbbət ilə hər bir tiflə məzacı tərəfincə ki, nifrət hasil

olmaya, şərbəti-hürufatı ki, hər biri bir növ' təm və xasiyyət sahibidir, nuş etdirib və təkmilən hürufatın əşkalü süvər və haləti-ittisalü infisallanı və sair qəvaidi-iste'malı və tərtibü tərkibi məcunları ilə əzhanı ətfaldan rəfi-səqmü i'vacac* edib, qülubuna şövqü səfavü həvasına zövqü zəka artırıb və bə'dət-təkmil bir və ya iki il dərəcəbədərəcə türki və farsi kitabları oxudub və iki il dəxi ərəbi ülumunu tə'lim etdikdən sonra bir az təvəccöhlə Qur'anı qələtsiz oxur. Əgər erabsız dəxi yazılmış ola və çoxunu öz fərasəti qədərincə tərcümə dəxi edə bilir. Çifayda, "vinqafe'le ta behəşr ləngəst"[294].

Mirzə Kazım əlifbamızın dəgşirilmək məsələsini çox əhəmmü əlzəm məsələlərdən birisi hesab edib mərhum Mirzə Fətəli Axundzadə kimi tərəqqi yolunda geridə qalmağımızı əlifbamızın qüsurundan görürdü. Mərhum təzəməslək adamlardan olduğuna görə, məişətimizin hansı bir tərəfi köhnəlib, çürüyüb, işə və vecə yaramadığını gördükdə onu kəsib atmağı və reformanın hər işdə lazım olmağını əhibaları məsləkində daim söylərdi.

Mirzə Kazım vəfat edibdir hicrətin 1310-cu[295] ilində vəba naxoşluğundan ki, İrəvanda haman ilin yay fəslində artıq şiddət edib, çox adam tələf eləmişdi.

* Səqm və i'vacac – mərəz və illət və əyrilik deməkdir. Səqm – naxoşluq, i'vacac – əyrilik



## HACI SEYİD RZA ƏMİRZADƏ "SABİR"

Hacı Seyid Rzanın əsil vətəni Xoy şəhəridir ki, oranın nəcib və məruf sadatından möhtərəm bir vücud idi. Məşhur qövlə görə, iyirmi yeddi sinnində İrəvan şəhərinə gəlib və bir zaman orada iqamət etdikdən sonra təəhhül ixtiyar edib, İrəvanı özü üçün ikinci vətən ittixaz qılmışdır.

Hacı Seyid Rzanın çox rəvan təb'i var idi və lakin onu işlətməyə salamat bir yol bulmayıb, qəsidə, mədh və həcvə şamil şe'rlər inşad etməyə sərf elərdi. Mərhum xeyli xoşsöhbət və zərif bir şair idi. Asari-qələmiyyəsindən mütəfərriq qəsidə, qəzəl və qit'ələr vardır. Onlardan ələ düşəni burada təhrir olunur.

Şair İrəvana gələn vaxtlarda Bakıda Həsən bəy "Əkinçi" qəzetini bina etmişdi. Hacı Seyid Rza "Əkinçi"yə İrəvandan əxbarnəvis olub, nəsr ilə yazılmış bə'zi məktubatı, onların cümləsindən nəzm ilə yazılmış bir məktubu dəxi "Əkinçi"də dərc olunmuşdur. Haman məktub Şamaxıda otuz sənə bundan müqəddəm bir camaat işkollası bina olunanda avam arasında vüqua gələn nifaqü gövtügu babındadır. və bunun müxtəsəri keyfiyyəti belədir ki, haman işkollaya Şamaxı sakini Hacı Seyid Əzim məliküşşüəra öz oğlu Mircəfəri təhsili-ülum etmək üçün qoymuşdur. Avam xalq Seyidi-mərhumun bu işindən rəncidə olub, onun əleyhində zəmm dilini uzatmışdır və Seyid bu babda Mircəfərə xitabən bu nəsihəti demişdir:

Cəfər, ey qönçeyi-gülüstanım,
Ey mənim bülbüli-xoşəlhanım...

Mərhum hacı Seyid Rzanın bu məktubu otuz sənə bundan əqdəm camaatımızın öbvzavü əhvalını, dərəceyi-kamalını göstərən bir dokument mənzələsindədir:

Mərhəba, ey Həsən bəyi-aqil,
Elmi-hikmətdə qabilü kamil,
Bafəhim olmağında söz yoxdur,
Oldu mə'lum: qeyrətin çoxdur.
Əhli-Qafqazı etmisən xoşnud,
Sən özün səd, əhl – naməs'ud.
Sənə hər kimsə tutsa bir irad,
Gurbatindi[296] bulmayıb irşad.
Bizə hər növ' söz desən həqdir,
Hər ki, təkzib qılsa nahəqdir.
Həddən artıq çəkib əziyyətlər,

Xalqa artırmısan həmiyyətlər.
Biz eşitdik əhaliyi-Şirvan
İşkola eyləyibdilər saman.
Şükr qıldıq xudayi-mənnanə,
Verdi[297] tövfiq əhli-Şirvanə.
Şiəvü sünni cəm' olubla tamam,
Eləyiblər bu xeyir işə iqdam.
Afərinlər bu qövmi-əllamə
Yaxşı rövnəq verirlər islamə,
Gərçi bizlər o şəhrdən duruq,
Leyk müslim deyillə, məsruruq.
Var bizim iftixarımız şəbü ruz,
Qeyrət islamdən edibdi büruz.
Əhli-islam bakəmal olsun,
Hamı işlərdə[298] əhli-hal olsun.
İmperaturi-əfxəmü ə'zəm
Xəlqə təklif edib zirahi kərəm,
Ol-zamandan ki, mülki-Qafqazi
Qıldı təsxir zati-mümtazi,
Ədlini xəlqə aşikar qılıb,
Əhli-ürfanı tacdar qılıb,
Fəlihaza əhaliyi-Şirvan
İşkol açmağa eyləyib bünyan.
Var xəbər, etməyirlə indi əməl,
Başlayıb xəlq içində cəngü cədəl.
Gər bu qism olsa[299] heç deyil insaf,
Kişi öz vədəsində etsə xilaf.
Nə səbəbdir bu şurü qovqayə,
Əhl düşmüşlə fikri-bicayə.
Bu, məsəldir ki, "bid bar verməz",
"Şurəzar olsa yer, səmər verməz".
Hər kəsi gəlsə belə göftarə,
Qalacaqdır cahanda avarə.
Nədir elmi-zəbani-rusiyyə,
Ya ki, elmi-əruzi-fərsiyyə?
Mali-dünya verib o şəxsə fərib,
Aparıb ondan ixtiyari-şəkib.
Düşdü başa nəsihətin şuru,
Pənd eşit, ey iki gözüm nuru!
Qıymayıb dövlətini saxlarsan,
Ehtiyacın olanda anlarsan.
Qədrini elmin, ey xücəstəxisal,
Nə imiş aləm içrə fəhmü kəmal?
Bir-birə şövq ilən qılın imdad,
Götürülsün bu vərtədən əfsad.
Öylə kim ol dəliri-fərzanə



Nisbəti vardı şahı-mərdanə,
Şüəranın əmiri, sultanı,
Mə'rifət təxtinin Süleymanı,
Hacı Seyyid Əzim-arifi-həq,
Elmü zöhdündə yoxdu söz mütləq.
Cümlə[300] elmü fününa mahirdir,
Özü fazil, qəribə şairdir.
Tutiyi-təb'i eyləmiş ahəng,
Əhli-əfsadə ərzi eyləyə[301] təng.
Həqqi var, həqqi var ki, mövladır,
Yaxşıya bəd buyursa, övladır.
İstəməz ol cənabi-barütbət
Dalı düşsün bu qövmi-xoştinət.
Sizlərin miknətü vüğarız var,
Vəli minbə'd ixtiyarız var,
Ey Həsən bəy, ədibi-mərdanə,
Olma məşğul qövmi-nadanə!
Aldadıb çoxları həvavü həvəs,
Gülün ətrini anlamaz kərkəs.
Var bizim şəhrimizdə də neçəsi,[302]
Dövləti, öz yanında dəbdəbəsi.
Hali-məxluqə eybü bədcudur,
Görsə suyu, deyər ki, bu, sudur.
Ləzzəti-əklü şürbi-dünyani
Nə bilir vəhşiyi-biyabani?
Dağılıb babi-elmi-hikmətdən,
Müxbir et onları təriqətdən.
Mə'rifətli cahanda adəmdir,
Mə'rifət bulmayan nə adəmdir?
Şikvə qılsam yetişməz itmamə,
İrəvandan yazıldı bu namə.
Xəlqdən mən də gəlmişəm dadə,
Yəni Seyyid Rza Əmirzadə[303].

Müfti əfəndinin "Məcmüə"sində Hacı Seyid Rzanın əş'arından bir neçə müxəmməs, müstəzad, tərkibbənd və tərcibəndlər yazılıbdır. Aşağıda zikr olunan müsəbbə' tərcibəndi haman məcmuədən götürmüşük:

Dilbəra, gəl, gəl ki, əyyami-baharın vaxtıdır,
Daməni-səhradə seyri-laləzarın vaxtıdır,
Mövsümi-gülgəştü cami-zərnigarın vaxtıdır,
Sən kimi fərxündə zati-gül'üzarın vaxtıdır,
Dövri-ruxsarında zülfi-tabdarın vaxtıdır,
Lütf ilə can almağa çeşmi-xumarın vaxtıdır,
Görməyə ruxsarını bu dilfikarın vaxtıdır.

Sızlaram şamü səhər hicrində daim misli-ney,
Şahidi-halımdürür[304] aləmdə mütləq külli-şey,
Zövqi-könlümdür təmənnayi-ləbindən "mim"ü "yey",
Qaşların manəndi-bismillah içində ikki "rey",
Olmuşam dərdü qəmi-hicrinlə həmağuşi-"hey",
Çəkmə gəl xaki-məzəllət içrə munca qəhri-dey,
Dilbəra, gəl, gəl ki, əyyami-baharın vaxtıdır.

Rahzənlik etdi çox eşqində ov baş fələk,
Görmədi sahir sənin tək çeşm, nə qaş fələk,
Gözlərindən paybusunçun töküb yaş fələk,
Çəkmədi xəttin kimi bir xamə nəqqaş fələk,
Nəş'ə verməz badə tək tiryaki-xəşxaşi-fələk,
Döşəmiş işrət büsatın türfə fərraş[305] fələk,
Daməni-səhradə seyri-taləzarın vaxtıdır.

Əndəlibasa gülüstan üzrə cəngü cuş edək,[306]
Novərusi-şahidi-mə'nanı həmağuş edək,
Mə'rifətdən neçə əlfazi-qəribə guş edək,
Can damağın badeyi-gülrəng ilə mədhuş edək.
Könlümüzü[307] saqiyi-rən'ayə duşaduş edək,
Sağərü peymanəni bəzm içrə nuşanuş edək,
Mövsümi-gülgəştü cami-zərnigarın vaxtıdır.

Mənzəri-xurşidü xavər məh cəmalın görməyə,
Qönçeyi-bağı-İrəm şol rəngi-alın görməyə,
Tutiyi-can hər zaman şirin məqalın görməyə,
Tubiyü ərər qiyami-novnihalın görməyə,
Arizumənd ol könül eydi-vüsalın görməyə,
Nola bir əzm eyləsə bu xakmalın görməyə,
Dilbəri-fərxündəzati-gül'üzarın vaxtıdır.

Sübhdəm bazari-hüsnün gör nə rəngin eyləmiş,
Guşeyi-əbrulərin xətt ilə təzyin eyləmiş,
Lə'li kövhərbarın ol Fərhadə Şirin eyləmiş,
Aşiqi-şeydani ellərdə süxənçin eyləmiş,
Lütfünü eşq əhlinə qayətdə səngin eyləmiş,
Türrəsin badi-səba, dəst ilə çin-çin eyləmiş,
Dövri-ruxsarında zülfi-tabdarın vaxtıdır.

Munca kim, eşqi yolunda etdim anı cüstücu,
Üzdü övqati-qərarım dəşti-qəmdə rah bu,
Demədim ol zülfi-müşkəfşanə halım mubəmu,
Rəşhei lə'li-ləbindən könlüm eylər arizu,
Xəsmi-can etmiş cigərdən ikki xunxar ədu,
Əyləşib[308] bu macəradə bir-birilə rubəru.
Lütf ilə can almağa çeşmi-xumarın vaxtıdır.



Ey Riza, aşiq deyil, kim eyləsə namusu nəng,
Eyləməz eşq əjdər ilən mütləqa aşubü cəng,
İçməyən cami-ələstdən key olur məst pələng,
Hanı məhrulər içində sən kimi bir şuxü şə'ng,
Arizindən gül xəcil, həm ləblərindən qönçə təng,
Kəsmə gəl, payi-məhəbbət, başın üçün etmə ləng,
Görməyə ruxsarını bu dilfikarın vaxtıdır[309].

Mərhumun bundan savayı yenə çox gözəl və şirin kəlamları vardır. Leyk cümləsini yazmağa ehtiyac yoxdur. Hacı Seyid Rza vəfat edibdir İrəvan şəhərində hicrətin 1322-ci[310] ilində. Ömrü təxminən altmış ilə çatmışdı.

Tarixi-vəfatını məzar daşı üstə həkk etmək üçün əhibbalarından Mirzə Abbas "Zari" təxəllüs bu qit'əni inşad etmişdir:

Fəxre-əşrafe-zəman Seyyid Reza Saber ke, bud,
Haviye-fənne-bəlağət, məcmə'e-fəzlo kəmal.
Əz cəhan yeksər beqolzare-cenan kərd ertehal,
şe'rəş əz bəs bod həlavətbəxşe-kame-arefan,
Gəşt tarixe-fəvatəş "şaere-şirinməqal"[311]

## MİRZƏ ƏLİXAN ŞƏMSÜL-HÜKƏMA "LƏLİ"

Mirzə Əlixan Şəmsül-hükəma təvəllüd edibdir Təbrizdə: 1261,[312] vəfatı Tiflisdə: 1325[313]. Ata və anası irəvanlıdırlar. Tə'lim-tərbiyəsi Təbrizdə [olub] oranın mədrəsələrində. Ərəb və fars dillərində lazım olan qədəri məlumat kəsb edibdir. Orada əttariyyat dükanı açıbdır və bir zaman nüsxəbəndlik edib, sonraları oranın məşhur təbiblərinin yanında filcümlə təbabət elmindən məlumat kəsb edibdir. Təbabət elmini təkmil etmək üçün Tehrana gedibdir və orada elmini tamama yetirəndən sonra dübarə Təbrizə müraciət edib, orada həkimliyə məşğul olubdur və bir çox təcrübə kəsb edibdir. Bədən Misirə, İslambula və hətta Avropanın bə'zi şəhərlərinə azim olub, öz bilik və təcrübəsini artırıbdır. belə ki, İran təbiblərinin məşhurundan birisi sayılırmış.

Bunlardan əlavə ziyadə fəsih və şirinzəban olduğu üçün Təbrizin əyanü əşrafı arasında özü üçün böyük hörmət qazanıbdır və onlar ilə həmcəlis olubdur. Bu halda dəxi Lə'linin türfə sözləri və pürhikmət kəlamları zərbülməsəl məqamında iste'mal olunur. Bununla belə Lə'linin bir növ' həcvguluğa meyli var imiş və bir çox həcvləri vardır ki, onların kitabımıza küncayişi yoxdur. "Şəmsül-hükəma" ləqəbini almağa səbəb Məzəffərəddin şahın[314] Təbrizdə vəliəhd olan vaxtlarda müqərrəblərindən birisinə müalicə edib sağaltması olubdur və bundan əlavə ona vəzifə dəxi tə'yin olunubdur.

Məddahlığa və qəsidəguluğa çəndan meyli yoxmuş. Zatən hürriyyətpərəst və azadəlik sevən və təməllüqdən uzaq bir vücud imiş. Belə ki, çox böyük adamların və sahibixtiyar şəxslərin həcvindən özünü saxlamayıb, qüsurlarını haman həcvlərdə bəyan edibdir. Vaxtının çoxunu səyahətdə keçirərmiş. Əksər övqat Tiflisdə və İslambulda olarmış. Ərfəüddövlə[315] ilə böyük mürafiqəti varmış.

Məaşı təbabət ilə keçərmiş. təb'i-şe'riyyəsi ziyadə qüvvəli və əş'arı mövzun və pürməzmun. Əksəri türk lisanındadır. Çox gözəl qəsidələri, qəzəlləri, dübeytləri və növhələri vardır. Farsca dəxi hər qisim abdar kəlamları vardır. Vəfatına səbəb təzyiqi-nəfəs olubdur.

Tiflisin istiliyi babında yazıbdır:

Bir deyən yoxdur, ey xudavəndə,
Bu bədən qurquşundu, ya misdi?
Kürəxanə deyil bizim mənzil,
Nəyə lazımdı bu qədər isti?
Bizim ev Məkkə, mən ərəb deyiləm,
Ərəbistan deyil bu, Tiflisdi.



Bu hava xətti istivadə gərək,
Sakinani-şimalə çox pisdi.
Bunu göndər ki, özgə bəndələrin
Cümləsi acü urü müflisdi.
Cücülər doldurub kitab arasın,
Biri molla, biri müdərrisdi.
Birəvü mığmığavü kor milçək
Cəm' olub, bir qəribə məclisdi.
Şəhəri qızdırıb, çölü soyudub,
Bilmirəm bu necə mühəndisdi?!

Tiflisin yağışı barəsində demişdir:

Bu yağışa dayanırmı dəmir, daş, görüm,
Qalaydı xeyrin, ilahi, qapında kaş görüm!

Yağış gərək çölə yağsın, nə şəhr, bazarə,
Nə xeyri var sənə üstü başımı yaş görüm?

Bir aydı üst-başım zığdı, başmağım palçıq,
Özün mələklər ilə bircə gün sulaş görüm.

Nə vaxt yağıbdı yağış, küçələrdə it boğulub,
Nə vaxt yağıbdı dolu, sındırıbdı baş görüm.

Bahalıq ildə acından ölənləri gördün,
Tapa bilir onların qırxı bir lavaş görüm?

# İSKƏNDƏR AĞA QAİBBƏYOB "ŞAİR"

Qazax şairlərinin məşhurundan birisi də dağkəsəmənli şair İskəndər ağa ibn Hüseyn ağadır. İskəndər ağa ziyadə baməzə, xoşsöhbət, açıq qabaqlı, deyib-danışan və bir az hərzəgu bir şəxs imiş. Müsəlmanca savadı az imişsə də, lakin güşadə təb'i varmış. İskəndər ağa 52 və ya 53 sənə ömür edibdir. Vəfatı ittifaq düşübdür 1873-cü il tarixi-miladiyyədə sentyabrın 24-də. Əşarü ədəbiyyatı çox isə də, cümləsi müntəzəm bir məcmuə halında deyildir. Əsərlərində bir neçəsi burada zikr olunur.

Qəzəl:

Əziza, bülbüli-təb'im sənə bir macəra söylər,
Nə təqsir eylər əhvalı, nə anda iftira söylər.

Güli-novrəstəni əvvəl çəməndə xar ilən görmüş,
Unutmuş mərhəba rəsmin, xəyal etmə riya söylər.

Rəqibi yar ilən aşiq görəndə nəql olur əqli,
Zəmani-zülmdə mərdüm nə söylərsə, xəta söylər.

Üzr məqbuldur ində kiraminnas söylərlər,
Kiramünnas mə'zurə hədisi "qul kəfa"[316] söylər.

Qəzəl gülzarına, təb'in əziza, çünki mayildir,
Bəs indi bülbüli-təb'im kəlami-xoşsəfa söylər.

Çəməndə bülbülün qədrin güli-novrəstələr bilsə,
Səhər gülzardə bülbül süruri-canfəza söylər.

Qələt məşhur düşmüşdür fənadə bə'zi əsmalər,
Kəlamai-küfr ilə aşiq ki, zülfi əjdaha söylər.

Yenə bu cümlədən xeyli xətayə getmiş ol qafil,
Xəyali-xam ilə hər dəm cəfanı həm vəfa söylər.

Vəfa bir zülmdür hər kəs özünə ixtiyar etsə,
Vəfa əhlini münsiflər bəlayə mübtəla söylər.

Şəb asudə yatar hər kim ona qafil deyər qafil,
Cünun tək hər gecə ağlar, onu xəlq övliya söylər.

Həmişə başını biəcr verir pərvanə, pərvanə
Yanar odlarə bihudə, özün əhli-riza söylər.



Oxur həm "Şərhi-təcrid"ivü[317] "la röhbanə fil-islam",[318]
Xilafi-şərlə Nasir təriqi-Mustəfa söylər.*

Xəyali-sübhi-vəsl ilə şəbi-hicranda aşiqlər
Öpüb zülfü deyər "vəlleyl"ü ruyi "vəzzüha" söylər.

Hamana dami-təzvirdir, məazəllah, məscidlər,
Kələklərdirlər ol sözlər ki, vaiz cabəca söylər.

Dirəm-dinar əgər versən, kəsər xud ənbiya nəslin,
Olar minbərdə kim, hər dəm şəhidi-Kərbəla söylər.

Həsəb məşhurdur ancaq bu təb'im təşbihi bülbül,
Bu yerdə zəmm ol zarə könül qeyri rəva söylər.

İskəndər ağanın bu qəzəli-dilpəzirində xeyli gözəl və doğru sözlər vardır ki, onlara diqqət yetirməmək olmaz. Necə ki, əbəs yerə kəlami-küfr ilə aşiq zülfü əjdahaya təşbih tutar və ondan əlhəzər deyib fəryad edər. Çünki həqiqətdə zülfün əjdaha ilə heç bir oxşayışı yoxdur. Əjdaha cana xövf və nifrət salır, zülf isə aşiqin könlünü özünə bənd eləyir. Birisini xövf və nifrətlə uzaqlaşdırır, qeyri birisini lətafət və təravətlə yavuqlaşdırır. Əjdəhanın zülfə nə münasibəti?!

Habelə şair deyir ki, xeyli xətaya düşmüş ol qafil ki, xəyali-xam ilə cəfanı həm vəfa söylər, həqiqəti-hal bəsirət gözü ilə baxılsa, vəfada dəxi çox zülmlər görər. Çünki vəfada möhkəm və müstəqil durmağa çox hünər istər. Bu yol xətərli yoldur. Burada can-başdan keçmək lazım gəlir. Ol səbəbdəndir ki, münsiflər vəfa əhlini dərdə mübtəla söylər. Həmçinin gecələr bəstəri-nazda rahat yatanlara qafil deyirlər, amma cünun tək sübhə kimi oyaq qalıb raz-niyaz edənlərə övliya söylərlər. Belə söyləyənlərin özləri xud qafil deyillərmi?!

Ağılsız pərvanə canını oda salıb yandırır, nədir ki, mənə əhli-riza desinlər. Burada eyni-səfahət deyilmi?! Məzaəllah, məscidlər də dami-təzvirdir. Adamları içində topladır və vaizin sözləri birbəbir kələkdir. O kəslər kim, minbərdə şəhidi-Kərbəla deyib ağlarlar, onlara əgər dinarü dirəm versəniz, özləri ənbiya nəslini öz əlləri ilə kəsib yer üzündən götürər...

...Cananın vəsfində və qazi Mirzə Nəbi əfəndi Qaibovun mədhində deyibdir:

* Əmizadəsi Mustafa ağa "Nasir" təxəllüs guşənişin olub röhbanlar kimi dünyadan qət'i-əlaqə olmasına işarədir.

Baxar qaşlarına aşiq, oxur "nun vəlqələm"[319] şərhin,
Gülün dövrünə sünbüllər yazar tərhi-rəqəm şərhin.

Çəkən azarını ruhum bədəndə zar edər, yoxsa
Gözün, ağzın xəyalilə qılır xabi-ədəm şərhin.

Əyibsən qəddimi, saqi, edəməm qaşının vəsfin,
Dəmağım badədən tərdir, xətərnakəm əyəm şərhin.

Xərabi-nərgisi-məstəm, əlimdə ixtiyarım yox,
Açıb hüsnün kitabını bu xəlqə göstərəm şərhin.

Oxur piranəsər Şair həmişə mədhü övsafın,
Tutar damanını bir gün, umar səndən kərəm şərhin.

Soran dövranın əhvalın cənabi-qazidən sorsun,
Odur gülgəşteyi-dövran, bilir zövqü ələm şərhin.

Başımdan sayəsi onun təğəyyür olmasın bir dəm,
Əgəm olmasa ol, ya rəb, kim eylər dərdü qəm şərhin.

Bilir gülzarın əhvalın o, bülbüldən gözəl söylər,
Könüllər halını anlar, deyər mədhinü həm şərhin.

Nə nazik riştədən tutdu, nə ziba eylədi ol gün,
O tiri-xunfəşan vəsfin, o zülfi-xəmbəxəm şərhin.

Edər əş'arımı təhsin görən saətdə ol kəs kim,
Qoyar insafı ortayə oxur ürfi-həkəm şərhin.

Deyirlər Şairin dərdi füzundur cümlə aləmdən,
Yetən bidərdə namərdəm bu dərdin eyləsəm şərhin.

Mərhum İskəndər ağa laübali bir vücud olduğundan dünya və axirətin qeydinə qalmayıb, beş günlük ömrü xoş keçirməyi qənimət bilib, eyş-işrətə məşğul idi və Ömər Xəyyam kimi axirətə e'tiqadı və inamı olmayıb, onun tutduğu təriqdə müstəhkəm idi və Xəyyamın əqidəsi isə bu rübaidən aşkar olunur.

Ey an ke, nəticeyi-cəharo həfti,
Vəz' həfto çəhar daim əndər təfti,
Mey xor ke, hezar bar bişət qoftəm,
Baz amədənət nist, rəfti, rəfti[320].

İskəndər ağa Şair də ömrünün axır günlərində dünya və axirət onun gözünə görünməyib, nəzərində hər ikisi biqədrü qiymət olduğu babda yazıbdır:



Ömr həftadə yetib, dünya nə dərkarımadır,
Gəlib azari-əcəl, şorba nə dərkarımadır,
Kürəxanə, dəbilən halva nə dərkarımadır,
O münacat adlı zurna nə dərkarımadır,
Ağü bezdən o kəfən torba nə dərkarımadır,
Qəbr nə karımadır, sapa* nə dərkarımadır.

Üç gün ə'za yerinə qonşu verən xürdü xörək,
Yeddi gündən sonra xeyratə ölən ökküz, inək,
Qırx günündə gələn ol vaizi-qırxdil bişək,
Yığılan təzvir üçün zahidi-sahib dügələk,
Vurhavur xeyrat üçün o minilən at, eşşək
Çorta-çort getsə və ya yorğa nə dərkarımadır.

Gedə ol gündə ki, can tərk qıla zövqi-cahan,
Nə mənim vecimədir o əyilib qəbri qazan,
Heç görünməz gözümə donba durub taxta yonan,
Bərcəhənnəm, o gecə tərəkə minib getsə canan,
Minməyə daşı nola tox qarına daşı yazan,
Çataçat daş yazan molla nə dərkarımadır.

Keçsə əyyami-xəzan, gəlsə zəmani-novruz,
İl mürurunda yenə molla edər hiylə büruz –
Ki, gərək xeyrat üçün zəbh oluna kəl öküz,
Hüsni-xeyrat üçün nəqlə bərabər dura yüz,
Cüğdi-viranə kimi əyləşib evdə yalğuz,
Getməyib nazlı yarım qalsa, nə dərkarımadır.

Daşə əfsunmu verir daş yazan ol molla –
Ki, minib daşı vurar hər çəkici bir yolla,
Yoxsa xəttin üfürür ki, quruda nəfxi-cəfa,
Mərhəba mə'rifəti-zahidü əhli-təqva,
Tə'miri-mərqədimə naz ilə gəlsə usta,
Belə surətdə haman usta nə dərkarımadır.**

Ömr həftad ilə zal etdi fənadən ki, səfər
Olmasa, heyf deyən olsa, nə dərkarımadır.

Şairin ömrü həftada yetib, amma dünya və axirət vecinə deyil. Mə'lumdur ki, sinn artıqca və ölüm zamanı yavuqlaşdıqca adam axirət

* Sapa – qəbrin dibində qiblə tərəfə yer qazıb, meyiti onun içinə qoyub ağzını daş və taxta ilə örtürlər. Haman qəbrin içində kənara qazılan yerə "sapa" deyilir.

** Bundan sonra iki beyt əslində buraxılmışdır.

fikrinə düşüb, gününü ibadətlə keçirir və zöhdü təqvasını artırır ki, cavanlıqda puç və zay etdiyi günlərində oruc-namazı və sair vacibati-diniyyəsini təkmil qılsın. Amma Şair bu gunə fikir və əməllərdən uzaqdır. Onun əqidəsincə, azari-əcəl yetişəndən sonra heç bir şey fayda verə bilməz. İnsan gərək ölüb fövt olsun və öləndən sonra onun üstə oxunan Qur'an, çəkilən münacat, qüsl, kəfən, qəbir, sapa və qəbristanda yeyilən halva onun vecinə deyil. Bu müsəddəs kəlamda şair dehat və tərəkəmə əhlinin ölü üstündə cari olan qayda və adətlərini dəxi istehza təriqincə nəzmə çəkir, heç biri barədə bir qüsur qoymur. Qonum-qonşu üç gün ə'za yerinə göndərdiyi xürdü xörək, yeddisində və qırxında sahibi-tə'ziyə verdiyi xeyrat və ehsanat və o xeyratda minilən at, eşşəyin çorta-çort və ya yorğa getməsi və həmçinin donba durub taxta yonan və qəbir daşına minib çataçat daş yazan molla və hətta şairin nazlı yarının ərə getməsi və ya cüğdi-viranə kimi evdə oturması şairin əsla və qət'a vecinə deyil və onun vəfatından sonra ona rəhmət oxunacaqmı-oxunmayacaqmı, onu təəssüflə yada salan olacaqmı-olmayacaqmı? Bu fikirlər də şairin xəyalına gəlmir və halına təfavüt etmir.

İskəndər ağa, necə ki, bu kəlamından görünür, molla sinfini sevməzmiş və mollanın həcvində yazdığı özgə bir kəlamında molla qisminə olan onun nifrəti dəxi də aydın görünür. Molla qisminin halına müvafiq yazmış:

Geymə saluslugla ağü kətən, ay molla!
Gəzmə avarə, olub tərki-vətən, ay molla!

Biədəblikdi sual eyləməyim hərçəndi,
Müşkülüm olsa, gərək həll edəsən, ay molla!

Bir uşaq ağlardı: – Vay, atam öldü, deyir
Sizin uşaq ona güldü, bu nədən, ay molla?!

Güldü şükranə uşağın, dedi: – Halva yeyərik,
Çün ölübdür bu gecə Usta Həsən, ay molla!

Mərəzi-mövtdə batildi – dedin – tövli-məriz,
Nola can haqqı da batildi desən, ay molla!

Soydun, ol pirin apardın nə üçün çarığini,
Qoydun ancaq ona bir quru kəfən, ay molla!

Xəlqə iblis cəhənnəm tələb eylər, sən əcəl,
Sirriniz biridi sizin iblis ilən, ay molla!



Aldadıb xəlqi, lotu, lə'n demə şeytanə,
Eybdir ürfdə sirdaşə söyən, ay molla!

Mə'lun atan səninlə gedəli qırx ildir,
Bircə ehsan veribən evdə yesən, ay molla!

Yığılır xeyli gözəllər ki, müsibət evinə,
Əqrabadır olara bəlkə ölən, ay molla!

Nola qarşı oturub ol gözü qan yaşlılara,
Aşü bozbaş yeməyib, çor yeyəsən, ay molla!

Cümə axşamı yolun düşməyə dostun evinə,
Çəkilə yollarına qara tikan, ay molla!

Dostun ol kəsdi ki, oğlan ölə, oğlan öləsən,
Düşmənindi, yaşama, yüz yaşayan, ay molla!

Yaxşı sındırdı səni öldü dünən boz məşədi,
Müflis oldu ki, yanıb-yaxılasan, ay molla!

İntiqamını o gün səndən alıb boz məşədi,
Ac qalıb gərnəşəsən, ulayasan, ay molla!

Bitəkəllüf eşək kimi girirsən hər evə,
Soxulursan tula tək hər qapıdan, ay molla!

Sən ki, Qur'anda özün "əlhəqqü mürr"[321] oxumusan,
İncimə, acı olur həqqi süxən, ay molla!

Qapacaqsan məni də it kimi bir gün bilirəm,
Qapdırır itə özün iti vuran, ay molla!

Molla qisminin, əlbəttə, eyibləri çoxdur və Azərbaycan şairləri öz əsərlərində ruhani atalarımızın o eyib və nöqsanlarını rişteyi-nəzmə çəkib, nazik işarə və eyham ilə göstəriblər. Bu barədə şayani-diqqət olan əsərlər mərhum Zakirin və Hacı Seyid Əzimin əsərləridir ki, xeyli zərifani ruhanilərə toxunub, onların çirkin və nalayiq işlərindən, xüsusən dəryalara bərabər olan hirsü tamahlarından yazıb bəyan ediblər. Amma İskəndər ağa isə lap baltanı dibindən vurub, haqqı söyləməkdən zərrə qədəri də ürpənib çəkinməyibdir.

Filhəqiqə, Şair İskəndər ağa hər kəsin eybini açıq üzünə deməkdə tək yaranmışdır. Necə ki, buna özünün də bir şe'ri şəhadət verir:

Ərseyi-əş'ardə mən Rüstəmi-dəhrəm vəli
Söylərəm xövfü xətərsiz, şiri-aslan içmişəm[322].

Mərhum İskəndər ağanın əsərlərindən biri də onun nəzm ilə yazılmış "Hərçi bədtər" nam kitabçasıdır. Bu kitabça artıq fəsahət və bəlağətlə məsnəvi səbkində yazılmış baməzə bir hekayədir. Fəqir bir dehqanın sərgüzəşti onda bəyan olunubdur.

Məzmuni-hekayə münasib olmadığından burada zikr olunmur və lakin hekayənin bir para yerlərindən nümunələr göstərməyi lazım bildik.

Qazaxda qız-gəlinlərin Qaynara paltar yumağa getməyini bəyan edir:

Bülbüli-bustani-şəhri Qazaq,
Şairi-nüsxəbəndi-əhli-məzaq,
Əndəlibi-riyazi-əfsanə,
Şairi-nəxlbəndi-piranə,
Saldı qülqül riyazi-sövdayə,
Verdi bağı-xəyalə pirayə.
Kim haçan nəql edər zəmani-xəzan,
Ta gəlir təxtə bəhari-zəman[323].
Novbahar aləmi müzəyyən edər,
Dəştü səhra olur şükufeyi-tər.
Onda rən'alənib qız ilə gəlin,
Sərvi-azadə tək çəkib ətəyin,
Seyr edərlər çıxıb qatar-qatar,
Durna tək qəryədən gəzərlə kənar.
Gəşt edib səbzəzari-çeşməkənar,
Bir ləbi-Dəclədə qərar tutar.
Dəstə-dəstə o cümlə laləüzar,
Səf-səf eylər tədarüki-Qaynar.
Sərvboylar sərasıdır Qaynar,
Ahugözlər binasıdır Qaynar.
Sanma mətləb olara behcətdir,
Bəlkə məqsəd olara zinətdir.
Kimi zülfün açar, kimisi hörər,
Kimi ayinədə cəmalı görər.
Bəzi əbrusinə çəkər vəsmə,
Bəzi müjganına sürtər sürmə.
Zülfə şanə dəyəndə cilvələnir,
Gözə sürmə çəkəndə işvələnir.
Üzünə saçsa yar cilvədə su,
Alır ondan səfayi-seyqəl ru.
Su təravət gətirməsə cismə,
Sərvboylar ararmı sərçeşmə?!

"Hərçi bedtər" və "Hekayəti-dehqan" nam kitabça itmama yetdikdə İskəndər ağanı qazi Mirzə Nəbi əfəndiyə ki, sahibi-kamal və mə'rifət bir



şəxs imiş və fünuni-şe'rdən filcümlə xəbərdarlığı var imiş, göstərib, "Hekayəti-dehqan"da olan bə'zi nalayiq və hərzə-hədyanın barəsində onun rə'yini soruşmuşdur[324]. Mirzə Nəbi əfəndi bu barədə öz rə'yini belə bəyan edibdir və şairi bir növ' təskinül-qəlb qılıbdır. Necə ki, şair deyir:

Macəranı ki, eylədim təqrir,
Belə verdi cavabını ol pir –
Ki, deyil şairin ədəb tələbi,
Gözləməz şe'rdə olar ədəbi.
Şərti-şair ədəb ola izhar,
Sanma vəznü məzamini axtar.
Şe'r oldur ki, kəşf ola məzmun,
Nəzm oldur ki, çox ola mövzun.
Söz odur zahiri zərif ola,
Batini mənidə lətif ola.
Təb'dir təmsiz sözün nəməyi,
Təb'dir hər rəkik sözün ələyi.
Nəzmdir pərdədari biədəbin,
Şe'r şirazəsidi hərzəliyin.
Görsə cürmün günah ilə yeksan,
Ruzi-məhşərdə mö'minin yəzdan,
Kilki-əfvin çəkər günahə o dəm,
Bəlkə eylər ona behişt kərəm.
İndi mə'lumdur xitabından,
Cürmün əskik ola savabından.
Hər nə şair ki, iftira söylər,
Əksərin bəndi-biriya söylər.
Şüəra mücrimi-mükərrəmdir,
Şüəra dərdiməndi-biqəmdir.
Şüəra əhli-hali-məşhurdur.
Əhli-halın günahı mə'zurdur.
Buyurubdur Məhəmmədi-ərəbi:
Şüəra xəlq olub zibədi-nəbi.
Xövf etmə sözün xətasından,
Xeyri-ümmid tut cəzasından.
Çün nə dəm ki, bu şe'ri müflis oxur,
Nəfsi-əmmarəyə müqəyyəd olur.
Bilsə biçiz ki, böylədir əhval,
Daxi olmaz əsiri-qeydi-əyal.
Olmayanlar əlində simü zəri
Eyləməz arizuyi-simbəri.
Pəndinə bəndə olsa övrətlər,
Şövhəri-müflisə mürüvvət edər.

Axirül-əmrdə o əhli-təmiz
Dedi: – Ey dərdmənd yari-əziz,
....................................kitabət ola,
Müzdi-şəm' sənə xəsarət ola[325].
Ehtiyat eyləmə, əgər diqqət
Tutsa nadan, danışsa bimürvət,
Çünki surətpərəstdir onlar,
Şahidi-mənidən nə zövq qanar.
Eylə tənin hünərlərin izhar,
İstə axırda tövbə, istiğfar.
Çək kəmiyyət kəmalına mizrab,
Əfv eylər ki, qafiri-əznab[326].
Təb'i-şair nüfusi-piri müğan,
Oldu me'mari-xaneyi-dastan.

Şair İskəndər ağa "Hekayəti-dehqan"ı 1288-ci[327] səneyi-hicriyyədə yazıbdır. Şairin bundan əlavə əş'arü asarı çoxsa da, mürəttəb bir divan və məcmuəsi yoxdur.



## MUSTAFA AĞA "NASİR"

Mərhum Mustafa ağa ülum və maarif cəhətincə, demək olur ki, cəm'i Qazax şüəravü üdəbasının əfzəli və ələmi olub, öz vaxtında mislü bərabəri az tapılan xoşxülq, naziktəb' və alinəsəb bir şəxs imiş ki, əksəri-ovqatını firəng, rus və fars kitablarını mütaliədə keçirərmiş.

Mustafa ağa təvəllüd edibdir Qazaxda Dağkəsəmən qəryəsində. Nəşvü nüması və tə'lim tərbiyəsi dəxi haman məkanda olubdur. Təvəllüdü vaqe olubdur 1824-cü sənədə oktyabr ayının 15-ci günündə ki, tarixi-hicriyyənin 1240-cı[328] ilinə mütabiqdir.

Mustafa ağanın pədəri-valaları podpolkovnik Həsən ağadır ki, o da nəcabətü şücaətdə məşhurü namdar və öz əsrində sahibi-hökumətü iqtidar bir bəy imiş. Cümlə övladü ənsabı-cəddi-büzürgvarları Qiyas bəyə nisbətlə "Qiyasbəyzadələr" deməklə beynələn'am müştəhir və bən'amdırlar.

Mustafa ağa Dağıstan davasında çox sədaqət və hünərlər göstərib çin almışdı və iki il Varşavada qalıb rus və firəng dillərini kifayətincə öyrənmişdi. Lakin, necə ki, dəfəat ilə təcrübə olunubdur, Mustafa ağanın hünər və sədaqətləri dövlət nəzərində qədrü qiymətsiz qalıb və hətta onun haqqında aşkaran ədalətsizlik vüqua gəlməyə görə, Mustafa ağa öz vətəninə müraciət edib və üzlətü fərağət guşəsini ixtiyar qılıb, vaxtlarını ibadətdə və təhsili ülumü maarifdə keçiribdir. Necə ki, bu barədə Nasirin divaniəş'arının müqəddiməsində Poylu qəryəsinin sakini fazilül-üləma mərhum Hacı Sə'di əfəndi lisani-bəlağət-nişanı ilə təhrir qılmışdır ki, "ol xücəstəsifat, yə'ni Mustafa ağa Nasiri-ömri-səadətsəmat və övqatiizzətayatin min əvvəlihi ilə axir manəndi-Əmir Nizami Əlişir əlimütəxəllis be "Nəvai" əzhəmeyi-şüğlha sir və cəm'i-əsbabü müzəxrəfatidünyəviyyədən mütənəffirü dilgir olub, əvvələn təhsili-ülumü maarif və təkmili-nükatü lətaifə və saniyən inşadi-şe'rü ibqa asari-xeyrə bəzlü sərf etdi və axırda nəş'əyabi-rəhiqi-həlqeyi-əhli-təriqət və cür'ənuşi-camibəzmi-ərbabi-həqiqət olmaqla mərtəbeyi-qürbü istifazə yetdi".

Mövlana Caminin atidə zikr olunan kəlami-dürsənci:

Xoştər ze ketab dər cəhan yari nist,
Dər ğəmkədeye-zəmane ğəmxari nist.
Hər ləhze əz u bequşeye-tənhai
Səd rahət həsto hərgez azari nist[329].

– mərhum Mustafa ağanın şə'ni-izzətnişanına sadiq və ətvari-sülukü təəyyüşünə şayəstə və layiq idi. Xüsusən şair ömrünün axır vaxtlarında

həmvarə üzlətgüzin və xəlvətnişin olub, kitabü mütaliədən maədа özünə qeyri bir munis və rəfiq bulmazdı". Necə ki, Hacı Sə'di əfəndi şairin halına müvafiq deyibdir:

Ey xoş ol azadə kim, jəngi-təəllüqdən müdam
Saf edib dil şişəsini, xeyrə qıldı ehtimam.
Dəftərü-şe'rü kitabi-din olub munis ona,
Rehlətində rəhmət ilə zikr edər anı ən'am.

Mərhum Mustafa ağanın sinni əlliyə baliğ olduqda bu dünyayi-dunu tərk qılıb, azimi-dari-bəqa olubdur. Necə kim, bir şairi-tazə bub babda yazmışdır:

Bilin, adı Qazaxi Mustəfadır –
Ki, pəncah ömr ilə gözdən xəfadır.

Hacı Sə'di ibn əlqazi Sə'di əfəndi ki, Nasirin zümreyi-xülsi-əhbabü əshabından mədud ki, şairin tarixi-vəfatını belə nəzmə çəkmişdir:

Mülkü malü cahi-dünyayə, könül, etmə nəzər,
Qafil olma, bil yəqin kim, mövtədir axır güzər.
Görmədinmi Nasiri əhli-kəmalın əkməlin
Fövt qıldı dəhri-dun ba cümleyi-fəzlü hünər?!
Came'i-ənva'i-hikmət həm süxənsəncü zərif,
Maliki-mülkü imarət, şə'nü şövkət izzü fər.
Böylə kim, məcmu' idi onda şücaət, mülkü din,
Nadir olsa yoxsa kim, olmaz ona həmta digər.
Zümreyi-əkməl içində zati-paki müntəxəb,
Nəzmi şöhrətyabi-aləm, həm cahanda namvər.
Gərçi cismi gənc tək xak içrə mədfundur, vəli
Nami-niku, nəzmi-xoş dünyadədir ondan səmər.
Zikri-xeyr ilə əbəd nami cahanda baqidir,
Deməsin qalmadı kəs nəxli-vücudundan səmər.
Çün "ğəfir"* oldu, xudaya, tarixi-fövti onun,
Eyləyib məğfurə, üqbadə ona vermə kədər.
Niknamü xoşəməl kim oldu, oldu cavidan,
Yoxsa kim, baqi deyil dünyadə, Sə'di, bir bəşər.

Vəfatı vaqe olubdur 1291-ci səneyi-hicriyyədə – oktyabrın 10-cu günündə ki, tarixi-məsihiyyənin 1873-cü sənəsində mütabiqdir. Onun qəbrinin daşı üstə öz kəlamından bu şe'r yazılıbdır:

* "Ğəfir"dən hesabi-əbcəd ilə tarixi-vəfatı çıxartmaq lazımdır[330].



Olur qəbrim görən dəmdə xütur xatiri-arif –
Ki, Nasir əslinə[331] rücət edib axır qubar oldu.

Mustafa ağanın fars və türk dillərində yazdığı əş'arü asarı hali-həyatında bir qayda üzrə tərtib olunmayıb, bisərü pa və mütəfərriqül-əcza qalmışdı. Bədəl-vəfat müqərrəbi-zati-həmidəsifatı olan Molla Məhəmməd Cənnətzadə həzrətləri əzruyi-həqvari və şükürgüzari cümləsini cəm' və tərkib və hürufi-heca üzrə tərtib etdi. Bununla dostluq və sədaqət vəzifəsini yerinə yetirib, cümlə əqrəbavü əhibbasına böyük minnətlər qoydu. Və lakin Mustafa ağanın divani-bəlağətünvanı hənuz çap olunmayıbdır. Bir-iki əl ilə yazılmış nüsxələri var və əgər onlar da itib tərk olsa, onda dübarə o divanı tərtib etmək mümkün olmayacaqdır[332]. Onun adını baqi saxlamaq möhtərəm bəradərləri polkovnik Nəsib ağa Qiyasbəyov cənablarına borc olur. Türki və farsi əsərlərindən bir neçəsi burada dərc olunur.

Dünyanın əhvalına dair:

Deləm xahət həme əhvale-donya,
Ze əvvəl mikonəd ta axər inşa.
Bedana zolme-faheş mikonəd çərx,
Begərdəd daema ba kame-kana.
Qoruhe-əbləhan əndər tə'nəom,
Xorəd xune-cegər dər dəhr dana.
Ze nadan daema dana bərəd cour,
Dəlil arəm ze əhde-adəm inca.
Bədəste-Qabele-naqabel oftad,
Bezəxme tire-Qabel Habel əz pa.
Ço Nəmrud atəşe-xodra bərəfruxt
Xəlilira dər u ufkənd dər va.
Be pakiyo [be] hosn ol-xolq Yusef,
Çe tohmətha bedidəş əz Zoleyxa.
Bedəste-kaferan şod sər boride
Əgər tarix xani bini Yəhya.
Yəhudan coure-bipayan nəmudənd,
Bedan paki ke mibudi Məsiha.
Təvanəm dər qozəşt əz coure-əğyar,
Ze şagerdane-u bude Yəhuda[333].
Rəva başəd ke, İsara bedan qədr,
Minase-u bovəd derye-Səkuba.
Nədidi ke, be Mesr əz dəste-Feron
Təzəllom kərd sobho şam Musa.
Besəd noe-məsiyyət axəroləmr
Qozər benmud ba qouməş ze dərya.

Həkimi bud Qeys əndər qəbile,
Şode Məcnun nam əz eşqe-Leyla.
Əgər Vameq nəbudi naderol-əsr
Nəbudi ğərqe-ab əz dərde-Əzra.
Həmi Soqratra zəhre-həlahil
Benuşanid qouməş bi məhaba[333a].

Burada şair keçir öz büti-bimehrinin cövrü və ondan şikayət edib deyir:

Əgər çe həst sədre-u bolurin,
Deləş səxt əst çon əz səngxara.
Dela, xune-dərunət çənd puşi,
Ze əşke-mən şode sərrət hoveyda.
Ço əncom məhv migəştənd xuban,
Roxe-deldare-mən çon gəşt peyda[334].

Şair öz məhbubeyi-dilfəribəsini tə'rifü tövsif edib, yenə əvvəlki mətləbə keçib, gərdişi-zəmanədən şikvəvü nalə edir:

Əgər Tusi bovəd əndər zəbanəm,
Konəd təhsin in əbyate-ğərra.
Səfihanra fələk dadəst ezzət,
Həkimanra nəkərde hiç pərva.
Qoyuran daema ba bəxt dər cəng,
Həme əsbabe-dəyyusan mohəyya.
Fələk hər dəm berizəd xune-pakan,
Begərdan, saqiya, an came'-mina.
Hər an kəs dəm zəd əz mərdi zəbun şod,
Nəşod agəh kəsi əz in moəmma.
Besenne-dəh gerefti kelke-delha,
Besenne-to şode lolovo lala.
Ço çel* şod sale-mən, ey del, coz əz mərg
Nemidarəm ze dəhre-dun təmənna.
Bedəhr əndər bəsi gəştənd aşeq,
Nəgəştəndi ço Naser leyk rosva[335].

Atidə məstur olan qəzəli namə'lum bir şairin mədhində deyibdir. Çox ola bilər ki, bu şair mərhum İskəndər ağa "Şair" təxəllüs və ya Abbas ağa Qaibov "Nazir" təxəllüs olmuş ola. Çünki hər iki şairin təb'i-mövzunu Nasirin artıq xoşuna gəlirmiş, amma Abbas ağa Qaibov Mustafa ağanın vaxtında hənuz cavan sinndəymiş və asari-qələmiyyə[si] artıq bir elə məta'i-fəsahət və bəlağət meydanına vəz' etməmişdi və ehtimal var ki, Nasirin bu mədhi Şeyx Nizami haqqında olmuş ola. Çünki mərhumun ən

* Ç e h e l – *red.*



sevdiyi kitab mumaileyhin asari-cəliləsi – "Xəmseyi Nizami" idi ki, həmə vəqt onu mütaliə edərdi:

Zəhi təb'i ke, həmçon bəhre-kane-dorre-qəltanəst,
Zəhi nəzmi ke, bəhre-u beh əz lolovo mərcanəst.
Soxən quyivo dor sənci təaləllah bedin payə,
Dele-qouhərfeşane-u məgər dəryaye-ommanəst?
Sezəd kər əqde-nəzməşra mələk dər gərdən avizəd,
Xəridare-nokate-u fələk bin kəz delo canəst.
Sər ayəd şe're-u əknun beçərx əndər həmi Zohre,
Əcəb nabvəd əgər Bəhrame-Çin dəstar əfşanəst.
Otaredra sezəd gəştən dəbire-nəzme vey hər dəm,
Təaləllah çe nəzməst in to qui couhəre-canəst.
Əgər təşbihi-mən noun beşəre-kofr mibaşəd,
Çe qəm gərdəd əgər quyəd hər an ke, namosəlmanəst:
Kəlaməş vəhye-monzəl gər bexanəm hiç nəbvəd eyb,
Xodaya, əfv kon corməm ke, dər həqqe soxəndanəst.
To dadi in çenni təb'i ke, xəlqəş bəhr ənqarəd,
Benəzde-xas yarai əgər çe bərtər əz anəst.
Əgər çe hasele-giti bəhaye-nəzme-u girənd,
Bepişe-aref in qeymət bəsi ərzane-ərzanəst.
Mesale-mo'ceze-İsa konəd əmvatra ehya,
Qolube-xəsteqanra in çenin əş'ar dərmanəst.
Nədide dideəm şe'ri beomr xubtər in san,
Səzəd gər noqteəş beeynih eyne-ensanəst[336].

Şair bu kəlamın axırında yenə dənitəb' bicövhər və bikamal adamların dünyada xoşbəxt, kamran olmaqların, hükəma və üqəlanın zillət və üsrətdə zindəganlıq etmələri zəbani-təərrüzlə zikrü bəyan eləyib deyir:

Xəran dər touqe-zərrin ərseye-giti həmi girənd,
Dela, bin əsbe-tazira ke, zire-bare-palanəst.
Konəd əhle-honərra çərx mohtəc əbləhanra,
Sərasər gərdeşe-gərdun bekame-kəcco nadanəst.
Bekame-del resəd mərdom əgər homqe-səfahanəst,
Nəsibe-aqelan daem bezire-çərxe-hermanəst.
Gereftare-bəla gərdəd kera bəhre ze daneş həst.
Qolame-cahel gərdəd behekmet hər ke, Loğmanəst[337].

Qəzəli-türki:

Nigara, şəm'i-ruyinlə yenə bəzmim münəvvərdir,
Bihəmdillah, nişatım cami-vəslindən müyəssərdir.

Müsəlsəl zülflərin tarına peyvənd etmişəm canım,
Dolanmaq başına daim mənə indi müqərrərdir.

Gəhi türrən alır huşum, üzarın cah canımı,
Gecə-gündüz bu vəch ilə mənə, ey məh, bərabərdir.

Nə hacət məscidə girmək, dəxi mehrabə baş əymək,
Səri-kuyindürür qibləm, qaşın mehrabü mənbərdir.

Dəmadəm yadi-lə'l ilə olur dil məstü layə'qəl,
Sanırlar bixəbərlər kim, dəmağım badədən tərdir.

Kimin kim eşq odu olsa, o yanmaz qeyri odlarə,
Qiyas eylə ol oddan kim, Xəlilə dəf'i-azərdir.

Tutub ruzi-əzəldə ateşi-eşqinlə xuy[338] könlüm,
Yox əsla baki yanmaqdan, sanasan kim, səməndərdir.

Qəmin çün kuhi-Qaf olsa, götürrəm başıma yeksər,
Təni-fərsudəmə baxma mənim kim, munca lağərdir.

Görəndə mö'cüzi-lə'lin ki, əmvatı edər əhya,
Ona iman gətirməz, zahidi gör kim, nə kafərdir

Meyi-gülguni nuş eylə, keçib bu zöhdü təqvadən,
Könül, əyyami-gül gəldi, zəmani-dövri-sağərdir.

Dili-üşşaqı hər ləhzə edərsən tarümar, ey şux,
Bəli, fəxri-şahənşah hər zaman bir fəthi-kişvərdir.

Deyil xali xəyalımdan bir an ol ləblərin zikri,
Sifatın ayəti daim dilü canımda əzbərdir.

Səba məhrum olalı zülfi-müşkinindən[339] ol mahın,
Sərasər guhü səhralər ol ətr ilə müəttərdir.

Hünərdən vurma dəm, Nasir, səni biqədr edər gərdun,
Bəli, məşhuri-aləmdir ki, dövran süfləpərvərdir.

Bu qəzəldən bir neçə fərdlər ki, mə'nən təkrari-kəlam qəbilindəndirlər, buraxılıbdır.

Əyzən kəlami-türki:

Könül, ordibehişt[340] oldu, zəmani-eyşü[341] işrətdir,
Bu dəhri-fanidə eyşü tərəb beş gün qənimətdir.



Qəmü ənduh ayağından tutub, et sərnigun, saqi,
Əyağın qoyma əldən cani-mən həngami-fürsətdir.

Bulunmazsa əgər həmdəm, behişt içrə olur duzəx,
Əgər duzəxdə həmdəm bulsa, əhli-halə cənnətdir.

Canımdan qeyri yanımda sənə bir türfə töhfəm yox,
Qəbul etsən bu mərcanı, nigara, cana minnətdir.

Səri-kuyin verib Adəm alıbmış cənnəti əvvəl,
İqamət eyləyib sonra bilib eyni-xəsarətdir.

Gədayi dərgəhin, cana, həvayi-səltənət tutmuş,
Məqam etmiş səri'-kuyin o kim, əhli-səadətdir.

Zəhi ol təb'i-mövzuna ki, misli bəhri-ümmandır,
Bəli, qəvvasi-bəhri-nəzm olana gövhərəfşandır.

Görəndə mərdümi-çeşmim sərasər nöqtəsin öpdü,
Nədir bus etdiyin – sordum, dedi: – Əfsanə, insandır.

Dedim: – Noldu günahı kim, kəm etməz dövr cövr ondan,
Dedi[342] dil kim, budur cürmi ki, xoştəb'ü süxəndandır.

Qalıbdır cümlə danalar, dəriğa, künci-möhnətdə,
Bulan kami-dilin dəhr içrə yeksər kicü nadandır.

Qalıbdır əsbi-tazilər yekayek ziri-palanda,
Sərasər tovqi-zərrin birlə xərlər əhli meydandır.

Sanasan qövli sadiqlər misali-lalü əbkəmdir,
Olardır əhli-divan kim, şüarı kizbü böhtandır.

Nəsib etmiş ona çərx licami-gövhərəndudi –
Ki, insaf ilə layiq hissəsi əfsərü palandır.

Sual huşdan qıldım: Bu xoş ləhcə nədir, şair?
Dedi kim, əndəlibasa bu bir mürği-xoşəlhandır.

Dedim: – Bu şe'ri-ərbərbu məgər Çin nafəsindəndir?
Dedi dil: – Zadeyi-təb' odur kim, qiyməti qandır.

Vəfa etdi, cəfa gördü bəsi yari-münafiqdən,
Dəlili-vazehim bunda mənim məhbusi-Şirvandır.

Təmənna etdi xaliqdən ki, qurtulsun münafiqdən,
Behişti-ədndə sakin rəfiqi indi rizvandır.

Gözümdən qaib oldu nami-əcdadi kimi ol yar*,
Məqami cənnətül-mə'va, ənisi hüru qılmandır.

Neçün bu qüssəvü qəmdən, könül, azad olmazsan,
Bilirsən kim, əbəs ənduh daim düşməni-candır?!

Onunçun bu cahana ariyət, cana, demişlər kim,
Gələn dünyaya növbətlə ki, beş gün onda mehmandır.

Nədir, Nasir, dilərsən cah, bilməz[sən] deyil baqi,
Köçüb şahü gəda ondan, cahan mülki-Süleymandır.

Mərhum Mustafa ağa dünyanın özündən və əhlindən o qədər cəfavü sitəmlər görübmüş, az şe'ri tapılar ki, onda hər ikisindən şikayət etməsin və eyni-rahatlığı, salamatlığı Mirzə Cəfər Qarabaği kimi ancaq guşeyi-vəhdətdə bul[ma]sın. Aşağıda yazılan qəzəl sözümüzü qət'i surətdə təsdiq edə bilər:

Könül, gəldi gül əyyami, güzər eylə gülüstanə –
Ki, onda bülbüli-təb'in gətirsin qönçə dəstanə.

Dila, bu az ömründə cahanı imtahan etdin,
Əcəb olmaz gər ah ilən görürsən cümlə məstanə.

Sərasər əhli-dünyanı, könül peymanşikən gördüm,
Kənar ol, əhli-aləmdən, əlindən qoyma peymanə.

Cahan əhlində iş ancaq fəribü məkrdir yeksər,
Gözümdə qaldı ki, bir kəs danışsın sözü mərdanə.

Vəfası əhli-dünyanın dəmadəm ğədrdir, təzvir,
Gözüm, sən e'tibar etmə bu aləmdə bir insanə.

Qarındaşın[343] isə, ey dil, sözünə etmə gəl bavər,
Qaçıb bu əhli-aləmdən, sığın bir şahi-mərdanə.

Könül, ənqa kimi eylə təriqi-üzləti pişə,
Fəribindən həzər eylə, qərin olma bir insanə.

Vidayi-dəhri-dun etsəm, olam[344] qəmnak mən haşa,
Çü əbnayi-zəman məkri yetirmiş Nasiri canə.

* "Gözümdən qaib oldu nami-əcdadi kimi ol yar" – bu yar isə Qaibovlardandır. Çox ola bilər ki, Qazi Mirzə Nəbi əfəndi Qaibovun qızı Bədirnisə xanıma işarə[dir] ki, həmidəxısal və nikucamal bir cavanə imiş.



Bu kəlamın məzmun və məalı nə dərəcədə nasirin batini aləmini və onun dünyaya nə göz ilə baxmasını bəyanü əyan edirsə də, ona bir sözümüzü yox və lakin qəzəlin zahirinə nəzəri-tənqid ilə baxılsa, bir para qüsurlar müayinə olunur. Məsələn, əvvəlinci beytin ikinci misraı – "Ki, onda bülbüli-təb'in gətirsin qönçə dəstanə" nə demək olduğu dürüst təfhim olunmur. "Gətirsin qönçə dəstanə", yə'ni şairin bülbüli-təb'i nə eləsin? Qönçənimi tə'rifü mədh qılsın? Hər nə isə, kəlam açıq deyil.

İkinci beytin yenə ikinci misraı mövhum və mücməl kəlamlar cümləsindəndir: "Əcəb olmaz gər ah ilən görürsən cümlə məstanə". Mə'nən vazeh tərzdə ifadə olunmayıbdır.

Dördüncü fərdin əvvəlinci misrasına itemal olunan "iş" kəlməsi mə'naya xələl yetirmirsə də, kəlamı mühəssənatdan salır. Onun əvəzinə "fikr" və ya özgə bir söz işlənsə, daha da münasibraqdır. Haman fərdin ikinci misraı vəzn cəhətincə dürüst gəlmir.

Beşinci fərdin əvvəlinci misraında "ğədr" əvəzinə "zülm" sözü iste'mal olunsaydı, daha da şe'r mövzun düşərdi.

Mərhum Mustafa ağanın xalqdan qət'i-əlaqə edib guşənişin olmasına ümdə səbəblərdən biri də onun istəkli zövceyi-möhtərəməsi Xeyransa xanımın hənuz bir nazənin cavanə ikən vəfat etməsidir. Mustafa ağaya vəfalı və ismətli yoldaşının vaxtsız mərgi ziyadə tə'sir edib. Onun tarixi-vəfatını belə nəzmə çəkmişdir:

Bu mərqəd mərqədi-Xeyrənisadır,
Təvaf et, ey könül, əhli-vəfadır.
Behiştə gərçi ruhu etdi pərvaz,
Vəli hicri məni-zarə cəfadır.
Xudaya, lütfün et şamil o mahə –
Ki, əhli-iffətü kani-həyadır.
Şəfi' ol, ya rəsulüllah, ona kim,
Kənizi-Fatimə, ali-əbadır.
Nə bəklərsən, məgər bilməzmisən kim,
Həqiqətdə bu ev mehmansəradır?!
Yəqin bil, abi-kövsər eyləməz ağ
Əzəl gündən kimin bəxti qəradır.
Min ildən sonra gəlsən qəbrim üstə,
Görərsən kim, bitən mehr kiyadır[345]
Özüdür gərçi nəsli-zülqədrdən,
Vəli-zövcü Qəzaxi-Mustəfadır.
Fəxarət etmə, ey dil, mehri-çərxə –
Ki, süsti-əhdü eyni-bibinadır.
Vüsalı qədrini bilməzdin, ey dil,
Fərağın gör sənə eyni-cəfadır.
Nişimən rövzeyi-rizvanı eylər,
Kim əhli-həqqə dildən aşinadır.

Çü cananım vida etdi cahandan,
Qəmi-hicranə canım mübtəladır.
Vəfatı tarixin gər sorsa, Arif,
De: kafü ğeynü sinü ravü madır*
Verib can vasil olsan yarə, Nasir,
Deyər aləm sənə əhli-vəfadır.

Nasir fars dilində dəxi zövceyi-möhtərəmə və əzizəsinin maddeyi-tarixini suznak şe'rlər ilə inşad qılıbdır. Bu fərdlər mərhumeyi-məğfurənin şə'nü rütbəsini göstərir:

Ço morğan cane-pakəş kərde pərvaz,
Belotfe-həqq ferdousaşiyan şod.
Ço bud əz sakenane-aləmə-qods,
Soye-mə'vaye-xod şadikonan şod[346].

Mustafa ağanın asari-nəfisələrindən biri də Şeyx Nizami əleyhirrəhmənin "Xosrov və Şirin" hekayəsinin tərcüməsidir. Heyfa ki, şair əcəldən macal bulmayıb, başladığı işi əncama yetirməmiş axirət mənzilinə səfər qılmış. Bir neçə məclis ki, Nasir "Xosrov və Şirin"dən tərcümə edibdir, onun təb'inin rəvan və salim olmağına dəlalət edir. Qareini-girama nümunə üçün hekayənin ibtidasından bir neçə sətirlər burada təstir olundu:

Sipasü həmdi-bipayan xudayə –
Ki, oldur bibədayə, binəhayə.
Münəzzihdir bəsi vəhmü gümandan,
Bəridir hər cəhatü hər məkandan.
Nə dəm "kön" ləfzinə əmr etdi cabbar
İki hərf ilə qıldı aləmi var.
İradə oldu çün həyyü vədudə,
Gətirdi cümlə məxluqi vücudə.
Cəm'i əşyanı qıldıqda o peyda,
Ona yavər ola "haşa və kəlla!"

Məcliskərdəni-Xosrov və söxəngöftən ba arifani-ərbabi-şirinləban:

Gətir, saqi, şərabi-ərğəvani –
Ki, Xızr ondan bulubdur zindəgani.
Peyapey son məni-məstü xumarə,
İnayət etgilən ömri-dübarə.
Bu ömri-faniyə yox e'tibarım,
Bəqayi-ömr üçün qıl yadigarım –
Ki, şöhrət bula adım bu cahanda,
Fəramuş olmayım dövri-zamanda.

* Əbcəd hesabı ilə tarixini bulmaq olar[347]



Dedi bir arifi-şirinrəvayət
Edəndə bəzmi-Xosrovdan hekayət –
Ki, bir gün cəşn qıldı şah Xosrov,
Cəmalından salıb cam içrə pərtov.
Ayaq üzrə durub mətbui-saqi
Verirdi badə ilə ömri-baqi.
Bir əldə camü bir əldə sürahi
Oxurdu nəğmeyi-"haza mübahi"[348]
Hərifan düşmüş idi məstü məxmur,
Üzari-saqidən kim, çəşmi-bəd dur.
Təranəsaz idi hər bir tərانə,
Oxurlardı nəvayi-aşiqanə.
Cavan idi bəsi şahi-cavanbəxt,
Arardı bir ərusi-varisi-təxt.
Miyani-bəzmdə şahi-yeganə
Gətirdi cümlə əsrarin bəyanə.
Soruşdu hər bir ərbabi-hünərdən –
Ki, rəcət eyləmişdr bir səfərdən –
Ki, cümlə şərh qılsın ol nigari,
Gəzən dəmdə eylədi yəğmayi-Çindən,
Olarda gördüyü hər nazənindən.
Biri söz açdı Türkanü Xitadən,
Dilü imanı afatü bəladən.
Biri xubani-Turani qılıb yad,
Verirdi əqlü səbri cümlə bərbad.
Biri nəql eyləyirdi rumiyandan,
Nigari-sərvqəddi-mumiyandan.
Biri kəşmirü Hindi yad edirdi,
Şəhin könlün onunla şad edirdi.
Biri söylərdi xubani-Yəməndən,
Ruxi gülnarü sədri yasəməndən.
Gəlib göftarə ol fərzanə Şapur
Dedi: – Ey dövlətindən çəşmi-bəd dur,
Səfər etdikdə mən Ərmənzəminə,
Sataşdı gözlərim bir nazəninə.
Mələk zənn eylədim, lakin bəşərdir,
Cəmali şux-şəng, ali göhərdir*.
Ruxindən əks alır ol mehri-rəxşan
Fədayi-cəbhəsidir mahi-taban.
Saçından sünbülə min tab iribdir.
Gözündən nərgisə həm xab iribdir.
Xuramı sərvi pabəst eyləyibdir,
Həvası aləmi məst eyləyibdir.
Ona fəğfurü xaqan çakər olmuş,
Şəhi-rusi qulami-kəmtər olmuş.

* Cəmali şə'ng, özü ilə göhərdir

Təaləllah nəziri yox cahanda,
Bulunmaz böyləsi kövnü məkanda.
Görüb onu məlahət birlə rəngin,
Zəmanə onun adın qoydu Şirin.
Miyani-vəsfdə şahi-zəmanə,
Çəkib candan sədayi-aşiqanə.
Xəyali dilbərin olduqda mənzur,
Düşüb bixud səlahi-əqldən dur.

Burada Xosrov özündən gedir[349]. Şapur onun üzünə ətirlər səpib huşa gətirir və şah ayıldıqda ona xitabən əmr edir:

Dedi Şapura ki, ustadi-kamil,
Sənə lütfüm olur peyvəstə şamil,
Əgər peyğam o canandan gətirsən,
Məni ol hur vəslinə yetirsən.
Deyib ləbbeyk ayağə durdu Şapur –
Ki, etsin ol zaman əzmi-rəhi-dur.
Ona zadi-rəh üçün şahi-novrəs
Nisar etdi zərü dürrü göhər bəs...

Bu müxtəsər nümunədən möhtərəm oxucular görür ki, Nasir "Xosrov və Şirin" kimi belə zərif və nazik əsərin tərcüməsində şairin özünə bərabər məharət və bəlağət izhar edibdir. Və çox heyifdir ki Mustafa ağanın belə pürqiymət zəhməti yarımçıq qalıb, ədəbiyyat və lisanımız "Xosrov və Şirin" kimi lətif və gözəl əsərin tərcüməsindən məhrum qalsın.

Anladığımıza görə, bizim pali-həyatda olan şairlərimizin bir neçəsi, əzancümlə Mirzə Rəhim Fəna, Mirzə Ələkbər Sabir, Məşhədi Əyyub Baki, Mirzə Həsib Qüdsi, Mirzə İbrahim Tahir mərhum Mustafa ağanın natamam qalmış zəhmətini asanlıqla bacarıb itmama yetirə bilərlər.

Cənab Sabirin "Rəhbər"[350] jurnalında çap ol[un]an "Şahnamə"dən tərcüməsi, Tahirin və Qüdsinin ruznamə və jurnallarda dərc olunan əş'ari-abdarları və Fənanın və Bakinin gözəl və can riştəsi kimi nazik olan qəzəlləri bizim rə'yimizi təsdiqedici dəlillərdir. Bu şairlərdən hər birisi və ya özgə bir şair bizim təklifimizi qəbul etməli olsalar, həqirə bildirsinlər ki, mən də Mustafa ağanın tərcüməsini lazimeyi-dəstaviz ilə onlara təqdim edim.

Mustafa ağa Nasirin qeyri asari-mütənəvvеələri dəxi çox imiş və lakin mərhum bir gecə mütaliə etdiyi vaxtda yorulub yuxuya gedibdir və nə sayaq olubsa, yanında yanan şam yıxılıb, çevrəsində olan kitabların və təsnifatından bir çoxunu yandırıb tələf edibdir.



# HACI RƏHİM AĞA DİLBAZOV "VƏHİDİ"

Qazax şairlərinin mö'təbər və müqtədirlərindən biri də mərhum Hacı Rəhim ağa "Vəhidi" təxəllüsdür. Hacı Rəhim ağanın bəyani-halını və izhari-əhvali-səadətiştimalını yenə fazili-möhtərəm Hacı Sə'di əfəndi ibn əlqazi Sə'di əfəndi müxtəsərən yazıb, onun əş'arü asarından bir divan səbkində tərtib qılıbdır.

Hacı Sə'di əfəndinin yazmağından belə mə'lum olur ki, Hacı Rəhim ağa əmrən tərkidünya və üsrən eşqi-mövla və fizzahir məlali və filbatin bikin və laübali olan bir zati-vilayətsemat imiş. Özü də Qazax mahalında Xanlıqlar qəryəsində 1238-ci[351] səneyi-hicriyyədə təvəllüd edibdir. Tə'lim və tərbiyəsi öz valideyninin təhti-nəzarətində olubdur. Həddi-kamala yetincə oxumağa və yazmağa məşğul olubdur və ziyadə zehnü fərasət sahibi olduğuna görə, az vaxtda çox məlumat, xüsusən mə'rifəti-ilahiyə dair bilik, kamalat kəsb qılıbdır.

Hacı Rəhim ağanın abavü əcdadı nəcabətü fətanətdə məşhur, fəsahətü bəlağətdə və həmçinin şairiyyətdə mə'lum və püriştihar ümərayi-Dilbazdandır və şairin atası Allahyar ağa dəyanətkirdar və səxavətşüar bir bəy imiş.

Hacı Rəhim ağanın üləmavü füzəlavü şüara sinifləri ilə beyni xoş olmağa görə, onlar ilə söhbət edərmiş və onlara riayətü hörmət və bəzli-mərhəmət göstərirmiş və onların məclisində vaxtlarını inşayi-şe'r və imlayi-nəzmə sərfü bəzl qılarmış.

Hicrətin 1276-cı[352] ilində Hacı Rəhim ağa azimi-Həccişərif olub, İslambul şəhərində hala calisi-səriri-hidayət və rövnəqəfzayi-xanədani-təriqət, nəqşbəndiyeyi-səadətbünyad olan mövlana Hacı Mirhəmzə əfəndi "Nigari" təxəllüs ilə görüşübdür və mə'lum ola ki, sabiqdə Mirhəmzə əfəndi bir sənə miqdarı Xanlıqlarda məksü iqamət edibmiş, çünki ol şərifü müəzzəz zatın Xanlıqlar ağaları ilə və xüsusən Allahyar ağa ilə dostluğu varmış.

Mirhəmzə əfəndi Hacı Rəhim ağaya artıq hörmət, iltifat göstərib və şair öz mürşidinin füyuzati-mə'nəviyyəsindən feyzyab olub, ol pirdili-münirə rabiteyi-sidqü ixlas ilə inabətü intisab etmişdi.

Hacı ziyarət edib salamat geri qayıtdıqda şair yenə İslambulda mövlana Hacı Mirhəmzə əfəndi ilə görüşüb onun xidməti-zişərafətlərindən bəhrəmənd[353] oldular. Vətəni-mə'luflarına övdət etdikdən sonra şair həmişə Mirhəmzə əfəndinin fikrü xəyalı ilə olub, onun surətini və söhbətini xatirindən çıxarmazdı və dünya işlərinə məşğul olmazdı. Necə ki, bu babda Hacı Sə'di əfəndi zəbani fəsahətbəyanı ilə yazıbdır: "Bəd əzan,

yə'ni vətənə müraciət etdikdə lövhi-xatiri-feyzməzahirlərin səvadi-masəvadən" müsəffa və pürincila və səfheyi-sineyi-bikinələrin xəyali-surəti-pürsəfvəti-piri-binəzir ilə mənquş və müsəvvər və rabiteyi-fəna fişşeyx ilə dili-maarifmənzillərin münəvvər və pürziya etmişdilər. Bir gunə kim, zakiri-övliya və təkəllümi-övsaf və əxlaqi-piri-bihəmtadan bir ləhzə xali və əqvalü əf'ali-axirə hərgiz nəzərü iştiğalı olmazdı və hər-çənd belə zəvati-xacəsurət dərvişsirət tə'yin edər, amma bu zati-şərif dəryayi-qürbü hüzura öylə müstəqrəq və atəşi-şövqü iştiyaq ilə bir gunə mühərrəq olmuşdu ki, zahirü batində qeyr əz dərvişi bir hal mülahizə və müşahidə olunmazdı..."

Hacı Rəhim ağanın Mirhəmzə əfəndi ilə miyanələrində həmişə irsalü mürasələ və mükatəbə olurdu. Ol zati-müəzzəzin xidməti-zirif'ətinə tər-qim etdiyi namədir, o qəzəl ki, buyurubdur:

Yazıb bir şəqqə, ey şahim, bizi sən sərfəraz etsən,
Sənə müştaqü heyranəm, bizə sən nazi az etsən.

Mərizi-eşqdir könlüm, bu cism zağə nisbətdir,
Uçurub göylərə, şahim, bizi bir şahbaz etsən.

Dualər eylərəm daim, bulud qoymaz göyə çıxsın,
Gədayə bu tərəhhümdür, buludları ayaz etsən.

Əzizim, qədrin ə'ladır, necə ə'ladan ə'la mən,
Sən ol Mahmudi-Qəznəvi, bizi də sən Əyaz etsən.

Nə hasil zövqi-dünyadən, müridlər zövqü sizdəndir,
Duan dərgahdə məqbul, bizimçün bir niyaz etsən.

Həqiqi mürşidim sənsən, məcazidə mənəm bir xak,
Nəzərin kimyadır bəs bu torpağə bir az etsən.

Çevirdin eşq camından, məni dəryayə qərq etdin.
Dərindir eşq dəryası, mənimçün bir dayaz et sən.

Yəqindir bizdə lütfün var ki, feyzindən dilər könlüm,
Kərəm qıl sən, kərəm kanı, kərəm dəstini baz et sən.

Gözüm yaşilə yazdım kuyinə bu, nameyi-qəmdir,
Tökər qan həşrə dək çeşmim, bizi əhli-məcaz et sən!

Kəlami-pakın ilə min Vəhidi pak olur hər dəm,
Aman, Ey Şahnigarım, bizə bir kar saz et sən!



Yenə öz mürşidi Hacı Mirhəmzə əfəndinin həsrət və arzusunda deyibdir:

Bir məlahət gülşənində yarı[354] gözlər gözlərim,
Bəhri-dür qəvvasiyəm, mirvarı gözlər gözlərim.

Feyzinin[355] müştağı çeşmim müttəsil bidardır,
Ol təriqət mürşidi Nigarı gözlər gözlərim.

Saqiya, ver bir qədəh, artır gözüm fəvvarəsin,
Çün sənin sərməstinəm, xummarı gözlər gözlərim.

Qılma inkarın həsuda, aşiqin məhbubu var,
Var olalı yox demə, bir varı gözlər gözlərim.

Eşq sərfindən, həbiba, bir məta'im var mənim,
Bu məta'i satmağa bazarı gözlər gözlərim.

Şükrülillah çün Vəhidi saqidən sərməstdir,
Məsti-lütfi-vəhdətəm, didarı gözlər gözlərim.

Şair dərgahi-həqqə münacat edib, bu dil ilə öz günahü mə'siyətlərin-dən əfv istəyir:

Necə illər keçdi ömrüm fisq ilə, üsyan ilə,
Çün peşimanəm, ilahi, ağlaram iman[356] ilə.

Mən peşimanın, xudaya, əfv qıl üsyanını,
Vardı xövfüm cümləsindən sən keçir asan ilə.

Bigünəh çün ömri-fani keçməyir bir an də,
Qafil olduq, heyf keçdi ömrümüz nadan ilə.

Bəhri-əltafın ki, bihəd, mərhəmət qıl qətrəsin,
Rəhmətindən naümid şeytan olur şeytan ilə.

Ol həbibin hörmətinə qılıram min salavat,
Min sərlamə bir şəfaət lütf edə ehsan ilə.

Şəfqətindən məğfirətdir çün, xudaya, qıl ə'ta
Bu Vəhidi xəstəni əhli-təriq ixvan ilə.

Zəmanədən və əhli-dünyadan şikayət:

İmtahan etdim, fənadə qövli sadiq yari yox,
Cövrünü çəkdim cahanın, qəmi var, qəmxari yox.

Neçə kəslər bəslədimsə, görmədim nəfin anın,
Bəslədim bir nəxl kim, yaprağı vardır, barı yox.

Şahı olsa bu cahanın sən qəmsiz keçər,[357]
Kimi gördün bu fənadə kimdi ki, azarı yox.

Hansı xubun, hansı ziştin mədhü zəmmin söyləyim,
Çün pərişanəm, Vəhidi, söyləmək izharı yox.

Şair yenə əhli-zəmanədən xüsusən divan əmələlərindən və bəniəsfər zülmündən bir müxəmməsində naləvü fəryad edib, qadirü qəhhar olan xudavəndi-aləmə hali-dilini ərz eləyir. Şairə artıq tə'sir edən bu hal olur ki, xaricdə hər dənitəb', səfil adamlar varsa bizim vilayətimizdə ağalıq edib və rüşvət almaq ilə özünə malü dövlət qazanıb, böyük iddialara düşür və heç kəsi tanımır; fəqir-füqəraya və əlsiz-ayaqsızlara həddən ziyadə zülmü sitəmi rəva görüb, mö'min və mütəqqi kəslərin üstünə də min cür'ə şərrü böhtan atır.

Bu müxəmməs bə'zi səbəblərə görə buraya daxil olmadı.

Mustafa ağa Nasir ilə Vəhidi mabeynində ülfətü məvəddət varmış və yek-digərlərinə şe'rü qəzəllər yazıb göndərərlərmiş. Bir qəzəlində Vəhidi Nasiri öz evinə qonaq də'vət edib özünün ona olan ixlasü sədaqətini bəyan qılır və onun guşənişin olmasını təsdiq edib deyir ki, yaxşı kəslərin adətidir ki, pislərdən kənar gəzər, amma mən sənin xeyirxahınam, gərəkdir ki, məni pislərdən ayırıb onlara bərabər etməyəsən:

Mən sənin ixlasınam, yanında gər mə'zur isəm,
Fəhm qıl, yaxşı tanı bir dost ilə düşmanı sən!

Gah lütf et, gah da ol guşədə xəlvətnişin,
Oxu şe'ri-Sə'dini, Firdovs ilə Xaqanı sən!

Çün Vəhidi, şaira, çox müntəzirdir vəslinə,
Tövbə qıl, bir də demə hər dəm ona böhtani sən!

Vəhidi haqqında Nasir dediyi böhtan sözlər nə imişsə, ona çox əsər edibdir və Vəhidi bu barədə ona bu cavabı yazıbdır:

Şair, ol güşənişin, söz demə agahlərə,
Dilini zəbt elə bir düşməyəsən çahlərə.

Bir ocağız ki, biz, çaçiləyən tə'liqədir,
Bu səfahət nə sən kimi bədxahlərə.



Bu ocaq öylə ocaqdır işığı hər yanə
Gah-gah şö'lə salır sən kimi gümrahlərə.

Vəkil olmaqda məramın bu imiş ev yıxasan,
Neçə sən kimiləri dur gərək cahlərə.

Bu qəzəldir ki, Füzuli dedi xoş saətdə:
Bəxt şayəstə deyil himməti kutahlərə.

Ey Vəhidi, sığınıb sidq ilə sən eylə dua,
Aləmin xaliqinə, rütbə verən şahlərə.

Təb'i ə'la olanı bəxt özü meydanə çəkər,
Belə ədna təb' ilə uyma o həmrahlərə.

Ya rəb, oldur duamız özünə möhtac eylə,
Bizi möhtac eləmə hər üzü siyahlərə.

Bu şe'r Nasirin haqqında deyilməyi ondan mə'lum olur ki, Vəhidi öz kəlamını bu sözlər ilə başlayır:

Şair, ol guşənişin, söz demə agahlərə...

Nasirdən başqa Qazax mahalında guşənişin qeyri bir şair olmayıbdır. Amma Vəhidinin qeyri sözləri mərhum Mustafa ağanın halına və xasiyyətinə uyan sifətlər deyil. Məsələn:

Vəkil olmaqda məramın bu imiş ev yıxasan.

– və qeyri hübbi-cahü şövkət kimi. Mə'lumdur ki, Mustafa ağa Nasir cahü cəlalı axtaran və vəkillik iddiasına düşən adam deyilmiş. Xilafü-şər'ü nainsaf işlər də onun təbiətinə ziddü bər'əks olduğu halda "ev yıxmaqlıq" və "şərarət" sözü dəxi onun şə'nü halına münasib deyil. Və digər, Mustafa ağanın əş'arü kəlamı içində Vəhidiyə toxunan bir əsər görmədik ki, Vəhidi məcburən ona belə sərt və acı məzmunlu cavab yazsın. Hər surətdə həqiqəti-hal gərək özgə tərzdə olsun və onu dəxi kəşf etmək bizə müyəssər olmadı. Amma bunu dürüst deyə bilərik ki, Vəhidi mərhum Mustafa ağanın şə'nü rütbəsini bilib, xatirini əziz tutarmış və Mustafa ağanın ölməyi ona ziyadə tə'sir eləyibdir və bu babda yazıbdır:

Ah kim, yıxdı fələk mehrab ilə bir minbəri,
Biri şair, şe'rgu Nasirdir, aləm sərvəri.

Qəbr içində şe'rlər tənzim edər, bil, ey fələk,
Durmağa sənlə hesabə gözləyir ol, məhşəri.

Qoymadın ki, eyləyib şe'rin tamam dastan edə,
Gözünə soxsa, yeridir, ruzi-məhşər dəftəri.

Nasirin ahı səni bil yandırır çırpı kimi,
Xarü xəs üzrə qoyasan bir qızarmış əxgəri.

Eşqdən bil yandı Nasir, xövfü yoxdur nardən,
Necə kim, yanmaz oda gər atasan səməndəri.

Ey Vəhidi, qafil olma, kəndini gözlə müdam,
Sübhü şam təkrar qıl ahini dildə əzbəri.

Hacı Rəhim ağa Vəhidinin elmü kamalı artıqmışsa da, təb'i çəndan rəvan və mövzun deyilmiş və kəlamının əksəri mə'nən indəl-ürəfavü şüəra məqbul isə də, zahirən qüsurü rəkakətdən ari və bəri deyil.

Şeyx Sə'di əleyhirrəhmənin

Bərge-derəxtane-səbz dər nəzəre-huşyar,
Hər vərəqəş dəftərist mərefəte-kerdeqar[358].

– şe'rinə yazdığı nəzirə şayani-diqqət olduğundan burada təstir olundu.

Kəlami-Vəhidi:

Qətreye-nisane-ab dər sədəfe-bəxtiyar,
Xase-cəvaher şəvəd mərefəte-kerdeqar.
Kerme-zəif mixorəd bərge-derəxti əz an,
Ətləse-diba şəvəd mərefəte-kerdeqar.
Saqi dəhəd badevo məst şəvəd hər morid,
Zekr konəd hər yeki, mərefəte-kerdeqar[359].

Mədhi-dilbər babında deyibdir:

Üzün gülbərg tək nazik, qədin minadən ə'ladır,
Yanağın lalədən göyçək, güli-rən'adən ə'ladır.

Sənin tək bir Züleyxanın ucundan bəndi-zindanəm,
Mənəm sövdadə Yusif tək, necə sövdadən ə'ladır.

Züleyxadən sən ə'lasən ki, təb'ində fəsad olmaz,
Ol etdi Yusifi rüsva ki, çox rüsvadən ə'ladır.

Qaşın nuri-hilal, ey gül, gözün məxmurü məstanə,
Cəmalın öylə zibadır, tamam zibadan ə'ladır.

Cəb'inin bədri-ənvərdir, ləbin mö'cüzi-İsadır,[360]
Əlin üşşaqə can verir, yədi-beyzadən ə'ladır.



Yəqin, ey qönçeyi-xəndan, sinən sirri-ilahidir,
Sənin ayineyi-könlün cahannümadən ə'ladır.

Dürü mirvari bəzmində düri-nasüftəsən derlər,
Düri-nasüftə hər yerdə düri-əladən ə'ladır.

Açıb hüsnün kitabın, bağladın dibaçeyi-Şirin,
Sənin dibaçeyi-hüsnün Şirinü Leyladən ə'ladır –

Ki, bir Leylanın eşqində necə Məcnuni-şeyda var,
Vəhidi öylə şeydadır ki, hər şeydadən ə'ladır.

Hacı Rəhim ağa özü tə'mir etdirdiyi məscidin tarixini və basəfa yerdə bina olmağını tə'rif edir:

Nə cayi-dilgüşadır kim, bu məscid bunda var olmuş,
Baxan göz açılır, könül, çay üstü laləzar olmuş.

Xətibi xütbə oxuyur, imami mədhi-mövlayi,
Yanar qəndil ilə şəm'i cəmaət feyzbar olmuş.

Səhər bülbül sədasindən müəzzin xabdən bidar,
Müəzzin naləsindən gör balıqlar guşdar olmuş,

İbadət eyləyir onda, xuda indində məqbuldur
O kim, ondan qaçar, bil, xarü zarü şərmsar olmuş.

Müvərrix tarixin, bil, "xaneyi pərvərdigar"[361] etmiş,
Vəhidi, ali-Dilbazə bu məscid yadigar olmuş.

Vəhidinin atidə zikr olunan kəlamından belə mə'lum olur ki, onun əqrəba və yaxud əhibbalarından birisi Qazax mahalından dilgirü rəncidə olub, köçüb Qarabağa Tərtərbasana, yə'ni Cavanşir mahalına gedibdir. Şair indi ondan əhvalpürsan o yerin övza'vü əhvalından xəbər istəyir:

Ə'la ey tutiyi-əsrar, xoşam nalən vüsalından,
Fəraqın çəkmə övtanın fərar etdin xisalından.

Qazaxı incinib ənqa kimi çün tərk qıldın sən,
Danış, lal olma, tutiyi-Qarabağın kamalından.

Duası müstəcab olur, qərib qürbətdə səbr etsə,
Qarabağ içrə seyr eylə, xəbər ver yaxşı halından,

Qazax əhvalının bil, sən görəndən indi bədtərdir,
Çıxıb Yə'cuc ilə Dəccal,[362] yağər qan məkrü alından,

Sonası Kür qırağının sizə mə'lum, müşəxxəsdir,
De, Tərtər üstünün varmı gözəli gül cəmalından?

Sərində eşq sövdası, Vəhidi məstdir hala,
Olaydı bir nigar, ey dil, yazaydım xəttü xalından.

Hacı Rəhim ağa vəfat edibdir məhərrəmül-həram ayında 1291-ci[363] sənədə. Vəfatının təfsilini Hacı Sə'di əfəndi bu sayaq yazır: "1291-ci sənənin məhərrəmül-həram ayının 9-cusu çərşənbə günü bə'zi həvayici-məaş üçün Xanlıqlar ilə həmməhəlli çarsu bazar və cayi-iqaməti-hökumətü girdar olan Dağkəsəmən qəryəsinə bir qədər nasaz ola-ola azim olub, şəbangah özünün müxlisi-qədimi və məhəbbəti-səmimi[364] zaiqi-cür'eyi-bəzmi-səfa və şaiqi-müridani-dərgah müəllimi olan Molla Vəli Kirəvəli oğlunun otağına adəti-mə'lufəsi üzrə nüzul və ol gecə orada istirahət ediblər. Bə'd əz namazi-sübh çay içib oturub kamali-zövqü şövq ilə İbrahim Həqqi qəddəsə sirrənin bu qəzəlini oxuduğu vaxt əsnayi-münəşidədə təslimi-ruh və canibi-illiyyinə rehlətipürfütuh ediblər".

İbrahim Həqqinin qəzəli budur:

Vəfa istərsən Allahdan bu gün cövrü cəfadən keç!
Səfa ümmid edərsən işrətü zövqü səfadən keç!

Dila, biganələrlə aşina olmaq sana düşməz,
Kəsil biganədən, mövladən özgə aşinadən keç!

Sənin kibi hezarın bağrına xar oldu bu gülşən,
Təəllüq eyləmə hərgiz bu dəhri bivəfadan keç!

Müridi-eşq isən trəki-iradət eylə, ey sufi,
Vücudi-məhvi-küll qıl, [həm] fənadan keç, bəqadən keç!

Əlin ərşi-bərinə irsə, Həqqi, olmağil məğrur,
"Ov ədna"* mərkəzin gözlə, məqami-müntəhadən keç!

* "Ov ədna" sözü sufilərdə bir istilahdır



# ŞAHNİGAR XANIM "RƏNCUR"

Şahnigar xanım binti-Kazım ağa Qiyasbəyov Qazax şüərasının naziktəb'lərindən biri hesab olunur. Şahnigar xanım təvəllüd edibdir öz qəryələrində ki, Ağköynək adı ilə məşhurdur.[365] İndiki Qazax şəhərinin yavuqluğunda xırdaca bir kənddir. Şairənin təxəllüsü "Rəncur" isə də, tamami Qazaxda "Mollaxanım" ləqəbi ilə iştihar bulmuşdur.

Şahnigar xanımın tə'lim və tərbiyəsi öz qardaşının – Hacı Məhəmməd ağanın təhti-nəzarətində olubdur. Şairə üç-dörd sənə bundan müqəddəm qırx beş və ya artıq, yaşı əlli sinnində vəfat edibdir.

Mollaxanım ziyadə mö'minə və abidə, ismətli və həyalı bir övrət idi ki, vaxtının çoxunu ibadət və riyazətdə keçirərdi. Ol səbəbdən ona "Mollaxanım" ləqəbi verilmişdir. Şahnigar xanımın artıq elmi yoxmuşsa da, təb'i rəvan imiş. Rəncurun yazdıqlarının əksrəi münacat, mərsiyə, maddeyi-tarix və sair dost və əhibbaları arasında vüqua gələn nəviştəcat qismindən olub, qəzəliyyatı-vəsfi-dilbər kimi əsərləri azdır.

Hacı Mirhəmzə əfəndinin müridlərindən olduğu üçün əş'arü kəlamının çoxunda ol cənab tutduğu məsləkdə olduğunu bildirib, üluhiyyət və mə'nəviyyət aləmindən bəhs edir.

Yari-mürşiddən kağız gəlmək babında yazıbdır:

Həmd kim, dəstindən, ey şəh, gəldi bir feyzanə xət,
Gün kim aləmdə sərdən tab edər hər yanə xət.

Şükrülilləh kim, Nigara, öylə zənn eylər könül,
Nisbət ol gündən münəvvər ayeyi-Qur'anə xət.

İylərəm, hər dəm verir ol həşt cənnət buyini,
Hövzi-kövsərdən saçar su atəşi-hicranə xət.

Hər zaman kim, xəttini tövf eyləyib məzmununu
Oxuram, bağrım çəkər hər ləhzə min bir yanə xət.

## MÜNACAT

Könül çün qəsri-şövqündür, ilahi, beyti-qəm qılma,
Dəxi ol iştiyaqından cüda bir ləhzə dəm qılma!

Xəyali-şur ilə, şahim, pərişan etmə dil şəhrin,
Qədim dəhr içrə ol dərdü qəmin dəstində xəm qılma!

Üzü qara qulam bir bu fənayi-bibəqa içrə,
Rəhima, rəhmini məndən inayət birlə kəm qılma!

Məhəbbət dürcünü hifz et dəmadəm mehri-kəndində,
Rəqibin vermə məqsudin, əlim bicami-Cəm' qılma!

Cahanda dur qıl bizövq olan qəmlərdən əmma ol
Qəmi-eşqinlə Rəncurun üzün bieşkü nəm qılma!

Yenə Hacı Mirhəmzə əfəndi göndərdiyi namənin cavabında yazmış:

Yazıb bir şəqqəni şahim, sərimə sayə göndərmiş,
Ona nəqş eyləmiş mehrin, dili-şeydayə göndərmiş.

Nigaridir kərəm kani kərəm dəstini baz etmiş,[366]
Nübüvvət gülşənindən bir güli-həmrayə göndərmiş

Mənim cürmi-kəbir içrə pərişan olduğum bilmiş,
Duayi-iltifatını mənə pirayə göndərmiş.

Kərəm dəryasıdır, bir dövləti-biqayə malikdir,
Sərapa lütfdür kim, töhfeyi-biqayə göndərmiş.

Gözüm pürnur olur, baxdıqca könlüm açılır guya,
Hərayə pərtövi-şəmsi-ruxindən ayə göndərmiş.

Əcəb xoşnud olurmu iltifatımdan deyə sövqat,
Kərəm qılmış nigaranə, dili-rüsvayə göndərmiş.

Yenə sövdayə düşmüş, aşiqanə bir qəzəl yazmış,
Nigari bir qəzəlnamə büti-zibayə göndərmiş.

Şairə bir qəzəlində artıq təəssüf edir ki, öz mürşidi-kamili olan Nigarinin məh camalını görüb, dərgahi-pakına üz sürtmək, əlin-ayağını öpmək, bülbül kimi gecələr sübhədək kuyində nalə etmək və müridləri dairəsində "hu-hu" deyib, məstü laübali olmaq ona müyəssər olmadı:

Ey dəriğa kim, o şahın məh camalın görmədim,
Üz sürüb dərgahına, ruxsari-alın görmədim.

Ötmədim kuyində hər şəb ta səhər bülbül kimi,
Yetmədim məqsudə bir dəm gül vüsalın görmədim.

Dəsti-pakın bus edib, həm hər tərəf "hu-hu" deyə,
Seyr edən sərməsti-rindi-laübalın görmədim.



Ey dəriğa kim, o mahın həlqeyi-üşşaqdə
Seyri-çalakın, vücudi-bimisalın görmədim.

Ey dəriğa, dərgəhində aşiqi-şeydasının
Xub avazın, dəxi şirin məqalın görmədim.

Əfv qıl, ya rəbbəna, hər dəm dili-divanəmi
Cürmü üsyan ilə gördüm, yaxşı halın görmədim.

Dər cahan, əlhəmdülilləh, xəsteyi Rəncurənin
Mədhi-şahından səvayi bir kəmalın görmədim.

Mirhəmzə əfəndi Şahnigar xanıma cavabında yazmış:

Nigari-nazəninim fərşi-bəzmarayə göndərmiş,
Nigariş eyləmiş rəngi-tərin şeydayə göndərmiş.

Rəvac olsun deyərdim hüsni bazari-məlahətdə –
Ki, rəngin aşiqi-şeydasinə sərmayə göndərmiş.

Gözəl nəqşü nigariş eyləmiş, zibatərin yazmış,
Müzəyyən müshəfi-ruxsardən bir ayə göndərmiş.

Məgər şuridəsin yad eyləmiş kim, Şahnigarım tək,
Fərəhəfza, dilara töhfeyi-rən'ayə göndərmiş.

Deyil bimənі bu ikrami-ziba ol sənəmsima,
Əmiri-həmzəyə, əlbəttə, bir mə'nayə göndərmiş.

Gözüm pürnur olur baxdıqca, könlüm açılır guya,
Hədiyyə pərtövi-şəmsi-ruxindən ayə göndərmiş.

Ziyad olsun dəmadəm iltifatı ol gözəl namın,
Nigarım tək kərəm dəryasını biqayə göndərmiş.

Kərəm dəryasıdır, bir dövləti-bipayə malikdir,
Sərapa lütfdür kim, töfheyi-bipayə göndərmiş.

Yenə sövdayə düşmüş, aşiqanə bir qəzəl yazmış,
Nigari bir qəzəlnamə büti-zibayə göndərmiş.

Şahnigar xanımın müxtəlif əş'arü qəzəliyyatı iki yüzə kimi olar. Divanı varsa da, övraqü pərişandır. Bizim əlimizdə olan dəftərdə şairənin münacat və qəzəliyyatından maə'da bir neçə rübailəri, müxəmməs və müsəddəsləri və saqinamələri də vardır ki, tamamisi aydın və rəvan

yazılmış şe'rlərdən ibarətdir və lakin cümləsi məzmun cəhətincə bir-birinə oxşadığına görə burada zikr olunmadı.

Atidə dərc olunan qəzəl dəxi Rəncurun təzə səbkdə inşa etdiyi kəlamların bir növüdür:

Aludeyi-sərməstəm, bu kar nədir bilməm,
Saqi ilə həmdəstəm, sərşar nədir bilməm.

Aludeyi-bir yarəm, eşqində bu gün zarəm,
Dəymə ki, sızıllarəm, azar nədir bilməm.

Aludeyi-gülzarəm, dillərdəki göftarəm,
Sanmaz məni kim, xarəm, gülzar nədir bilməm.

Aludeyi-həmsayəm, düşməz dərinə sayəm,
Çün şe'rdürür mayəm, göftar nədir bilməm.

Aludeyi-dildarəm, hər şamü səhər zarəm,
Bir çeşmə giriftarəm, xummar nədir bilməm.

Aludeyi şahmarəm, yalvarmada bir marəm,
Zülfilə günüqarəm, tərrar nədir bilməm.

Aludeyi-in karəm, aşüfteyi-bir yarəm,
Mən talibi-dildarəm, əğyar nədir bilməm.

Bu qəzəldə "aludeyi-həmsayəm" və "zülfilə günüqarəm" sözləri şe'rin vəzni düz gəlmək üçün "həmsayəyəm" əvəzinə "həmsayəm" "qarəyəm" əvəzinə "qarəm" yazılıbdır.

Rəncur aşağıda yazılan kəlamı Mövlana Təbriziyə və Mirəbülqasım Nəbatiyə nəzirə səbkində inşad qılıbdır və bir para fərdlərə öz təbinin xüsusiyyət və mahiyyətini bəyan edibdir:

Nə küfrüm var, nə imanım,
Nə dinim var, nə ədyanım,
Fəəmma şahi-qüfranə
Ümidim, biimanəm mən.

Nə dindarəm, nə islaməm,
Nə meynuşəm, nə pürcaməm,
Nə Bəsrə əhli, nə Şaməm,
Nə əz Hindü İranəm mən.



Nə şiə, sünniyəm pürlaf,
Çahar yarə könlüm saf,
Nə əhli-zülmi-biinsaf,
Nə mərziyə inanəm mən.

Müavi həqqinə* lə'ni
Edərəm müttəsil, yə'ni
Bulardır küfri-biməni,
Bu əhl ilə yamanəm mən.

Nə hüsn əhli kəmalım var,
Nə bir sahibcəmalım var,
Nə mülküm var, nə malım var,
Deyirlər bir şəbanəm mən.

Nə göftarım həqiqətdir,
Nə rahım bir təriqətdir,
Danışsam, nə bəliğətdir,
Nə bir əhli-iqanəm mən.

Nə dünya, əhli-üqbayəm,
Nə sövda, əhli-rüsvayəm,
Nə rahətdə fərəhzayəm,
Nə həqdən bigümanəm mən.

Nə bəxtim var, nə də biqəm,
Nə ə'ladır, nə bəxtim kəm,
Nə şad oldum, nə çeşmim nəm,
Nə rüsvayi-cahanəm mən.

Nədir talib, nədir mətlub,
Nədir rağib, nədir mərğub,
Nədir cazib, nədir məczub,
Nə zənn olsa, cinanəm mən.

Əyyub ağa Muradov bina etdiyi məscidin tarixi babında yazıbdır:

Zəhi Əyyub ağanın yadigari,
Cahan içrə olub bu beyt bari.
Günahın əfv qıl, ya rəb, o şəxsin,
Rəva qılma ona minbə'd nari.
Məqamın cənnət et, huri ənisin,
Müşəxxəs qıl ona tacül-vüqari.

* "Həqq" əvəzinə "nəsli" olsa, daha da mə'na düz və doğru olar.

Nüsuhasa qəbul et tövbəsini,
Bina etdi çü beytül-iştihari.
Yazıb Rəncur mübarək tarixin "ğərq",[367]
Gəzib qəvvasvəş bəhrul-fikari.

Mərhum Əyyub ağanın Dağkəsəməndə bina etdiyi məscid heyfa ki, itmama yetmədi və onun baniyi-möhtərəmi məscidi tə'mir edib başa gətirməmiş vəfat elədi. Övladi-kəsirəsi içində bir elə şüurlu və mütədəyyin şəxs tapılmadı ki, babasının xeyir işini əncama yetirsin və haqq-taala ibadətxanası yarımçıq qalmasın. Həmişə Aqstafadan gəlib Qazaxa gedən vaxtı Dağkəsəmənin içindən keçdikdə həqir Allahın evini elə yarımçıq və pərişan halda görüb məğmun və pərişan oluram. Keçmiş halımızla indiki halımızı nəzərə gətirdikdə Mirzə Rəhim Fənanın fəna tə'sirli şe'ri yadıma düşüb, dəxi də könlümü xarab edir:

Sən gəzən gülşəni gördüm, dağılıb övraqi,
Bülbülün nalənü fəryadı tutub afaqi...



# MİRZƏ NƏBİ ƏFƏNDİ QAİBOV

Mərhum Mirzə Nəbi əfəndi indi hali-həyatda olan şair Abbas ağa "Nazir" təxəllüsün pədəri-büzürgvarıdır ki, öz əsrində, necə ki, fövqdə zikr olundu, əhli-kamalü mə'rifət və sahibi-elmü fəzilət bir şəxs imiş.

Mirzə Nəbi əfəndinin Şair İskəndər ağa ilə aralarında dostluq və məvəddət varmış və Şair yazdıqları əş'arü kəlamın çoxunu onun nəzəri tənqidinə təqdim edərmiş.

Mirzə Nəbi əfəndinin çox rəvan və açıq təb'i var imişsə[də], şe'r deməyə özünün çəndan meylü rəğbəti yoxmuş. Onun yazdığı şe'rdən ancaq Şair İskəndər ağaya müraciətən inşad qıldığı "Vəsfi-yaran"ı və "dərdipünhan"ı və "Əhvali-dövran"ı bəyan etmək xüsusunda yazdığı əsərdir ki, burada eyni ilə dərc olunur. Bu beytlər fəhrist məqamında yazılıbdır:

Şe'r beşaer, zire be Kerman,
Qafiyehai dər "Vəsfe-yaran",
Çənd degər həm əz "Dərde-ponhan",
Xatemeye-an "Əhvale-douran".[368]

## VƏSFİ-YARAN

Şair, eşitdinmi əziz yeznəsi
Qaynı qaziyə gətirdiyin şək,
Yoldaşlığın tərk eləyib dediyin
Haza firaqü beyni və beynək.[369]

Pənahın bu idi ola muradı,
Həmşirəzadeyi-qazi damadı,
Qızın ona verdi, bunu boşadı,
Tutarmı bu işi bir şəxsi-erkək?!

Mürtəza Əlini hər görən insan
Yaraşdırır baxmasına ad və san,
Öz adını özü qoyubdu Səlman,
Bundan artıq ona daha nə demək?!

Vəkili alimdir, alimi-qadir,
Qamisiyyədə çlen elədi Nasir,
Polkovnik də əlhəq batilü zahir
Hər işində ona verdi çox kömək.

Axır necə tərk elədi buları,
Gətirmədi yadə əhdü iqrarı,
Heç birinin əsla yox e'tibarı,
Bu övladdır bihüquqü binəmək.

Demə Məşhəd üçün getdi İranə,
Ya ki, ziyarəti-şahi-mərdanə,
Əli ziyarətin etdi bəhanə
Bu ölkədən qaçdı mərhum Əli bək.

Bundan ziyadə həm münasib halat
Nəzm etmək istədi təb'i-xəyalat,
Leyk əql dedi: Tərk eylə, heyhat
Mətləb anlayana müxtəsər gərək.

Dərdməndə söyləsən öz dərdini,
Bir təbibə yetir bu yüz dəridini,
Nə şe'r dəf' edər, nə söz dərdini,
Ə'lacıdır dərd əhlinə söyləmək.

## DƏRDİ-PÜNHAN

Məclisi-dünyadə zarü şikəstəm,
Şərabi-zülmüqdən xərabü məstəm,
Məxmuri-heyrətəm, begir dəstəm,
Saqi, ədir kəsən udü xeyrən lək.[370]

Badə ilə qılıb camı zərnigar,
Boş qoyma əlimi, olsun əlin var,
Dərdimdə ol mənə müinü qəmxar,
Dərdməndə şərhü bəyan eyləyək.

Gör başıma nələr gəldi, ey ustad,
Qədimi aşina məndən oldu yad,
Düşmənlər ortaya saldılar fəsad,
Dedilər: – Xaindir, gəlin öldürək!

Zülm etdilər mənə bicürmü günah,
Necə gavı şirə öldürtdü rubah,
Dost oldu tazədən bir neçə bədxah,
Başladılar əhdü peyman eyləmək.

Hər nə dedilərsə, ona inandım,
Düşmənləri sadiq, mühübb sandım,
Yoldaşların cəfasına dayandım
Nə qədər başıma gəldisə kələk.

Təəssübdə keçdim can ilə başdan,
Hərgiz yarımadım qövmü qardaşdan,
Sədaqət görmədim yarü yoldaşdan,
İmtahan eylədim hər birin tək-tək.



Əqaribə əqrəb deyibdir ustad,
Çün niş vurmağa olubdu mö'tad,
Xoş ol kəs ki, ola əqrəbdən azad,
Haram olmaz ona yemək və içmək.

Yaxşı gündə sənə yoldaş olurlar,
Yaman gündə ayağını çalırlar,[371]
Parə çörək üçün dalda qalırlar,
Tutsun gözlərini haman duz-çörək.

Görəndə bir nəf'i, eylər hörməti,
Görməyəndə qılır qət'i-ülfəti,
Bir mənqurca olmaz qədrü qiyməti,
Zər vermiş olasan gündə yüz ətək.

Demə bunlar kimi zünnar taxardı,
Sahibindən qaçıb gendən baxardı,
Düşmən qabağına hürüb çıxardı,
Saxlasaydım əgər bir neçə köpək.

Köpəkdən də bunlar bədtər oldular,
Yediyi çörəyi yaddan saldılar,
Saxlayanı ortalığa aldılar,
Hər biri bir yanə etdi çəkaçək.

Əlində iş olsa yarü qonağın
Gətirməz xatirə hərgiz nifaqın,
Vay halına əgər sürçə ayağın,
Başına vurarlar çomaq, dəynək.

Etimad eyləyən əhli-Qazağə,
Öz xeyrindən özün salar uzağə,
Ahu tək düşəndə işdi duzağə
Tapamaz bir yoldaş, çün muşi-zirək.

Yoldaşlıqda muşə oldu qurbağa,
Ayağı yuxarı, başı aşağa,
Həmcinsin tapmayan düşər ayağa,
Kefi olmaz, badə içsə bir sənək.

Xuda tək yaradıb sən dərdməndi,
Yoxdur bu dünyada mislü manəndi,
Doğru zənn etmədim verdiyin pəndi,
İndi bildim sözün var imiş gerçək.

Bir də cavan olsaydım əgər mən,
Sahibi-təcrübə olurdum pürfən,
Çifayda, elmi-dudik öyrənən
Qocalıqda çalar gorda dümbələk.

Demə səhv eylədik, tapdıq zərəri,
Xəlq edən xaliqdir xeyr ilə şəri,
İza caəl-qəza əməl bəsəri,
Fikr ilə təqdirə çarə neyləyək?

Raziqi-aləmsən, la-şərikə lək,
Cudinə mötə'rif insü həm mələk,
Əmrinlədir dövrül-ərzi vəlfələk,
Səddəqtü rəbbəna lək cəllə təbarək,[372]

## ƏHVALİ-DÖVRAN

Saqi, ayağə dur, dəstinə al mey,
Əyaği dövranə gətir peydərpey,
Sitəmi-dövrandan mürdəni qıl hey,
Dəstgirin olsun ruh vəlmələk.

Tut əlimi gedək zülmdən dadə,
Qələmdən özgəyə getmə imdadə,
Məşqimizi yazaq verək ustadə,
"Əhvali-dövran"ı ona göstərək.

Bir nəzər qıl, ey şairi-fərzanə
Böylə zəmanəyə, böylə dövranə,
Nə oğula ata, nə qıza anə,
Nə qardaş-qardaşa verirlər əmək.

Oğul və qız ağ ata və anayə,[373]
Qoymazlar fəqirlər gələ xanəyə,
Derlər zəncir gərək bu divanəyə,
Qocalıb azıbdır, nə üzün görək.

Qardaşlar bacıya qılmazlar hörmət,
Bacılar qardaşdan edərlər qiybət,
Əmidə, dayıda yoxdur mürüvvət,
Əmoğlu bir-birin istər öldürmək.

Övrətlərdə şərmü həya qalmayıb,
Ərlərdə mərdlik əsla qalmayıb,
Qazilərdə şərti-qəza qalmayıb,
İşləridir tamam məsxərə hənək.



Müxtəsər qalmayıb bir doğru halət,
Nə bəydə ədalət, nə eldə adət,
Nə əməldə əməl, nə dində taət,
Nə bir kəsdə vardır doğru söz demək.

Əhli-fəzli gördüm zəlilü şikəst,
Nadanı izzətdə layə'qəlü məst,
Bəylər olub rö'yaya ziri-dəst,
Rəiyyətlər olub hər biri bir səg.

Mat qalmışam bu dövrana, bu hala,
Heç kəs meyl eyləməz əhli-kamala,
Namərdlər əl vurub cahü cəlala,
Mərdlərin əlləri olubdur gödək.

Anlamazlar olur məclisdə sərdə,
Anlayanlar mübtəladır min dərdə,
Ya rəb, varmı heç ədalət bir yerdə,
Bu virandan qaçaq oraya gedək?!

Fələyin böylədir dövrü əhvali –
Kim, cahilə verir dövlətü mali,
Fazillər feyzindən xalidir, xali,
Görüm bərbad olsun bu çərxi-fələk!

Yoxdur zəmanədə bir dərdi qanan,
Vilayətdə halı qanıb qandıran,
Sözü qanmayanda özü qəhrəman,
Skajet on tebe sumaşedşi dürək.[374]

Ağ iti qaraquş deyib çağırır,
Qandırmaz mətləbi, bar-bar bağırır,
Ərzəçiyə böylə söyür, çığırır;
Niponiyal menya iskatin səbək.[375]

Gör necə məğşuşluq olubdur əhval –
Kim, künci-heyrətdə qalıb nitqi lal,
Fəsih sözlü, şirin dilli Molla Zal*
Məgər üzün örtüb belə ilə kürək?

Dünyada görmədim rahətü səfa,
Əhlində tapmadım bir əhli-vəfa,
Rahəti zəhmətdir səfası cəfa,
Ağlamaq yeridir, bunda nə gülmək?!

* Molla Zal – Qaçaq Kərəmin babasıdır ki, ziyadə fəsih, dilavər və cəsur bir kişi imiş.

Söylə görüm, ey şairi-sultani,
Aləmin sultani İskəndər[376] hani?
Dünyanın mehmani özüdür fani,
Bu fanidən sən gəl əlimiz çəkək!

Ey mürği-can, təndə ömrü nəfəsdən[377]
Az qalıbdır, əl çək zövqü həvəsdən,
Pərvaz eylə aşiyanə qəfəsdən,
Raşidən məhdiyyən Allahü məək.[378]

Mərhum Mirzə Nəbinin şair İskəndər ağaya xitabən yazdığı bu kəlamı sadəlikdə və açıqlıqda Qasım bəy Zakirin Mirzə Fətəliyə yazdığı kağızlara oxşayır. Mə'na cəhətincə dəxi hər iki şair əhvali-dövranı, vəsfi[379]-yaranı bir sayaqda yazıb zəmanədən şikayət edirlər.

Nə sayaq ki, mərhum Zakir Qarabağın əhvalatını nəzmə çəkir, o minval üzrə qazi Mirzə Nəbi əfəndi Qazax vilayətinin övza'vü əhvalatını və onda cari olan nasəza işləri və divan əhlinin cövrü sitəmini və müsəlmanlar ilə dürüşt və sərt rəftar etməsini şərhü bəyan qılır.

Heyfa ki, mərhumun belə rəvan və güşadə təb'i ola-ola ədəbiyyatımız xəzinəsinə çox az dürrü cəvahirlər saçıbdır. Mirzə Nəbi əfəndi vəfat edibdir 59 sinnində 1869-[cu] tarixi-miladın sənəsində; dəfn olunubdur Salahlıda.



# HACI MAHMUD ƏFƏNDİ "NAFE"

Peyğəmbərimizin məddahlarından biri də mərhum Hacı Mahmud əfəndi Hacı Əli oğlu "Nafe" təxəllüsdür ki, Nuxa şəhərinin Dodu adlanan məhəlləsindəndir. Nafenin şüğlü müdərrislik olubdur. Dodu məhəlləsində prixod mollalığına tə'yin olunub, müsəddiq ruhanilər sinfindən olubdur.

Mərhum Hacı Mahmud əfəndinin yaxşı savadı və rəvan təb'i varmış. Amma kəlamının əksəri nə'ti rəsulüllah, münacat, qəsidə və mədhi-ənbiyavü övliya haqqında olubdur.

Nafe vəfat edibdir altmış beş yaşında, tarixi-hicriyyənin 1293-[cü] sənəsində zilhiccə ayında. Tarixi-məsihiyyə[nin] 1876-[cı ilinə] mütaqibdir.

Kəlamından nümunə:

## NƏTİ RƏSULÜLLAH

Göründü gözümə bir dəm ziyayi-rövzeyi-xəzra,
Ətirati-dilavizi damağımda şəmiməfza.
Təkapu eylədi çeşmi-rəməd kim, kəhl qəsdinə,
Qubari-müşkbarımdan təsəlla qıldı istirxa.
Nəzər qıldım, o surətdə şühudül-qəlb əl verdi,
Tə'nəüm ləzzətin bulduq, bihəmdillah, ey mövla.
Ziya bir növ' üruc etmiş səmavatın dərunundan,
Məqami rövzədən ta zilli-ərşə etmiş istela.
Məlayiklər müniratı görüb ikram edən vaxtda
Xitabi-müstətab endi: "Fəsübhanəl-ləzi üsra".
Tərənnüm etməyə mürği-dilim çox cüstücu etdi,
Təhəyyür damənim tutdu ki, nitqim olmadı guya.
Saqın, ey müflis, aldanma, təhidəstəm – deyib uyma
Cəvahir mə'dənin bulduq fəamənna və əsləmna.
Hüzuri-mə'nəvidə ruyi-sərgərdanlığım oldu,
Nə surət yerdə qaldı, bilmədim nə siyrəti-əsla.
Civari-rövzənin sirri-qəribindən nişan bilməz,
Bilir ol kimsə kim, fəhm eylədi "vəlleyl iza yəğşa".
Hədisin məzhəri "lov kanə min bədi ələt-təğriz",
Sərayi-qüdsiyan ruhaniyan sirrin edər hala.
Ədəbsiz olma, əl çək, Nafe övsafında dəm vurma,
Neçün nə'ti-şərifi sureyi-"Yasin"ü həm "Təha".

Cənabi-həqqin və rəsuli-Məhəmmədin və onun ali-ətharının və xüləfayi-raşidinin və sair övliyanın mədhində deyibdir:

Vücudi-vacibi-zatın müqəddəm həm müəxxərdir,
Şəhadət kəlməsi daim dilimdə şəhdü şəkkərdir.

Ona həmd eyləmək məqsudi-bizzat ol səbəbdəndir –
Ki, mün'im həqqinə həmd eyləmək ancaq müqərrərdir.
Sifati-əkməli zati-vücudun kainat içrə
Sifati-nəqsdən ari nümayanü müqəddərdir.
Səlat ilə səlam ol seyyidi-sadat üçün əlzəm,
Cəmali-bədrinə layiq bu sirr onda müsəvvərdir.
Şəfi'ül-müznibindir həm müşəffi' cümlədən əvvəl,
Güruhi-ənbiya, həm övliyalər üzrə sərvərdir.
Dinində müstəqimə əhli-beytü alü əshabə,
Xüsusən onlara kim, bizlər üçün rahbərlərdir.
Xilafət sədrinə yetmiş, səadət təxtini bulmuş,
Şəriət gülşəninin bülbülü, siddiqi-əkbərdir.
Əqibincə xəta etməz, kim olsa hökmünə münqad,
Sütuni-ədl ilə movsuf olan Faruqi-əşhərdir.
Həyavü hilm ilə məruf olan damadi-Zünnureyn,
Şəhadət rütbəsində came'ül-Qur'an əzbərdir.
Nəsəbdə şəmsvəş zahir, ülumi-şərdə mahir,
Xilafət xətminə nasir olan Kərrar Heydərdir.
Hüseyn ilə Həsən bədri-ziyayi-dideyi-Zəhra,
Təzəkkür Həmzəvü Abbas məhafillərdə zivərdir.
Fəxarət etsin ol kim, tabeinə iqtida etdi –
Ki, ol mərhumlər dinü dəyanətdə müzəffərdir.
İmami-Hadiyi-Ne'mani-sabiq maliki-lahiq,
Məhəmməd Şafe'iyyü Hənbəli Əhməd səzavərdir.
Mühəqqər Nafeinin cürmünə "layöhsa" demək layiq,
Vəli əltafi-rəhmanda bu, timsali-müsəqqərdir.



# HACI RƏSUL "RƏSUL"

Hacı Rəsul ibn Zərgər Kərim dəxi Fateh, Nicati[380] və Nafe kimi rəsuli- xudanın və onun ali-əttharının və əshabi-güzininin məddahlarından biri olub, əsərlərindən müfəssəl mövludnamə, vəq'eyi-Kərbəla, bə'zi münacat, qəsaid və təsnifati-mütəəddidələri vardır.

Hacı Rəsul Nuxa şəhərinin Yuxarıbaş məhəlləsində sakin olurmuş və həştad sənəyə qədər ömür sürübdür. Vəfat edibdir 1300-cü tarixdə rəbiüləvvəl ayında.[381]

Mərhum çox zirək adam imiş. Bir qədər məlumat cəm' edib, gah mollalıq edərmiş və gah ticarət və çörəkçilik sən'əti ilə ehtiyacsız, rahat dolanarmış. Çox müttəqi və mö'min bir şəxs olduğundan əsərlərindən çoxunda dəxi dinü imana dair məsaildən bəhs edərmiş. Nümunə üçün bə'zi əş'arı burada zikr olunubdur.

Sifəti-rövzeyi-şərif:

Yetişdim rövzəyə, gördüm binayi-Mustəfadır bu,
Məqami-sərvəri-din, şafe'yi-yövmül-bəqadır bu.

Girib babi-səlamətdən hüzurə əssəlam etdik,
Görərkən rövzəsin bildik ki, məhbubi-xudadır bu.

Münəvvər canibi-riclində ənvər türbeyi-siddiq,
Huvəs-siddiq ki, ol məzhəri-din müqtədadır bu.

Onun payi-şərifi üzrə vazeh türbeyi-Faruq,
Səadət gəncinin fəxrivü nuri-bilhüdadır bu.

Məratib türbeyi-salis vüqui rövzətül vahid,
Dərun beyti-şərifasa, vəli qeyri nümadır bu.

Qəfayi-rövzədə binti-Məhəmməd məfxəri-mövcud,
Məqami-Fatimə ümmi-şəhidi-Kərbəladır bu.

Cəlali-rövzənin mədhi misali-cənnətül-firdovs,
Rizası baisül-cənnət Rəsuli-kibriyadır bu.

Səfayi-nurə müstəqraq olan anlar bu asarı,
Nə bilsin mən kimi qafil necə darüs-səfadır bu.

Mühəssil dari-mə'vadır. Məqami-Əhmədi-Məhmud,
İcabət əhlinə tuba, rəhi cənnətsəradır bu.

Dər həqqi-çahar yar:

Lətafəti-xüləfa ləzzəti çahar yarə
Xülusi-eşq ilə hər kəs edərsə nəzzarə,
Olurdu cövfünə varid hədisi-hikməti-nur,
Çatar bəqayi-səfadə məqami-əbrarə.
Cahanda gör nə cəfalər çəkibdi hər birisi,
Nə intiqam ilə xəsmə edibdilər çarə.
Üsuli-dində peyapey ümurə qoydu qədəm,
Müvafiqət edib əmri-cənabi-qəffarə.
Bax onların səbəbi-ictihadi-qeyrətinə,
Qıl inqiyad əsərincə yol açma əğyarə.
Əqayidi-xüləfə, həm rəsuli-əmri-xuda
Bərati-bağİ cinandır, baxın bu əş'arə.
Müvəhhidi mütəvəccih edər bu əxbarat,
Rizayi-həqq ilə bir bax bu çərxi-dəvvarə.
Hərarəti-mütəəttəşü ma'i birrü səfa,
Nə iltizaz verir gör qülubi-ənvarə.
Nə fe'li var isə əbdin qəza günü açılır
Hüzuri-dərgəhi-şahi-qədimü qəhharə.
O gündə, rəbbi, Rəsulun ricasın eylə qəbul,
Behörməti-nəbəvi rif'əti-kərəmkarə.
Edək həbibi-xudanın cəmalına sələvat,
Şəfi'yi-şahid mütləqdi biz günəhkarə.

Bu kəlamda xülafayi-raşidinin din yolunda çəkdikləri cəfavü bəlalara şair işarə qılıb, onların əmri-ilahini və üsuli-şəriəti-nəbəvini yerinə yetirməkdə müttəfiqül-qövl və fe'l olmaqlarını bəyan edib özünə xitabən deyir:

Bax onların səbəbi-ictihadi-qeyrətinə,
Qıl inqiyad əsərincə yol açma əğyarə.

Bu beyt kaffeyi-müsəlman üçün bir ziqiymət dərguş mənziləsində olub, heç vaxt xatirlərdən gərək unudulmasın.



## RƏSUL "DÜLGƏR"

Nuxa şairlərindən şair Rəsul İsmayıl oğlu Yuxarıbaş məhəlləsində sakin olurmuş. Şairin sən'əti dülgərlik, bənnalıq kimi me'marlıq olubdur. Uşaqlıqda oxumaq-yazmaq tə'limində olmayıb, ancaq sonradan özünün sə'yü ehtimamı ilə bir qədri savad kəsb edibdir. Bainhəmə şair Rəsulun savadı azmışsa da, təb'i rəvanmış və lakin fünuni-şe'riyyədən çəndan ittilaatı olmadığına görə, bir para şe'rlərinin bəhrü vəzni dürüst gəlmir.

Şair Rəsul vəfat edibdir 63 sinnində 1305-ci tarixi-hicriyyədə zilqədə ayında.[382]

Əsərləri çoxsa da, pərişan və övraqdır. Dostlarından usta Hüseyn nuxalıya onun tərki-vətən olub, qövm əqrəbanı yaddan çıxarmağı və İlisuda üçüncü dəfə təəhhül etməyi barəsində yazır:

Əya pirim, sizə məndən səlami-bişümar olsun,
Cahanda ömrüm əl verdikcə hər leylü nahar olsun.

Cünuni-həsrətəm, əfv et, gər olsa səhv ərzimdə,
Cünuni-əfv edib rəhman ki, təklifdən kənar olsun.

Yoxumdur səbrü aramım, qərarım qalmayıb əsla,
Fəraqın qoymayır bir ləhzə şüğlüm kəsbi-kar olsun.

Salıbsan bizləri gözdən, bu var: üz döndü, göz döndü,
Məhəbbət qəlbdə müzmər, nə mümkün var kənar olsun.

Nədir bais ki, tərk etdin bu qədri sileyi-rəhmi,
Nə vəqtə kimi, bimürvət, bu məxluq intizar olsun?!

Əgər cahil tuta hər fe'l, ona yox eyb, cahildir,
Zərurətdir ki, kamillərdə qədrincə vüqar olsun.

Gələndə mövcə dərya xatirin sal qətrəni yadə,
Yazıb mətləb nə var, əmr et, həqirə iftixar olsun.

Nəzər ilə təfəkkür qıl bahari-aləmaranı,
Xudayi-külli-əşyanın kəmali aşikar olsun.

Edibdir mürdəni əhya bu dəmdə xaliqi-yekta,
Qılıbdır qüdrətin zahir ki, aləm mərğzar olsun.

Edər mürği-səhər əfğan, salıb gülşən ara məskən
Canından əl çəkib pərvanələr şəm'ə düçar olsun.

Şükufə gunəgun açmış, hərə bir növ' zikr eylər,
Çəkərmi qəm olan aqil belə pərvərdigar olsun?!

Əbəsdir qullara etmək olan batil xəyalatı,
Müqəddərdir əzəl gündən qədərdə hər nə var olsun.

Hərə öz rə'yin eylərsə, görək dünya dolanırmı?
Gedərmi kəsbinə hər qul əlində ixtiyar olsun?!

Nizami-səltənət daim sürər sultan nizamilə,
Nizamın hər biri istər ki, şahi-tacdar olsun.

Yetər mətlubinə əl'an tutan ümmid rəzzaqə,
Qalan məhrum o kəsdir kəsbinə ümmidvar olsun.

Yapışsa həqqə sidq ilə səni dünya arar kəndi,
Bu növ'dür xasiyət dünyaya harisdən fərar olsun.

Bəsi əsləhdi, dərviş ol, kilim altında rahət yat,
Nelərsən padşahlıq kim, sənə bu dünya dar olsun?!

Nizami-aləmi düzmüş xuda elmin qılır izhar,
Nə növ' olsa, səlahidir, qulun kasib-kübar olsun.

Nə görsə gözlər aləmdə, tamami cifə dünyadır,
Çalış min gündə sən cəm' et, o, bir gün tarümar olsun.

Keçirmə fürsəti, zinət ver ol baqi olan mülkə,
Peşiman olmaz aləmlər ki, bir kəs mülkədar olsun.

Fəna mülki ziraətdir, hədis var dari-üqbayə,
Ötər vəqti, ələ gəlməz, onu qoyma səvar olsun!

Müsəlmanlıq ibarətdir, yəqin dünyadə qeyrətdən,
Müsəlmanda gərək qeyrət, gərək namusü ar olsun.

Xətadır işlədib üsyan, qəzayə eyləmək isnad,
Deyil hökmi-əzəl bir şey onu quldan sorar olsun.

Özün qul nəfsinə, nəfsi sənə qul etmə, ey şahim,
Həvada şahbaz oynar ki, ol yerdə şikar olsun.

Rəsuli-həq buyurmuş kəndinə xud nəfsini düşmən,
Vəli mə'mur odur onda bu qövlə e'tibar olsun.

Neçün gümrah edirsən izdivacə meyl edib şəb-ruz,
Zəif et nəfsini ol qədr ona fəhmin həsar olsun.



Əgər məqsudin övladdır, onu həqq əmr edib fitnə,
Hanı saleh ki, yüz eybin birinə pərdədar olsun?!

Sənə tən etmərəm, alma iki yüz, nəfsinə zülm et,
Bacarsan ədlü ehsanı, nədir eybi, çahar olsun!

"Ribaə" ayəsi həqdrü in "xiftüm" ağır yükdür,
Birini sərbülənd etmə, birini qoyma xar olsun!

Cavabın söylə, bax, fikr et, hesab eylə bir ayətdir,
O də'vayə nədir üzrün ki, hökmi-kirdigar olsun.

Əgər hal əhlisən, al əhli-hali, xoş keçir övqat,
Gül ilə həmnişin ol ki, zimistanın bahar olsun.

Şair Dülgər dostuna yazdığı bu məktubunda bir neçə rə'yü e'tiqadlar izhar qılır ki, bir tək şair o e'tiqadü əqidədə olmayıb, bəlkə müsəlman qardaşların əksəri haman rə'yü e'tiqadlara şərikdirlər. Amma həqiqətihalda bu e'tiqadlardır bizim ağlımızı, huş və diqqətimizi pərdələyib qaranlıqda saxlayın. Əqlü fərasət haqq-taalanın öz bəndəsinə verdiyi ən ali və gözəl ne'mətlərdir ki, insan onların vasitəsilə sair məxluqat və heyvanatın əfzəli və əşrəfi olubdur. Hər şəxs gərəkdir bu gözəl ne'mətin qədrini bilib onunla şərafətlənsin. Özgə ağıl ilə, özgə tədbir ilə dolanan, öz ağlını unudub, öz fəhmü dərrakəsini yatızdırıb qeyrilərə təqlid edən, müridbazlıqda ömrünü zay edən kəs həmişə fəlakətdə və zillətdə olacaqdır. Amma müsəlman ruhaniləri və onlar ilə müttəfiq müsəlman ədib və fazilləri məqamındı olan ağayi-möhtərəmin çoxu bu əqidədədir ki, adam öz əqli-qasiri ilə iş görsə, axırda peşmanlıq çəkər. Bəs lazımdır ki, öz rə'yincə iş görməyib qeyrilərin buyurmağına qulaq asasan və əmrinə tabe olasan. Ona binaən şair Rəsul söylədiyi sözlər:

> Hərə öz rə'yin eylərsə, görək dünya dolanırmı,
> Gedərmi kəsbinə bir qul, əlində ixtiyar olsun.

– tək onun qövlü fikri olmayıb, bəlkə ümum müsəlmanların rə'yü fikridir. Çünki doğrudan da müsəlmanların çoxu bu əqidədədir ki, hürriyyət və azadəlik ancaq fəsad və inqilab törədici[dir]. Onların sayəsində rahət məişət eləmək qeyri-mümkündür.

Avama hürriyyət verilsə, o öz bildiyini eləyəcəkdir və belə olan surətdə bir kəs onun xətasından və bəlasından eymən və fariq qalmayacaqdır. Bəs, bu xətalardan və fəsadlardan salamat qalmaq üçün nə lazım gəlibdir hər kəs öz əqlü rə'yini işlətsin, ağıllılarımız və işbilənlərimiz hər

nə buyursalar, sairləri də onların əmrinə müti' olsunlar və onlar göstərdiyi yol ilə getsinlər. Bir yana baxsan, bu, yaxşı məsləhətdir. Amma iş budur ki, ağıllılarımız və işbilənlərimiz həmişə avamın xeyrini mülahizə eləmir, onun nəf'inə çalışmır, bəlkə onların əksər övqat firkrü xəyalları budur ki, avamı avamlıqda saxlayıb, onların avamlığı və qanmazlığı sayəsində özləri kəmali-rifahət və səadət ilə güzəran etsinlər. Və bir də biz müsəlmanlar nə vaxta kimi avamlıq halında qalacağıq və nə zamana kimi özümüzü qoyun sürüsünə müşabeh edəcəyik?

Hər şeydən əvvəl bizə lazım olan elm və bilikdir. Elm və kamalsız bizim tərəqqimiz qeyri-mümkündür. Elm və kamalımız olsa, öz başımız ilə iş görməyə müqtədir ola bilərik, o halda bizə qəyyum dəxi lazım olmaz. Onda qoyunluq halından çıxıb çobansız da başımızı dolandıra bilərik, onda hürriyyətin də səməri acı olmaz. Və bir kəsin qeyrisinə xeyirdən başqa zərəri olmaz. Hər bir şəxsin zəhməti təklikdə özünə nəf' gətirən kimi, ümum nassə də onun xeyiri yetişər.

Sonra şair Rəsul hamımızın dilindən söyləyir ki, xudayi-müttəala ki, rəzzaqül-aləmindir, ümid bağlamaq lazımdır. Sidqi-dil ilə haqqa ümid olunsa, bəndə ac və susuz qalmaz və öz arzusuna yetişər. Məhrum qalan ancaq ümidsizlər olubdur. Sidq ilə haqqa yapışsan, hər niyyətin hasil olunacaqdır. Dünyanın dalısınca düşüb onu aramaq əbəsdir.

Bu ümumi bir [383] qaydadır: hər kəs bir şey'i şövq ilə axtarsa, bir şeyə bərk həris olsa, o şey ondan fərar edəcəkdir və bir də cəm'i dünyanı gəşt eləsən, onda qədərdən qeyri bir şey bulmazsan. Ona görə huşyar adamlar daim qəzaya razıdırlar. Necə ki, şair bu mətləbləri nəzmə çəkibdir:

Yetər mətlubinə əl'an tutan ümmid rəzzaqə,
Qalan məhrum o kəsdir kəsbinə ümmidvar olsun.

Yapışsan [həqqə] sidq ilə səni dünya arar kəndi,
Bu növ'dür xasiyət dünyayə harisdən fərar olsun.

Dolansan cəm'i dünyanı qədirdən qeyri bir şey yox,
Qəzayə razıdır ol kəs ki, daim huşyar olsun.[384]

Əlbəttə, rəzzağə ümid bağlamaq hər bir cəhətdən yaxşıdır. Məsəldir ki: "Ümidsiz düşmənin olsun". Ümid olmayan yerdə insanın zindəganlığı nəyə lazımdır? İş ümid ilədir, ümidə bağlıdır. Ümidsiz kim bir işə şüru edə bilər? Ümid işin ruhudur. Amma söz buradadır ki, ümidə yetişmək üçün onun səmərini dadmaq üçün sə'y və zəhmət lazımdır. Zəhmətsiz murad və mətləbə yetişmək mümkün deyil, mümkün olsa da, zəhmətsiz muradın meyvəsi bir o qədər ləzzətli və şirin olmur. Necə ki, zəhmət ilə



yetişən meyvənin dadı ləzzətli olur. Haqq özü dəxi ona ümid bağlayanı dost tutur, bəşərti ki, ümid bağlayan şəxs əl-ayağını boşaldıb böyrü üstə yatmaya ki, "Allah yetirəcəkdir" ki, "Allahdan buyuruq, ağzıma quyruq", bəşərti ki, ümid bağlayan şəxs alnının tərini silə-silə zəhmət çəkə və haqqdan naümid olmaya. Atalar haqqın dilindən deyiblər: "səndən hərəkət, məndən bərəkət". Hərəkətsiz bərəkət hərgiz müyəssər olmaz və Dülgərin bu barədə qövlü batildir ki:

Qalan məhrum o kəsdir kəsbinə ümmidvar olsun...

Kəsbinə ümmidvar olan, yə'ni zəhmət çəkən adam heç vaxt məhrum qalmaz. Bu şərt ilə ki, onun kəsbi halal olsun. Çün halal kəsb özü ibadətdəndir. O ki, qaldı "qəzaya riza verməк" bu xüsusda bizim də rə'yimiz budur ki, qəzaya lazımdır razı olmaq. yə'ni insanın başında qəzadan bir iş gəlsə, artıq cəza-fəza etməmək. Çünki ağlamaq və ah-zar etmək ilə vüqua gələn bəlavü müsibəti rəf' etmək olmaz və lakin insan öz məişətini düzəldib arastə qalmasa və boş-bikar oturub "hər nə müqəddərdir, o olacaqdır" – deyib bir şüğlü kəsb dalınca getməsə, gün-gündən pozğun və pərişan hala düçar olacaqdır və öz pərişan halını qəzavü qədərə həml eləməyin (bu əqidə eyni batil əqidədir) nəticəsi axırda fəqirlik və dərvişlikdir ki, onu şair bu başdan tövsiyə edir ki, dünyanın qilü qalına düşüb başını ağrıtma, dərvişsifət bir növ' beş günlük ömrünü başa yetir:

Bəsi əsləhdi, dərviş ol, kilim altında rahət yat,
Nelərsən padşahlıq kim, sənə bu dünya dar olsun.

Keçirmə fürsəti, zinət ver ol baqi olan mülkə,
Peşiman olmaz aləmlər ki, bir kəs mülkədar olsun.

Şair Rəsul bu kəlamı ümum müsəlmanların dünyaya və insana və insanın nə növ' bu fani dünyada güzəran etməsinə hankı nöqteyi-nəzər ilə baxmağını ifadə etməklə bizim nəzərimizdə əhəmiyyətlidir. Kəlamın axırında izdivac məsələsi barəsində dəxi bir neçə şe'rlər deyibdir. O mətləbin nə dərəcədə haqq və batil olmasını oxucuların öz nəzəri-tənqidlərinə vagüzar edirik.

Əyzən kəlami-Dülgər:

Eşq əhli olan tarixi-dünya gərək olsun,
Alsın nəzərə mətləbi-mövla gərək olsun.

Yüz gəz kəsilə ərrə ilə heç deməsin uf,
Taqətdə misali-Zəkəriyya gərək olsun.

Eşq atəşini eyləyibən sinəyə müzmər,
Yusif deyəsən misli-Züleyxa gərək olsun.

Hər Qeys olub sidq ilə Leylanı sevən kəs
Məcnun kimi sərgəşteyi-səhra gərək olsun.

Tök, zahidə ver dürdünü, ey saqi, şərabın,
Üşşaqlərə badə mühəyya gərək olsun.

Zahid nə bilir mey nədi, meyxanə nə yerdir,
Bu rahə gedən aqilü dana gərək olsun.

Dülgər, tut əlin rahi-şəriətdən, usanma,
Sail əlinə mö'təbər əsla gərək olsun.



# XƏSTƏ QƏDİR

Xəstə Qədir nam bir şəxs də Nuxa şüərası zümrəsindən olubdur. Xəstə Qədir Çayqırağı məhəlləsindən olub, atası Qasım Nuru oğludur. Şair Rəsul Dülgərin müasiri olub, 20-25 sənə bundan irəli qırx yaşında məqtul olubdur. Xəstə Qədirin əsərlərindən bir parası əlimizə düşdüsə də, onlardan heç birini ədəbiyyata layiq görməyib, məcmuəmizə nümunə salmadıq.

## MUSTAFA AĞA "ŞUXİ"

Mustafa ağa Şəkixanov məşhur şair Kərim ağa Fatehin sülbi oğludur. Mustafa ağa validi-büzürgvarı kimi mə'rifət və kamal sahibi, möhtərəm bir şəxs olub, əksər övqat məclisinin ürəfavü şüaralar ilə təzyin edərmiş. Zindəganlığının ibtidasında dövlətmənd olub, axır vaxtlarda bir az kasıb düşübdür və özünə mütəəlliq olan əmlakın mədaxili ilə güzəran edərmiş. Mərhum Mustafa ağa Şuxinin çox gözəl və rəvan təb'i var imiş. Öz dəst-xətti ilə yazılmış bir divanı vardır ki, onda ədəbiyyatın hər növünə dair əş'arü kəlam vardır[385]. Onlardan bə'zisi nümunə olaraq burada zikr olunur.

Zəmanə əhlinin əxlaqi-zəmiməsinə dair deyilibdir:

Nə surət bilməzəm əhvali-xəlqi-dövri-hazirdir,
Olubdur bir-birinə cürmsiz nahəqq cabirdir.

Xəyanətlə dəruni sərbəsər məmlüvvdür xəlqin,
Kimi təsviri-adəmlikdə görsən, şəkli zahirdir.

Əgər kim, dərdini izhar edərsən sandığın yarə –
Ki, guya aləmə izhar üçün mə'mur naşirdir

Atıb öz karını cümlə biri həmdigəri halın
Təcəssüs eyləməkdə daima amadə, nazirdir.

Ucalda gər fələk həmmillətindən bir kəsin başın,
Dili-əqvami büxlindən müdam aşüftəxatirdir.

Və ya dövri-qəza birlə ola əfsürdə ixvanı,
Dənaətdən görə qardaşın ol halətdə şakirdir.

Edib əf'alını məğşuş cümlə sahibi-sən'ət,
Həzaran heyf ol ustadlər kim, işdə mahirdir.

Görünməz doğruluq əqvalü ə'mali-xəlayiqdə,
Sərapa əyrilikdir fe'li-mərdüm hərçi sadirdir.

Nolur bilməm bu əf'al ilə axır karımız, ya rəb,
Bu tərz ilə olub yek-digərindən cümlə nafirdir.

Gəhi xəndan, gəhi giryan edir dövri-fələk daim,
Əsasi-dövri-aləm ruzü şəb çəndan ki, dairdir.

Zamanın halətin bu tərz ilə gördükdə, ey Şuxi,
Vəfa eylərmi göftarə dili ol kəs ki, şairdir[386].



Şuxinin bu qəzəli şikvəüslub olsa da, pürməzmun kəlamlardan birisi olub, bizim yerlərin əhalisinin müqtəzayi-təbiətləri olan büxlü həSə'di, nəmmamçılığı, öz işini buraxıb özgə sözü danışmağı, aralıq qarışdırmağı, qövm-əqrəbanın tərəqqisinə xəyanət və əfsürdəhal olmasına bəşaşət etməkləri və filcümlə bəşərə layiq olmayan halı və sifətlərini şərhü bəyan edir.

Filhəqiqə, ancaq bizim torpağın adamlarıdır kəsrəti-kəsalətdən öz şüğlü karını atıb, həmdigəri halını təcnis etməyə daim amadə və nazir ola. Bir kəsin başı uca olsa, onun büxlindən digəri pərişan və aşüftəxatir ola. Qardaşı qəzadan bir bəlaya düçar olsa, ona təsəlli verməyib kəsrəti-qənaətdən onun pəjmürdə halına qəlbdən şadü şakir ola. Bu qisim sifət-lər ilə müttəsif olanlar, əlbəttə, zahirdə adama bənzəsələr də, batində və həqiqətdə adamlıqdan uzaq və kənardırlar. Odur ki, şair deyibdir:

Xəyanətlə dəruni sərbəsər məmlüvvdür xəlqin,
Kimi təsviri-adəmlikdə görəsən, şəkli-zahirdir.

Bu şe'r Mövlana Cəmaləddin Ruminin kəlamını xatirə gətirir:

İn ke, mibini xelafe-adəmənd,
Nistənd adəm ğelafe-adəmənd[387].

Müəllim Nacinin[388] dəxi bu babda məşhuri-üdəba olan tərcibəndində dediyi fərdlər şayani-diqqətdir:

Zahirdə görüb bizləri sanma üqəlayiz,
Biz bir sürü aqil sifətində büdəlayiz*
Aqil denilirmi bizə kim, halı bilürkən,
Dildadeyi-alayişi-neyrəngü həvayiz.

Və yenə bu babda Müəllim Naci yenə haman tərcibəndində deyir:

Dəhri arasan mində bir adəm bulamazsan,
Adəm görünən xərləri adəmmi sanırsan?[389]

Mərhum Mustafa ağa Şuxi öz din qardaşlarının belə pozğun və pəri-şan halda və xabi-qəflətdə qalmaqların görüb kəmali-təəssüflə deyir:

Yetdi dövran bizə bir vaxt, xudaya, səd heyif,
Vəzi-əyyam pərakəndə, nə bərca, səd heyif!

---

* Büdəla – kötük məzmunundadır

Xabi-qəflətdə qalıbdır belə əhli-islam,
Həmə bihuş, nə bir karə mühəyya, səd heyif

Hiç bir məşğələ yox bizdə ki, hasil ola nəf'
Onda mövcud nə dünyavü nə üqba, səd heyif!

Qabili-tərbiyeyi-elmü maarifdə ikən
Qalmışıq vadiyi-qəflətdə sərapa, səd heyif!

Var ikən gör necə pamali-cahan olmadayız,
Növ'i-insanda belə qədri-müəlla, səd heyif!

Söndürüb əldə ikən böylə qalıb zülmətdə
Nuri-islam kimi məşəli-ziba, səd heyif!

Nə səbəb qalmağa bu halətə bilməm, Şuxi,
Yox imiş bir kəsimiz samevü bina, səd heyif![390]

Doğrudan da səd heyif və yenə heyif ki, əlimizdə nuri-islam kimi belə pürziya və münəvvər çirağ ola-ola cəhalət qaranlığında və qəflət vadisində pərişan və sərgərdan qalıb, pamali-cahan olmuşuq.

Əşrəfi-ənbiya olan peyğəmbərimiz Məhəmmədəl-Mustafa həzrətlərinin mədhində və çahar yarın vəsfində inşa qıldığı kəlamdır:

Səni məhbub qılmışdır xudayi-əkbərü ə'la –
Ki, sənsən kainat içrə münəvvər gövhəri ə'la.

Şəhi-təxti nəbüvvətsən, həbibi-həqqi-ziqüdrət,
Səfarayi-güruhi-əhli-məhşər, sərvəri-əla.

Xoşa mümtaz qılmışdır səni kövnü məkan içrə,
Hamə məxluqi-aləmdən güzidə, bərtərü ə'la.

Hamana əbr açıb daim ə'laimdən cinahi-xoş,
Mübarək fərqinə bir çətri-zərrin şəhpəri-əla.

Şəbi-me'rac əzmində dəri-dərgahi-mövlayə,
Qədəmgahında fəth olmuş firavan kişvəri-əla.

Sənayi-cümlə əshabın, xüsusən çar yaranın
Öyünmək cümlə ümmətçün səzadır əzbəri-əla.

Əbubəkr sədaqət göstəri siddiqü yoldaşın,
Rəfaqətdə qədəm kəm qoymadı ol mehtəri-əla.

Hərasan sətvəti-Faruqdən dövründə[391] küffaran
Olubdur nəşr üçün dini-mübinə məzhəri-əla.



Güli-sədbərgi-gülzari-həya Osmani-Zünnureyn
Səadət bürcünə arayişəfza əxtəri-əla.

Məhi-bürci-səxa nəcmi-səadət şiri-yəzdani
Cənabi-xatəmi-təxti-xilafət Heydəri-əla.

Vücudunla verib xəllaqi-aləm bu cahan içrə
Çiraqi-aləməfruz olmağınla zivəri-əla.

Ümidim böylədir, ya müqbili-dərgahi-sübhani,
Qıla ümmətlərin ə'tasinin çün davəri-əla.

Əzancümlə olursa Şuxiyi-mücrim də azadə,
Nigahınla tərəhhüm etsən, ey sərdəftəri-əla[392].

Qəzəli-Şuxi:

Hər təbəssüm ki, gər ol lə'li-şəkərxəndə edər,
Özünə yüz dili-şeydanı o dəm bəndə edər.

Toxuna zülfünə nagah nəsimi-səhəri,
Ənbərəfşan qılır, əqli pərakəndə edər.

Pərtövi-bərq ilə pəjmürdəvü suzan kəs tək
Hər nigahında məni ol ruxi-tabəndə edər.

Edəsən ruyinə nəzzarə hər an dəm guya
Qeyri bir hissi-novicad nigarəndə edər.

Aparır huşumu məstanə dönüb baxması,
Hər zaman naz ilə ol sərv xuraməndə edər.

Firqətindən gözüm ol novgüli-şirindəhənin
Əşkini əbri-baharan kimi barəndə edər.

Şuxiya, vəqti-həlakımda yetən dəm ləbdən
Zində bir busə ilə büti-nazəndə edər[393].

Əşarü kəlamından mə'lum olur ki, mərhum Mustafa ağa ziyadə dindar və millət təəssübü çəkən bir vücud imiş. Mustafa ağa vəfat edibdir Nuxa şəhərində 1312-ci tarixi-islamiyyədə cəmadiyüləvvəl ayında ki, tarixi-məsihiyyənin 1895-ci sənə oktyabr ayına mütabiqdir[394].

Yenə baniyi-dini-mübinimiz olan Xatəmün-nəbinin şə'nində yazıbdır:

Sənə, ey nur, əyan xəlqi-cahan maildir,
Səndəki cəm'i-kəmalatə qamu qaildir.

Əqli-küll mənzəri[395]-zati-şərəfayinindir,
Cümlə övsaf vücudunda sənin kamildir.

Filisufani-cahan hərçi ki, tərqim edələr,
Qeyri əqvali-şəfabəxşin ola, batildir.

Xələli-izzətü namusuna kim qəsd qıla,
Nəssi-qate' onu cərh etmək üçün maildir.

Özünə gülşəni-kuyindən alıb daneyi-töxm,
Hər ülum üzrə ki, hər kim görünür, fazildir.

Ey şəhənşahi-cahan, lütfi-cahanpirayən
Cümlə fərqi-səri-məxluq üzərə şamildir.

Tövfi-kuyində süfufati-məlayik şəbü ruz
Dərgəhində həmə məxluqi-cahan saildir.

Kim ki, ixlasın ilə qılmaya pürnur dilin,
Sərnigun çahi-zəlalətdə qalıb, qafildir.

Sahiba, Şuxiyi-pürcürm hesab eylər özün
Lütfi-ami-dəri-şahənşəhinə naildir.[396]



# MOLLA MƏHƏMMƏD "HÜZNİ"

Molla Hacıbaba oğlu "Hüzni" təxəllüs Nuxa şairlərindən biri hesab olunur. Molla Məhəmmədin əsli Küngüt qəryəsindəndir. Atası Hacı əfəndinin dəxi təb'i-şe'riyyəsi varmış. Molla Məhəmməd öz sə'yi ilə bir qədər elmü mə'rifət kəsb edib prixod mollalığına[397] tə'yin olunubdur və mollalıq ilə güzəran edərmiş. Asudə vaxtını şe'r söyləməyə sərf edərmiş. Əsərlərindən [ki], ibarət ola təbrikna'mə, mərsiyə, tə'rifnamə, qəzəliyyat və sair inşaat ənva'ından, bir divan tərtib olunubdur.[398] Molla Məhəmməd Hüzni vəfat edibdir 1309-cu tarixdə (1822) vəba naxoşluğundan.

Əsərlərindən bə'zi nümunə olaraq burada təhrif olundu:

Həqqi tövhid qılıb qail olan mizanə,
Eylər iqdam necə şurü şər'ü üsyanə?!

Etsə Qur'anə əgər taət əhli-Qur'an,
Kafiran rəğbət edib tabe olar Qur'anə.

Etsə göftarına kirdar güruhi-üləma.
Əmri-həqdən cühəla bir qədəm olmaz yanə.

Qövli-həqdir ki, təsəllüt bulamaz düşməni-həq
Şəri-Məhmudi tutub taət edən yəzdanə.

Rəhnüma olmasa həmsayə, xəyanət edəməz,
Kimsəyə rah bulub, cür'ət edib biganə.

Eylə hər ləhzə həzar bir bəşərin şərrindən –
Kim olubdur sən ilə həmnəfəsü həmxanə.

Hüzniya, ta əbəd ənduhü qərabət görəməz,
Kim təvəkkül edə ixlas ilə həq sübhanə.

Bu kəlamda şairin artıq bir elmi və təb'i-şe'riyyəsi görünmədiyindən maəda, onun fikirlərində dəxi bir növ' kəclik və zəf müşahidə olunur. Məsələn, bu beytdə:

Eylə hər ləhzə həzər bir bəşərin şərrindən –
Kim, olubdur sən ilə həmnəfəsü həmxanə.

Burada aşkardır ki, həmnəfəs və həmxanədən ibarət kişinin əyalıdır. Vəqta ki, kişi öz əyalını sevməyib, ona bavər etməyə və hər dəqiqədə ondan ehtiyatda olub, özünü onun şərrindən qoruya, onda belə əyal ilə nə

növ' güzəran etmək olar və belə xanədə rahatlıq və könül xoşluğu ola bilərmi? Bu nə fəsad fikirdir ki, şair qeyrilərin də qəlbinə bunu ilqa eləyir?

Beş vaxt namazın övsafında deyibdir:

Hər kora sadiq olan də'vayi-imandır namaz,
İmtisali-əmri-həq sübhanə bürhandır namaz.

Gərçi bəs islamdə taatü ehsanat var,
Əfzəli-məcmueyi-taatü ehsandır namaz.

Cümlə ədyanın kitabında namaza əmr var,
Bir mücərrəd sanma kim, fərmani Qur'andır namaz.

Dini islamın sütunu şövkətü arayişi,
Məzhəri-hüsnü rizayi-fəzli-yəzdandır namaz.

Səddi-rahi-əhrimən, rövşəngəri-mir'ati-dil,
Baisi-rizqi-firavan, qüvvəti-candır namaz.

Nəfsi bədkirdara tabe, fasiqə düşvardır,
Salehü münqadi-əmri-həqqə asandır namaz.

Aləmi-zahirdə beynəlxalq mümtaz olmağa
Qeyri millətlərdən asari-müsəlmandır namaz.

Şiveyi-taatü məcmu'i-məlayik surəti,
Pişeyi-əhli sülukü rahi-ürfandır namaz.

Cümlə ə'za ilə durmaqdır hüzuri-xaliqə,
Bir nə ancaq sanma kim, tə'dili-ərkandır namaz.

Məzhəbi-islamdə bir gülsitani-basəfa
Gahbigah anda bir bubürdi-xoşxandır namaz.

Taətü təqvayə gün-gün rəğbətü pərva verib,
Nəhy edib rahi-mənahidən, nigəhbandır namaz.

Olsa kim cuya behiştə rəhnümayi-mö'təbər,
Rəhnümayi-gülşəni-cənnatü rizvandır namaz.

Mucibi-tənzimü təkrimi-bəni-növ'i-bəşər,
Cümleyi-taat ilə mizanda yeksandır namaz.

Qəbrdən mizanə qalxarkən olub əmri-xuda,
Əhli-islamın üzündə nuri-tabandır namaz.

Hüzniya, ancaq müvəqqət fərzlərdən maəda
Dərgəhi-izzətdə məqbul olsa, pünhandır namaz.



Elm və ədəb babında deyibdir:

Əşrəfül-xəlq olmağa bais bəşər elmü ədəb,
Hadiyi-rahi-riyazi-dadgər elmü ədəb.

İstəsən dünyavü üqba izzü rif'ət xəlq ara,
Eylə hasil, sə'y edib şamü səhər elmü ədəb.

Malü mənsəb sahibin eylər bəlayə mübtəla.
Sahibin amma bəladən hifz edər elmü ədəb.

Qəm deyil, olmazsa dünya dövlətindən dövlətin,
Olsa gər sərmayeyi-əqlü hünər elmü ədəb.

Ehtiram eylər ümumən pirü bürnayi-cahan,
Kim ki, olmuşdur ona deyhimi-sər elmü ədəb.

Sün'i-qüdrətdən tikilmiş gülşəni-aləmdədir
Bir nihali-barvər peyvəstətər elmü ədəb.

Eylə kuşiş, etməyib bir an təğafül, Hüzniya,
Rövnəqidir bəzmgahi-xeyrü şər elmü ədəb.

Peyğəmbərimizin şə'nində deyibdir:

Ey vücudun rövnəqi-nüzhətgəhi-darüssəlam,
Zayiri-firdovsi-kuyindir məlayik sübhü şam.

Yömni-təşrifi-qüdumundan bulub fəzlü şərəf,
Kəbeyi-əşrəf olubdur qibləgahi-xasü am.

Nuri-aləmgiri-xurşidi-cəmalın eşqinə
Buldu aləm dərgəhi-izzətdə izzü ehtiram.

Xilqəti-əflakdəndir gövhəri-zatın qərəz,
Tövfi-kuyindir təvafi-beytdən məqsudi-tam.

Bir imarətdir ki, darül-əmin-şəri-ənvərin,
Rəxnə bulmaz, olsa min tufan ilə yövmül-qiyam.

Olsa lütfün, bir bəni-adəm yaxılmaz atəşə,
Xassə bir adəm ki, dər nami-şərifində bən'am*

Rahi-şərin tut həmin salari-dinin Hüzniya,
Etdiyin rahi-mənahidə təkapudur tamam.

* Şairin özünə işarədir, çünki öz adı da Məhəmməddir.

## MƏHƏMMƏD "ŞƏMƏMDUZ"

Çarıqçı Məhəmməd ibn Səlman "Şəməmduz" təxəllüs dəxi Nuxa şüəarsı silkindən olub, bə'zi əş'arü kəlamı ilə şöhrət kəsb etmişdir. Məhəmmədin sən'əti çarıqçılıq olub, fəqir halında güzəran edərmiş. Çarıqçı şairin, əlbəttə, o qədər təvanası olmayıbdır ki, özünə lazımınca elmü savad qazansın, amma bir az oxumaq-yazmaq öyrənib, yenə öz sən'ətinə məşğul olubdur. Amma xudadadi iste'dadı və təbiəti-şe'riyyəsi olduğuna binaən, macalı olduqca bə'zi ittifaqlara nisbətən şe'rü qəzəl söyləmiş. Onun əsərlərindən bir parası nümunə üçün burada zikr olunur:

### QƏZƏL

Çün qəza tiri səni etdikdə nişan, ağlama!
Bax, əlacın var isə, tut qarşı qalxan, ağlama!

Çərxi-kəcrəftar özü sən kimi bir məxluqdur,
Sən də qıl öz dərdinə hər dəmdə dərman, ağlama!

Aşiqi-sadiq olan hər dərdə[399] qatlanmaq gərək,
Səbr qıl, səbr əhlinə yavəri-sübhan, ağlama!

Tab qıl, ol Qeys tək Leyladən ayrı düşmüsən,
Olmadın Məcnun kimi səhrada üryan, ağlama!

Ey həkima, ibrət al hər dəm baxıb pərvanədən,
Aşiqin olmaq gərəkdir bağrı suzan, ağlama!

Həqqin "üsrən yüsrən"[400] hökmün hər zaman sən yad qıl
Pak "ələm nəşrəh"dədir[401] bu əmri-yəzdan, ağlama!

Aqilü huşyar olan etmək gərək sirrin nihan,
Öldürür bu qəm səni, bihudə pünhan, ağlama!

Hər görən insanı dost sanma, cahanda aqil ol,
Nari-neyrandan betərdir təni-düşman, ağlama!

Sən vüqar ilə qəmi-hicranı çək, kamildən ol,
Saxla sirrin, etmə şikvə, gəzmə hər yan ağlama!

Yetmədi məqsudinə bir kəs riyazət çəkməmiş,
Səbr edib zindanə Yusif oldu sultan, ağlama!

Sor müalic dərdinə bir vaqifi-əsrardən,
Umma nakəs kimsələrdən fəzlü ehsan, ağlama!



Hər nə müşkül dərd olursa, bulunur dərman ona,
Eşq dərdinə müalic olmaz imkan, ağlama!

Görmədim mən bir rəfiqi e'tibarı var ola,
Qalmayıb aləmdə heç bir əhdü peyman, ağlama!

Ey Şəməmduz, ol xuda müşkülgüşa olmuş bizə,
Necə müşkül karın olsa, eylər asan, ağlama!

Şəməmduzun bu qəzəlindən bir neçə beytlər vəznən səqil gəlməyə görə buraxıldı. Bu kəlamda şairin bir beyti bizə ziyadə xoş gəldi. O da şairlərimizin ümumi adətinə müğayir olaraq çərxi-kəcrəftardan nalə etməyib, onunla müdafiə qılmağı tövsiyə etməyidir. Necə ki, şair deyibdir:

Çərxi-kəcrəftar özü sən kimi bir məxluqdur,
Sən də qıl öz dərdinə hər dəmdə dərman, ağlama!

Bu məzmunda şe'ri əvvəlinci dəfədir ki, bizim şüəralardan biz eşidirik. Adətən onların çoxusu, bəlkə hamısı, "çərxi-kəcrəftar"dan şikayət edib, naləvü fəryad edirlər və öz təqsirlərini, kəmcür'ət olmaqlarını bilkülliyyə "çərxi-kəcmədar" kimi adı var, özü yox olan şey'in üstə həvalə edib yüz dil ilə ondan şikayət edirlər.

Dostlarından "Nasir" təxəllüs bir şairə yazıbdır:

Mən sanırdım, nasir, səni dərdmənd,
Bu aləmdə hər bir dili qanmısan!
Bir gül idin [sən] ol şe'r bağında,
Mart ayında bir qar yağıb, yanmısan.

Aşiq gərək ah edəndə qan tökə,
Bir məsəldir: nər yükünü nər çəkə,
Yazmış idim neçə kəlmə məzhəkə,
Nə şairsən, məzhəkədən sönmüsən?!

Sınan kimsə neçün girər meydana,
Şair gərək hər nöqtədən şey qana,
Piri-müğan gərək duraq divana,
Zərafəti ləntəranə salmısan.

Onun üçün tə'nə yazırsan mana,
Bundan sora sataşmaram mən sana,
Tap, ver oxut dilbilən yoldaşına,
Zənnin itib sən qəmə boyanmısan.

Hər bəzmdə ariflikdən dəm vuran,
Bais nədir oldun belə bədgüman?!
Sitareyi-sübh ilə karvan qıran,
Fərq etməyib bixəbər oyanmısan.

Çox iş gəlir eşq əhlinin başına,
Aşiq gərək sui-zəndən daşına,
Çatdırmısan sinni əlli yaşına,
Zaye' qılıb bihudə dolanmısan.

Şəməmduzam, baxmaram hər kəlama,
Şair gərək düzə nəzmi nizama,
Aşiqdə səbr olur yetincə kama,
Rəfiq ikən rəqibə inanmısan.

Şəməmduz cavan ikən – otuz iki sinnində 1899-cu [il] iyul ayının 4-də Nuxa şəhərində vəfat edibdir.



## MOLLA İBRAHİMXƏLİL "DODUİ"

Nuxa şairlərindən biri də Molla İbrahimxəlil Məhəmməd oğlu "Dodui" və ya "İbrahim" təxəllüsdür. Molla İbrahim Nuxada Dodu məhəllə[sin]dən olmağına görə, təxəllüsünü dəxi "Dodui" qoymuşdur. Mərhum Molla İbrahim ülumi-ərəbiyyə təhsilinə məşğul olub, bu axır vaxtlarda Küdudlu qəryəsində prixod mollalığına tə'yin olunub, ruhanilər silkinə daxil olmuşdur.

Molla İbrahimxəlilin təb'i-şe'riyyəsi olmağa görə, mütəəddid şe'rlər dəxi inşa qılmışdır və lakin əsərləri mürəttəb bir qayda üzrə cəm' olunmayıb, pərişan haldadır. Onlardan ələ düşənlərinin bə'zisi burada zikr olunur:

Eşq bir bəhrdir kənarəsi yox,
Tərki-candan səvayi çarəsi yox.

Dudi-ahim dərundən çəksəm,
Asimanın olur sitarəsi yox.

Qəmi-əyyam dildədir məktub,
Bibəsərlər deyir ki, qarəsi yox.

Nalədən nalə döndü qaməti-rast,
Söylər əmma ki xəlq əmarəsi yox.

Dodui, fal əgər deyil niku,
Səndə ixlasü istixarəsi yox.

Zəkat yığmağa gedən tamahkar bir mollanın haqqında deyibdir:

Aləmdə neçə saili-cərrar görünmüş,
Zənn etmə ki, bir böyləcə idbar görünmüş.

Əhbablığa hiç səlahiyyəti yoxdur,
Fisqi səbəbilə mənə əğyar görünmüş.

İllikdən o yanə olur azuqəsi əfzun,
Çardağına get, bax neçə xarvar görünmüş.

Anınla nə ruyənlik edir gör ki, qəryədə,
Hətta dedilər qəryeyi-küffar görünmüş.

O yan Babaratma, bu yanı Dəhnəçapağan,*
Cümlə nəzəri-xəlqdə murdar görünmüş.

* Dəhnəçapağan, Babaratma – kənd adlarıdır

Kim sehrinə pabəstədi, tə'vizinə kim ram,
Bir nəf' zühur eyləmədi, zar görünmüş.

Söylərlər onun təntənəsi vəsfini bihəd,
Bu halla yox bir fərəci, xar görünmüş.

Həq verdiyi ənva'yi-niəm var ikən onda,
Bişərmliyi aləmə izhar görünmüş.

İqrari-qüsur eyləməz əsla o həyasız,
Yox sidqi, bütünlük ona hər bar görünmüş.

Hər qədr yığa, söyləyəcək: – Olmadı bir şey,
Bir dəfə onun adəti inkar görünmüş.

Burada şayani-diqqət olan budur ki, molla özü öz həmsinfinin bişərm, həris və tamahkar olmağına iqrar edib deyir ki, molla qismi nə qədər sədəqə, ehsanat və zəkat yığsa da, yenə söyləyəcəkdir ki, bir zad olmadı, çünki əvvəldən onun təbiətü adəti haqqı inkar etmək olubdur. Burada dəxi cəm' etdiyini hökmən gərəkdir inkar etsin.

Nəti-rəsulüllah:

Lisanın nə'tini guya deyildir, ya rəsulüllah,
Səzayi-dərgəhindir, ya deyildir, ya rəsulüllah!

Budur mənzur əltafi-xudadən eyləyə tövfiq –
Ki, mir'ati könül icla deyildir, ya rəsulüllah!

Həvayi-nəfsi zülmat içrə bir gəz əql şaşmışdır,
Hərimi-vəsfinə bina deyildir, ya rəsulüllah!

Səmavat ilə ərz onlarda hər nə var mövcudat,
Biri yox nurdən peyda deyildir, ya rəsulüllah!

Zülali-ləblərin sihhətfəzayi-dərdi-üsyandır,
Onun tək səlsəbil əhli deyildir, ya rəsulüllah!

Civari-kuyi-rövzən bir müəmma, sirri-bitimsal –
Ki, manəndi onun mə'va deyildir, ya rəsulüllah!

Dəmi-fəryadrəslik Doduiyə lütfün izhar et,
Günahın qabili-də'va deyildir, ya rəsulüllah!



Əyzən kəlami-Dodui:

Dedim: – Könül, səni bu halə dərdi-yar salıb?
Dedi: – Bəli, bəli, əlbəttə, bir nigar salıb.

Dedim: – Bu ahü ününə səbəb nədir şəbü ruz?
Dedi: – Bu sineyi-pürdərdə yar nar salıb.

Dedim: – Xəzan dəmidirmi belə pərişansan?
Dedi: – Fəraq qəmi, nə xəzan, bahar salıb.

Dedim ki, səbrü qərar ilə həll olur müşkül,
Dedi ki, zülfi-siyahi biixtiyar salıb.

Dedim ki, ey güli-tazə, nədir bu cövrü cəfa?
Dedi ki, böylədir adət ki, ruzigar salıb.

Dedim: – Bu hüsndə Yusifmisən, Züleyxasən?
Dedi: – İkisi bərabərcə yadigar salıb.

Dedim ki, lərzə salıb canə səfi-müjganın,
Dedi: – Nə bircə səni, çoxları fikar salıb.

Dedim: – Bu möhnəti hicranə yoxmu bir əncam?
Dedi: Nə çarə qəzayə ki, girdgar salıb.

Dedim: – Doduiyə bais olan ədavət nə?
Dedi: – Əbəs deyil, əlbəttə, vəchi var, salıb.

Molla İbrahimxəlil Dodui vəfat edibdir 1900-cü sənədə. Vəfatı vaxtı qırx yaşında imiş.

# İSMAYIL BƏY "NAKAM"

Nuxa şairlərinin ən məşhuru və müqtədiri İsmayıl bəy Nakamdır. İsmayıl bəyin atası mərhum Hacı Məhəmməd bəydir. Məşhur Hacı Sədrəddin bəyin nəslindən olmağa görə, familiyası Sədrəddinbəyovdur. İsmayıl bəy Nakam tarixi-hicriyyənin 1257-ci[402] sənəsində təvəllüd edibdir. Mərhum qırx yaşına qədər dövlətli və əmlak sahibi – mülkədar olub mürəffəhül-hal güzəran edirmiş və laikn qırx yaşından sonra dövlətü əmlakı getdikcə əlindən çıxıb məişəti genişlikdən darlığa – yüsrətdən üsrətə mübəddəl olubdur və axiri-ömrünü əlində baqi qalan bir para xırda mülkdən gələn cüz'i mədaxil ilə keçirərmiş.

Mərhum İsmayıl yaxşı məlumat sahibi olub, ürəfaməslək, xoşxülq və xoşrəftar bir vücud idi. Tamami-Şəki mahalında əvvəlinci şair hesab olunur. Əsərlərindən üç böyük divanı vardır ki, onlardan biri "Gənci ədəb" namilə məşhur və otuz bir məqalədən ibarət bir kitabdır.[403]

Nakamın əlimizə düşən əsərlərindən[404] görünür ki, onun çox açıq və rəvan təb'i varmış. Onlardan bir neçəsi burada nümunə üçün zikr olunur.

Qəzəliyyat:

Keçindin aləmi-heyrətdə, ey dil,
Keçirdin ömrünü qəflətdə, ey dil!

Görüb bu aləmi-adəmfəribi
Unutdun əhdi bir röyətdə, ey dil!

Fəraqət hasil et, tərki-səva qıl,
Yetər ah etdiyin möhnətdə, ey dil!

İrişdi aşiqan yeksər vüsalə,
Həmin sənsən qalan firqətdə, ey dil!

Mücərrəd ol, mücərrəd ol da, gör də
Nələr var guşeyi-vəhdətdə, ey dil!

Həzaran dərdi-ruhazar çəkdin,
Yenə töhmətdəsən, töhmətdə, ey dil!

Olub nakamə dil Nakam oldun,
Yaxıldın atəşi-həsrətdə, ey dil!

Əyzən qəzəli-Nakam:

Fəğan ki, künhi-qəmi-can bilinmədi, qaldı,
Təvəqqeyi-dili-nalan bilinmədi, qaldı.



Simati-dəhrdə[405] hər kəs nəsibini buldu,
Nəsibi-zümreyi-rindan bilinmədi, qaldı.

Cəfayi-firqəti-canan bilindi muybəmu,
Səfayi-vəsl kəmakan bilinmədi, qaldı.

Cahanda hər mərəzə bir əlac olub peyda,
Fəraq dərdinə dərman bilinmədi, qaldı.

Kitabi-eşqdə dərki-üqul əcz bulub,
Həzar nükteyi-pünhan bilinmədi, qaldı.

Bilindi qisseyi-aləm səbahi-həşr oldu,
Hekayəti-şəbi-hicran bilinmədi, qaldı.

Kimin əsiri, kimin namuradiyəm, Nakam,
Nədir bu etdiyim əfğan bilinmədi, qaldı.

Bu qəzəldə bir para iradlarımız var ki, onları aşkar etməyə məcburuq. Əvvəlinci beytdə "künhi-qəmi-can" ğərib əlfazlardan olmağa görə, qulağa ağır gəlir və mə'nası dəxi bir az çətin anlaşılır. "Künhi-qəmi-can" yə'ni nə? Qəmin də künhü olarmı? Qəm, qüssə, hüzn, ələm və həmçinin fərəh və şadlıq ruha məxsus olan halətlərdir ki, bə'zi zahiri illətlər onların ruhda və qəlbdə vüqua gəlməsinə səbəb olur və bu halətlərin altı, üstü, künhü və əsli cüz'i və külliyyəsi olmaz. Bu halətlər çəkiyə və ölçüyə gələn şeylər deyil. Ona görə "künhi-qəm" deməsi dəxi dürüst deyil. "Can" sözü dəxi artıqdır və öz yerində iste'mal olunmayıbdır. Çünki mə'lumdur ki, qəm ancaq canda, ürəkdə olur, özgə bir üzvdə, məsələn, başda, əldə və ayaqda onun olması qeyri-mümkündür. Belə olan surətdə onun təkrarı əbəsdir və habelə əvvəlinci beytin ikinci misrasında (Təvəqqeyi-dili-nalan bilinmədi, qaldı...) "təvəqqeyi-dil" sözləri ədəbiyyatda az işlənən və bəlkə işlənməyən sözlərdir. "Təvəqqe"nin əvəzinə "arizuyi-dil", "təmənnayi-dil", "hali-dil" kimi kəlmələrdən birisi qoyulsaydı, şe'rdə eyib olmazdı. Mə'nayi-kəlamı vəznü qafiyəyə qurban etmək dürüst deyil.

Nakamın Füzuli əleyhirrəhməyə yazdığı nəzirə onun dilpəzir və mərğub kəlamlarından birisidir:

Kuyi-nigarə duş gedib eylədim büka,
Guş eyləyib fəğanımı ol türki-dilrüba,
Dərdimi bildi, heyrətimi gördü cabəca,
Rəhm etdi halıma dedi: – Ey ərseyi-bəla,
Kim eyləmiş bu dərdə səni mübtəla? Dedim:
– Mən bilməm özgə, aşiqi-heyranınam sənin.

Ol sərvqəd eylər ikən gəşt gülşəni,
Fərş olmuş idi məqdəminə aşiqan təni,
Xak üzrə sayəvar görüb nagəhan məni,
Xəm qəddimə baxıb dedi: – Ey piri-münhəni,
Qəddi-xəmin bu günə nədəndir düta? Dedim:
– Həmmali-bari-möhnəti-hicranınam sənin.

Əfzun olub fəraq qəmi, səbr olub məhal,
Canü tənimi axır edib fədyeyi-vüsal,
Getdim minayi-kuyinə, ol mahi-bizəval
Qeydi-bəladə gördü məni, eylədi sual:
– Kimdir bu bəstə, kimə gəlibdir fəda?[406] Dedim:
– Kuyində zəbih qıl məni, qurbanınam sənin.

Dildə fəraq atəşi etdikcə iştidad,
Dil eyləyib bükayə şəban-ruz ictihad,
Çeşmim yeritdi aləm ara əşki-xunzad,
Axır görüb bükamı dedi ol pərinijad:
– Vəchi nədir bu rütbə edərsən büka? Dedim:
– Dilrişi-nişi-navəki-müjganınam sənin.

Şiddət bulub könüldə təəşşüq əsərləri,
Çevrəmdə huyü hal ilə ətfal ləşkəri,
Çəkdi hərimi-yarə məni eşq rəhbəri,
Əhvalımı xərab görüb dedi ol pəri:
– Divanəsən, nəsən, nə olubdur sənə? Dedim:
– Məftuni-çeşmi-sahiri-fəttanınam sənin.

Əfşan edib səlasilin ol şahi-şahidan,
Qıldı nəzərə canibi-üşşaqə bir zaman,
Zənciri-mə'nəvidə məni gördü nagəhan,
Xəndan sual edib dedi: – Ey aşiqi-novan,
Söylə nədir bu silsilədə macəra? Dedim:
– Dilbəsteyi-səlasili-əfşanınam sənin.

Oldum təriqi-eşqdə Nakami-namdar,
Nakamlıqda aləm ara buldum iştihar,
Nakam olduğum olub axır yəqini-yar,
Bir gün edib hüzur dedi ol mələküzar:
– Nakamsan nə vaxtdan, ey binəva? Dedim:
– Ta kamcuyi-vəsləti pünhanınam sənin.

Nakamın Füzuliyə nəzirə olaraq tənzim qıldığı bu tərcibəndi şairin rütbeyi-kəlamını və fünuni-şe'rdə olan məharət və qabiliyyətini göstərir. Bu kəlamda elə fərdlər var ki, ən böyük türk şairlərinin kəlamından onları ayırıb tərcih vermək mümkün deyil. Məsələn, şairin vəsf qıldığı "türki



dilrüba" zülflərin pərişan edib, üşşaqlara bir nəzər yetirib və zənciri-mə'nəvidə şair[i]görüb, təbəssüm ilə onun əsiri-silsilə olmağının macərasını istifsar qılmağı və aşiqi-biçarənin ona cavabını elə zərifanə rişteyi-nəzmə çəkibdir ki, hər kəsə onun tə'siri zövqü fərəh yetirir:

Əfşan edib səlasilin ol şahi-şahidan,
Qıldı nəzərə canibi-üşşaqə bir zaman,
Zənciri-mə'nəvidə məni gördü nagəhan,
Xəndan sual edib dedi: – Ey aşiqi-novan,
Söylə nədir bu silsilədə macəra? Dedim:
– Dilbəsteyi-səlasili-əfşanınam sənin.

Bu müsəddəs-tərcibəndin tamam bəndü hissələri bir-birindən məqbul və müstəhsəndir. Nakamın İbrahim Həqqi həzrətlərinin bir misrasını mütəzəmmin inşa qıldığı tərcibənd dəxi şayani-diqqəti-əhli-ürəfa və şüəra olduğundan burada eyni ilə təhrir olunur:

Ol dəmdə kim, ədəmdə vücudim nihan idi,
Birəng idim, qərargəhim binişan idi,
Şə'nim şükuhi qibtəgəhi-qüdsiyan idi,
Zülfi-nigar mürği-dilə aşiyan idi,
Bağı-səfadə bülbüli-can nəğməxan idi,
Canana can, dilbərə dil mehriban idi,
Vəslətdə idi canü könül, şadiman idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Nə qifli-"nun" güşayişinə "kaf" olub kilid,
Nə eyləmişdi aləmi-imkani müstəfid,
Nə əql idi mükəlləf, nə nəfs idi ənid,
Nə vədə dilgüşa idi, nə qəmfəza vəid,
Nə bimi-dilxəraş, nə canbəxş idi ümid,
Adəm hənuz abü gil içreydi napədid,
Mövcud cümlə müntəziri-kunfəkan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Dərkar olub bu tarimi[407]-niliyyi-nöhqübab?
Ta olmamışdı ünsüri-əcsam feyzyab,
Əhdi-şəbab keçmək üçün ömr edib şitab,
Fövt olmayırdı dəbdəbeyi-mövsümi-şəbab,
Mülki-vücudi qılmağa seyri-fəna xərab,
Dövr etməyirdi aləmi-hey'ətdə inqilab,
Mahiyyəti-vücudə qədr pasiban idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Ol sərvqəd eylər ikən gəşt gülşəni,
Fərş olmuş idi məqdəminə aşiqan təni,
Xak üzrə sayəvar görüb nagəhan məni,
Xəm qəddimə baxıb dedi: – Ey piri-münhəni,
Qəddi-xəmin bu günə nədəndir düta? Dedim:
– Həmmali-bari-möhnəti-hicranınam sənin.

Əfzun olub fəraq qəmi, səbr olub məhal,
Canü tənimi axır edib fədyeyi-vüsal,
Getdim minayi-kuyinə, ol mahi-bizəval
Qeydi-bəladə gördü məni, eylədi sual:
– Kimdir bu bəstə, kimə gəlibdir fəda?[406] Dedim:
– Kuyində zəbih qıl məni, qurbanınam sənin.

Dildə fəraq atəşi etdikcə iştidad,
Dil eyləyib bükayə şəban-ruz ictihad,
Çeşmim yeritdi aləm ara əşki-xunzad,
Axır görüb bükamı dedi ol pərinijad:
– Vəchi nədir bu rütbə edərsən büka? Dedim:
– Dilrişi-nişi-navəki-müjganınam sənin.

Şiddət bulub könüldə təəşşüq əsərləri,
Çevrəmdə huyü hal ilə ətfal ləşkəri,
Çəkdi hərimi-yarə məni eşq rəhbəri,
Əhvalımı xərab görüb dedi ol pəri:
– Divanəsən, nəsən, nə olubdur sənə? Dedim:
– Məftuni-çeşmi-sahiri-fəttanınam sənin.

Əfşan edib sələsilin ol şahi-şahidan,
Qıldı nəzarə canibi-üşşaqə bir zaman,
Zənciri-mə'nəvidə məni gördü nagəhan,
Xəndan sual edib dedi: – Ey aşiqi-novan,
Söylə nədir bu silsilədə macəra? Dedim:
– Dilbəsteyi-sələsili-əfşanınam sənin.

Oldum təriqi-eşqdə Nakami-namdar,
Nakamlıqda aləm ara buldum iştihar,
Nakam olduğum olub axır yəqini-yar,
Bir gün edib hüzur dedi ol mələküzar:
– Nakamsan nə vaxtdan, ey binəva? Dedim:
– Ta kamcuyi-vəsləti pünhanınam sənin.

Nakamın Füzuliyə nəzirə olaraq tənzim qıldığı bu tərcibəndi şairin rütbeyi-kəlamını və fünuni-şe'rdə olan məharət və qabiliyyətini göstərir. Bu kəlamda elə fərdlər var ki, ən böyük türk şairlərinin kəlamından onları ayırıb tərcih vermək mümkün deyil. Məsələn, şairin vəsf qıldığı "türki



dilrüba" zülflərin pərişan edib, üşşaqlara bir nəzər yetirib və zənciri-mə'nəvidə şair[i]görüb, təbəssüm ilə onun əsiri-silsilə olmağının macərasını istifsar qılmağı və aşiqi-biçarənin ona cavabını elə zərifanə rişteyi-nəzmə çəkibdir ki, hər kəsə onun tə'siri zövqü fərəh yetirir:

Əfşan edib sələsilin ol şahi-şahidan,
Qıldı nəzarə canibi-üşşaqə bir zaman,
Zənciri-mə'nəvidə məni gördü nagəhan,
Xəndan sual edib dedi: – Ey aşiqi-novan,
Söylə nədir bu silsilədə macəra? Dedim:
– Dilbəsteyi-sələsili-əfşanınam sənin.

Bu müsəddəs-tərcibəndin tamam bəndü hissələri bir-birindən məqbul və müstəhsəndir. Nakamın İbrahim Həqqi həzrətlərinin bir misrasını mütəzəmmin inşa qıldığı tərcibənd dəxi şayani-diqqəti-əhli-ürəfa və şüəra olduğundan burada eyni ilə təhrir olunur:

Ol dəmdə kim, ədəmdə vücudim nihan idi,
Birəng idim, qərargəhim binişan idi,
Şə'nim şükuhi qibtəgəhi-qüdsiyan idi,
Zülfi-nigar mürği-dilə aşiyan idi,
Bağı-səfadə bülbüli-can nəğməxan idi,
Canənə can, dilbərə dil mehriban idi,
Vəslətdə idi canü könül, şadiman idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Nə qifli-"nun" güşayişinə "kaf" olub kilid,
Nə eyləmişdi aləmi-imkani müstəfid,
Nə əql idi mükəlləf, nə nəfs idi ənid,
Nə vədə dilgüşa idi, nə qəmfəza vəid,
Nə bimi-dilxəraş, nə canbəxş idi ümid,
Adəm hənuz abü gil içreydi napədid,
Mövcud cümlə müntəziri-kunfəkan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Dərkar olub bu tarimi[407]-niliyyi-nöhqübab?
Ta olmamışdı ünsüri-əcsam feyzyab,
Əhdi-şəbab keçmək üçün ömr edib şitab,
Fövt olmayırdı dəbdəbeyi-mövsümi-şəbab,
Mülki-vücudi qılmağa seyri-fəna xərab,
Dövr etməyirdi aləmi-hey'ətdə inqilab,
Mahiyyəti-vücudə qədr pasiban idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Nə intizam bulmuş idi nəzmi-kainat,
Nə olmuş idi zatə ə'ta kisveyi-sifat,
Nə gəlmiş idi zahirə eyni-təəyyünat,
Nə kambəxş vəsl idi abayə ümməhat,
Nə kəşf idi nükati-müəmmayi-hadisat,
Nə əql idi məşvəşi-rəmzi-təəllüqat,
Nə dil səqimi-kəşməkeşi-inü an idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Xoş ol zaman ki, aşiqi-gümnam idi könül,
Varəsteyi-təəllüqi-övham idi könül,
Dərbəndi-çini-zülfi-siyəhfam idi könül,
Gəh saqi, gəh şərab, gəhi cam idi könül,
Pərvərdeyi-sükun idi, aram idi könül,
Bəzmi-vüsali-yardə nakam idi könül,
Peyvəstə səbzü xürrəmü kamran idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Ta gəlməmişdi mövsümi-həngameyi-ələst,
Zərrat idi müəzzəzü məs'udü həqpərəst,
Səngi-qürur şişeyi-əhdi qılıb şikəst,
Qədri-bülənd ruh hənuz olmamışdı pəst,
Damani-vəsli-şahidi-mə'na idi bədəst,
Qılmışdı canı şərbəti-didari-yar məst,
Gərm idi bəzm, sağəri-mey dər miyan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

İrdi zəmani-zilləti-hicran ehtiqar,
Tərkib olundu qeydimə bu ünsüri hisar,
Bu məhbəsi-küdurətə naçar edib güzar,
Nakam gəldim aləmi-nasutə xarü zar,
Getdi əlimdən axır o rif'ət, o e'tibar –
Kim, bulmuş idim ərseyi-lahutdə qərar,
Bir adəm idim onda məqamım cinan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Bu tərcibənddə Nakam xilqətdən müqəddəm ədəm aləmini və vücudun haman aləmdə nihanü birəngü binişan olmaqlarını dərxatir edib, cümleyi-mövcudatın hökmi-qadiri-əzəli "kunfəyakun"ə müntəzir olmaq dəmlərini və zamanını arzu eləyir.

Ol zamanü dəmlərdə vücudun rütbəsi artıq idi, şə'nü şükuhu qibtəgeyi-qüdsiyan idi. Zülfi-nigarda könül quşu aşiyan tutub baği-səfadə bülbüli-can xoş nəğmələr oxuyub, vəslində könül şadiman idi. Ol dəmlərdə ki, aləmi-imkan hənuz xəyallardan uzaq idi, nə ağıl mükəlləf olmuşdu və nə də nəfs ənidvar idi, nə vədə dilgüşa idi, və nə vəidin qəmi çəkilirdi. Nə



qorxu var idi və nə ümidi-həyatabəxş ilə könül şad olurdu. Ol zamanda vücudi-adəm abü gil içrə napədid idi və ol vücuda qədər özü pasiban olub, dövri-fələk onu fəna seyli ilə xərab etməyə mane olurdu.

Ol zamanda intizami-aləm bir qayda təhtinə girməmişdi, zatə kisveyi-sifat ə'ta olunmamışdı, aba ilə ümməhat vəsldən kəmyab olmamışdı, müəmmayi-hadisat kəşf olunmamışdı, vücudi-insan nəfsi-əmmarə əlində əsirü sərgərdan deyildi, azadə idi. Həngameyi-ruzi-ələstdən hənuz bir xəbər yox idi, məğrur, məs'ud, həqpərəst olan ancaq zərrat idi, səngi-qürur dəxi şişeyi-əhdin şikəst etməmişdi və ruhi-insan bə'zi təəllüqat ilə pabəst olmayıb keşməkeşi-dünyadan və ənva'yi-qeydlərdən azadə, bülənd məqamda pərvaz edirdi. Hal bu üzrə ikən zillət və aşüftəlik zamanı irişdi və vücudi-insanı qeyd etmək üçün min cür'ə riştələr və zəncirlər tərkib olundu və şair Nakam dəxi aləmi-nasutə xarü zar gəlib, küdurət məhbəsində əsir və müqəyyəd oldu. Ərseyi-lahutda bulduğu rif'ət və e'tibarı itirib mə'yus qaldı. Necə ki, şair zəbani-təəssüflə deyir:

İrdi zəmani-zilləti-hicran ehtiqar,
Tərkib olundu qeydimə bu ünsüri-hisar...
Bu məhbəsi-küdurətə naçar edib güzar,
Nakam gəldim aləmi-nasutə xarü zar,
Getdi əlimdən axır o rif'ət, o e'tibar –
Kim, bulmuş idim ərseyi-lahutdə qərar,
Bir adəm idim onda məqamım cinan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Molla Məhəmməd Bağdadi Füzuli dəxi bu mətləb üstündə xeyli gözəl mə'nalar kəlami-bəlağətsənci ilə rişteyi-nəzmə çəkib nəticeyi-kəlamda bu beyti demişdir:

Əlqissə, vücud dami-qəmdir,
Azadələrin yeri ədəmdir[408].

İbrahim Həqqinin bu tərcibəndinə nəzirə olaraq mərhum Hacı Seyid Əzim Şirvani və qarabağlı Məşhədi Əyyub Baki və nuxalı Rəşid bəy Əfəndizadə Şaki "Molla Nəsrəddin" jurnalının ikinci nömrəsində hər birisi məxsus birər tərkibbəndlər yazıbdırlar[409].

Hacı Seyid Əzim ilə Məşhədi Əyyub Baki təsnif qıldıqları kəlam əyyami-şəbablarında dilbəri-dilpəzirin vəsli ilə kamran olduqları dəmləri və zamanlarına xəyala gətirib, o xoş vaxtları həsrət ilə arzu edirlər. Cənab Şaki əsri-səadəti-nəbəvini və zamani-xüləfayi-raşidini həsrətlə

dərxatir edib, müsəlmanların o parlaq vaxtları ilə indiki pərişan hallarını tutuşdurub, öz hüznü məlalını izhar qılır və müsəlmanların o keçmiş pürsütuh və pürşükuh dəmlərini arzu eləyir. Molla Nəsrəddin isə mollaların dilindən söyləyib, keçmişdə onlara nə hörmət və nə izzət edirdilər və onların nüfuzu və ixtiyarı nə dərəcədə ali olduğunu izhar edib, indi o ixtiyaratın fövt olmağını və mollaların hörmətdən düşməyini dərxatir edib həsrət çəkirlər və keçmiş zamanı ahü zar ilə yad edirlər.

Nakam öz günah və təqsiratına müqirr olub, rəhim və mehriban olan haqq-taaladan məğfirət diləyir və onun rəsuli-əkrəmini və xüləfayi-raşidini və on iki imamları zəbani-fəsahətnişanı ilə yad edib, hər birindən ruzi-cəzada kömək istəyir. Nakamın bu qəsidəsi sair kəlamları kimi ən abdar əsərlərindən birisidir:

Mənəm əgərçi o tərdaməni-siyəhkirdar –
Ki, ruzü şəb əməlimdir xətayi-nahəmvar.
Vəli yeganəgiyi-xaliqi-rəvanbəxşə
Dəmi-ələstdə bissidq etmişəm iqrar –
Ki, eybpuş, günəhbəxşdir, qəfurdur o,
Odur həlimü səburü şəkur, odur səttar.
Odur rəhimü qəfurü rəufü heyyü vədud,
Qədimü qadirü qəyyumü vahidü qəffar.
Bir ismi-əzəmi Allahdır, biri rəhman,
Bu iki ismdə min nükteyi-bəş'arət var.
Digər risalətini xatəmün-nəbiyyinin
Ki, ruzi-həşrə odur həm şəfi'ü həm salar.
Edib zəban ilə iqrar, qəlb ilə təsdiq,
Kəminə ümmət olub, olmuşam sədaqətkar.
Həbibi-xaliqi-rəhman nəticeyi-lövlak,
Rəhimi-rəhməti-aləm, Məhəmmədi-muxtar –
Ki, cümlə ümməti-müznіblərin şəfaət edib,
Alıb behiştə gətirmək deyil ona düşvar.
Digər məvəddəti-qürəba, məhəbbəti-əshab
Sədaqəti-şürəfa, həm iradəti-ənsar.
Dilimdə sabit olub, dəmbədəm təzayüd edib
Bəsani-ruh bulubdur, rüsux olub padar.
Ələlxüsus o yarani-bivəfanın kim,
Biri cənab Əbubəkrdir, o sidqşüar.
Təriqi-dində həqqin rizasini gözədüb,
Cəm'ii-mamələkin bəzl qıldı, etdi, nisar.
Həbibi-əkrəmü əfxəm yolunda ğar içrə
Təni-əzizini qıldı fədayi-niştəri-mar.
Biri də həzrəti-Faruqdur ki, ol sərvər
Cahanda qıldı ədalət nə olduğun izhar.
Ucaltdı çar cəhətdə livayi-islami,



Olub da rövnəqi-şərə şüyu', dinə mədar.
Götürdü küfrü cahanda, cahanı pak etdi,
Sipahi-nüsrətəsər sövq edib diyar-diyar.
Biri də həzrəti-Osman cənabi-Zünnureyn –
Kodur rüsumi-vəfada səramədi-ibrar.
Hesab olursa əgər əhdinin fütuhatı,
Dehatü şəhrü qəraya olur həzar-həzar.
Həyavü helm idi ol pakizadə xas ancaq –
Ki baxmaz idi səmayə, edib həyadən ar.
Biri dəxi şəhi-Düldül səvar Əlidir kim,
Bir adıdır Əsədullah, digəri Kərrar.
Məhi-sipəhri-imamət, düri-künuzi-vəfa,
Kilidi-gənci-əmanət, xəzineyi-əsrar.
İmami-cinnü bəşər, şahi övliyadır o,
Müridi-müxlisidir cümlə övliyayi-kübar.
Deyil o kimsədə kim, hübbi-Mürtəza mövcud,
İki cahanda o bədbəxtdir səzayi-təbar.
Digər zəbaneyi-hübbi-əimmeyi-məsum
Dilimdə dağ yıxıb eyləmiş şəqayiq var.
Dilim bu atəşi-hübb içrə dəmbədəm yaxılıb,
Bu kimya ilə olmuş künun tamam əyyar.
Bəli, o kəsdə ki, vardır vidadi-ali-nəbi,
Halaldır ona cənnət, haramdır ona nar.
Bəli, o dildə ki, vardır məhəbbəti-sibteyn,
Səadəti-əzəlidir o hübb, ol asar.
İnayət eylə mədəd, ya Əli ki, bari-günəh,
Qılıb xəmidə məni aləm içrə etmiş xar.
Gözüm piyaləsi dönmüş piyaleyi-zəhrə,
Olub qəmi-Həsəni-Müctəbadən atəşbar.
Necə anıb ləbi xüşkün Hüseyni-məzlumun,
Yıxılmasın cigərim nari-qəmdə leylü nahar.
Çıxarmı xatiri-ümmətdən ol cəfayi-əlim,
Olarmı hiç fəramuş o cövri-dilazar –
Ki, Kərbəladə Hüseyni-şəhidə eylədilər
Fədaiyani-şəqavət müaşiri-füccar.
İmami-çarüm Zeynəlibad eşqindən
Edib fəğan, oluram ta səhər sitarəşümar.
Dilimdə qönçeyi-hübbi-Məhəmmədi-Bağır,
Olub şikiftə, edibdir vücudumu gülzar.
Bu buyi-hübb ilə xaki-məzarım əlyəqdir,
Olursa qibtəgəhi-nafeyi-qəzali-tatar.
Əcəb deyil əsəri-hübbi-Cəfəri-Sadiq
Məni edərsə güli-tazə tək şüküftəüzar.
Təriqi-eşqinə Musayi-Kazimin, billah,
Səzadır olsa dilü canım ər fəda sədbar.
Bərati-hübbi-Əliyyür-Rizayi canımda

Nicati-ruzi-cəzadən çox etmişəm əzxar.
Müjə səfindən ələ abnus əsa almış,
Təvafi-rövzəsi şövq ilə mərdümül-əbsar.
Xəyali-nəti-Məhəmməd təqilədir könlüm,
Dürudxani-Məhəmməd və itrəti-əthar.
Səfayi-eşqi cəmali-Nəqilə bulmuşdur.
Bu ünsüri-qəfəs içrə hümayi-ruh qərar.
Bu ol Əliyyi-Nəqidir ki, xəsmü münkirini
Səni'i-xamə olan nəqşü şir qıldı şikar.
Təəşşüqi-Həsənül-Əskəri [ilə] daim
Fəzayi-şövqdə könlüm neyi-cününə səvar.
Yəli-məhəbbətidir ərseyi-vücudimdə
Müdam ərbədəkarü həmişə nizəgüzar.
Digər Məhəmməd Mehdi, kodur* imami-zaman,
Qüdumuna nigərandır ələddəvam ənzar.
Yolunda verməyə can qalmışam füsuskönan,
Həmarə didə bərəh bil-əşiyyə vəl ibkar.
Dəxili-lütfünüzəm, lütf edin, ey ali-nəbi,
Nəzərdən eyləməyin həşrdə məni də kənar.
Sükut qıl dəxi, Nakam kim açıb sirrin
Ğərib rəngdə qıldın sədaqətin işar.
Bu bəzmi-eşqdə qəmxaneyi-məhəbbətdən
Bəhər dəqiqə peyapey bəhər nəfs təkrar.
Meyi-məhəbbəti-ali-rəsuldən, ya rəb,
İnayət eylə mənə bir piyaleyi-sərşar.

Təxmisi-qəzəli-Şeyx Sə'di bətəriqi-müləmmə:

## YUXUDA OLMAQ

Nədir, ey dil, bu təfazül, nədir, ey dil bu rüqud.
Hanı peymani-ələstü hanı əşrəfi-ühud?
Sərf qıl sə'yini, kəsbi-şərəf et, olma künud.
"Şərəfi-nəfs bəcudəst, kəramət bəsücud,
Hər iki, in hər dü nədarəd, ədəməş beh zi vücud".

İrməmiş mərhələyi-əmniyətə bir rəhrov,
Ədəmabadə gedər ləhzədə min rəhrovi-nov,
İftixar etmə olursansa bəsani-xosrov,
"Ey ki, dər ne'məti-nazi, bəcahan qürrə məşov –
Ki, məhaləst dərin mərhələ imkani-xülud".

Etmə qəm, olsa da idbarə mübəddəl iqbal –
Ki, bu deyri-kürənin cilvəsidir zilli-zəval,
Dəyməz ənduhinə bu qəmkədə, bu dari-vəbal,

* Ki odur – *red.*



"Ey ki, dər şiddəti-fəqriyyü pərişaniyi-hal,
Səbr kön kin dü-sə, ruzi bəsər ayəd mədud".

Peyrovi-xahiş olub az üçün az eylə təlaş,
Olma məğrur olub aşüfteyi-alayiş faş,
Naxüni-ücb ilə etmə dili-insafı xəraş,
"Xaki-rahi ki, bər u migüzəri sakin baş –
Ki, üyunəstü cüfunəstü xüdudəstü qüdud".

Budur ol günbədi-mərdümköşi-viranəpərəst, –
Ki, edib bəzmi-cahanda neçə peymanə şikəst,
Eyləmişdir neçə eyvani-fələkrif'əti pəst,
"İn həman çeşmeyi-xurşidi-cahanəfruzəst –
Ki, həmitaft bər arəmgəhi-Adü Səmud".

Nə olub bihudə idbari-cahan ilə novan,
Nə baxıb cilvei-iqbalına ol nazkönan,
Olma məftuni-cahan olsa sənin mülki-cahan,
Xaki-Misri-tərəbəngiz nə bini ki, həman,
"Xaki-Misrəst vəli bir səri'-Fir'onü cünud".

Getməmiş hiç cahandust cahandan xürsənd,
Əcəbəm kim, yenə aləmdir ona xahişmənd,
Ey xoşa kim ki, bu dünyada deyildir dilbənd,
"Dünya an qədr nədarəd ki, bəru rəşk bərənd,
Ey bəradər ki, nə məhsud bemanəd, nə həsud".

Hiteyi-rənci-zərurətdə olub müztər əgər,
Nari-üsrətdə yaxılsa dilü canım yeksər,
Etmə hər nakəsü kəmhimmətə izhari-kədər,
"Dəsti-hacət çü bəri, pişi-xudavəndi bər –
Ki, kərimə stü rəhiməstü, ğəfurəstü vədud".

Odur ancaq məliki-zəlkərəmü zəlehsan,
Hadiyü mün'imü vəhhabü rəufü rəhman,
Sami-nalişi-puşideyi-hacətməndan,
"Kərəməş namütənahi, niəməş bipayan,
Hiç xahəndə əz in dər nərəvəd biməqsud".

Cilvə qıldıqca dəmadəm niəmi suybəsu,
Eyləyib çeşmeyi-ixlasdə təcdidi-vüzu.
Dərgəhi-izzətinə cümlə qoyur əcz ilə ru,
"Əz səra ta bə-Süreyya bəübudiyyəti-u,
Həmə dər zikrü münacatü qiyaməndü qüud".

Ruzü şəb sabit olub daireyi-əhddə, sən
Həqqə təslim olub feyz bulub taətdən,
Eylə nuri-şərəfi-zatını gün-gün rövşən,
"Qiyməti-xudra[410] bəmə'nahiyyü məlahi məşikən,
Gərət iman[411] dürüstəst bəruzi-mövud".

Daməni-piri edib eşqdə, Nakam, bədəst,
Pəndi-canbəxşinə ləbbeyk dedin ruzi-ələst,
Olmamış səni kimi bir müxlisi-piranpərəst,
"Pəndi-Sə'di ki, kilidi-dəri-gənci-sə'dəst,
Nətəvanəd ki, bəca avarəd illa məs'ud".

Nakamın hər qisim kəlamları vardır ki, cümləsini burada təhrir etmək mümkün deyil. Türk istilahında çox vaxtı bir kəlməyə qafiyə olaraq özgə bir kəlmə də qoşurlar ki, onun əsla məzmunu yoxdur. Məsələn, "zad-mad", "şey-mey" və hakəza. Nakam belə cüft qafiyəli xoşməzmun bir qəzəl inşa edibdir ki, burada zikr olunur:

Cami-səfadə qalmayıb artıq əsər-məsər,
Mir'ati-dildə qət'-qət olubdur kədər-mədər.

Müşkülsə də iqamət əgər kuyi-yardə,
Mümkün deyil bu büqədən, ey dil, səfər-məfər.

Təzvirdir, fəribdir axır nəticəsi,
Hər bir kəlamın olsa məali əgər-məgər.

Getmiş qərar təndə Süleymani-ruhdən
Yoxdur hənuz hüdhüdi-dildən xəbər-məbər.

Məcnun kimi kənar olub adabi-eşqdən
Hər Leylivəş cəmalına qılmam nəzər-məzər.

Mən aşiqəm o şahidə kim, çıxsa pərdədən,
Nabud olur süehhrdə xur-mur, qəmər-məmər.

Nakam, yandın atəşi-möhnətdə, bəd əz in
Yazmaz səni cəhimü məhimü səqər-məqər.

Nakamın ən mövzun kəlamlarından biri də sözün keyfiyyət və mahiyyətində olan fəzilətin kefyiyyəti bəyanındadır. Nakam bu kəlamında və həmçinin eşqi-məcazi və eşqi-həqiqi babında inşad qıldığı kəlamında Şeyx Nizami əleyhirrəhməyə təqlidən hər şeydən artıq və əfzəl olmasını kəlami-gövhərsənci ilə nəzmə çəkib deyir ki, xilqətin səbəbi əmri-"kön"



olduqda, hər şeydən əvvəl vücuda gələn süxən olubdur və aləmi-xilqətdə hər nə varsa, cümləsi "kön" əmri ilə vücuda gəlibdir. Belə olan surətdə cümlə məxluqat[ın] vücuda gəlməsinə səbəb söz olubdur. Sözün meydanı o qədər vüs'ətlidir ki, onun sərhəddi və əndazəsi təsəvvürə gəlməz. Söz məani bəhrinə Nuh və cümlə masəvaya ruhdur. Şairin öz sözü ilə sözün fəzilətini göstərəlim:

Demə ki, bu, töhfeyi-şayan deyil,
Qabili-dərgahi-kəriman deyil.
Olsa da hər payədə naçiz əgər,
Payi-mələxdən ki, deyil duntər –
Kim, bu sərapa süxəni-nəğzdir,
Cümlə səva qişrdir, o, məğzdir.
Təng deyildir süxən əndazəsi,
Aləmi tutmuş süxən avazəsi.
Bəhri-məanidə süxən Nuhdur,[412]
Cümlə səva cism, süxən ruhdur.
Çıxmasını zahirə gənci-nihan
Qıldı iradə çü xudayi-cahan.
"Kaf" olub ol gənci-nihandan bürun,
Çıxdı həm ol "kaf" ilə birunə "nun".
Bu iki hərf ilə süxən saz olub,
Sövti-bilakeyf ilə avaz olub.
Xilqətin oldu səbəbi əmri-"kən",
Yəni əzəl gəldi vücudə süxən.
Aləmi-xilqətdə nə kim, vardır,
Cümlə ol əmr ilə pədidardır.
Gövhəri-dəryayi-nihandır süxən,
Cövhəri-gəncineyi-candır süxən.
Feyzi-süxəndə qəm olur müzməhil,
Hasil olur cümleyi-məqsudi-dil.
Aləmi-sürətdə olub cilvəgər,
Olmaz əyan şahidi-mə'na əgər,
Qamətini qılmasa mövzun süxən,
Tələtini etməsə gülgun süxən,
Dəhrdə dana ilə nadan haman
Fəsl olunub fərqi olunmaq əyan,
Xaric olar hiyteyi-imkandən,
Olmasa zahir süxən insandən.
Sahibi-fəzlə olunur e'tibar,
Fəzl süxənlə olunub aşikar.
Kim, süxən olmuşdur əyari-xirəd,
Bu süxən ilə bilinir nikü bəd.
Ta süxənin oldu vücudi əyan,
Qalmadı asari-şükuhi nihan.

Vüs' bulub dəmbədəm əndazəsi,
Tutdu cahanı süxən avazəsi.
Şə'ni-süxən vəsfidir ondan füzun, –
Kim, süxəni vəsf edə əhli-fünun.
Olmasa gər vəsf süxənlə süxən,
Vəsf edə bilməz süxəni əhli-fən.
Ta bəqiyam olsa süxən vəsf əgər.
Aciz olur nüktəvəran[413] müxtəsər.
Cümlə süxən vəsfin edənlər rəqəm,
Mö'tərif olmuş buna kim, lacərəm.
Bülbüli-gülzari-bəyandır süxən,
Qasidi-dil, peyki-rəvandır süxən.
Olmasa aləmdə süxəndən məded,
Məsələn puşidə qalıb ta əbəd,
Aləm ara cümleyi-mafissüdur,
Gənci-xəmuşandən etməz zühur.
Ey süxəni-işvəgərü dilrüba,
Dil bulur ancaq sənin ilə səfa.
Nayil olan yoxsa da didarına,
Cümlə giriftardır asarına,
Oldu vücudunla cahan paydar,
Buldu rəvan təndə səninlə qərar.
Cümlə cərahata verib iltiyam,
Cümlə ümuri sən edərsən tamam.
Rəbt olunubdur sənə fəhmü xirəd,
Fərq səninlə olunur nikü bəd.
Cümlə süxənsənclər iqrar edir,
Dəmbədəm iqrarını təkrar edir –
Kim, bu cahan ta ki, pədidardır,
Cümlədə səndən bir əsər vardır.
Məhfəzeyi-nitqdəsən, ey süxən,
Bir göhəri-dilkəşü çanbəxşsən.
Sirri-zəmayir sənə peyvəstədir,
Kəşfi-bəyani sənə vabəstədir.
Qisseyi-nəşnidəni sənsən bilən,
Aləmi ol qissədən agah edən.
Gərçi cahanda köhən[414] avazəsən,
Zahir olan dəmdə vəli tazəsən.
Təxtdə sən, tacdə xosrov da sən,
Köhnə də sənsən, köhəni-nov da sən.
Köhnəliyin tazə qılır canları,
Tazəliyin şiftə insanları.
Etməyib artıq dəxi lafü gəzaf.
Eyləyib insaf, edirəm etiraf –
Kim, süxənin nükteyi-əsrarını,
Cilvəsini, nə'şeyi-asarını.



Mən edəməm şərh kəmahu bəyan,
Şərh qılıbdır onu pişiniyan.
Şeyx Nizami ki, süxənsazdır,
Bülbüli-qüds ilə həmavazdır,
O, süxənin həqqin ə'da eyləmiş,
Əhsəni-vəch ilə bəyan söyləmiş:
"Ma ke, nəzər dər soxən əfkəndeim,
Mordeye-uyim, bədu zindeim,
Dər loğəte-eşq soxən cani-mast,
Ma soxənim, in tələl eyvani-mast.
Gər nə soxən reşteye-can tafti,
Can səri'-in reştə koca[415] yafti?"
Pərdeye-xəlvət ço bərəndaxtənd,
Celveyi-əvvəl bəsoxən saxtənd.
Sədrneşintər ze soxən nist kəs,
Douləte-in molk soxənrast, bəs!"[416]
Madəri-kön doğmamış hərgiz hənuz,
Hiç süxən tək vələdi-dilfüruz.
Xızr[417] sifət həm nov olan, həm köhən,
Aləm ara məhz süxəndir, süxən!
Çeşmeyi-nuşin ki, deyirlər, həmin
Bil ki, haman çeşmə süxəndir, yəqin!
Cümlə bina dəhrdə bərbad olur,
Leyk binayi-süxən abad olur.
Bax [ki], cahan var olalı dəmbədəm
Qoydular onlar ki, cahana qədəm,
Eylədilər bir süxəni yadigar,
Cümlə gedib, olmadılar payidar.
Bircə süxəndir ki, cahanda haman,
Hey'əti-əslində qalır cavidan.
Qeyri nə kim, dəhrdə mövcud olur,
Cümləsi tədric ilə nabud olur.
Hər süxəni-rəğz ki, bieybdir,
Gövhəri-gəncineyi-lareybdir.
Vəh necə gəncinə ki, gənci-əta,
Sərf olunur olsa əgər daima.
Dəmbədəm onda görünür izdiyad,
Gövhəri fiqdan bulub olmaz kəsad.
Dürrləri bəzl ilə əfzun olur,
Gövhəri-canbəxş ilə məşhun olur.
Yox ki, süxən öylə gülüstandır –
Kim, gülü hər haldə xəndandır.
Qönçəsi əşgiftə qalıb hər zaman,
Kargər olmaz ona badi-xəzan.
Söyləmə artıq dəxi, Nakam, sən –
Kim, rəhi-göftardə sən xamsən.

Olma süxən vəsfin edib şərmsar,
Sən süxəni qıl süxənə vagüzar.
Başqa nəva saz edib, avaz qıl,
Mətləbi şərh etməyə ağaz qıl.[418]

Nakamın bu dərəcə süxəni tə'rif və tövsif qılması bir kəsin təəccübünə gəlməsin. Həqiqətdə süxən hər qisim tə'rifə şayəstədir. Cümlə süxən vəsfinə rəqəm və onlar buna mö'tərif olmuş ki, bəyanati-gülşənin bülbüli-xoşnəğməsi sözdür. Sözsüz cümlə məsələlər və sirrlər aləmdə iləl-əbəd puşidə qalardı və insanın heyvanat və nəbatat qismindən artıq bir fərqi və təfavütü olmazdı və aləmdə cümleyi mafissüvər olan gənci-xəmuşandan zühur etməzdi.

Bəs, nə vaxtdan ki, dünya yaranıbdır, onda vüqua gələn əlamətlərin cümləsində sözdən bir əsər var. Məhfəzeyi-nitqdə söz canbəxş olan bir gövhəri-dilkəşdir və sətri-zəmayir ona bağlı olub, kəşfi-bəyanı ondan asılıdır. İnsanın fikrində yengi doğub təşkil bulan qissələri ən əvvəlcə bilən və onları əlvan libas geydirib aləmə göstərən sözdür və nə qədər ki, dünyada söz köhənavazədir, vəli yengi doğduqda yenə tərü təzədir və Şeyx Nizaminin dediyi haqdır ki, bizim həyatü məmatımız söz varlığına və yoxluğuna vabəstədir.

Hər bir millətin ruhani həyat və səadəti bağlıdır onun öz ana dilinə. Necə ki, ana dili azadə dillərdə caridir, o millət baqi qalacaqdır. Bir millət nə qədər zillət və üsrətə düşsə də, nə qədər xar və zəlil olub, ixtiyarını itirsə də, nə qədər aciz, zəif və məğlub olsa da, fövt olmaz, itib batmaz, bəşərti ki, onun ana dili əlindən alınmaya, o dilə cəbr olunmaya, onun hürriyyət və istiqlaliyyətinə mümaniət göstərilməyə və əluzunluq və qələbə olunmaya.

Cənab İlminskinin[419] ana dilinin vasitəsilə Qazan, Orenburq, Ufa və sair daxili quberniyaların tatarlarını ruslaşdırmaq fikir və niyyəti, necə ki, axırda zahir olundu, nəticəsiz qaldı.

Doğrudur, Qazan şəhərində və onun həvalsində tatarlardan bə'ziləri pravoslaviya dinini ələzzahir qəbul elədilər və boyunlarına xaç asıb, zahirpərəst rusları aldadıb şadü xürrəm qıldılar və lakin bunu bilmək gərəkdir o müsəlmanlar ki, dini dinara satıb, zünnara sitayiş göstərdilər, onlar həqiqi müsəlman olmadıqları kimi həqiqi rus da olmadılar və dinlərini ancaq əğrazi-şəxsiyyətlərinə və dünya mənfəətinə satıb, əbədi mürtəd oldular və zahirpərəstləri böyük səhvlərə düçar qıldılar.

Bizim müsəlmanlar İlminskini və onun müqəllidlərini sevməyib, lə'n ilə adlarını zik edirlər. Amma əksəri ol cənabın üsulundan bixəbərdirlər və belə güman edirlər ki, İlminski bizim ana dilmizi əlimizdən almaq



istəyir və dilimizi alıb istəyir bizi rus eləsin. Doğrudur, onun əsil niyyəti tatarları rus eləməkdir. Amma nə yolla? Tatarların dillərini əllərindən almaq iləmi? Yoxsa özgə bir təriq iləmi?

O istəyib ki, tatarları öz dillərinin vasitəsilə xristian eləsin və onun böyük səhvi bu təriqi tutmaqa olubdur ki, cümlə fikir və təşəbbüsatları bisəmər qalıb hədər və zaye' olur.

İlminskinin fikri bu imiş ki, Rusiya müsəlmanları öz dinlərindən bixəbərdir, ancaq onun zahiri əməllərini ə'da edirlər. Bixəbər olmaqlarına səbəb budur ki, ehkami-şəriyyələri ərəb dilində yazılıbdır. O dili dəxi, əcnəbi dil olmağa görə, nə özləri başa düşür və nə mollaları. Belə surətdə şəriətin ancaq zahiri ehkamlarına əməl olunur. Əsil din nədən ibarət olduğunu anlamırlar və bir də anlasalar da, müsəlman dini elə bir mö'təbər və ruhpərvər din deyil ki, qəlbi-xəlayiq onunla pərvəriş tapıb, əmniyyət və ülviyyət kəsb eləsin.

Amma həqiqi din həzrət İsanın dinidir. Hər gah müsəlmanlar ondan xəbərdar olsalar və o dinin künhü mahiyyətini və üsuli-əqayidini kamalınca düşünsələr və anlasalar, bişəkkü laşübhə onlar Məsiha dinini qəbul edərlər.

Bəs lazım olan budur ki, İncili sadə və açıq türk dilinə tərcümə edib, tatarların arasında onun intişarına sərfi-himmət eləmək. Elə ki, müsəlmanlar xristian dini ilə aşina olub, onu qəbul etdilər, onda, əlbəttə, rus da olacaqlar. Və lakin sadə türk dilində yazılan İncil müsəlmanlara xoş gəlmədi. "Xoş gəlmədi" deməkdən muradımız budur ki, həzrət İsanın təbiəti-bəşərə müğayir və zidd olan ehkamı və "troitsa" məsələsi, yə'ni Allahın üç sifətdə olması ki, ibarət ola müqəddəs atadan, müqəddəs oğuldan və müqəddəs ruhdan, dolaşıq və fəhmə sığışmayan bir məsələ olduğu halda həqiqət axtaranlar və həqiqətpərəstlər ki, ibarət ola Rusiya tatarlarından, belə dolaşıq və ağıl kəsməyən və ruh qəbul etməyən dini götürməkdən gərdənkəşan[444] oldular.

Belə [ki], İlminskinin niyyəti nə qədər fasid və müzirr olmuş isə də, bizə artıq bir zərər yetirə bilmədi, [...] İlminskinin üsulu – yə'ni ana dilinin vasitəsilə müsəlmanları xaçpərəst eləmək onlara artıq bir fayda yetirmədi. Layiqi-nifrət və töhmət ancaq onun niyyətidir ki, müsəlmanları lazım döndərib xaçpərəst eləmək. Bu dəxi bir İlminskinin fikir və niyyəti olmayıb, ümum mütəəssib ruslara müxtəs və siyasi dona girmiş böyük bir məsələ olmuşdu ki, çoxları onun əncampəzir olmasına sərfi-himmət edirdilər.

Bu yolda ümum Qafqazın sabiqi maarif naziri dəxi geridə qalmaq istəməyib və Peterburqun diqqətini cəlb etmək istəyib, [...] bu barədə ilminskilərə rəhmət oxutdu.

Qafqazın sabiqi maarif mütəvəllisi icad elədiyi üsul bu oldu ki, Qafqazın müxtəlif əqvamü tayfalarını ruslaşdırmaq üçün özgə bir yol yoxdur, bəqeyr əz an ki, bu müxtəlif əqvamü milələin ana dilini əlindən almaq və onlara qadağan eləmək [...]. Bu əmri məktəblərin vasitəsilə icra etmək eyni-səlah göründü və levitskilər meydana gəlib, təzə "lal üsulu" namında kitabçalar tərtib olunub, onların gücü ilə ana dili məktəblərdən qovuldu. Və ana dilinin başına gələn bu qədər zülmlərin və hürriyyətə vurulan bu qədər ağır toxmaqların nəticəsi bu oldu ki, cəm'i Rus məmləkətini iğtişaş və inqilab əhatə elədi.

İmperaturi-əfxəm Nikolayi-saninin 1905-ci tarixdə oktyabrın 17-də hürriyyətə dair verdiyi fərmani-humayun dəxi haman inqilabı yatırmaqda aciz qaldı.

İsmayıl bəy Nakam sözün şə'nində bu qədər gözəl söylədikdən sonra yenə süxəni tə'rif etməkdə özünü xamlar cərgəsinə qoşub, süxənin vəsfini süxənə vagüzar edir və başqa bir mətləbə şüru etməklə onun vəsfü tə'rifə sığmayan fəzilətini göstərir:

Olma süxən vəsfin edib şərmsar,
Sən süxəni qıl süxənə vagüzar.
Başqa nəva saz qılıb, avaz qıl,
Mətləbi şərh etməyə ağaz qıl.

"Başqa nəva"dan murad təzə bir qissəvü hekayətdir ki, şair onun inşasına iqdam edib, mə'lum deyil ki, onu başa gətiribdir, ya yox. Haman qissə bir neçə hissə və məqalədən ibarət olduğu ondan mə'lumdur ki, onun əvvəlinci məqaləsi şairin rəqəmi-gövhərrizindən bəhmə gəlibdir və əvvəlinci hissə və ya bab bu sərlövhə ilə təhrir olunubdur: "Əvvəlinci məqalə eşqi-məcazi və eşqi-həqiqi tə'sirdə yeksan,[421] onun axırı xüsran,[422] bunun aqibəti qüfran olmağı bəyanındadır". Bu məqaləni öz qəlbinə xitabən bu sayaq başlayır:

Ey dil, edib tərki-səva, zində ol,
Aşiq olub zindəvü payəndə ol!
Zaye' edib vəqtini qəflətdə sən,
Qoyma məni ərseyi-töhmətdə sən!
Keç bu həvadən, yetər eşqi-məcaz,
Tifl sifət olma dəxi xakbaz.
Vəhdətə təhvil qılıb kəsrəti,
Kəsrət içində bula gör vəhdəti.
Aləmin amizişi ülfətlədir,
Ülfəti-aləm də məhəbbətlədir.



Olmasa aləmdə məhəbbət əgər,
Cümleyi-mövcuddən olmaz əsər.
Aləmi-əsrardəki karü bar,
Meylü məhəbbətlə olur aşikar.
Şamü səhər qəlbdə dövran edən
Bülbülü nalan, gülü xəndan edən,
Meylü məhəbbət, biri də eşqdir,
Ləfzi müqayirsə də, bir məşqdir.
Cazibeyi-meyl ilə həm zərrələr
Pişgəhi-mehrdədir cilvəgər.
Hübbün əzəl payəsidir meyl bəs,
Dildə olur meyl ilə peyda həvəs.
Qüvvəsi meylin ki, nəhayət bulur,
Meyl dönüb onda məhəbbət olur.
Dildə əlaməti-məhəbbət də həm,
Şiddət edib anü bəan, dəmbədəm.
Dövri-məhəbbət dəxi qayət bulur,
Namini təb'dil qılıb eşq olur.
Məniyi eşq isə, məhəbbətdir o,
Fərti-məhəbbətdən ibarətdir o.
Eşq iki növ' ilə nümayan olur,
Hər ikisi qüvvədə yeksan olur.
Meyli-səvadə biridir cangüdaz
Hübbi-xudadə digəri dilnəvaz.
Meyli-səva batilü məqduhdur,
Hübbi-xuda qabilü məmduhdur.
Gülşəniyani edir əhli-nəim,
Gülxəniyani edir əhli-cəhim.
Meyli-səva zülmətü deycurdur,
Hübbi-xuda atifəti-nurdur.
Divin olur peyrəvi zülmatiyan,
Həqqin olur vasili nuraniyan.
Eşqi-səva hübbi-cahandır haman,
Hübb-cahan isə ziyandır, ziyan.
Eşqi-səva rə'si xətayatdır,[423]
Badiyi-xüsranü cəvayatdır.
Vaqif ol, ey dil, bu rümuzatdən,
Eşqi-həqiqidəki halatdən.
Məl'əbeyi-qəflət ilə olma məst,
Tərk qılıb qəfləti ol həqpərəst.
Mahiyəti-nəfsini bil, vaqif ol,
Qalma bu cəhl ilə, saqın, arif ol!
Şamü səhər şüğlini tövhid qıl,
Vəsvəseyi-digəri təb'id qıl.
Bir çəməni-ruhfəzadır bədən,
Sən də onun laleyi-canbəxşisən.

Sənlə bulur rövnəqini ol çəmən,
Anın ilə sən dəxi rövnəqdəsən.
Lalələrin rövnəqbəxş bağdır,
Lalələrin rövnəqi də dağdır.
Atəşi-eşq ilə olub dağdar,
Sən də haman dağ ilə qıl iftixar.
Olma cahangir, olub rişdil,
Səy qıl, ol aşiqi-dərvişdil.
Nuri-həqiqətlə olur müncəli,
Eşqi-məcazidir onun əvvəli.
Xah həqiqi ola eşqin sənin,
Xah məcazi ola məşqin sənin.
Hansı birində olasan eşqbaz,
Sabitü sadiq olub, ol sərfəraz.
Eşqdə də'vayi-xilaf eyləmə,
Bihudə ağazi-kəzaf eyləmə!
Qıl həzər axırda yaman olmadan,
Məzhəkeyi-əhli-cahan olmadan!
Var idi bir padşəhi-kamgar,
Misri-qədim içrə idi şəhriyar,
Aləm ara cümleyi-övladdən
Hissəsi ancaq bu qəmabaddən
Var idi bir düxtəri-məhpeykəri,
Hüsnü bəha aləminin dilbəri.
Oldu onun aşiqi bir binəva,
Oldu əyan cümləyə bu macəra.
Hadisədən etdilər agah şəhi,
Qıldılar ona şəhi-dilagəhi.
Söylədilər aşiqin əhvalini,
Ahü büka olduğun əf'alini.
Şah qılıb cəlb onu ol zaman
Söylədi:[424] – Ey aşiqi-bixaniman,
Düxtərimə sən əgər aşiq isən,
Də'vayi-eşqində də sadiq isən,
Etməyib izhar digər üzrlər,
Ya gərək indi edəsən tərki-sər,
Eyləyəsən ya dəxi tərki-diyar,
Bu iki əmrin birin et ixtiyar!
Məhz quru[425] laf imiş eşqi onun,
Oldu əyan süfteyi-məşqi onun.
Eşqdə can vermədən oldu nükul,
Tərki-diyar etməyi qıldı qəbul.
Getdi həngamdə şahi-cahan
Eylədi cəlladə işarə həman.
Hökm verib, çəkdi o dəm bir nida;[426]
Başın onun qıl – dedi – təndən cüda!



Tutdu gəribanını cəlla onun,
Tökdü o dəm qanını cəllad onun.
Qalxdı vəzirin birisi, söylədi,
Ərz qılıb şahə səna eylədi.
Dedi: – O biçarə idi bigünah,
Tökdü onun qanını heyfa ki, şah.
Qıldı vəzirə şəhi-adil xitab,
Tərzi-həkimanədə verdi cavab.
Dedi: – Onu bil ki, günəhkar idi,
Qətlə də, bişübhə, səzavar idi.
Yox ikən onda səri'-sövdayi-eşq,
Eyləyərək bihudə də'vayi-eşq,
Aləmə aşiqliyin etdi əyan,
Mən də künun etdim onu imtəhan.
Eşqdə mərdanə edib tərki-sər
Olsa idi aşiqi-sadiq əgər,
Düxtərimi mən ona təzvic edib,
Tənteneyi-eşqini tərvic edib,
Edəcək idim onu fərzənd mən,
Məsnədi-iqbaldə xürsənd mən.
Lakin o, kəzzabi-siyəhkar imiş,
Hərzəvü biqeyrətü biar imiş.
Oldu əyan ruyi-siyahı anın,
Qıldı onu küştə günahi anın.
Nitqini, Nakam, xəmuş eyləmə,
Sən bu rəviş bihudə cuş eyləmə,
Eşq rümuzatını kəşf eylədin.
Türfə xəbər, türfə məsəl söylədin.
Bu məsəli indi eşitdik tamam,
Də'vayi-eşq etmə əbəs, vəssalam![427]

Burada Nakam eşq və məhəbbətdən bəhs edib, cümlə mövcudat və məxluqatda müşahidə olunan əsərləri, cümbiş və hərəkətləri eşq və məhəbbətdən görür və aləmi-əsrardə olan karbarın aşkara çıxmasına səbəb meyl və məhəbbət olur. Hansı ki, şamü səhər qəlblərdə cövlan edib, insanı şövqü zövqə gətirir. Bülbülü nalan və gülü xəndan və pərvanəni şəm'ə suzan edən haman məhəbbətdir. Şair bu müqəddəs və pakizə hissi üç yerə təqsim edir: meyl, məhəbbət və eşq. Əvvəl payədə meyli qoyur, ikinci payədə məhəbbəti, üçüncü payədə eşqi. Qəlbi-aşiqdə əvvəlcə zövq və həvəs meyl ilə zahir olur. O meyl bir az artıb çoxaldıqda məhəbbətə mübəddəl olur və qəlbdə əlamati-məhəbbət dəxi tədriclə artıb şiddət edən zamanı onun yerini eşq tutur:

Məniyi-eşq isə məhəbbətdir o,
Fərti-məhəbbətdən ibarətdir o.

Eşqi dəxi şair iki qismə təqsim qılıb, onun birisi dilbəri-zibaya və mə'şuqeyi-dilkəşə cangüzardır, biri dəxi həqqi-mə'buda dilnəvazdır. Hər ikisi qüvvədə yeksan isə də, şair həqqə olan məhəbbəti məmduh və meyli-səvaya olan eşqi məqduh hesab eləyir. Xəllaqül-aləminə aşiq olanların gülşəniyanlar zümrəsinə ki, ibarət ola İbrahimxəlil peyğəmbərdən, daxil edib onlara "əhli-nəim" deyir. Dinarın zibü zinətinə aşiq olanları gülxəniyanlar silkinə daxil qılıb, onlara "əhli-cəhim" deyir. Çünki eşqi-səva tamam hübbi-cahandır, hübbi-cahan isə başdan ayağa ziyanə və ziyan və xətadan qaçınaq hamıya fərzdir. Bəs:

Məl'əbeyi-qəflət ilə olma məst,
Tərk qılıb qəfləti, ol həqpərəst.
Mahiyyəti-nəfsini bil, vaqif ol,
Qalma bu cəhl ilə, saqın, arif ol!
Şamü səhər şüğlünü tövhid qıl,
Vəsvəseyi-digəri təb'id qıl!

Şair dünyaya və onun məcmueyi-dilcusuna olan məhəbbəti məcazi və xudayi-zülcəlala olan məhəbbəti həqiqi adlandırıb, hər ikisində sabitqədəm olmağı tövsiyə eləyir:

Xah həqiqi ola eşqin sənin,
Xah məcazi ola eşqin sənin,
Hansı birində olasan eşqbaz,
Sabitü sadiq olub, ol sərəfraz!

Və burada şair eşqi-məcazidə dəxi sabitqədəm olmayan kəslərin axırda cəzası böyük tənbeh olduğunu göstərmək üçün timsal gətirib, Misir padşahının qızına yalandan aşiq olan bir şəxsin yalan eşqi ucundan fənaya getməsini bildirir. Sonradan şair eşq və məhəbbətdə müstəhkəm və sabitqədəm olmaqdan bəhs edib, qisseyi-Şeyx Sən'anı və onun eşq yolunda dinü imandan keçməsini və qisim-qisim bəlalara və zillətlərə mübtəla olmasını zikr qılıb deyir:

Qisseyi-Sən'anı edib dərnəzər,
Eşqdə Sən'an kimi ol cilvəgər!
Yad qıl anı ki, o piri-dilir
Düxtəri-tərsayə çü oldu əsir,
Eşqə fəda qıldı dilü canını,
Eşqdə tərk etmədi cananını.



Sabit olub eşqdə ol binəva,
Xahişi-cananəsin etdi rəva.
Bağladı zünnar, olub bütpərəst,
Etmədi peymaneyi-eşqi şikəst.
Dərgəhi-tərsadə olub xukban,
Oldu xənazir ilə ülfətkönan.
Böylə rəzalətləri qıldı qəbul,
Etmədi adabi-vəfadan nükul.
Oldu rəhi-həqqi bulub [aqibət
Sədrnişini-hərəmi-mə'rifət.
İmdi bu pəndimdən olub] hissəmənd,[428]
Zümreyi-üşşaqdə ol sərbülənd.
Səndə olub eşqdə sabitqəm,
Mətləbi-dilxahını bul sən də həm.
Qeyrət edib aşiqi yekrəng ol,
Yar ilə həmbəzmü həmahəng ol!
Şərt deyil aşiqi-rüxsar olub,
Bəsteyi-dil zülfi-siyəhkar olub,
Nalə qılıb, eyləyib ahü büka,
Didələrin qan tökə sübhü məsa.
Xas deyil eşqi-ruxi-dilbərə –
Kim, olub aşiq büti-məhpeykərə.
Vəsldə hər dəm olub əndərtələb,
Hicrdə nalan olasan ruzü şəb.[429]
..................................................
..................................................
Eyləyib əsnami-məcazi şikəst
Məqsədin olmağa həqiqətpərəst.
Səltənəti-fəqrdə sər piç qıl,
Mülki-Süleymanı keçib hiç qıl!
Ey dili-şuridə, bəhəqqi-xuda,
Olma dəxi rahi-hüdadan cüda!
Rahi-həqi bulmağa bir himmət et,
Vasili-həqq olmağına qeyrət et!
Bülbül edər nalə xuda eşqinə,
Sən dəxi gəl halə xuda eşqinə.
Əbr qılır giryə haman şövq ilə,
Qönçə qılır xəndə haman zövq ilə.
Olmasa hər dildə əgər eşq, bil,
Tömesidir gürbənin ol, dil deyil.
Eşq deyil siyrəti abü gilin,
Eşq isə ancaq sifətidir dilin.
Can təni-adəmdə edən dəm qərar,
Niştəri-eşq ilə olub zəxmdar.
Atəşəsər[430] bir neçə qətrati-xun
Çıxdı haman zəxmdən, oldu bürun.

Bildilər ol halətin əncamını,
Qoydular ol qətrəyə "dil" namını.
Olmasa dil aşiqi-möhnətzədə
Parçeyi-ləhmdir afətzədə.
Ləhmliyi tərk qılıb, gəl dil ol,
Elmü ədəb eşqinə sərmənzil ol![431]

Burada Şəms Təbrizinin ləhmdil adamların haqqında dediyi sözlər münasibi-məqal görünüb yad olundu:

Hər ke, nəbvəd mobtəlaye-xubruy,
Name-u əz louhe-ensani beşuy,
Hər kera dər sər nəbaşəd eşqe-yar,
Bəhre-u palano əfsari biyar,
Sineye-xali ze mehre-qolroxan,
Kohne ənbani bovəd por ostoxan.[432]

Həqiqətdə zövqü şövqsüz adamlara, əhli-hal və əhli-dil olmayanlara palan ilə əfsar lazımdır və məhəbbətdən xali sinələr sürsümük ilə dolmuş köhnə bir dağardır. Belə şəxslərin adları lövhi-insaniyyətdən pozulub götürülsə, eyni-səlahdır.

Sonradan Nakam eşqi-həqiqi ədəb və kəmaldan və mə'rifəti-ilahidən ibarət olmasını şərhü bəyan edib deyir:

Eşq o deyildir kim, olub bütpərəst,
Daim olub cami-qürur ilə məst.
Etməyəsən fəhm ki, dünya nədir,
Bilməyəsən aləmi-üqba nədir.
Yenə xətadə olasan hərzərov,
Meykədələrdə ola başın girov.
Eşq odur kim, ədəbamuz ola,
Aqibətü xürrəmü firuz ola.
Olsa əgər eşq həqiqətnüma,
Aşiq olar peyrəvi-əhli-vəfa.
Aşiq olan xaki-təb'iət olur,
Vaqifi-əsrari-həqiqət olur.
Eşq sərapa ədəbü elmdir,
Eşq, demək, məskənəti-helmdir.
Aşiqin əxlaqi mühəzzəb gərək,
Aşiq olan pakü müəddəb gərək –
Kim, ədəbilə bulur əhli-vəfa,
Kişvəri-ürfanda taci-səfa.
Elmü ədəbdən xəbəri olmiyən
Bəhrəvər olmaz əsəri-dindən.
Cümleyi-ədyanda əsasi-mətin,



Elmü ədəb olduğunu bil yəqin.
Şəri-mübin daxi ədəbdir əyan,
Yəni ki, din isə, ədəbdir həman.
Adəmə kəşf oldu ədəb aləmi,
Feyzi-ədəb qıldı əziz Adəmi.
Oldu çü iblis ədəbdən kənar,
Randeyi-dərgah olunub, oldu xar.
Olma cüda, ey könül, əbrardən,
Sən də götür hissə bu göftardən.
Bil ki, ədəb içrə təcəlla nədir,
Sudi nədir, ondakı mə'na nədir.
Dövləti-pürsud ədəbdir, ədəb,
Himməti-məs'udi-xirəddir ədəb.
Bari-əmanət bu ədəbdir haman –
Kim, çəkir ancaq onu insan olan.
Məhz ədəbdir ədəbin hasili,
İzzəti-dareyni bulur vasili.
Yəni ədəb sahibi hüşyar olub,
Cümleyi-üzv ilə ədəbkar olub,
Verdiyi peymanına etsə vəfa,
Bəndəliyi haqqını qılsa ə'da,
Adəmiyət silkinə daxil olur,
Rüşd bulur, mərdümi-kamil olur.
Meyl qılıb həqqə cənabi-Xəlil,
Olduğiçün aşiqi-rəbbi-cəlil,
Narı məqərr etməyi qıldı qəbul,
Eyləmədi rəsmi-ədəbdən nükul.
Hifz qılıb kəndi xuda dustin,
Etmədi əğyarə fəda dustin.
Lütf qılıb eylədi ehsan ona,
Qıldı həmən narı gülüstan ona.
Sən dəxi qıl sidq ildə, Nakam, nuş
Meykədeyi-eşqdə bir cami-nuş!
Eşqdən, ədəbdən agah olub,
Pakdilü arifi-billah olub,
Əvvəl edib pəndinə kəndin əməl,[433]
Sonra çıxıb ərseyi-təbliğə gəl!
Söylə ədəb nolduğunu, qıl bəyan –
Kim, bilib, əhli-ədəb olsun cəhan![434]

Bu məqalələrdən sonra yəqin ki, İsmayıl bəy Nakam yenə bir neçə məqalələr tərtibü tənzim qılıb, hər bir məqalədə məxsus mətləb üstündə, məsələn, ədəb, elm, sədaqət kimi, öz rə'y və fikirlərini əş'ari-abdar ilə ifadə qılıbdır. İsmayıl bəy vəfat edibdir 1324-cü[435] sənədə Nuxa şəhərində.

# DƏRBƏND ŞAİRLƏRİ

Mə'lum ola ki, Dərbənd şəhəri qədim binalardan birisi olub, Xəzər dənizinin kənarında tə'mir olunmuşdur. Dərbəndin binasını, bə'zi rəvayətə görə – əzan cümlə "Dərbəndnamə"də[436] yazıldığına binaən, İran padşahı Keyqubad[437] qoyubdur. Keyqubad şahın əsrində Dağıstanın şimal səmti, Dərbənd həvalisi, Krım, Qazan və Rusiyanın şərqi-cənub səmti xəzərlərin padşahı Xaqana tabe idi.

Şah Keyqubad Xaqanın qızını hiylə ilə təzvic edib, onunla qohumluq binasını qoydu və sonradan dərya kənarında İskəndər Zülqərneyn tə'mir etdirdiyi hasarın ayağını dəryaya kimi çəkməklə hər iki dövlətin arasında bir sərhəd binasını möhkəmləşdirməyə izn aldı.

Xaqan dostluq və qərabəti mənzur edib mane olmadı və Keyqubad şah indiki Dərbənd olan məhələ külli me'mar və bənna və fəhlələr göndərib, dəryanın kənarında iki tərəfli xeyli mətin və möhkəm hasarlar çəkdirdi və onun içində bir şəhər bina etdirdi.

Tə'mirat tamam olandan sonra sərəskər və bir me'marbaşı şaha xəbər verdilər ki, haqq-taalanın övni-mərhəməti ilə tə'mirat hasilə gəlibdir. Haman şəhərin adını "Babül-əbvavb" qoyub, şahın hökmü ilə üç min ev İrandan oraya nəql olunmuşdu və bundan əlavə şəhəri mühafizət etmək üçün üç min atlı qoşun dəxi oraya göndərilmişdi.

"Dərbəndnamə" sahibi rəvayət edir,[438] zəmani ki, şəhər uca və zorba hasarlar və dəmir qapılar ilə möhkəmləşir və şah bilmərrə xatircəm olub, Xaqanın qızını gətirdiyi halət üzrə, yə'ni ona müqaribət et[mə]miş atasının üstə göndərib, öz xəyanətini və fasid niyyətini büruz edib və bu əhvaldan sonra xəzərlər ilə iranlıların arasında böyük cəngü davalar vüqua gəlib, amma nüsrət yenə Keyqubad tərəfdə olur və bir müddət İranın nüfuzu haman yerlərdə artır. Belə ki, Keyqubad şahın oğlu Nuşirəvani-adil haman ətrafda və Dağıstanın çox yerlərində şəhər və qəryələr bina etdirir. Nuşirəvanın vəfatından sonra xəzərlər yenə külli qoşun ilə Dərbənd səmtinə hücum edib, oralarda malik olurlar və hətta İraqi-əcəmin və Azərbaycanın çox yerlərini zəbt qılırlar.

Vəqti ki, Cəzirətül-Ərəbdə dini-mübini-Məhəmmədi zühur etdi, onun nuru ətrafü əknafa dağılıb da bir ləm'əsi Qafqaziya dağlarını və ətəklərini münəvvər elədi və Dərbənd qalası ərəblərin yədi-təsərrüfünə keçdi. Xəzərlər ilə ərəblərin arasında dəfəat ilə böyük davalar vüqua gəlibsə də, xəzərlər həmə vaxt məğlub və münhəzəm olublar. Ən böyük davanın birisinə 40 nəfər ərəb bahadırlar Səlman ilə Rəbiətül-Xeylin sərkərdəliyi ilə özlərini qəlbi-ləşkərə vurub, xeyli cəsarət və rəşadətdən sonra özləri dəxi



şərbəti-şəhadət nuş ediblər. Onların qəbri şəhərin şimal tərəfində vaqe olan məzarıstanlıqda ümumi bir hasarın içindədir. Böyük, uzun qəbirlər yan-yana düşüblər və "Qırxlar" adı ilə məşhur ziyarətgahdır.

Dərbənd hasarları bu halda dəxi hər kəsin diqqətini cəlb edəsi bir əlamətdir ki, keçmiş bənna və me'marların fünuni-tə'miratda nə dərəcədə mahir və qabil olmaqlarına böyük şəhadət edir. Bu hasarın cənub tərəfinə beş darvaza və şimal tərəfinə üç darvaza qoyulub və bu darvazaların bə'zisinin üstünə kufə xətti ilə "la ilahə illəllah Məhəmmədin rəsulüllah" yazılıbdır. Şəhərin yuxarı tərəfində qədim və vəsi' bir məscid bina olunubdur. Onan asari-qədimədən olduğuna həmin bu kifayət edir ki, onun tə'miri 130 ildən ziyadədir. Onu Əbumüslüm bina etdiribdir. Demək olar ki, Qafqaz məmləkətində onun misli yoxdur. Sonralardan Şah Abbas Səfəviyi-mərhum əsrində onun əmri ilə yeddi yerdə məhəllə məscidi bina olunubdur və neçə yerlərdə mütəəddid çeşmələr gətirdib və yeddi ab-anbar bina etdiribdir. Məzkur binalar bu halda mövcuddur.

Rus dövləti Dərbəndə iki dəfə təsxir edibdir. Əvvəlinci dəfə 1722-ci sənədə Pyotri-kəbirin qoşunu ilə, ikinci dəfə 1796-cı sənədə İmperator Pavelin əsrində. Dərbəndin Rusiyaya mülhəq olması 1806-cı sənədə vaqe olubdur. Bu şəhərin əhalisi qədimdən islam dinində olduğuna görə, həmişə şüari-islamı müraat edib, dindarlıqda və dinpərvərlikdə şöhrət bulublar. Ramazanül-mübarək və məhərəmmül-həram aylarının kəmali-sədaqət və ehtiram ilə zöhdü ibadətdə və tə'ziyədarlıqda keçirməyi müqəddəs vəzifələrindən hesab edirlər. Xüsusən Şühədayi-Kərbəla üçün ə'la mərtəbədə tə'ziyə tutub, rövzəxanlığa və şəbihkərdanlığa artıq meylü rəğbət göstərirlər. Şəbih binası yüz ildən ziyadədir ki, Dərbənd şəhərində qoyulubdur. Hər əsrdə bu şəbih ümuratına mübaşir olan şairlər olubdur. Amma bu dəstgaha cümlədən artıq rövnəq verən şüəra üç nəfərdir: Mirzə Kərim Şüai, Mirzə Cəbrayıl Süpehri və Mirzə Məhəmədtağı Qumri.

# MİRZƏ KƏRİM "ŞÜAİ"

Mirzə Kərim "Şüai" təxəllüs əslən Dərbəndin cənub tərəfindən – Kürə nahiyəsində Üşdül qəryəsindən İsrafil adında bir şəxsin oğludur. Məzkur mahalda polkovnik Sultan Əhməd bəy ki, o mahalın maliki-riqabı hesab olunurdu, Mirzə Kərimi öz yanında müsəlmani mühərrirliyinə götürüb, hər yerə gedəndə öz yanınca aparardı. Hətta Şeyx Şamilin davasında Mirzə Kərimə əvvəlinci çin və medal verdiribdir. Sonralardan məzkur Sultan Əhməd bəy Dərbənddə sakin olduğu üçün Mirzə Kərimini atası İsrafil öz əhlü əyalı ilə köçüb Dərbəndə gəlibdir və orada cənab polkovnikin zilli-himayətində dolanırdı. İttifaqən Sultan Əhməd bəy övza'yi-zəmanədən təngə gəlib, özünü qətlə yetirdi və Mirzə Kərim öz vəliyyün-ne'məsinin qətlindən bir növ' müttəhim olub Sibirə göndərildi və neçə illər orada qalıb, imperaturi-əzəm tərəfindən fərmani-humayun sadir olmağa görə, mürəxxəs olub, dübarə Dərbəndə müraciət elədi. Artıq fəhmü zəkavət sahibi olmağa görə, Rusiyada qaldığı zaman rusca oxumağı və yazmağı ləyaqətincə kəsb etmişdi. Sibirdən qayıdandan sonra Dərbənddə nəcib familiyadan təəhhül ixtiyar edib, əziz və möhtərəm şəxslərdən biri oldu və məhəllə rəisi (kvartalnı) mənsəbinə nail olub, xoş güzəran edərdi və sakin olduğu məhəllənin şəbih ümuratına mübaşir olub, məscidi-came'də şəbih gətirmək həm ona mühəvvəl olmuşdu. Şüai şəbih büsatına dair mükalimələr yazıb, mərsiyələr inşa etmişdir və bunlardan əlavə bir kitab hürufi-heca qafiyəsində təlif edib, öz həyatında birinci dəfə çap etdiribdir.[439] Çifayda, o kitabı ələ gətirmək bizə məqdur olmadı. Mirzə Kərim Şüai türk və fars[440] dillərinə dara, fəsih bir şəxs olduğuna [binaən], bu dillərdə onun əş'arü kəlamları vardır.

Şüai vəfat edibdir tarixi-miladın 1894-cü sənəsində Dərbənd şəhərində. Onun böyük oğlu Məhəmmədəli nam Badkubədə qulluq edir və ikinci oğlu Şəhriyar bəy Dərbəndin uyezdni xəzinəsində çinovnikdir.



# MİRZƏ CƏBRAYIL "SÜPEHRİ"

Mirzə Kərimin kiçik qardaşıdır. Mirzə Cəbrayıl Şüainin vasitəsilə Dərbəndin uyezdni işkollasına ehkami-şəriyyə müəllimi tə'yin olunmuşdur. Amma 1877-ci ildə məzkur işkolla təb'dil tapıb, Mirzə Cəbrayıla pensiya qərar etdilər. Mirzə Cəbrayıl şəbih ümuratına məşğul olardı və onun dəxi xeyli mükalimat və mərsiyələri və sair ədəbiyyati-mütəfərriqələri vardır. Amma bir kitab tərtib qılmayıb. Olan əş'arü kəlamı övraq və pərişan haldadır.

Mirzə Süpehri, necə ki, rəvayət olunur, çox əhli-zövq və alitəb' bir vücud imiş. Keçmiş şüəra əş'arü ədəbiyyatına çox meylü rəğbəti olmağa görə, çoxunu hafizəsində saxlarmış. Ələlxüsus Əlişir Nəvainin türkcə, noqay istilahatında[441] inşa qıldığı qəzəliyyatın əksərini əzbərdən bilib, çox mərğub oxurmuş (Belə ki, Nəvai əgər həyatda olub, onun qiraətinə istima' etsəydi, əlhəqq, insaf verərdi).

Süpehri vəfat edibdir miladın 1902-ci sənəsində, fevral ayının qürrəsində. Onun böyük oğlu universitetdə kəsbi-ülumü fünuna məşğuldur. Şüai və Süpehrinin atalarının adı İsrafil olmağa görə, familiyaları İsrafilovdur.

# MİRZƏ MƏHƏMMƏD TAĞI "QUMRİ"

Dərbənd şairlərindən ən məşhuru Mirzə Məhəmməd Tağı ibnül-mərhum İbrahim və "Qumri" təxəllüsdür. Qumri əslən Dərbənd əhli olub, zamani-viladəti haman şəhərdə tarixi-hicriyyənin 1235-ci[442] sənəsində vaqe olubdur.

Qumri səğir sinnindən məktəbə qoyulub, öz zehnü fərasəti sayəsində az vaxtda türkcə, farsca və hətta ərəbcə gözəl savad kəsb edib, öz vaxtının və müasirinin mabeynində mütədavil olan ülumü kəmalata dara olubdur.

Mirzə Məhəmməd Tağı əxlaqü ətvar cəhətincə cümlənin nəzərində məmduhü mümtaz bir vücudi-möhtərəm sayılırdı. Kəsbi-məaşını ticarət əmrinə münhəsir qılıb, mütəşəxxis və mö'təbər tüccarlardan birisi hesab olunurdu. Sahibi-əqlü tədbir olduğu üçün müşkül əmrlərdə əbnayi-vətəni, dost və aşnası ona rücu edib, onun səlahdidi ilə rəftar edərdilər. Otuz sinninə yetdikdə nəzmü təlifi-əş'ari-gövhərbar və əbyati-dürnisari-müsibəti-əhli-beyti-əthar və şühədayi-Kərbəlaya şüru etməklə bir qüvveyi-iqtidar peyda etmiş Qumri "Kənzül-məsaib"[443] nam əsərinin dibaçəsində nəsr ilə yazdığı bir neçə püribarə sətirlərdən belə anlaşılır ki, əyyami-şəbabını zövqü işrətdə keçirdiyindən peşman olubdur. Necə ki, ol cənab bu xüsusda deyir: "Bəndeyi-zəlil rusiyah əlmüznibü təhidəst, sərmayeyi-itaəti-übudiyyət və qutəvəri-dəryayi-bimüntəhayi-məasi, əsiri-həvayi-nəfsi-əmmareyi-şərir əbdül-həqir kəsirüz-zünubü təqsir Məhəmməd Tağı ibnül-mərhum İbrahim Dərbəndi əlmütəxəllis və "Qumri" məşğuli-sevdayi-cəmali-bər xəttü-xali məhbubani-əbruhilal və məftuni-nərgisi-fəttani-dilfəribani-cadumisal olub və bəmüfadi "əl məcazü qəntərətül-həqiqə"[444] gülüstani-aləmi-imkanü məcazdə aşüftəvü nalan, kəmali-nəğmeyi-məqamati-fərəhəfza ilə guya və rətbül-lisan olduğu halda nagah şahbazi-büləndpərvazi-nüktəpərdazi-əqli-mümtazi-kamilnəvazi-[aləmi]-insan mərəzi-xitab-itaba gəlib, mütərənnimi-məqal vəcdü hal və müstəhzəri-sualü cavab oldu"[445].

Bu kəlamın müxtəsər mə'nası budur ki, Qumri cavanlıq əyyamını bir müddət eyşü işrətdə keçirib, ömrünü gözəllərin xəttü xalına və əbruyi-hilalına və naz-işvəsinə sərf etdiyi halda əqli-mümtaz qəflətən xitab-itaba gəlib, onun qəflətdə olması və cani-nəqdini bihudə sərf etməsini bu minval bəyan edir:

Bu sevdadən keç, ey qafil, dəxi ömri-cəvan keçdi.
Şəbab əyyami getdi, zövqi-sövdayi-cahan keçdi.



Qivami-ünsüriyyətdən qivayi[446] – xəmsə süst oldu,
Yəqin abai-ülvi iltifatından əyan keçdi.

Yavuqlaşdı dəmi-rehlət, təravətdən düşüb qamət,
Olub əfsürdə bərgi-tari çün sərvi-rəvan keçdi.

Ağardı muyi-sər, qaldı ziyadən çeşmi-nurani,
Məqali-söhbəti-əhli-ləbi-şəkkərfişan keçdi.

Münadi qeybdən eylər nida, ey bixəbər, yatmış,
Oyan bir xabi-qəflətdən, yatıbsan çox, zaman keçdi.

Cərəs fəryad edər, qom-qom vurarlar kus peydərpey,
Qətari-kuç yükləndi sərasər, karvan keçdi.

Sərayi-ariyətdə hər gələn beş gün qalır mehman,
Rəfiqü aşina getdi, tamamən həmzəban keçdi.

Rəcul səyyadi müstəhzər[447] durubdur can sorağında,
O vaxt agah olursan kim, çıxıb əldən inan keçdi.

Dayanmaz masələf gəl ma-sə-yəti üstə fikr eylə,
Görürsən bir zaman əldən behişti-cavidan keçdi.

Gedər dünyayi-fani, axirət əmrində qıl çarə,
Keçənlər ya qəminü, ya həzin, ya şadiman keçdi.

Gəlir bir gün deyər qədrin bilənlər heyf dünyadan,
Qoyub nəzmi-dürəfşan Qumriyi-şirinzəban keçdi[448].

Şairin təb'i-rəvanpərvəri ağılın bu gunə Qumrini xabi-qəflətdən bidar edib, axirət və mə'nəviyyət aləminə onun fikrü xəyalatını sövq etməyini müşahidə edib, filfövr ağıl ilə mübahisəyə daxil olur və meydani-fəsahətü bəlağət[də] tündü çapük gedən atını cövlan etdirib, bir xeyli mükalimə və mübahisədən sonra təb' ağıla qalib gəlir. Burada təb'dən murad məhəbbəti -əzəli və eşqi-həqiqidir. Çün hər şey'i cünbişü hərəkətə gətirən və hər şeyə ruhü can verən, hər şey'i gözəl, lətif, mərğubü tərtazə qılan eşqdir, ona binaən külli-məxluqata sahibü hökmfərman olan, cəm'i yaranmışa ağalıq edən, xüsusən bəni-növ'i-bəşəri öz təhti-idarəsində dolandıran, piri cavana, cavanı pirə, tərsanı müsəlmana, müsəlmanı tərsaya bənd edən dinü məzhəbi, malü canı, qeyrətü himməti, irzü namusu, namü şöhrəti öz əlində əsir edən lazım olduqda cümləsini badi-fənaya verən eşqdir. Necə ki, onun hər şeydən artıq sahibi-qüdrət olması babında Mollayi-Rumi öz "Məsnəvi"sində deyibdir:

Hər çe quyəm eşq əz an bərtər bovəd,
Eşq Əmirəlmomenin Heydər bovəd.[449]

Ağılın əvvəlinci xitabını ki:

Bu sevdadən keç, ey qafil, dəxi ömri-cavan keçdi,
Şəbab əyyamı getdi, zövqi-sevdayi-cahan keçdi –

– eşitcək şairin bülbüli-təb'i dürci-dəhanın açıb, onunla bu sayaq hazırcavab olur:

Məgər divanədir üşşaq eşqi-yardən keçsin,
Həvayi-vəslü sevdayi-ruxi-dildardən keçsin?!

Rəvadır təşneyi-cami-məhəbbət meydən əl çəksin,
Qoyub zövqü səfanı, badeyi-gülnardan keçsin?!

Ol anda fəsli-gül tər qönçənin arayiş əyyami,[450]
Qoyarmı eşq şeyda bülbülü gülzardan keçsin?!

Keçər nazü nəimi-cavidandan aşiqi-sadiq
Və lakin müşkül işdir ləzzəti-didardən keçsin.

Olur keçmək Bədəxşan lə'linin alafü əlfindən,
Çətindir aşiqə lə'li-ləbi-göftardən keçsin.

Mənim mehrabü qibləm tağı-əbruyi-bütan olmuş,
Məazəllah ki, zahid qibleyi-əxyardən keçsin.

Olub Qumridən ötrü riştеyi-can gisuyi-canan,
Məgər candan keçib ol türreyi-tərrardən keçsin?![451]

Ağıl:[452]

Açdı dübarə dürci-dəhan əqli-nüktədan,
Çəkdi bu rəmzi riştеyi-nəzmə qılıb bəyan:

Sevda nədir başında, bu sevdadən əl götür!
Eşqi-məcazü söhbəti-bicadən əl götür!
Aldanma xubruylərin xəttü xalına,
Çeşmi-xumarü nərgisi-şəhladən əl götür!
Öz rəngi tək siyah qılar ruzigaruvi,[453]
Tərrar türrə, zülfi-çəlipadən əl götür.
Əbrukəmanların dəmi-tizindən et həzər,
Yox e'tibarı lö'bəti-dünyadən[454] əl götür!



Aşiqlərin həmişə qara bağrı qan olur,
Zahid,[455] fəribi-şuxi-dilaradan əl götür!
Minayi-eşq edər səni leylü nəhar məst,
Ol hüşyar, gərdəni-minadən əl götür!
Az qaldı qamətin xəm ola, ömr qurtara,
Bir ibrət[456] eylə, qaməti-rən'adən əl götür!
Keçdi cavanlıq aləmi, göz nurdən düşüb,
Nəzzareyi-rüxi-güli-həmradən əl götür!
Cami-məhəbbəti-ruxi-dildari qılma nuş,
Çox nakyvar meydi, bu səhbadən əl götür!
Qövqası çox, vəfaları yox mahrulərin,
Vardır nədaməti, belə qövqadən əl götür!
Pabənd olma xubruylərin zülf damına,
Gisuyi-müşki-cə'di-səmənsadən əl götür!
Eşqi-bütan ürəklərə hər ləhzə qan qoyar,
Dəryayi-qandı, girmə, o dəryadən əl götür!
Cadu gözü çəkib salu təsxirə dilbərin,
Çox fitnədir, bu fitneyi-üzmadən əl götür!
Döndər inani-təb'ini bir ayrı gülşənə,
Qumri, bu pürməlal təmaşadən əl götür![457]

Təb' yaxud eşq:

Tutiyyi-təb' dürci-dəhan açdı bihicab,
Sultani-əqlə verdi bu ünvan ilə cəvab:

Heç gülüstan bu lətafətdə dilara olmaz,
Arizi yar kimi laleyi-həmra olmaz.
Hansı sərvin boyu var qaməti-dildar kimi,
Rövzeyi-bağı-cinanda belə tuba olmaz.
Baxaram kakili-müşkini dilaramlərə,
Misli heç müşki-təri-cənnətü mə'va olmaz.
Ruxi-xubani-cahan bərq vurar ayinə tək,
Bu nəzakətdə heç ayinə müsəffa olmaz.
Nə əcəb nəqş edib ustadi-əzəl təsvirin,
Əhsənüllah ki, belə surəti-ziba olmaz.
Gər təbəssüm edələr, gövhəri-dəndan görünür,
Pərtövi mehri-dirəxşanda hüveyda olmaz.
Guşeyi-çeşm ilə üşşaqə nigah eyləməyi,
O baxışda deyəsən ahuyi-səhra olmaz.
Ləbi-gülbərgləri rəşk verir yaquta,
Lə'li canan kimi yaqut mücəlla olmaz.
Görsənir lə'li-ləbində oların abi-həyat,
Ola min çeşmeyi-kövsər, ona həmta olmaz.
Bəxt olur qismət olan cür'əsi hər aşiqə kim,[458]

Dəxi kövsər suyuna meylü təmənna olmaz.
Əl çəkən damәni-məhbubi-mələksima'dən
Olsa hər kimsə, olur, Qumriyi-şeyda[459] olmaz.

Ağıl:

Tövsəni-əql girib cür'ət ilə meydanə,
Gəldi göftari-nəsihətlə əcəb cövlanə:

Ey könül, eşqi-məcaz əhli səbükbar olmaz,
Ayılıb nə'şeyi-meydən, dəxi hüşyar olmaz.
Şuxü rən'ayi-cəfaculərə bel bağlamayın –
Kim, gözəllərdə sözü doğru vəfadar olmaz.[460]

Gözəllərin vəfasız və e'tibarsız olmağına işarə etdikdən sonra ağıl şairin dili ilə yenə başlayır onların afətyetirici üzvlərini bir-bir zikr etməyə və hər birisinin fitnəvü fəsadından şairi saqındırıb tənbehü tövsiyə eləyir, deyir: Özünü gözlə, ayıq və hüşyar ol, səni dami-zülf ilə bənd edib, çahi[461]-zənəxdana salar və dəxi bu bəlalı quyudan kənara çıxmağa çarə bulmazsan. Kakilinin rayihəsi ilə könlün evini bir sayaq viran edər ki, dər-divardan bir əsər qalmaz. Fitnəcu gözləri cadu qurubdur. Hərgiz qafil gəzmə, həzər eylə, onlar kimi səhhar heç yerdə tapılmaz. Tiri-müjganları əbru yayından çıxıb, sinəni məcruh qılar, belə zalım və mahir ox atan ovçu görünməyib. Mahruların bivəfa və sitəmkar olmağını dübarə şair zikr edib deyir:

Qəti-ülfət elə, Qumri, bu pərirulərdən,
Bivəfalardı, bulardan sənə heç yar olmaz.[462]

Təb':

Həzari-təb'i-rəvan eşqdən olub dəmsaz,
Hüzuri[463]-əqldə qıldı bu mətləbi ağaz:

Könül həmişə həvayi-vüsali-yardədir,
Haçan müyəssər olur çeşmim intizardədir.
Çəkib zibəs ki, zimistan qəmin həzareyi-dil,
Qərarü səbr gedib, gözləri bahardədir.
Əgər açılsa gülüstanda min güli-əlvan,
Və leyk meyli-dilim türfə taləzardədir.
Deyəllər mayil olur rəngi-sürxə divanə,
Cünuni-eşqəmü meylim güli-üzardədir.
Səfayi-meydə nə var, ya nədir şərabi-təhur,



Tamami-ləzzəti-dünya ləbi-nigardədir.
Meyi-məhəbbətinin cür'əsini içən aşiq
Ayılmayıbdı yenə indi də xummardədir.
Çəkibdi türreyi-mişkin üzari-yarə niqab,
Deyillə gün tutulub, aləm iztirabdədir[464].

Qumriyi-şikəstəxatir eşqin fəzilətini bu minval daha neçə-neçə mövzun kəlamlarda rişteyi-nəzmə çəkib, ağılın gözəl və ibrətamiz nəsihətlərini qəbul etməkdən onu uzaq və kənar eləyir.

Ağıl eşqə deyir:

Səhl sanma, eşqi-xubani-cahan düşvardır,
Zahirən gül, batinən amma sərasər xardır...
Eşq bir pünhan mərəzdi aşiqi zar öldürür,
Bəlkə ölməkdən bətər ta ömrə var bimardır.
Rahət olmaz, canı hərgiz qüssədən olmaz xilas,
Fikrü zikri yar ilən ta sübhə dək bidardır.
Ya cünuni eşq olur, məcnun sifət səhranəvərd,
Ya budur Mənsur tək axır məqamı dardır.
Gər vəfasına inansa bivəfa məhrulərin,
Filhəqiqə Qumriyi-şirinzəban biardır[465].

Eşq cavabında deyir:

Gisuyi-mişki-dilbəri dünyaya verməərəm,
Həm tari-zülfünü şəbi-yeldayəyə vermərəm.
Bir cilveyi-cəlali-cəmali-cəmilini
Çərx üzrə bədri-kamil olan ayə vermərəm.
Həngami-sübh rayiheyi-ətri-kakilin
Hərgiz nəsimi-cənnətü mə'vayə vermərəm.
Hər bir nəfəsdə nəkhəti-dürci-dəhanını
Əhyayi-mövt edən dəmi-İsayə vermərəm.
Gülbərgi-ləblərində olan şəhdü şəkkəri
Min hovzi-abi-kövsəri-üqbayə vermərəm.
Naz ilə sərv qamətinin bir xuramını,
Haşa xurami-nəxleyi-tubayə vermərəm.
Məftuh edəndə simi-müsəffayi-sinəsin,
Musadə görsənən yədi-beyzayə vermərəm.
Dürci-dəhan içində o dəndani-dürrini
Min kənizi-dürü lö'löyi-lalayə vermərəm.
Mehri-müniri-səfheyi-ruxsarü arizin
Yüz afitabi-çərxi-müəllayə vermərəm.
Müjgan oxilə sinəmi sevdayə qoymuşam,
Kimdir deyə cahanı bu sevdayə vermərəm.

Başdan məhaldır çıxa şövqi-liqayi-yar,
Heç qəlbimi bir ayrı təmənnayə vermərəm.
Naseh, məlamət eyləmə Qumrini eşq üçün,
Hərgiz qulaq bu söhbəti-bicayə verrnərəm[466].

* * *

Kənzi-nəsayihin açıban əqli-tacdar,
Çəkdi bəyan riştəsinə dürri-şahvar:

Ey dil, vəfası yoxdu dilara gözəllərin,
Cövrü cəfası çoxdu bu rən'a gözəllərin.
Yüz nazü qəmzə ilə can almaqdır adəti,
Ahu baxışlı gözləri şəhla gözəllərin.
Hər tarı bir kəmənd kimi xəlqi bənd edər,
Dami bəlayə zülfi mütərra gözəllərin.
Tavus tək bəzər özünü, xəlqi aldadar,
Çün fikrü zikri məkrdi qət'a gözəllərin.
Bir dəfə güldürər səni, min dəfə ağladar,
Şə'nində gəlməyibdi təvəlla gözəllərin.
Çox imtahan edibdi kəma-keyf haqqına,
Arifdi çünki, Qumriyi-şeyda gözəllərin.

* * *

Verdi cavab əqlə yenə təb'i-pürhünər:
Qılmaz mənə bu növ' nəsihətlərin əsər.

Çıxmaz başımdan eşq ilə sevdası dilbərin,
Könlümdə var həmişə təmənnası dilbərin,
Nuş etmişəm şərabi-məhəbbət ələstdə,
Getməz ölüncə nə'şeyi-səhbası dilbərin.
Vaiz, məlamət etmə məni, həq mənimlədir,
Gəl bax,[467] bu mən, bu sən, bu, tamaşası dilbərin.
Cənnətdə hər nə vardı, sənin, qoy mənim ola
Bir kəlmə söhbəti-fərəhəfzası dilbərin.
Yox özgə məşqi vəsli-ruxi-yardən səva,
Qumri olubdur aşiqi-şeydası dilbərin[468].

* * *

Qıldı dür fəsahəti əqli-köhən nisar,
Ərz etdi pir təb'ə ki, ey mərdi-hüşyar,

Cana məhəbbət aləmi pürinqilab olur,
Əhli-məhəbbətin işi daim əzab olur.
Aramü taqəti kəsilir əhli-nəş'ənin,
Bisəbrü bitəhəmmülü büxürdü xab olur.
Əncüm sayar sabaha kimi aşiqin gözü,



Hicranda hər gecə ona yövmül-hesab olur.
Bir tarmuy ilən dağıdar can binasını,
Ol kakilin[469] ki, riştəsi pürpiçü tab olur.
Əhli-günahə nari-cəhənnəm verir əzab,
Üşşaqı dilkəbab eləyən lə'li nab olur.
Ruxsari-mahtəl'ətə baxmaq deyil rəva,
Çox baxsa aftabə əgər göz, xərab olur.
Abi-həyat tək görünür vəsli-məhvəşan,
Təhqiqi-nəfsül-əmrdə baxsan sərab olur.
Vermə könül o taifeyi-bədməzacə kim,
Kirdari nazü kəlmeyi-nitqi itab olur.
Bir nuş versə qəlbüvə yüz nişi-qəm urar,
Cövrü cəfası aşiqinə bihesab olur.
Yoxdu kitabi-məzhəbi kafir gözəllərin,
Kafir bulardan əsldə əhli-kitab olur.
Aldanma hüsni-surətə, bu xudfüruşlər
Surətdə bülbül olsa da, batin qürab olur.
Zahirdə Müştəridir, əgər batinən Zühəl,
Axır Zühəldən aləm ara ictinab olur.
Bu növ'dür vəfalarının istiqaməti,
Guya ki, filməsəl, su üzündə hübab olur.
Qət'ən əqidəsində bu zalimlərin yəqin
Aşiqlərə cəfa eləmək çox savab olur.
Qumri, bu qövlə mö'tərif ol, qılma e'tiraz,
Bəsdir dəxi, nə qədər sualü cavab olar?!

* * *

Meydani ehticacda çün təb'i-sərfəraz
Rəxşi-fəsahət üstə minib oldu yekkətaz.

Yetməz kəmalə canda əgər cövhər olmasa,
Bizzat əsli-cövhəri-canpərvər olmasa.
İnsan ilən bəhayim içində nə fərq var,
Başda həvayi-vəsli-ruxi-dilbər olmasa?![470]
Olmaz nəvayi-bülbüli-şeyda fərəhfəza,
Gər sinəsində şövqi-güli-əhmər olmasa.
Harda qəbuli-məhzəri-əhli-kamal olur,
Hər kim kitabi-eşqdə sərdəftər olmasa.
Heç nəfs sahibi tapa bilməz[471] həqiqəti,
Ta yari-gül'üzar ilə həmsağər olmasa.
Nəzmin qəzaləsin edə bilməz şikarü seyd,
Şahini-fikr uçmaq üçün şəhpər olmasa.
Düşməz füruqi aləmə kanuni-sinədə
Eşq atəşilə şö'lələnib əxgər olmasa.
Atmaz kənarə dürrünü dərya min il, əgər
Ta gəlməyib təlatümə şurü şər olmasa.

Cami-məhəbbəti-ruxi-canani-nuş edən
Bak eyləməz, nəsibi meyi-kövsər olmasa.
Qabil deyil o kimsə ki, dövri-zəmanədə
Tumari-eşq məşqi ona əzbər olmasa.[472]
Olmaz çəməndə Qumriyi-şuridə nəğməsaz,
Mənzuri sərvqaməti-siminbər olmasa.

Tutiyyi-nəfsi-natiqə oldu göhərfişan
Sərgəştə təb'ə verdi əcəb gülstan nişan.[473]

"Kənzül məsaib"də ağıl ilə təb'in bu qisim mükaliməvü mücadilələrindən sonra şair kitabın səbəbi-təlifü tənzimi barəsində bir-iki mövzun qəsidələr inşa qılıb, gülüstani-Kərbəlaya nəzər yetirib və onda ənva'i-çiçəkləri və əqsami-nəbatatü şükufələri və quşları pərişanhal, giryanü nalan görür və hər birisi zəbani-hal ilə Kərbəla müsibətini zikr qılır:

Gəhi nəzarə qılar həsrət ilə reyhanə,
Onu şəbih tutar xətti-ənbərəfşanə.
Kəmali-hüzn ilə nalandı binəva Məhzun,
Qılıbdı arizini əşki-xun ilə gülgun.
Baxanda sünbülə əfğan edər bəsövti-cəli,
Düşər xəyalına gisuyi-müşkbari-Əli.
Fəna fəğanə gəlib qönçə gül budağında,
Həmişə suzişi-pünhanı var dodağında.
Baxıb[474] o qönçə gülə Qasimi salır yadə –
Ki, türfə yas tutubdu ərusi-damadə.
Bahari-təziyədə bağlayıb əcəb divan,
Salıbdı səhni-gülüstanə nəzm ilə tufan[475].

Bu minval bənəfşə, qərənfil, güli-novruz, güli-cəfəri, güli-sabahi-Süleymani, lalə, süsən, reyhan hər birisi hali pəjmürdələri ilə özlərini şühədayi-Kərbəlaya oxşadıb naləvü fəryad edirlər. Bənəfşə gərdənini kəc görəndə badili-zar Səkinəni gətirib xatirinə qan ağlar. Bu büsatü övza'i gördükdə Qumri dərin fikrə gedib, özünü bu məclisi-vəfaya və bu gülşəni-pürsəfaya daxil etməyə layiq görmür və Kərbəla gülşəninin bülbüllərini bir-bir zikr edib özünü onların müqabilində bir aciz və həqiri-bibəzaət şair hesab edir. Neynəva gülüstanın bülbülləri isə bu əşxasi-möhtərəmdən ibarətdir ki, hər biri facieyi-Kərbəlanı və dastani-pürməlali-seyyidi-şühədanı nəsrən və nəzmən təhrir qılıblar: Müqbil, Mirfəttah, Məhzun, Ağabağır, Cövhəri, Dəxil, Xaki, Sərbaz və qeyriləri. Bu zəvati-giramın hər birinin ismi-şəriflərini Qumri kamali-ədəbü ehtiram ilə bu sayaq zikr qılır:



Görüb bu məclisi bir dəm xəmuş oldu məqal,[476]
Dedim: – Bu gülşənə girməkliyimdir əmri-məhal.
Nə abru ilə gülzarə eyləyim pərvaz,
Gəlib fəğanə, qılım nalə dəmbədəm ağaz.
Nə cür'ət ilə təkəllüm qılım məni-nalan,
Olum riyazi-qəmi-Kərbəladə rətbi-lisan.
Nə növ' cilvələnim[477] Möhtəşəm qabağında,
Çəkim sədayi-məhəbbət Hüseyn fəraqında.
Nə növ' daxil olum məclisi-Süleymanə,
Deyil gədalərə layiq rəvaqi-şahanə.
Hanı o rütbə ki, bəzmi-Vüsalə qabil olum,
Fənavü Bidil ilən Müqbilə müqabil olum.
Nə qabiliyyət ilən həmzəban olum Mirə,
Nə qism ilən gətirim dürri-nəzmi təsvirə.
Necə bərabər olum dilşikəstə Məhzunə,
Kəlamı göz yaşını döndəribdi Ceyhunə.
Olum nə növ' ilə həmdastan Bağır ilən,
Əza məcalisini doldurub cəvahir ilən.
Necə əkim bu gülüstanda nəzm güllərini,
Çəkibdi Cövhəriyi-xoşkəlam cövhərini.
Hanı o feyz meyi-eşqdən olum məxmur,
İçim Dəxil ilə bir camdən şərabi-təhur.
Necə müqabili-Xaki olum bu dəm məni-zar,
Cəvahirati-qəzəl eyləyib bu qəmdə nisar.
Nə qüdrətim var olam həmtəranə Sərbazə,
O qədr tutiyi-təbimdə yoxdur əndazə.[478]

Qumriyi-dilxəstə dübarə fikrə gedib belə böyük şairlərin müqabilində özünü zəifü aciz götürsə də və lakin günahü təqsirinin çoxluğundan naəlac qalıb, özünü yenə bargahi-Süleymana və yə'ni Kərbəla şahı İmam Hüseynə dəxil salır və ona növhəgər olub, ol vəfa kanından səyyiatı üçün əfv tələb edir:

Dübarə fikr elədim bəs ki, çox günahkarəm,
Bu gülüstanda fəğan eyləməkdə naçarəm.
Çəkəllə hər biri bir nalə gül fərağında,
Gərək fəğanə gəlim mən də sərv ayağında.
Müdam Qumriyi-dilxəstə tək batım yasə
Və leyk nalə qılım sərvqədd Abbasə.
Hüseynə növhəgər olmaq əcəb şərafətdir,
Əgər qəbul eləsə, çox böyük səadətdir.
Vəli qovulmayıb hiç kəs bu babi-rəhmətdən,
Əgər qovulsa, uzaqdır yəqin mürüvvətdən.
Necə qovar qapısından, edər məni məhrum,
Veribdi ümmət üçün baş o sərvəri-məzlum.

Necə qovar qapıdan nökərini bir mövla
Kəsəndə Şimr başın ümmətə edərdi dua.
Əməl yoxumdu, günahımdı çox, üzüm qarə,
Deyillə düşsə olur pak it nəməkzarə.
Gətirmişəm məni-miskin bu dudmanə pənah,
Yəqin günahımı məhşərdə əfv edər Allah[479].

Bundan sonra Azərbaycana təvəccöh edib, şüərayi-fəsahət və bəlağətşüəra onlardan kamalü-əczü inkisar ilə təvəqqe eləyir ki, onun kəlamında və şiveyi-nəzmü lisanında müşahidə olunan eybü rəkakətə mültəfü eybcu olmayıb, xətalarına əfv qələmini çəksinlər:

Təvəqqöüm budur, ey sahibani-əqlü şüur,
Hüseyn xatirinə siz tutun məni mə'zur!
Əgərçi şiveyi-nəzmimdə olmuş olsa xilaf,[480]
Kərəm yüzilə kəmal əhli eyləsinlə məaf.
Gəlir təkəllümə hər kəs bəqədri-qüvveyi-xiş –
Ki, bərgi səbzdir aləmdə tövheyi-dərviş.
Olanda Yusifi-Misrin füruş bazari,
Kəlafə ilə gələn həm olub xəridari.
Gətirsə payi-mələx mur əgər zəlilanə,
Hədiyyə xoş görünür həzrəti-Süleymanə.
Nə qədr olsa kəlamım külüftü naməqbul,
Olur hüzuri-Süleymani-Kərbəladə qəbul.

* * *

Həzar şükr sərəfrazi-nəş'əteyn oldum,
Qulami-həlqəbəkuşi-dəri-Hüseyn oldum.
Həzar şükr yetişdim mürədə aləmdə,
Həmişə növhəgər oldum bu bəzmi-matəmdə[481].
Həzar şükr bu fəxr ilə ta dəmi-məhşər
Deyirlər adıma məddahi-ali-peyğəmbər.
Həzar şükr ki, təb'i-rəvan qılıb imdad,
Riyazi-qəmdə nəvaxanlıq eylədim bünyad.
Bu gülşəni-qəmdə Qumri kimin qılıb pərvaz,
Edim təəzzül "Kənzul məsaib"i ağaz[482].

Qumri xoşkəlam və süxənsənc bir şair olduğundan, əsərlərinin əksəri dəxi nəzmən yazılıbdır. "Kənzül-məsaib"nam əsərlərinin ibtidasında deyir: "Çün dürri-giranbəhayi-şe'ri-abdar füsəhayi-əbnayi-ruzigar və hərifani-süxənsənci-kamili-əyyar həzrətlərinin hüzurunda pürqiymət və alimiqdar hesab olunur, binaənəleyh bu kitab dəxi nəzmiyyət ilə əncam olundu və billahit-tövfiq və bihinəstəin"[483].

Şe'rin mədhü tövsifində kitabın əvvəlinci səhifəsində yazıbdır:



Şe'rdir qaimeyi-ərşdə bir kənzi-xəfa,
Əsl müftahi o kənzindi lisanüş-şüəra.
Nitqi-şairdi, bilaşübhə, Məsiha nəfəsi,
Çün dəmi-ruhi-qüdsdür hər iki ruhə səfa,
Şe'ri insaf ilə hərgəh çəkələr bazarə,
Dari-dünyadə tapılmaz ona heç vəch bəha.
Şe'r bir dürri-giranmayədir hər kəlməsinin
Qiyməti olmaz, əgər külli-cibal olsa təla.
Şe'r bir bəhrdi bətni-sədəfi dürri-yetim,
Ol sədəf dürrünə möhtacdı şah ilə gəda.
Şe'rdir həddi-kəmalə yetirən mə'rifəti,
Şe'rdir əncümə'narayi-mümui-ürəfa.
Şe'r bir çeşmeyi-şirindi gəlir cənnətdən,
Nuş edən cür'əsin aləmdə tapar nəhci-hüda.
Nə rəvadır belə pürqiymət olan əş'arın
Katibi eyləyə təhriri-hürufunda xəta.
Çox mürüvvətdən uzaqdır düşə nadan əlinə,
Edə kim şairə bir nöqtə xəfasında cəfa.
Nazimi nadim edə, nəzmi sala rövnəqdən,
Verə təbirinə təğyir, məlasinə bəla.
Qumriya, nəzm ilə, qəm çəkmə, kəlamındı zərif,
Olur, əlbəttə, qəbuli-ürəfavü üqəla.

Və yenə şe'r və nəzmin vəsfində inşad qıldığı bir qəsideyi-bəlağətsirişdə deyir:

Miftahi-kənzi eşqdi alati-şe'rdən,[484]
Təhsil olur həmişə kəmalati-şe'rdən.
Dünyayə bixəbər gəlibən bixəbər gedər
Hər kimsə agəh[485] olmasa halati-şe'rdən.
Kafir təriqi-həqqi tutub səlbi-küfr edər,
Gər görsə mö'cüzatü kəramati şe'rdən.
Huşü bəsirət əhlinə ayinə göstərir
Bipərdə qüds gülşəni mir'ati-şe'rdən.
Nəfis-nəfis olub bu təmənnadə nüktəsənc,[486]
Artar səfayi-zehn xəyalati-şe'rdən.
Qoymaz qədəm o kimsə rikabi-fəsahətə,
Ta etməsə şikar qəzalati-şe'rdən.
Var çün rümuzi-eşqdə ayati-bəyinnat,[487]
Çoxlar yetib səfayə hədayəti-şe'rdən.
Bənnayi-ruzigar əgər min bina qoya,
Bir beytə çatmaz əsli-büyutati-şe'rdən[488].

İbtidayi-"Kənzül-məsaib"də dərc olunmuş saqinamələr dəxi Qumrinin gözəl və fəsih kəlamlarındanədd olunur. Əvvəlinci saqinaməsində

saqiyi-siminsaqa xitab edib, ondan kərəm və himmət tələb edib deyir: qədəhi həzrət Əlinin eşq badəsi ilə ləbaləb edib, mənə ə'ta elə, ta ki, ol badeyi-gülfami-fərəhbəxşi-zülalı nuş qılıb, o mövlanı mədh etmək üçün şahinmisal zərrin bal açıb aləmi-baladə dövr etməyə pərvaz edim. Sonradan şair saqiyə üz tutub, ona deyir ki, bu bəzmi-şahanəyə və məclisi ürfana şüərayi-əcəm, türk, Buxaranı gətir. Şairin öz lisanı ilə ifadə edəlim:

Sədəfi-nəzm təmamən yetirib dürri-yetim,
Qiymətin bilməyə sərrafi-süxəndanı gətir!
Birce bu məclisə, ey saqiyi-fərxündəcəmal,
Şüərayi-əcəmü türkü Buxaranı gətir!
Əvvəla eylə güzər məmləkəti-Şirvanə,
Nəzmdə firqeyi-şairlərə Xaqanı gətir!
Rə'yəti-təb'im olub hər tərəfə şəqqgüşa,
Bir dəm, ey təb'i-rəvan, başıma sevdanı gətir!
Söylə Xaqaniyə, ey Çini-süxən xaqani,
Ərməğan əldə tutub nəzmi-dürəfşanı, gətir!
Ünsüri,[489] aləmi-zülmati-ənasirdə göz aç
Vadiyi-eymənə gəl, nuri-təcəllanı gətir!
Qıl xəbərdar Nəvai kimi sahibhünəri,
De: tamaşayə tamam əfsəhi-Turanı gətir.
Ənvəri, neyyəri-əzəm kimi nəzmindi münir,
Dür nisar eyləməyə əqdi-Sürəyyanı gətir!
Cami Vəhdətdən içən Camiyi-Cəmcahə deyin,
Açıban dürci-fəsahət, dürü mərcanı gətir.
Sə'diya, ism sənin, taleyi-məs'ud mənim,
Bərgi-bibardi "Bustan"ü "Gülüstan"ı gətir!
Ey olan Hafizi-kənzi-şəhvari qəzəl,
Yarü mə'şuqə nədir, huriyü qılmanı gətir.
Ey Nizami, demə çox Xosrov ilə Şirindən,
İstəsən təxti-büsat üstə Süleymanı gətir.
Ar ola qüvveyi-idrakına,[490] Ey Qaani,
Sən də gəl öz dediyin hərzəvü hədyanı gətir.
Çox da fəxr eyləmə öz nəzminə, ey Firdovsi,
Sevəsən söz yerinə lə'li-Bədəxşanı gətir![491]

Qumrinin Firdovsi ilə müqabilə etməsi:

Gəl, şücaətlə gərək hər ikimiz cəngahə,
Mərəzi-cəngə qədəm qoymağa meydanı gətir!
Dörd ağac xari-müğilan yetirən büt'ə mənim,
Sən müqabildə durub[492] saheti-qəbranı* gətir!

*Q ə b r a – yer, ruyi-zəmin mə'nasındadır



Qabiliyyət hanı qəbrada müqabil durasan,[493]
Gər qələt eyləməsəm, ərşi-müəllanı gətir!
Mən açıb rəzmdə bir qanlı ələm şəqqəsini,
Ələmi-Gavə nədir, mehri-dirəxşanı gətir!
Vardı bir müşk mənim saf suyum ma'i-Fərat.
Rudi-Ceyhun demə, keç qülzümü Ümmanı gətir!
Mən Üqab adlı səmənd üstə qoyum zivərü zin,
Sən də öz Rəxşin ilə ərsədə cövlanı gətir.
Zülfüqar adlı qılınc mən çəkərəm də'vadə,
Gavi-sər gürz ilə sən puri-Nərimanı gətir!
Məndə bir sinəsi dörd min yaralı köynək var,
Sən Təhəmtən geyinən cövşənü xəftanı gətir!
Bəsdi bir qan ilən əlvan olan əmmamə mənə,
Sən gedib məğfəri-fuladi-mütəllanı gətir!
Ləşkərim yetmiş iki təşnə dilavərdi mənim,
Sən özün cəm'i qılıb ləşkəri-İranı gətir!
Arizu eyləmə hər beytinə dinari-təla,
Mən kimi beytinə bir cənnətü rizvanı gətir!
Heyf zəhmət[494] çəkibən bağlamısan "Şahnamə",
Onda vəsf eylədiyin Rüstəmi-dastanı gətir!
Kimdi Rüstəm, nə Fəramərz, nə Söhrab, nə Giv,
Bəlkə İskəndər ilən Bəhmənü Daranı gətir.
Nədir İskəndərü Dara, nə səlatini-Kəyan,
Turi-Sinayə gedib həzrəti-Musanı gətir!
Ya gəzib səfheyi-dünyada dolan, eylə soraq,
Misirdən təxti ilənYusifi-Kə'nanı gətir!
Harda var səndə mənim tək şərəfü cahü cəlal,
Şiveyi-nəzmdə girəm yədi-beyzanı gətir!
Rəhbərimdir iki dünyada Hüseyn ibni-Əli,
Gər varın olsa sənin də belə mövlanı gətir!
Həşrdə cami-bülur əldə tutub şiri-xuda,
Buyurar təşnədi çox Qumriyi-nalanı gətir![495]

Qumrinin bu saqinamələri bir-birindən mövzun və müsəlsəldir. Təmamisini burada zikr etməyə ehtiyac yoxdur. Səkkizinci saqinaməsində şair Kərbəla müsibətinə şüru edib deyir:

Piyalə ver mənə, saqi, ələm həvası gəlir,
Yavaş-yavaş gözümün dürri-pürbəhası gəlir[496].

Altıncı və yeddinci saqinamənin arasında şair mətləbdən kənara çıxıb, Kərbəla müsibətinə dair əhvalat yazan şairləri mədh və bundan qeyrilərini bir növ' zəmm qılıb, keçir riyakar və əhli-təzvir ruhanilərə və onların eyb və qüsurlarını bu sayaq göstərir:

Tayiri-tizi-xəyalım çıxdı mətləbdən kənar,
Yazmağa nuki-qələm bir özgə ünvan axtarır.
Dami-təzvir əhlinin sövmü səlatından həzər,
"Nə'bdü iyyak"də[497] xud məhz küfran axtarır.
Günbədi-pürməkrdir əmmameyi-əhli-riya,
Hər müdəvvər piçü tabı dinə talan axtarır.
Rişteyi-təhtül-hənəkdən, ey müsəlmanlar,[498] haray,
Bir yaman əfi ilandır, qətlə insan axtarır.
Sübheyi-səddanə ilən çubi-badami əsa,
Biəməl alim əlində nəf'yi-iman axtarır.
Ağ libasü ağ ridanın dаməni evlər yıxar,
Etməyə mə'mureyi-imanı viran axtarır.
Xirqeyi-salusi-zahid hiyləsindən əl-aman,
Dəmbədəm hər tarı yüz min məkri-pünhan axtarır.
Can fəda elm əhlinin dinpərvərü dindarına,
Fikrü zikri müttəsil ayati-Qur'an axtarır.
Onların əmmaməsi həmduşi-taqi-ərşdir,
Çün olar bir firqədir, tövfiqi-sübhan axtarır.
Axtarır afaqdə hər aşiq öz mə'şuqəsin,
Qumriyi-bəzmi-əza şahi-şəhidan axtarır[499].

Qumrinin biəməl və mühil üləmaların zəmmində yazdığı bu kəlam xeyli nazik və ədibanə əsərlərdən biri hesab oluna bilər. Burada iste'mal olunan "günbədi-pürməkrdir əmmameyi-əhli riya" kimi bə'zi istiarat və işarələr ancaq müqtədir və kamil şairin qüvvəsindən xaric olan kəlamlardır.

Kəlamın cümləsindən mə'lum olur ki, Mirzə Məhəmməd Tağı Qumri həqiqətdə bir bəliği-şirinzəban və sahibi-təb'i-mövzun şair imiş. Səhih qövlə görə, ol cənab təb'i-səlimdən başqa qeyrəti-milliyyəsi ilə müasiri beynində iştihar bulmuş ziyadə cür'ətli və himmətli və sahibmənsəb və hükkam hüzurunda məruf və ictima'i-nasdə Dərbənd əhlinin ehtiyacını bildirən və ərzi-halü dərdi-dilini ərseyi-zühurə gətirən dilavərü mütəkəlim və mütəəssibü millətpərəst bir vücud idi.

Ziyadə dindar və çakəri-əhli-beyti-rəsul olduğuna binaən, qədimdən Dərbənddə şəbih əsası mütədavil ikən ol cənab dəxi şəbih büsatına rağib və mayil olub, hər sənə mübaliğ pullar sərf edib, şəbihə dair mükalimatcə'didə tərtib edərmiş.

Ol mərhumun xəsayisi-qəribəsindən biri də bu imiş ki, xəlayiqisübhan ona iki çeşmi-giryan manəndi-əbri-neysan ə'ta buyurmuşdu ki, hər vaxt nəzmi-müsibət qıldıqda xütuti-övraq gözlərinin yaşından pozulub, dübarə onları təhrir edərdi. Necə ki, bu barədə şair deyibdir:

Çeşme-geryan ceşmeye-feyze-xodast[500].



Və yenə axırıncı saqinaməsində buyurubdur:

Bu sirri bilməyirəm şur göz yaşında nə var,
Axanda lö'löyi-şəhvar tək cilası gəlir[501].

"Kənzül-məsaib"dən səva Qumrinin əş'ari-nəfisə və əbyati-mütəfərriqəsi çoxdur. "Kənzül-məsaib"ə əlli sinnində olduqda yenə bir neçə yüz əhvalat üsərayi-Kərbəladan mülhəq qılıb, onu "Külliyyat" ismi ilə mövsum etmişdir.

Mərhumun zükur övladlarından Mirzə Mehdi və Mirzə Cəfər üçün qəzzayi-rəbbanidən bir hadiseyi-üzmə üz verib, nizami-səltənətə görə hükkami-divani-ədliyyə hər ikisini müqəssir bilib, iki il müddəti Dərbənddə məhbus saxlayıb, sonra Sibirə İrkut quberniyasına rəvan etdirmşdi. Mərhum Qumri bu yolda – öz oğlanlarının xilası üçün çox zəhmətlər çəkib və çox pullar sərf edib, hər bir tərəfə səfər qılıb, gahi Tiflisə, gahi Peterburqa və gahi Tehrana. Amma heç bir tərəfdən dərdi-dilinə çarə tapmayıbdır. Bununla belə Qumri öz ənduhü məlalı və pərişan halını öz ürəyində gizlin saxlayıb, əğyarü bədxah nəzərində və təslimi-rizadə sabitqədəm olub, qeyrət və himmətinə əsla qüsur yetirməyibdir və sabiqi adətinə görə nəzmü təlif'ə məşğul ikən:

Şod ze səhraye-ədəm bade-əcəl yekdəm kənar,
Nagəhan rəft an qole-rən'a ze dəste-ruzeqar.
Bəst əz in dare-fəna rəhl eqamət, bər bəqa,
Yek hezaro si sədo noh miqozəşt əz salha[502].

– nazimi-mərhum hicrətin 1309-cu[503] tarixində yetmiş beşinci sinnə yetdikdə dari-üqbaya rehlət buyurdu. Məşhur qövlə görə, Qümrinin on dörd cüz nəzmi-qəsaidi-ərəbiyü, farsiyü, turki və ibrətnaməvü nəsihətnaməvü dübeyt və sair əsərləri qalıbdır. Onlardan əksəri təb' olunmayıbdır. Məcmueyi-mənzumədə[504] əbnayi-zəmanəyə yazdığı ibrətnamələrindən birisidir:

Axtar siyab qiymətin, ey dust, urdən
Dərk et həyat nəş'əsin əhli-qüburdən.
Ne'mət əlində qədrini bil, sora tapmasan,
Biqədr tutma əldə olanda vüfurdən.
Qəlp etmə lövhi-qəlbini, ey qəlb sahibi,
Xilqətdə saf xəlq olunubdur bülurdən.
Ey bixəbər, nə eşqdəsən ya nə məşqdə,
Əsla gözün ayağını görməz qürurdən.
Bir qətrə nöqtədəndi vücudun, nə kibrdir,

Fəxr istəməz, yaranmamısan sən ki, nurdən.
Rahət yol üstə yuxlamısan bixəbər yatıb,
Bangi-cərəs cahanı tutub hər sünurdən.
Bir vaxt olur gəlir mələkül-mövt dur gedək,
Verməz aman əgər keçəsən min kürurdən.*
Əl boş, üzün qara, qalacaq mal özgəyə,
Şərməndə kirdigari-əfüvvü qəfurdən[505].

Müəllifi-qüfranpənahın fərzəndlərindən Mirzə Əliabbas "Riyazi" təxəllüs atasının natamam olan məcmueyi-mənzuməsində bir süls nəzmən öz qüvveyi-təbiyyəsi ilə izafə qılıb itmamə yetiribdir və "Kənzül-maarif" ismi ilə təsmiyə qılıbdır. Əlan ol məcmuənin təb'ü intişarına hazırlaşır.

Cənab Mirzə Abbas hər bir barədə atasının qaimməqamı olub, o natamam qoyduğu işləri və fikirləri yerinə yetirməkdədir:

Qəm deyil gər danəni məhv etsə dövri-ruzigar,
Çün nihali-barvər qalmışdır ondan yadigar.

Mirzə Məhəmməd Tağı Qumrinin mədhində mərhum Molla Feyzulla "Feyzi" təxəllüs bir neçə rübaiyyat deyibdir. Onlardan bir-ikisi burada təhrir olundu:

Ə'la ya əyyühəl-Qumri, bəyanın mayeyi-behcət,
Yazıbdır lövhi-sinəndə qələm əsrari-pürhikmət.
Dəmi-ruhül qüdüsdür bu və ya sehri-mühəlləldir,
Əgər xəsmin ola münkir bu höccət əldədir höccət.

Əcəb nəzmi-dilkəş, əcəb xoş kəlam,
Kəlimi-zaman ver Məsifə pəyam,
Deyin Qumriyə bəzmi-firdovs ara:
Kəlamül-imami, imamül-kəlam.

Filhəqiqə Qumrinin çox rəvan və mövzun təb'i varmış. Buna şəhadət verən onun əş'ari-abdarı [və] xoşgüvarıdır. Heyfa ki, Qumri qüvveyi-şe'riyyəsini ancaq bir yolda – yə'ni müsibət yazmaqda sərf edib, özgə qisim asar qoymayıbdır ki, şayani-diqqət ola. Əlbəttə, buna səbəb onun pişrovları və müasirinin, xüsusən Dərbənd əhlinin müsibətnaməni hər qisim əş'arü kəlama tərcih tutmaqları və xud şairin özünün əyyami-tüfuliyyətdən şəbihkərdanlar və mərsiyəxanlar və növhəsazlar arasında nəşvü nüma tapması və ev tərbiyəsi olubdur.

---

* **Kürur** – yarım milyona bərabər – *red.*



Mə'lumdur ki, beş-on sənə bundan əqdəm artıq hörmət və şöhrətdə olan ancaq İmam Hüseyn müsibətinə dair növhə və mərsiyə yazan şairlər idi ki, onların kəlamı məscidlərdə təkyələrdə oxunurdu və onlar öz kəlamlarını eşibid, xalqın tə'rifü tövsifi ilə sərəfraz olurdular və növhə yazmağa dəxi də artıq şövqmənd olub, bütün vaxtlarını və qüvveyi-şe'riyyələrini bu yolda sərf edirdilər. On beş-iyirmi sənə bundan əqdəm Şuşa qələdə əli qələm tutan kəmsavad uşaqlar dəxi növhə yazmağa məşğul olub, hər birisi öz düzdüyü şe'rə oxşayan kəlamları ilə iftixar edirdilər. Amma bu axır vaxtlarda növhə və mərsiyə mövsümü bir növ' keçib və solub. Təğazayi-zəmanəyə görə şairlərimiz indi də təzə məsləkdə və qeyri bir məzmunda şe'r yazırlar. Məzmunu məsləkin dəgşirilməsi ilə belə şairlərimiz şiveyi-lisanlarını da dəgşiriblər.

# MİRZƏ HƏSƏN ƏFƏNDİ ƏLQƏDARİ

Cənabi-fəzailməab sədrül-üləma Mirzə Həsən əfəndi ibn Əlhac Abdulla əfəndi Əlqədari "Məmnuni" təxəllüs əsrimizin ən məşhur və mö'təbər tarixnəvisi hesab olunur. Bu zati-ərbabi-qələmi və ədibi və ən mö'təbər tarixnəvisi hesab olunur. Bu zati-ərbabi-qələmi və ədibi həmidəxəsailin "Asari-Dağıstan" nam kitabında dərc olunmuş əxbarü rəvayətin cümləsi müsənnifin ziyadə mə'lumatlı, fəsih və kamil bir vücud olmasına dəlalət edir. Ülumi-mütənəvvəeyə dara olmaqdan maəda Mirzə Həsən əfəndinin təb'i-mövzun sahibi olmağı dəxi onun əş'ari-bərcüzidələrindən mə'lum olur.

"Asari-Dağıstan"ın 249-cu səhifəsində Əlqədari cənabları kəmali-həqarətlə özlərini Dağıstan üləmaları silkinə daxil qılıb, tərcümeyi-halına dair bir para mə'lumat verirlər və biz dəxi burada haman mə'xəzdən nəf'bərdar oluruq. Mirzə Həsən əfəndinin validi-əmcədi Dağıstanda Kürə nahiyəsində Əlqədar kəndinin sakini Əlhac Abdulla əfəndidir ki, üləmayi-mütəbəhhirin cümləsindən ədd olunur və öz kəndində xeyli müddət müdərrislik edibdir. Ol cənabın valideyi-möhtərəməsi Şeyx Məhəmməd əfəndi Əlyərağinin qızı Hafizədir. Mirzə Həsən cənabları təvəllüd edibdir Avar xanlığında Beyləqan adlı qəryədə camadiyülaxirin 11-ci günündə hicrətin 1250-ci[506] tarixində. Bu halda Beyləqan Zaqatala okruğuna daxildir, ziyadə məhsuldar və meyvəcat gətirən bir yerdir.

Mirzə Həsən əfəndinin təvəllüdündən sonra onun atası vətəninə qayıdıb, Əlqədarda sakin olubdur və öz valideyninin təhti-nəzarətində nəşvü nüma tapıbdır. Haman qəryədə olan mədrəsədə on beş sinnə qədər ülumü fününi-ərəbiyyeyi-mütədavilənin təhsilinə məşğul olubdur və həm də orada fars dilinin müəllimi olan ağdaşlı, Qaraxan kəndinin əhli Əsseyid Abdulla əfəndidən fars və türki lisanını layiqincə öyrənibdir və bir müddət dəxi Kürədən yuxarı Yarağ qəryəsində Əlhac İsmayıl əfəndinin hüzurunda qiraət edibdir və övqati-əxirədə Axtı qəryəsində müdərrislik edən əlqazi Mirzə Əli əfəndinin "Hey'ət" və "Hikmət" nüsxələrini oxuyubdur. Təhsildən fariq olub, tədrisə məşğul olduqda ol cənabı o zaman Kürədə xan olan general Əlhac Yusif xan hüzurlarına aparıb, altı sənəyə qədər onu öz yanında saxlayıbdır və bu əsnada onun şüğlü kitabət və tə'lim olubdur. Bədən Kürə nahiyəsində rus divanxanası açılanda bir müddət də burada əvvəlcə mühərrir və bə'dən divanbəyi xidmətində iqamət edibdir. Bundan sonra on iki ilə qədər dövləti-Rusiyyə canibindən cənubi Təbərsəranda nayiblik edibdir.

1294-cü[507] sənədə Dağıstanda vüqua gələn iğtişaşda müttəhim olan əşxasın cümləsindən haqq-nahaq Mirzə Həsən əfəndi də idrac olunub,



dövləti-Rusiyyə hökmü ilə Dağıstandan əhlü əyalı ilə Rusiyaya, Tambovski quberniyaya göndərilibdir və dörd ilə qədər haman məkani-qürbətdə üsrət və pərişanhallıqda vəqti-əzizini sərf edibdir. Sonradan dövlət tərəfindən Dağıstana müraciət etməyə izn verilib və ol cənab əyalü ətfalı ilə Kürəyə qayıdıb, vətəni-əslisi olan Əlqədar qəryəsində sakin olubdur. Necə ki, yuxarıda zikr olundu, Rus dövləti ilə Osmanlı dövlətinin 1294-cü sənədə müharibəsi başlanan zamanı Dağıstanda böyük iğtişaş və inqilab zühura gəldi və izhari-bəğyü xəyanət etdiklərindən ziyadə zərər və xəsarətə düçar oldular və vaxtın qarışıqlığına görə haqq-nahaq əyri doğrudan seçilmədi. Atalar sözü misdaqınca: "Quru oduna yaş da yandı". Ol əsnada cənab Məmnuni Peterburqda imperaturi-əzəmin hüzurunda konvoyi-məxsusi xidmətində olan oğlu Əbumüslimə nəzmən təhrir qıldığı məktubdan bə'zi təfsilatı-vəqaye müstəfad olunur. O, məktubu bu sayaq başlayır:

Ey Əbamüslim, ey əzizi-pədər,
Ey cigərguşeyi-sütudəsiyər,
Ola ömrün tə'vili-səhhətdə,
Yarın olsan cahanda bəxti-zəfər.
Dəstgirin ola həmə övqat
Şahi-lövlak, saqiyi kövsər.
Bə'd əzan ümdeyi-mətalibimiz
Olmağındır həmişə sə'dəxtər.
Saniyən eyləsən əgər məndən,
Həm bu ətrafdən sual, xəbər,
Həmdilillah bu vaxtacan sağam,
Əyzən əmamü ixvətü madər,
Həmçinin sairi-əqaribimiz,
Leyk bunda göründü çox işlər.
Çərxi-cərdun edib bəəks mədar,
Gərdişi düzlüyündən[508] oldu bə'dər.
Aşikar etdi sün'i-buqələmun
Növbənöv nəqşi-müstənfər.
Qırılıb rişteyi-qəladeyi-dəhr,
Tutdu gövhər yerini möhreyi-xər.
Oldu zahir fəsadi-səfki-dima'
Gəldi misdaqi-şərri-qəmm-bəşər.
Düşdü xaki-məzəllətə birdən,
Neçə xürrəm gəzən bəyü əfsər.
Yəni bu mərz-bumi-Dağıstan
Olmuş ikən fəraqətə bəstər,
Nagəhan etdi əhli- səğri-Əkəg
Bir qələt kim, cahana saldı şərər[509].

Bundan sonra iğtişaş düşən dehatın və ədavət göstərən əfradın filcümlə adları zikr olunub və təəccüb burasıdır ki, ləzgilər də bu axır vaxtlarda ermeni-müsəlman ədavətində müsəlman qardaşlar göstərən hərəkatü əf'ali-şəniəni büruz edib, bir-birlərinin canına, malına yağı düşüblər, necə ki, şair deyir:

Qaçdı bu iğtişaşda Kürədən
Bakı şəhrinə alişan kəslər.
Qaldı əhli-Kürə sərasimə,
Dedilər: xəlvət oldu bu dərələr.
Bildilər fürsəti qənimət ta,
Sandılar qarəti cahanda hünər.
Bir-birin kəsdi-basdı axırda,
Tikdilər ittifaq ilə sərvər[510].

Bundan sonra hər yerin əhli özlərinə min şərarətü xəyanət ilə böyük tə'yin edirlər və bu intixabda haqq və ədalətin üzünə nainsaflığın qara pərdələrini çəkirlər. Şair bu halı – Dağıstanın pərişan övza'ını görüb fəryad edir:

Ahü vahəsrəta bu ölkələrin
Cümləsi etdilər əzim zərər.
Yox imiş heç birində bunların
Beş nəfər müstəqim əqlü nəzər.
Olmadı hiç yerdə asudə[511]
Kənd əhli, qudurdu oğrulər.
Götürüldu bulardan insanlıq,
Çoxusu döndü qurda, qəlbi həcər.
Sirqətü qarətə olub mayil,
Az qalıb bir-birin boğub yeyələr.
Füqəra çöllərə qaçıbdı tamam,
Qarışıb səsləri təbiü bəqər.
Qalmış idi yetim, dul övrət,
Soyuq altında bid tək titrər.
Kəsməyirdi yağış arasını nəf'
Verməyirdi olara zilli-şəcər.
Qayalar altı döndü qələlərə,
Sanki hər bir mağara bir Xeybər[512].

Burada şair müvəqqəti rəyasət edən kəslərin zülmü sitəmindən və naməşrü' əməllərindən filcümlə [...] bəyan edir. O əsnada Şimali və Şərqi Qafqazın hər yerlərinə şurişü vəlvələ düşür [...] və əhaliyi-şəhrü dehat böyük xövfü əndişəyə düşür. Dağıstanın yavuqunda olanlar hərə bir canibə qaçırlar. Necə-ki, şair deyir:



Düşdü Dərbəndü Qübbəyə nifrin,
Gəldi ha, gəldi ləzgi, eynə məfər?
Çox əkabir edib əyal ilə,
Hacıtərxana kəşti ilə səfər.
Çoxu həm ehtiyat edib oradan,
Saldı dəryada neçə gün ləngər.
Mən də Dərbəndə eylədim rehlət,
Əlqədardan edib burada həzər.
Gəldi xani[513]-mükərrəmim oraya,
Həm neçə əhli-qəryeyi-digər.
Leyk gördük orada çox qiybət,
Danışıb üstümüzdə hər əbtər.
Bu səbəbdən olunmuşuq məhbus,
Ta ola sidqü kizb müstəhzər[514].

Bundan sonra Məmnuni Rusun qoşunu gəlib, ölkəni əmnü asayişə salmağından və əhli-fəsada tənbihü bazxast yerişməyindən danışıb, oğluna xitabən bu nəhv xətmi-kəlam edir:

Ah, çoxdur burada əhvalat,
Var kitabətdə ehtiyat əksər.
Ancaq ümmidvarıq Allaha –
Ki, qıla lütfünü bizə rəhbər.
Çünki oldur müsəbbibül-əsbab,
Qüdrətilə dönər məhü xavər.
Onun əmirlədir təqəllübi-qəlb,
Əməli-rəfü nəsb, mənsəbü cər.
Ummarıq üstümüzdə eyləyə o,
Hükəmayi-üzami dilpərvər.
Ey oğul, ol həmişə nikəməl,
Olma heç vaxt maili-münkər.
Eylə məktublarınla Məmnuni
Dəmbədəm şad, ey ziyayi-bəsər[515].

Cənab Məmnuninin fərzəndi-dilpəsəndinə təhrir qıldığı bu məktubu onun mövzun və mö'təbər kəlamlarından birisidir. Mirzə Həsən əfəndinin beş-altı nəfər zükur övladı vardır ki, cümləsi pədəri-büzürgvarları getdiyi yol ilə zahib olub, elmü mə'rifət kəsbi ilə özlərinə şöhrət və hörmət qazanıblar. Onlardan böyüyü Mirzə Əhməd əfəndi məhkəmeyi-qəryədə qazilik etməkdədir. Qeyriləri isə qisim-qisim dövləti qulluqlarda və kəsbi-ülumda yaşamaqdadırlar. Haqq-taala cümləsinə ömri-tə'vil və xoşbəxtlik ə'ta eləsin.

Cənab Əlqədarinin asari-qələmiyyəsinə gəldikdə, deyə bilərik ki, onlar həddən mütəcavizdir. Əksəri ərəb lisanında olmağa binaən, onların

barəsində burada bəhs olunmayacaqdır. Türk dilində nəzmən tərtib olunmuş əsərləri bunlardır: 1) "Mənzum üsuliddin", 2) "Əlfulül-matəm fihəqqil-matəm", 3) "İzharül-hal fixüsusil-al", 4) "Asari-Dağıstan" nəsrən və bunlardan əlavə xeyli əş'ari-mütənəvvеələri vardır ki, onlardan bir neçəsini nümunə üçün öz mövqeyində göstəririk.

Alimi-mühəqqiq Mirzə Həsən əfəndinin asari-qələmiyyəsinin cümləsindən biz Azərbaycan türklərinə artıq müfidü zərur olanı və bizi öz tariximizlə bələd edəni "Asari-Dağıstan" adı ilə təb' olunmuş kitabıdır ki, hər əhli-savada onun mütaliəsini nəinki məsləhət, hətta borc görürük. Bu əsər açıq və asan türk lisanı ilə yazılmış, 255 səhifədən ibarət xoşsəliqə bir kitabdır. Qiyməti dəxi ağır deyil, bir manatdır. Bakıda kitabfüruşların mağazasında satılmaqdadır. Müsənnifin özündən dəxi yazıb gətirmək mümkündür. Oxucularımızı bu kitabın mündəricatı ilə aşina etmək üçün onun bir müqəddiməsi və on iki babları və nə mətləbü məbhəsdən söylədiyini müxtəsərən burada zikr eləyirik:

"Asari-Dağıstan"ın müqəddiməsi Dağıstan əhalisinin bu ana qədər əsnafü nəvahiləri bəyanında və burada müstəməl olan əlsinəvü lüğatiməşhurə bəyanında, həmçinin islamdan irəli burada sakin olan xəlayiqin əqayidi xüsusundadır.

I bab dini-mübini-islam bu diyara varid olandan sonra Teymurləngin bu tərəflərə xüruc etdiyi zamana qədər bu yerlərdə vaqe olan əhvalat xüsusundadır.

II bab Teymurləng zahir olandan sonra dövləti-Osmaniyyə və dövləti-Səfəviyyənin (qızılbaşların) rəyasət və siyasətləri bu ətrafa yetənəcən zühur edən vəqaye barəsindədir.

III bab haman iki dövləti-islamiyyə zühur edəndən sonra Rus dövlətinin əvvəl dəfə varid olduğuna kimi vüqua gələn əhvalat xüsusundadır.

IV bab Rus dövlətinin qoşunu əvvəl dəfədə Dağıstan canibinə vürud edib, oradan qayıdana kimi cari olan əhvalat və güzarişat bəyanındadır.

V bab Rus qoşunu Dağıstandan qayıdan zamandan Pyotri-kəbirin əsakirlə Dağıstana yeriş etməyinə kimi vüqua gələn əhvalat bəyanındadır.

VI bab imperator Pyotri-kəbir Dağıstandan müraciət etdikdən sonra Nadir şahın zühuruna kimi vaqe olan əhvalat bəyanındadır.

VII bab Dağıstanda Nadir şah xüruc etdikdən sonra onun qətlinəcən burada ittifaq olan əhvalat bəyanındadır.

VIII bab Nadir şah məqtul olandan sonra rus əsgərləri üçüncü dəfə bu ətrafa gələnəcən vaqe olan əhvalat bəyanındadır.

IX bab üçüncü dəfə Rus dövlətinin qoşunu Dağıstana daxil olub, müraciət eləyənəcən zühura gələn əhvalat bəyanındadır.



X bab rus əsakiri[516] üçüncü dəfə Dağıstandan qayıdandan sonra dövləti-Qacariyyə zahir olanacan və rus qoşunu dördüncü dəfə bu ətrafa gələnəcən burada olan əhvalat bəyanındadır.

XI bab dövləti-Qacariyyə zahir olandan sonra və Rusiya əsakiri dördüncü dəfə buraya gələndən sonra ol iki dövlət mabeynində "Müsaliheyi-Gülüstan" iniqad olana kimi vüqua gələn əhvalat bəyanındadır.

XII bab bu zikr olunmuş iki dövlətin aralarında "Gülüstan müsalihəsi" iniqad olunandan sonra ba vaxta kimi Dağıstanda vaqe olan hadisat bəyanındadır.

Əlxatimə Dağıstan əhalisinin əxlaqü adəti bəyanında və bir para üməravü mərhumiyin və üləmavü ümərayi-əhya halü şə'nləri barəsindədir[517].

Bu mə'lumatın təmamisi ziyadə əhəmiyyətli və lazıməli olmağa görə, biz dəxi onların təhsilini əbnayi-vətənə tövsiyə qıldıq. "Asari-Dağıstan"ın ibtidasında təb' olunmuş qəzəl kitabın təlifinə bais Həmidi sakini Əhməd xanın fərzəndi Bəybala bəy olduğunu bəyan eləyir; necə ki, deyibdir:

Bu təlif'ə olub bais mənə bir fəxri-Dağıstan,
Əmiri-binəzirü dilpəzirü sahibi-ürfan.

Təbəsəran diyarında əmarət xanədanında
Kəmaləti edib təhsil, olan səramədi-əqran.

Təvazö əhli, xoş əxlaqü xoşdidarü xoşsöhbət,
Həmidi sakini Bəybala bəy fərzəndi-Əhməd xan.

Xuda qılsın onu hər dəm mükərrəm əqrəbasilə,
Müvəffəq eyləsin əmali-xeyrə daimül-əhyan.

Əgər düşsə bu asarım rəkikü ləfzim aşüftə,
Səzadır kim, məni əyzən qılıb aşüftədil dövran

Verən varın utanmaz, mal bənzər malikə, həqqa,
Bular doğru misallardır, mənim əhvalıma şayan.

Bu təlifin şüruində yazıb Məmnun bu tarixi:
"Ğəvaşi" lamsuz sali, məhi şəvvali-xoşünvan[518].

Zeyldə yazılan mənzumat dəxi "Asari-Dağıstan"ın dibaçəsində dərc olunmuş və ixtisar vechdə Dağıstanın keçmiş halına və onda vüqua gələn asarü əlamata və onun şimdiki pərişan əhvalına işarə edici şe'rlərdir ki, müəllifin qələmindən südur etmişdir:

Qərəz oldur ki, bizdən qaib ixvanə ola əş'ar,
Fəramuşxanə Dağıstan diyarından neçə asar –
Ki, bilsinlər necə bunda olubdur naili-zəhmət,[519]
Qəriqi-bəhri-rəhmət olmuş əbrarü ulul-əbsar.
Neçə əshabi-peyğəmbər dəxi ətba'i qılmışlar
Xəzərdən bu diyarı pakü çəkmişlər cəfa bəsyar.
Necə almış Əbumüslim bu ölkə fatehi namin –
Ki ta məhşər olur adı duayi-xeyr ilə təzkar.
Neçə şamxalü xanlar, usmiyü məsumü qadilər
Qılıblar xəlq içində bunda, dini-həqqi, istiqrar.
Neçə məscidlərin mə'mur ediblər həsbətüllahi,
Neçə tədrisxanə, xanəgahü qələni əmar.
Neçə yüz il idarə eyləmişlər bu nəvahidə,
Vəli təfsil ilə mə'lum deyildir imdi ol rəftar.
Olub hami səlatini-bəni-Abbas bunlarə –
Ki, ta Teymurləng etdi buları ləng bir miqdar.
Gəhi şahani-İran etdilər bunda rəyasətlər,
Gəhi qıldı siyasətlər burada bir neçə xunkar.
Gəhi tarixi-hicrətdən zamani-qərni-aşirdə
Açıldı ləzgilər başı, cahanı qıldılar bizar.
Biri çəkdi qoşun Şirvanü Gəncə, Ərdəbil üstə,
Birisi cari Gürcüstanı qıldı xeylinə mizmar*.
Gəhi çəkdi Krım sultanları bu canibə ləşkər,
Gəhi avarə düşdü bu tərəfdə firqeyi-tatar.
Gəhi-təcdidi-dinə oldu dai bunda Şeyx Mənsur,
Gəhi Qazi Məhəmməd, gah Həmzə etdi istikbar.
Gəhi Şamil əfəndi bunda qıldı hökmünü şamil,
Çıxardı hər tərəf əmr etsə bundan ləşkəri-cərrar.
Bihəmdillah düşüb hazırda növbət dövləti-Rusa,
Olubdur xəlq arasında ədalət işlərə meyar.
Açıldı əhli-Dağıstana kəsbi-elmin əbvabı,
Olubdur gərmü rayic[520] kəsbi-mala həmçinin bazar.
Və lakin ləzgilər vaxtı edib təzyi', yatmışlar
Təğafül bəstərində, olmayırlar xabdən bidar.
Deməzlər barı indi biz də insanıq bu aləmdə,
Edək tə'lim övladı ki, bilsinlər nə yox, nə var.
Açılsın gözləri aləmdə, görsünlər nə lazımdır,
Həm etsinlər paroxodlar, ədmir yollar ilə əfsar.
Qalıbdır ləzgi qardaşlar fənavü fəqr küncündə,
Sanasan bunlara göydən yağar ərzaq ilə iftar.
Əgərçi var bularda bə'zi əhli-mə'rifət əşxas,
Olublar müqtəzayi-dəhrdən agahü[521] bərxürdar.
Edərlər ehtimami-tə'lim övladi xüsusunda,
Vəli bir neçə gül qılmaz belə səhraları gülzar.

* Mizmar – qoşu (cıdır)[522] meydanı



Gərək əyyami-istiqbalə etsinlər dürüst himmət,
Gərək fürsət zamanın etməsinlər bad ilə imrar.
Məsəldir: arifə bəsdir işarı, annamaz cahil,
Oxunsa üstünə[523] Tövratü İncilü Zəbur təkrar.
Gərək zər'ə təəhhüd iştidadi-həbbədən əqdəm,
Gərək əşcar ola islah, ta saleh ola əsmar.
Xuda tövfiq versin qullərinə himməti-xeyrə,
Budur məmnun duası isticabət eyləsin qəffar.[524]

Cənab Əlqədarinin əbnayi-vətəni olan ləzgi qardaşların pərişan halına canü dildən yanması bica deyil. Ümumən, ləzgilər zirək, maddəli, qoçaq və qabili-tərbiyə birtayfa olub da, belə elmü mə'rifətcə hamıdan geridə qalmaqları, yoxsulluq və dilənçilik halında yaşamaqları cümləmizə gərəkdir bir dərəcədə tə'sir edib, qəlbimizi məhzun və mükəddər qılsın və onların tərbiyəvü tə'limi yolunda cümlə ərbabi-bəsirət və sahibi-miknətü mə'rifət gərəkdir sərfi-himmət eləsin.

Ustadi-möhtərəmimiz və mürşidi-kamilimiz olan Mirzə Həsən əfəndi lütfü şəfəqqət edib öz tərcümeyi-hallarını iki sənə bundan irəli nəzmən tərtib qılıb bəndlərinə göndərmişdir. Əgərçi ol cənabın seyrü süluku fövqdə təhrir olunubdur, amma bu mənzuməni dəxi burada yazmağı münasib gördük. Çünki bu mövzun kəlamda müsənnif həzrətlərinin tərcümeyi-hallarına dair bir para mə'lumat təfsilən bəyan olunubdur.

### BİSMİHİ SÜBHANƏHÜ VƏ TAALA

Bihəmdilləh, yetişdi sinnim islam içrə həştadə –
Ki, iman ilə varam rehləti-üqbayə amadə.
Sual olsa, nə gördün, nə qazandın dari-dünyadə,
Nə xeyri eylədin təqdim ki, zadın olsun üxradə?
Cavabımdır ki, gördüm hər nə, gördüm məhz rö'yadə.

O rö'yanın budur bir müxtəsər təqrirü tibyani,
Uşaqlıqdan tutub təhsil qıldım dərsi-Qur'ani,
Ərəbcə əsli-dini elmi-sərfü nəhvü mizani,
Əruzi, məntiqi, elmi-bəyani, şərhi-Fürqani,[525]
Əhadis içrə bəzli-himmət etdim elmi-isnadə.

Oxudum hikməti, elmi-hesabi, elmi-hey'ati,
Üsuli-fiqh ilə fiqhi, həm üstürlabi-miqati,
Zəbani-farsü türkiyə lavazim istilahati,[526]
Xülasə, xaki-Dağıstanda mümkün ədəbiyyati,
Atamın ehtimamı rəhbərim oldu ol irşadə.

İyirmi üç sənə ömrüm təmamində qəza qalib
Gəlib tədbirimə, oldum bir özgə sən'ətə sahib –
Ki, mərhum Hacı Yusif xan məni ikram ilə katib
Edib, yanında qaldım altı il, oldum ona rağib,
Həm övladına tədris eylədim elmi ol əsnadə.

Helə ki, oldu Dağıstanda xanlıq rütbəsi tə'til,
Açıldı bunda rus divanı, oldu zabitə təb'dil,
Bu divanda kitabət xidmətində qalmışam üç il –
Ki, ta qıldı qubernaturi-Dərbənd bəndəni təhvil,
Niyabət xidmətinə qəryeyi-Yarağí-süfladə.

Bu naiblik ibarətdir Təbəsəranın ərzində,
Cəm'in əlli dörd kənddən on iki sal ərzində
Dolandırdım oları müqtəzayi-əsri-fərxündə,
Poruçik çininə çatdım ki, ğərsəd inqirazında,
Dolandı çərxi-kəcrov, özgə babət oldum üftadə –

Ki, yə'ni ol sənə rus etdi cəngin türk ilə e'lan,
Verildi əhli-Dağıstana əzmi-rəzminə fərman,
Bu fərmandan neçə kənd əhli oldu sanki rugərdan,
Cahandan bixəbər ləzgilər içrə bir neçə fəttan
Edib təzvir, qılmışlar buları türkə dildadə.

Büruz etdi qəzavət fikri tüfrakdan ələlqəflə,
Qumuq əhli yetirdilər kübari-dövləti qətlə,
Ol atəşdən dağıldı yerbəyer ətrafına şö'lə,
Olub yaği zəd Qarulu, Əşəbaşlı filcümlə,
Təbəsaran, Axtı, Qübbə düşdülər ifsadə.

Bəs etdi əsgəri-dövlət oları fövr ilə təfriq,
Neçə ə'yani darə çəkdi, qıldı evlərin təhriq,
Neçə əşxasi həbs etdi, neçəsin eylədi təzyiq,
Vəli bir paralar haqqında əsla olmadı təhqiq,
Süründülər Saratova naxır tək ahü veyladə.

O həşrü nəşr arasında məni həm etdilər məhbus –
Ki, guya ol zamanda xidmətimdə zəf olub məhsus,
Yarım il qəleyi-Dərbənd içində qalmışam məhrus,
Şikayət eylədim divanə versinlər məni, əfsus,
Qəbula keçmədi ərzim, təarüz* oldu Şuradə.**

* Təriz – manelik
** Şura -Teymurxanşura şəhərindən ibarətdir



Vəziri-daxiliyyə hökmü oldu bir zaman tərtib,
Olundum Tambova istitan* üçün təğrib,**[527]
Həm əhli-beytimi cəbr ilə qıldılar mənə təznib,
Mürur etdi orada vəqtimiz üç il ələttəqrib,
Zühura gəldi bir əmri-qəribi-xarüqüladə.

Cənabi-imperaturi-zaman – İskəndəri-sani
Olub məqtul, ta ki, oğlu oldu Rus sultani,
Bunun vəqti-cülusunda verildi əfv fərmani,
Ümumən, əhli-Dağıstanə keçdi lütfi-rəbbani –
Ki, divansız məğarib qismi küllən oldu azadə.

Rücu etdim oradan Kürrəyə əhlü əyalımla,
Məaşım oldu kəndimdə müyəssər mülkü malımla,
Həzaran şükr ola pərvərdigara sidqü balımla,***
Keçirdim bunda övqatı üluma iştiğalımla,
İyirmi iki il tədris qıldım bu zəvayadə.****

Bu işdə ümdə məqsudim oldur həsbətə lillah,
Olam nəşri-ülumi-din ilə əqranıma həmrah,
Dəxi taliblərim əyzən olalar bəndəyə əşbah –
Ki, bu minval ilə məhfuz ola şəri-rəsulüllah,
Səlat olsun ona al ilə təslimati-müzdadə.

Bəli, övladıma sorsa, olur naqabili-təqsim
Əsərlər kim, oları eylədim mövquf bittəmim,
Yenə cüz'i ziraət ərzi-mərci, nə zərü nə sim,
"Və ma min-daabbətin illa"nı[528] qıldım onlara təfhim,
Gətirsinlər halal kəsbi ilə mə'nasını yadə.

Dəxi etdim olara bu vəsiyyət ki, qılıb zəbtin,
Ümur içrə müraat eyləsinlər rahi-mövsutin,
Oxutsunlar uşaqlarına dinü mə'rifət şərtin,
Ərəb, həm türkü, rusü, farsın əlsinəsin,[529] xəttin,
Əzimət eyləsinlər zəri-ərzə dadü bəstadə.

Cənabi-müstətabi-həzrəti-əllaməyi-təhrir
Firidün bəy, xuda qılsın onun mətlubini teysir
Mənə fərmayiş etmişdi ki, onunçun edim təhrir
Həqirin sərgüzəştin, ixtisar ilə budur təqrir
Edib, göndərdim anı də'vat ilə ol ustadə.

* İstitan – vətən olunmaq, vətən etmək
** Təğrib – vətənindən qürbətə göndərilmək, sürülmək
*** Bal – xövf, qorxu
**** Zəvaya – zaviyə, guşə

Rəbülaxirin nisfində tarixi-sənə "ğəşkəb"[530]
Həyati-müstəarım baqidir, amma budur mətləb –
Ki, həngami-vəfatımda olam iman ilə həmləb,
Lihaza eylərəm həmmanıma fəryad luzü şəb –
Ki, ya rəbbi, tərəhhüm eylə bu Məmnuni bizadə.

Kürə mahalının xanı general Əlhac Yusif xan 1295-ci[531] sənədə Dərbənd şəhərində vəfat edib, Qırxlar ziyarətgahında mədfun olmuşdur. Necə ki, sabiqdə zikr olundu, cənab Mirzə Həsən əfəndi o alişan xanın yanında altı sənə qalıb, onun övladı tə'limü tərbiyəsinə məşğul olubdur.

Bu zati-şərif qayətdə pəhrizkar və taatü qərabata mülazimü müttəqi və dindar bir şəxs olduğundan, özünə artıq hörmət və məhəbbət qazanmışdı ki, və necə ki, Əlqədari cənabları öz kitabında yazıbdır, ol cənabın otaqları daima mədrəsə kimi tə'lim və təəllümi-ülumi fünundan xali olmazdı və bundan əlavə ol mərhumun himmət və xərci ilə Kürə nahiyəsində çoxlu körpülər tikilib, yollar qayrılıb və məscidü mədrəsələr tə'mir olunubdur. Öz ehsanatü xeyratı ilə külli-Dağıstanda şöhrət kəsb edibdir.

Cənab Mirzə Həsən əfəndi mərhum xanın vəfatı ittifaqında atidə zikr olunmuş mərsiyəni inşad qılıbdır ki, xeyli mərğubü dilpəsənd kəlamlarından birisidir:

Dəriğa, ahü vaveyla ki, alicah Yusif xan
Edib darül-bəqa əzmin, cahandan oldu rugərdan.
Vücudi zinəti-Qafqaz idi, həm əhli-islamə
Pənahi-xas olmuşdu, olanda müztərib dövran.
Qalıbdır indi başsız əhli-islam bu diyar içər,
Səzadır kim, ona matəm tuta məcmu'i-Dağıstan.
Xudaya, mərqədi-pakın münəvvər eylə lütfünlə,
Həm əmsalın onun nəslindən etmə hiç dəm nöqsan.
Xitami-şəhri-zilqədə vəfatın olub tarix,
Keçəndə sali-hicrətdə min iki yüz beşü doxsan.
Tutun, ey nazirin, ibrət, əcəldən olmayın qafil,
O mərhumi duayi-xeyrdən həm etməyin nisyan[532].

İki sənə bundan müqəddəm sünni və şiəməzhəb idareyi-ruhaniyyələrin qərardadlarını əsrimizin iqtizasına müvafiq və təğyirü təb'dil verməк üçün Tiflisə cəm olan üləmavü ürəfa silkində həqir dəxi olub, orada cənabi-fəzilət-məab Mirzə Həsən əfəndi Əlqədari ilə bir azacıq vaxtda görüşüb tanış oldum. Bu zati-şərif ziyadə xoşsima və xoşxülq oluduğuna binaən, bir baxışda cümlənin meylü məhəbbətini öz ağıllı gözləri, güşadə və nurani üzü ilə cəlb eləyir. Mirzə Həsən əfəndinin bu halda yetmiş iki sinni vardır. Yaşı nəzərə çox gəlirsə də, möhtərəm əfəndinin bədəni sağ və salamatdır və mərhəməti-ilahi ilə daha da çox yaşamasına ümidimiz vardır[533].



# MİRZƏ ƏBDÜRRƏHİM ŞEYX ABUTALIBZADƏ

Şimali Qafqazın üləmavi şüəravü üdəbasından filcümlə məlumat verib, cənab fəzailməab Mirzə Əbdürrəhim Şeyx Abutalıbzadə həzrətlərinin ismi-şəriflərini təyəmmünən və təbərrükən zikr etməklə məcmuəmizi bir növ' müzəyyən qılmağı lazım gördük.

Əgərçi Mirzə Əbdürrəhim cənabları milliyyət cəhətincə Azərbaycan türklərinə mənsubdur və türk lisanı onun dilidir, vəli bu dil İranın mərkəzində bu axır vaxtlarda kimi qeyri mütədavil olduğu üçün ol cənab dəxi öz əsərlərini fars dilində yazıbdır və bu əsərləri ilə ümumi İran əhalisinin boynuna böyük minnət qoyubdur.

İki sənə bundan qabaq həqir ol cənabdan onun seyr-sülukuna dair bir para məlumat istəmişdi və o dəxi böyük iltifat edib, əsərlərinin bir neçəsi ilə məən müxtəsərən öz əhvalatını bizə göndərmişdi və xahişmənd olmuşdu ki, özü təhrir qıldığı kimi eyni-ibarət ilə məcmuəyə yazım. Biz dəxi ol cənabın fərmayişinə əməl edib yazdığını burada nəql edirik: "Adım Əbdürrəhim, atam Əbutalıb Nəccar,[534] doğulan yerim Təbriz, 1855 miladi,[535] məskənim layənfək Dağsıtanın mərkəzi Teymurxanşura, sən'ətim ticarət, öyrəndiyim qırx yaşında bir üç-dörd ilin ərzində səthi ittilaat. Xəlqən müstəvilxilqə, xülqən acıqlı və qeyzli, əxlaqi-həsənədən ari, fəzaili-nəf'saniyyədən bibəhrə, hər tövbixü təşniəyə ən şayəstə bir məchul adamam. "Pəndnameyi-Markus",[536] "Fizikayi-ibtidaiyyə",[537] "Hey'əti-Flamaryon"u[538] rusdan farsca tərcümə və iki cild "Əhməd ya səfineyi-Talibi",[539] bir "məsalikül-möhsinin"[540] və bir "məsailül-həyat",[541] tarixi-müxtəsəri-xatəmül-ənbiya "Nüxbeyi-süpehri"[542] öz təlifatımdandır. "Məsail" və "Məsalik"dən başqaları 1311 hicridən əvvəl çap olunubdur; yenə nüsxələri kəmyab olmuş. Bu kitablar Asiyada nəşrü təhsin və İranda artıq şöhrət tapmağının səbəbi özlərinin hüsni-təlifiyyəsi üçün deyil, bazari-məarifdə mətaın novzühur olmağı üçündür.

Gahi şe'r yazıram, amma çox az və əksəri mürtəcilən. Hamısı üç yüz beyt olmaz. Hər nə var isə də, bu ləng əş'ardır. Bu, bəndənin əhvali-sabiqə və lahiqəsidir. Sinnim 69 şəmsidədir.

Mirzə Əbdürrəhim cənabları məktubunun axırında tə'kid edir ki, onu eyni ilə yazım: "Oxuyan məni səhihən tanısın. Gələcəkdə tarix hər kimin haqqında öz qəzavətin icra edəcəkdir".

Hörmətli oxucularımız görürlər ki, cənab Talıbzadə ülumü kəmalatı ilə mütəəssif olduğu halda, əczü inkisar ilə öz şə'nü dərəcəsini, öz mə'rifətü fəzilətini nə mərtəbədə azaldıb qədrü qiymətsiz edir və hətta

özünün xilqəti və şəxsi qüsurlarını dəxi "xülqən acıqlı və qeyzli, əxlaqi-həsənədən ari, fəzaili-nəf'saniyyədən bibəhrə" ibarələr ilə açıb, hamının gözünün önünə qoyur. Bu sifətlərin onun vücudunda olub-olmamağını, əlbəttə, biz ya inkar və ya təsdiq edə bilmərik. Çünki əvvələn biz ol cənab ilə tanış deyilik və saniyən tanış olsaq da, öz vücudumuz hər bir qüsurat ilə malamal olduqda qeyrilərin eybini göstərməyə haqqımız və ixtiyarımız yoxdur.

Bəhər surət ol cənabın öz əleyhində belə açıq söz söyləməyi onun bir tərəfdən əhli-insafü mürüvvətü sədaqət olduğuna və qeyr bir tərəfdən şikəstənəfs, alçaqtəb' xoşxülq olmağını göstərir. O cənabın belə şikəstənəfsliyi və haqpərəstliyi xüsusən bizim bu zəmanədə baisi-heyrətdir. Çünki bizim hamımız xudpəsəndlik və məniyyət mərəzinə bir dərəcədə mübtəla olmuşuq ki, əslən öz gözümüzdə tiri görmürük və həmişə özgə gözündə qıl axtarmağa məşğuluq.

Cənab Mirzə Əbdürrəhim ŞeyxTalıbzadənin tamami əsərləri fars dilində olduğuna binaən, onların barəsində oxucularımıza təfsilən məlumat verməkdə acizik və bu iş bizim təklifimizdən xaricdir. Amma cənab müsənnif özü Azərbaycan oğlu olmağa görə və kitablarının tatamisi farslar ilə belə Azərbaycan türklərinin tərəqqivü təalisinə səbəb düşməyə binaən, onların barəsində bilmərrə sükut etmək də savab deyil.

Ədibi-möhtərəmin asari-qələmiyyəsinin əksəri ülumü fünuna dair mətalibdən bəhs edir. "Səfineyi-Talibi"nin hər iki cildləri, "Pəndnameyi-Markus", "Fizikayi-ibtidaiyyə", "Hey'əti-Flamaryon" və qeyriləri tatamən elmdən danışır və özləri də açıq və sadə dildə yazılıb, yaxşı kağızın üstə gözəl və mərğub hürufat ilə çap olunduğuna [görə], asan və rəvan oxunur. Kitabların çoxunda üluma dair məlumat sual-cavab təriqi ilə nəqlü rəvayət olunduğuna görə, tez və asan təfəhhüm olunur və artıq həvəslə mütaliə olunur.

Nəql olunan əhvalat hissiyyat və xəyalat aləmindən uzaq və dışqarı olduğuna görə, qarelərin qüvveyi-əqliyyələri və fikirləri zehnü fərasətləri işləyir, işıqlanır. Bu qüvvələr işlədikcə açılıb vüs'ətlənir, doğru və nəf'li məlumat ilə dövlətlənir, nuraniyyət və mə'rifət kəsb edir.

"Məsaili-həyat" nam kitablarda həllü kəşf olunan məsələlərin cümləsi hal-hazırda bizim məişət və diriliyimizə ən lazım olanlarıdır ki, hər bir kəsə onları oxuyub bilmək vacibdir. Zəmanəmiz elm və bilik zəmanəsidir. Bunlarsız tərəqqi və təməddün qeyri-mümkündür. Müsəlmanların dalda qalmasına ümdə səbəb elmsizlikdir. Aramızda müşahidə olunan ədəmi-ittifaq və ittihad, büxl, ədavət, zillət və rəzalət, əsarət cümləsi elmsizlikdən və avamlıqdan törəyən əlamətlərdir. Zorlu ikən zorsuz



olmağımız, varlı ikən yoxsul olmağımız, hürr ikən, ağa ikən qul olmağımız yenə elmsizlikdən və mə'rifətsizlikdəndir. Bəs, ən əvvəl bizə lazım olan, yemək-içmək kimi zəruri olan elm və mə'rifət qazanmaq, fünuni-hazirədən və sənayei-müxtəlifədən bəhrəmənd olmaqdır.

Elm və bilik qazanmaqda ədibi-kamilimiz Mirzə Əbdürrəhim cənablarının yazdıqları kitablar bizə əvvəlinci rəhbər olub, hüsni-xidmətlər göstərə bilir və elmin şirin səmərələrini bizə dadızdırıb, onu kəsb etməyə həvəsləndirir. Ona binaən intişari-maarif yolunda sərfi-himmət edən ərbabi-qələmlərimizdən acizanə təvəqqe olunur ki, maarifpərvər Talıbzadə cənablarının əsərlərindən bacardıqları qədər açıq və sadə dildə farsdan türkə tərcümə eləsinlər. Bu gözəl xidmətləri ilə onlar bir tərəfdən millətimizi ayıldıb elm və mə'rifətdən xəbərdar olmaqlarına səbəb olarlar. Digər bir tərəfdən ədəbiyyat xəzinəmizi belə pürqiymət əsərlərlə dövlətləndirib, özləri üçün hörmət, yaxşı ad qazanarlar.

Mirzə Əbdürrəhim cənablarının asari-qələmiyyəsinin cümləsindən vətəni-mə'lufu olan İrana aid bir məhəbbət rayihəsi və bəndəçilik hissi dərk olunur. "Məsailül-həyat"ın ikinci cildinin ibtidasından sahibi-təlif ilə oğlu Əhmədin mabeynində bu gunə söhbət vüqua gəlir.

Mə'lum ola ki cənab Talıbzadə "Kitabi-Əhməd"də ülumi-mütənəvveəyə dair verdiyi məlumat təzə ixtiraatının tamamisini fərzəndi-ərcüməndi Əhməd ilə mükalimə edə-edə kəşfü bəyan qılır. Əhməd isə ziyadə fərasətli və zəki və müstəhid və xoşəxlaq bir uşaq imiş ki, cümlə onun xatirini əziz tutub, öz övladı kimi istərmiş və müsənnif onun barəsində deyir ki: "Əhmede-bəndezade rofəqaye-mən behəmeye-motəəllemine-məkatibe-İran mişenasənd ke, dər tofileyyət çe estedade-qəribi daşt, çe tefle-bameze bud. Hekayəte-"Qorbeye-eynəki, morəkkəbsazi, əksəndazi və lebase-topçipuhişidəne-u məruf əst. Əgərçe oulade-mouhimiye-bəndeəst, əmma digəran biştər əz mən besəlamətiye-u doa mikərdənd"[543].

İndi Əhməd ali mədrəsədə təhsilini tamam edib qabil mühəndis çıxıbdır və özü dəxi sahibi-təlifdir. Əhməd atasının otağına daxil olub, onu kitabətə məşğul görüb deyir: "Yenə siz yazmağa məşğulsunuz? Bu qocalıq, zəiflik halında ki, bu qədər naxoşluqlara mübtəlasınız, gözləriniz nurdan düşübdür, niyə öz ömrünüzə heyfiniz gəlmir? Məgər ondan bezmisiniz? İndiyə kimi bu qədər ki, söyləyib yazıbsınız, hər yatanı oyatmağa və hər məsti huşyar etməyə, hər biədəbi təəddüd qılmağa, hər cahili alim, hər zalimi əhli-insafü mürüvvət etməyə xeyli kifayətdir. Görürsünüz ki, yağış qətrələri səngxaraya tə'sir etməyən kimi, sizin dəxi dəlayilü nəsayihiniz daş bağırlı iranlılara əsər etmir. Neçə gün bundan irəli bir məclisdə sizin "Hey'ət" kitabınız əldən-ələ keçirdi. Birisi onun cildini və

o birisi xəttini tə'rif edirdi, üçüncüsü şəkillərini çox bəyənmişdi. Haman məclisdə əhli-nüfuzdan birisi belə dedi: "Mən eşitmişəm ki, bu müzəxrəfatı yazan sahibi-əqlü idrak və əhli-təvanavü saman bir şəxsdir. Amma deyirlər ki, müxəbbətdir. Hər nə sözlər ki, danışır və hər nə mətləblər ki, yazır, vətənin eyblərini islah etmək üçündür. Bir kəs yoxdur ki, ondan soruşsun ki, ey Allahın bəndəsi, bizim vətənimiz ki, onda bu qədər behişt meyvələri və ətirli çörək bitib hasilə gəlir ki, misli heç bir torpaqda yoxdur, hansı məmləkətdən pisdir və onun nə eyibləri var ki, islah oluna?" Haşiyənişindən birisi deyir: "Mən onu mülağat etmişəm, bir biçarə naxoşdur və xudpəsəndlik dərdinə mübtəla olubdur. İranda bir şəxs və bir təbəqəni bəyənmir. Belə ki, dövlətin mərkəzi işlərindən soruşdum, dedi ki, nəzmü qanun yoxdur. Hükəmalardan xəbər aldım, dedi zalimdirlər, cəbr edən və rüşvət yeyəndirlər. Mirzələrdən aralığa söz saldım, dedi ki, mim hərfinin başını və nun hərfinin dairəsini yaxşı yazırlar, amma elmi-hesab oxumayıblar, həndəsə bilməzlər. Tüllab qismindən əhval istədim, buyurdu ki, yəğmada mahirdirlər. Üləmadan sual etdim, dedi ki, ətəbatda olanlar hirsü təmə'dən kənar, zahiri zinət və təcəm'mülatdan biniyazdırlar və kəklik, turac əti yeməkdən meyl etməyib, pənir və soğana qənaət edirlər. Onlar bizim ruhani atalarımızdır və taəti vacib olan əimmeyi-ətharın canişinləridir. Amma ruhanilərdən əksəri ki, İranda vardırlar, təmə'kar və möhtəkirdirlər. Bu qisim alimlər şurişü iğtişaş və ricali-dövlətin qövqasını dost tutarlar, otuz mindən əlli min tümənə qədər bunların əmlakından bir sənədə mədaxil gəlir. Tüccardan soruşdum, dedi ki, füccardırlar. Onlar əcnəbi dövlətin malına rəvac verməkdən və hübubatı anbarlara doldurmaqdan başqa bir şey bilməzlər. Bu təbəqədən mülkü millətə əsla fayda yoxdur. Bir gün arvadların libası üstündə söhbət düşdü, dedi ki, bəli, iranlılar öz qeyrətü şüurlarından ötrü arvadların gödək və qısa libaslarını miqyasi-səhih qərar ediblər. And olsun ağanın mübarək başına ki, bunların cümləsini bivasitə bu kitabın mütərcimi Hacı Mirzə Əbdürrəhim Təbrizdən Teymurxanşurada öz evində eşitmişəm. İndi özünüz mühakimə ediniz ki, bu şəxs naxoşdurmu və ya Məcnundurmu?"

Bu xəbərləri nəql edəndən sonra Əhməd bir ah çəkib dedi: Bəndənin ərzi kifayətdir ki, siz dürüst yəqin edəsiniz ki, bu cahil və avam millətin uğrunda çəkdiyiniz zəhmətlərin hamısı bada gedibdir, suda qərq olub və oda düşüb yanıbdır.

Mən Əhmədin bu sözlərinə qulaq asıb, ondan artıq mütəəssir və mə'yus oldum ki, nə üçün onun üfüqi-bəsirəti dar olubdur və özgələrin əqidəsincə işin fe'l və ya tərkibini vacib bilir, nə üçün "əmr bəməruf" və "nəhy əz münkər" hökmünü yaddan çıxarıbdır? Nə üçün bilmir ki, hər işin



əvvəli çətin olar və onu tənbih və bidar etmək üçün soruşdum: O sözlər ki, cühəla mənim haqqımda deyirlər, haqdır ya batil, mədhdir ya qübh? Əhməd dedi ki, əlbəttə, cühəlanın qövlü batildir. Mən dedim: Bəs, bir surətdə ki, mən bir neçə dəfə eyib axtaranların və bədxəyalü bədfikir şəxslərin iradlarını müraat edib, öz əməlimdən geri çəkiləcəyəm və bildiyimi deməyəcəyəm və yazmayacağam, onda mənimlə o cühəlanın arasında təfavüt nədə olacaqdır?

Bir adamın ki, bu halda islamın zillətdə olmasından və qərib zamanda onun bilkülliyyə inqiraz olmasına mühəyya olan xətərlərdən xəbəri olmaya və vətən məhəbbətindən onun qəlbində meyvənin bolluğundan və çörəyin müəttərliyindən qeyri özgə hiss olmaya, məgər o, insandır və onun sözlərində tə'sir ola bilər? Təəccübdür ki, o sözlər sizə tə'sir edibdir. Müntəzir idiniz ki, mən də avamın sözündən bulanıb aşüftədil olam. Avamların məclisində eşidilən sözlər haman yerdə dəxi gərək unudulsun, nəinki ürəfa və üdəba məclisində zikr olunsun.

Əhməd cavabında deyir ki, mən belə sözlərin qübhünü anlayıram, vəli siz mənim atam olduğunuza görə, istədim ki, sizi belə münafiqlərin və müanidlərin xəyalından agah edim. Mən dedim ki, çün burada cana bir xətər və mala bir zərər mülahizə olunmur və bu gunə xəbərlərin dilazürdəliyindən səva bir faydası yoxdur, ona görə sizin kimi mə'rifətli şəxsə layiq deyil onlara qulaq asasınız. Hər kəs cühəlanın söhbətini tərk etməzsə, onlara bir növ' özünü şərik edər. Mən öz vəzifəmi icra etməkdən geri durmayacağam və necə ki, həyatım var, deyəcəyəm və yazacağam. Əgər müasirinin qulaqları kardır, eşitmir və "fi əbsarihim ğişavətün"[544], gələcək əsrlərdə bu yazdıqlarımın az-çox faydası bilinib, zikri-xeyir ilə yad olunuram. Onda şayəb bizim rə'yimizin haqqü savab olması dərk olunar və diriliyin qədri layiqincə bilinib, millət azadlığına və vətənin abadlığına sərfi-himmət edərlər. Bizim peyğəmbərimizə Qüreyşin cürhəlası Məcnun dedilər "və ma huvə illa zikrün lil-aləmin"[545] bu hala şahiddir.

Əgər mənim kimi savadsız və elmsiz bir kişiyə dəli və divanə desələr, nə eyib olar?! Buraya kimi sözü pərdədə deyirdim, hala açıq deyəcəyəm, öz dediyimdən dilşad oluram. Vətən mənim mə'şuqumdur, vətən mənim mə'budumdur, zira həqiqi mə'bud öz bəndələrinin ibarəti-sitayişindən müstəqnidir, amma vətən öz əbnasının xidmət və pərəstişinə möhtacdır".

Filhəqiqə, nə dərin fikir və nə gözəl e'tiqad!.. Cümləmiz bu e'tiqadda olub, vətəni-mə'lufumuza xidmət və pərəstiş etmək üçün himmət kəmərini qeyrət belinə bağlamağa borclu oluruq. Hacı Mirzə Əbdürrəhim cənablarının gözəl əsərlərindən birisi də "Məsalikül-möhsinin"dir ki, fövqdə onu işarə olundu. Bu kitab məalü məzmunca "İbrahim bəyin səya-

hətnaməsi"nə çox bənzəyir. Bunda İranın övza'vü əhvalı və iranilərin adabü ayinləri, əxlaqü ətvarları, nə əqidə və qanacaqda olmaqları və nə qayda üzrə məişət etməkləri eyni ilə təhrir olunur. Sahibi-kitab bu əsərində İranın işlərindən və əhalisinin dolanacağından layiqincə baxəbər olmağını izhar edir. İranda indilikdə vüqua gələn bə'zi işləri və iranlıların övza'i-məişətini elə bir məharət və ustalıq və ədibanə ilə təhrir qılır ki, guya qabil bir nəqqaş onların eyni ilə surətini çəkib, gözlərimizin qabağına qoyur.

Kitabi-"Məsalikül-möhsinin" zahirdə beş hissəyə təqsim olunursa da, mə'nən bir əhvalat üstə danışır. Haman əhvalat bundan ibarətdir ki, idareyi-coğrafiyayi-müzəffəri tərəfindən düşənbə günü zilqədənin 1320-[ci][546] sənəsində bir hey'ət, yə'ni bir neçə elmli şəxslər Dəmavənd dağının başına çıxır, onun şimali tərəfində olan duz mə'dənin, dağın qülləsinin ucalığını və ona məxsus olan sair məlumat və mükaşifatı mülahizə edib və xəritəyə salıb öz idarələrinə təqdim etsinlər, mə'mur olurlar.

Hey'əti-məzkur bu şəxslərdən tərtib olunubdur: sədri-hey'ət – mühəndis Mirzə Möhsün xan ibn Abdulla xan, iki nəfər mühəndis – Mustafa və Hüseyn ismində, bir nəfər təbib – Əhməd və bir nəfər müəllimi-şimi – Məhəmməd adında. Bu hey'əti-fənniyyənin sədri Mirzə Möhsün xan İbrahim bəy kimi xeyli məlumatlı, xoştəqrir və sahibi-kamal bir şəxs olduğu hər yerdə göftarü kirdarından anlaşılır.

Artıq şayani-diqqət olan Mirzə Möhsün xanın əsnayi-rahda Xorasandan təşrif gətirən böyük bir müctəhid ilə Şah Abbas karvansarasında görüşüb, Avropa mədəniyyəti (sivilizasiyası) üstündə mükaliмə etməklə-ridir. Mirzə Möhsün xan Avropa sivilizasiyası xüsusunda lazım olan qədəri təfsilatü bəyanat verib, sözü bu məqama yetirir ki, gün-gündən zəmanə dəyişirilməkdədir və hər vaxtın təqazasına görə adamların fikri, işləri və övza'i-məişəti dəxi təğyirü təb'dil tapır. Amma biz müsəlmanlar min il bundan əqdəm tutduğumuz yol ilə gedib, ol vaxtda tə'sisü təşkil olunmuş qanun və qayda üzrə məişət edib, öz əf'alü kirdarımızı zəmanənin iqtizasına müvafiq etməyə əsla çalışmırıq və min ildən bəri biz xəfif və möhkəm dairə içində səfil və sərgərdan dolanıb, kənara çıxıb asudə nəfəs almağa meylü rəğbət göstərmirik.

Sair millətlər və dövlətlər irəli gedib, elm və mə'rifət sayəsində tərəqqi tapırlar, kamali-hürriyyət, vüs'ətlə güzaran edib, siz müsəlmanların malına mülkünə və canına sahib olurlar. Biz isək övqatımızı əczü qəflətdə keçiririk, dünyadan xəbərimiz yoxdur. Vətənimizin, dinü dünyamızın malü əmlakımızın hətta irzü namusumuzun hifzü əmanda qalmasına lazimeyi-binagüzarlıq, tədarükat və əsbab fərahəm etməməişik. Əgər üstümüzə bu



halda bir qəvi düşmən hücum etsə, mə'yusü məğlubü münhəzim olmağımıza şəkkü şübhə yoxdur. Cənab müəllifin öz yazdığına rücu edək: "Hala ma beinməsələye-mofəssəle əz tərəfe-təcrobe neqah mikonim. An vəqt irade-ədilleye-mocərebbeye-baleğe esbate-həqiqəte-əmrra kafi başəd. Emruz hicdəh doulәte-Orupa nüsəra həstənd və mottəfeqən mixahənd be melləte-eslam ğaleb şəvənd, məmaleke-anhara təsərrof konənd və məzhəbe-xodeşanra bedəhənd və əvayede-xodeşanra məril-ecra nəmayənd. Yə'ni məsacede-mara kəlisa besazənd və mara əbdo təbeye-xod bedanənd və bekonənd. Dər in surət əlbətte ma bayəd cəhad bekonim. Befərmaid əfrade-moslemin ke, bəndeye-şoma və həzərate-calesine-şərbətxore-həvaşist behəmlevo defa'e-sərbaz moəllem və tofəngo təhe-por və tup ke, hər dəqiqe devisto pəncah qolule be yek fərsəxe-məsafət miyəndazad qader həstim? Və mitəvanim becəhad berəvim? Əgər nərəvim əsir mişəvim, məğlub migərdim və məzhəbo vətənema bəhreye-ğalebin mişəvəd. Dər in surət təklif in əst ke, behomke-qanun cəhadra bər həmeye-cəvanane-bist-saleye-ma vaceb bekonim ke, hər sale çəndin hezar beqore də'vət şəvənd. Bename-hər kodam ke, tore aməd do sal dər rekab elme-cəngra biyamuzəd və morəxxəs şəvəd. Heyne-lozum təhte-selah ayəd və vətəno məzhəbe-xodra əz təcavoze-əcnəbi hefz nəmayəd. Hala ba çomağo nizevo şəmşiro təbərzin həfze-melko mellət momken nist. Vaceb əst ke, mocahedine-mosəlləh daşte başim və bəraye-məxarece-negəhdaştəne-anha məbləği əz hər təbəe beonvane-maliyate-cəhadiyye hər sale əxz nəmayim və sərfi-ləşkəro sərkərdeqane-u bekonim.

Ağa [yəni moctəhed][547] fərmud: – Məgər mar sərbaz nədarim? Qoftəm: – bəli, darim. Təbəe bəraye-anha pul midəhəd, vəli çon qanune-əxze-an pulo-xərce-ura nədarim, pul sərbəste bekiseye-digəran mirəvəd və sərbaz qorosnevo bilebaso əsləhe mimanəd. Əgər ina qanunra morrəttəb' və məbsut vəz' nəmayim, hər kəs həqq və dər surəte-təcavoz hədde-xodra bedanəd və əz dəstqahe-qəzavəte-əskəriyye mocazat yabəd, dər in surət məgər xoday nəxaste bevocub cəhad təhrif mikonim? Ya tərtibo tənzime-u bedət gərdəd? Fəqət tərhe-u və surəte-ecraye-u dər tebqe-eqtezaye-əsr monəzzəm və məzbut mişəvəd. ...Pəs, hər mosleme-zişouro monsef cozi təəmmol bekonəd. Danəd ke, eqtezaye-hər əsro rə'ye-qozəştevo ayəndeəst. Və əgər inhara nəfəhmim və nədanim və nəkonim və dər haləte-hezar sale-qəbl bemanim və əndəki in cəhalətra emtedad bedəhim an vəqt nə eslam xahim daşt və nə ehkamo əvaede-u. Meləle-əcnəbi əz in ğəfləte-ma montəfe' mişəvənd və mara ğələbe mikonənd"[548].

Sahibi-kitab Hacı Mirzə Əbdürrəhim cənabları Mirzə Möhsün xanın dilindən "Məsalikül-möhsinin"in axırıncı səhifələrində qanun barəsində

çox gözəl mətləblər danışıb, keçir Müzəffərəddin şahın imarəti-Ziyada-yasayi-müzəffəri-məclisinin güşadında söylədiyi nitqi-şahanəyə. Şah həzrətləri öz rəiyyət və təbəələrinə hürriyyət və azadlıq müjdəsini bu sayaq təbliğ edir: "Bedanid ke şomara betəvafe-Kəbeye-azadi və horrey-yəte-kamele də'vət nəmudeəm. Calese-bəzme-məhəbbəte-vətən və pə-rəsteşe-soltan həstid. Şomara beaine-eslam və xodaye-vahed qəsəm mi-dəhəm dər esteqrare-in bənaye-xeyro vəze-yasaye-mozəffəri ke, dibaçe-ye-tərəqqi və səngəre-hefze-esteqlaləst, çenan sə'y nomayid ke, bemoa-leceye-pəsərane-məhbube-xod mikonid. Əz xodavo əimme estemdad bekonid, əz mən montəzere-cəzavo səza başid. Hər kəs hər çe midanəd azad bequyəd, nətərsəd, nəhərasəd, xacetaşani nəkonəd, ğərəze-şəxsi nədaşte başəd... Dər xətme-kəlame-fərmayeşate-xodeman təyəmmonən təəssi bexatəmol-ənbiya nəmude beşomə miquyəm: "Əlyaumu əkməltu ləkum dinəkum və ətməmtu əleykum ne'məti və rəzzeeytu ləkum əlisə-ləm dinən..."[549]

Bəd əz an ba ruye-qoşade və souləte-şahane nəzəre-mərhəməti beətrafe-hozzar nəmude ba inke ğədəğən ba həmeye-hazerin, hətta fe-rəngiyan beavaze-boland "Zen. : baş! Dir bepa!" çenan səlavat keşidənd ke, otaqe-bein bozorgi... betəzəlzol dər aməd. Əz in sədaye-şəfəngiz əz xab bidar şodəm. Didam an qədr xabideəm, əndaməm amaz kərde. Bər xastəm. Xane tarik, çerağ məfğud, kibrit nist. Dər in zolməte-şəb koca berəvəm. Ta birun əz xane qədəm qozaştəm, doçare-əsəse-bidaruğe mi-şəvəm. Motəfəkker neşəstəm. Didəm əz xab behtər çizi nist. Səre-xodra bebalin qozaşte və baz xabidəm, ta key bidar şəvəm?"[550]



# HACI ƏBÜLHƏSƏN RACİ

Azərbaycanın İrana mütəəlliq qit'əsində zühur edən türk şairlərindən məşhuru Hacı Əbülhəsən Racidir. Racinin nüfuzu Araz çayının sol tərəfində sükunət edən Azərbaycan türklərinə dəxi ki, rus təbəələrindən ibarət olsun, keçibdir. Belə ki, Raci nə qədər İran torpağında mərufü məşhurdur, bir o qədər də Zaqafqaziya türkləri arasında onun hörmət və şöhrəti vardır. Bununla belə Raci kimi şairin ki, onun lətif və dilpəsənd qəzəlləri və cigərsuz növhələri böyükdən kiçiyə kimi cümlə əhli-savadın dillərində caridir, tərcümeyi-halına dair lazım olan məlumatı cəm' etməkdə aciz qaldıq. Divani-qəzəliyyat, qəsaid və növhəccatına[551] rücu etdik də şairin öz halü şə'ninə və filcümlə seyr-sülukuna məxsus bir işarə də bulmadıq. Bu isə bir tərəfdən şayani-təəssüf və bir yandan layiqi-heyrət və təəccüb bir haldır ki, kərrat və dəfəat ilə Rəcinin divani-əş'arü kəlamı çapdan çıxıb və hər bir sinif arasında intişar tapıbdır və divan çap etdirən kitabfüruşların və onun təbinə imtiyaz alan sair əşxasın heç birinin fikrinə gəlməyibdir ki, divan sahibi olan şairin tərcümeyi-əhvalına dair divanın, icmalən cüz'i məlumat kitabın bir guşəsində dərc edib, oxuyanları onunla aşina eləsin. Bu təəccüb gəlməsi hal bir Racinin haqqında olmayıb, bəlkə ümum İran və Azərbaycan şairlərinin halına şamildir. İndiyə kimi demək olur ki, Şeyx Sə'dinin "Gülüstan" və "Bustan" kitabları əqəllən yüz dəfə çapdan çıxıbdır, amma bu çapların heç bir nüsxəsinə Sə'di kimi müəzzəm və mö'təbər, əhli-hikmət şairin haqqında üç kəlmə də söz tapılmaz. Ancaq kitabın axırında çəndan lüzumiyyəti olmayan şey'i qeyd edirlər ki: "Təmam şod divane-mərhumol-məğfure-fe'lan əleyhorrəhme behəsbe-fərmayeşe sərvəre-mokərrəm və məlazol-ekram Məşhədi fe'lan və ya xeyrol-hace-fe'lan ketabforuş və besəyo ehtemame-Kərbəlaye fe'lan surəte-enteba' pəziroft. Allahummə ənfəəhu bihə və licəmiil-moumenin"[552]...

Hacı Əbülhəsən Racinin tərcümeyi-əhvalına dair bizdə olan cüz'i əxbardan mə'lum olur ki, ol mərhum təvəllüd edibdir tarixi-məhəmmədiyyənin 1247-1252-ci[553] illərində Təbriz şəhərinin Xiyaban məhəlləsində. Tə'lim və tərbiyəsi öz şəhərində olubdur. Ömrü qırxdan qırx beşə kimi olubdur. Vəfatı Həcc ziyarətindən müraciət edəndə olubdur. Cəddədə gəmiyə oturanda əsnayi-rahda dəryaya qərq olubdur və bu hüznavər hadisə hicrətin 1292-ci[554] ilində vaqe olubdur.

Şairin əhibbalarından birisi – "Səbur" təxəllüslü – Racinin belə qafil, vətəndən kənarda vaxtsız vəfatı barəsində yazdığı bir növhədə onu belə vəsf etmişdir:

Ey dəriğa ke, həzrəte-Raci
Çon zər əz kiseye-əhibba rəft.
Bihədd əfsus, sədhezar dəriğ
Ke, behəsrət ze dare-donya rəft.
Dağe-ferqət nəhad bər dele-ma,
Suxt əz hecre-u-dele-ma rəft.
Nə şəbəm şəb, nə ruze-mən ruzəst,
Huşəm əz sər, ze del şəkiba rəft.
Bi to ey çeşmeye-çerağe-sorur
Rouşənai ze çeşme-bina rəft.
Xake-qəm çərx bər sere-ma rixt –
Ke, tora, xare-mout bir pə rəft.
Heyf əz an şahbaze-qolleye-Qaf –
Ke, beqafe-ədəm ço Ənqa rəft.
Zan kəmalate-u-hezar əfsus –
Ke-bebade-əcəl beyekca rəft.
Ey mohiti-ke, xun şəvəd abət,
Abe-ru əz roxe-to əz ma rəft.
Ey ze şure-to şur dər delha,
Vəz şəre-to şərər becanha rəft.
Kaş an dəm ke, ubekəşti şod,
Hokme-"ya ərzu ibləi ma" rəft.
Ahü vahəsrəta ke, mədfəne-u,
Gəşt penhan vəli ze peyda rəft.
Qəbruhu fi qulubi min valast,
Gərçe dər zaher əz nəzərha rəft.
Gəşt çon Xezr zendevo cavid
Ta bezolmate-mərg tənha rəft.
Yunesasa ze Mesre-dare-fəna
Bərdəhane-nəhənge-oqba rəft.
Və minəl-ma'i kullu şey'in həyyun,
Zende baz şode Xezrasa rəft.
Şod rəvan suye-cənnətol-mə'va,
Tayere-qodse-xod bemə'va rəft.
Cesm boqzaşto sərbesər can şod,
Əz doi sələb gəşt yekta rəft.
Həmço qol və şod əndər in qolşən,
Pa keşid əz çəmən, beyəğma rəft.
Peye didar bude həmço Kəlim,
"Ərni" quyan be Ture-Sina rəft.
Şahede-mə'nəvi nəmudəş rox
Həmço Musa peye-təcəlla rəft.
Əz meye-eşq corei nuşid,
Baz çon bade suye-mina rəft.
Əz ərz pak gəşto couhər şod,
Həmço ruh əz kədər mosəffa rəft.



Yarı peyvəst aqebət ba yar,
Ançe mikərd əz ən təmənna rəft.
Qələme-ənbərinşəmime-Səbur
Bəhre-tarix kərdən enşa rəft.
Yaft əz kələmeye-"əya ğəffari",
Bəhre-təhrir kərdən emla rəft[555].

Səbur cənablarının burada yazılan şe'rlərindən mə'lum olur ki, mərhum Hacı Əbülhəsən Racinin şə'nü rütbəsi dost və əhibbası arasında xeyli tutulurmuş. Mərhum şairin pişəzvəqt qafil ölməyi əhibbalarını böyük yasü ələmə düçar edib, novgüllərinə ayrılıq və heyrət dağı çəkibdir. Cənab Səbur sair Azərbaycan şairləri kimi vəsfində mübaliğə edib, Racinin fəzilətini bir dərəcədə artırıb ki, onun şə'nü halını ənbiyayi-kiramdan bə'zinin halına təşbih qılıbdır. Bir sayaq üzrə ki, Raci dəxi müqəddəs və mütəhhər vücudlar kimi məaniyi-əshab ilə həmcəlis olub, cismi-kəsifdən xilas olmaq ilə böyük bir səadətə vasil olubdur. Necə ki, şair deyibdir:

Əz ərz pak gəşto couhər şod,
Həmço ruh əz kədər mosəffa rəft.

Racinin divani-əş'arı bu qayda üzrə tərtib olunubdur: qəzəliyyati-farsi, qəsaidi-türki, qəzəliyyati-türki, təcnisi-türki, Kərbəla şühədalarının əhli-beytinin müsibətinə dair növhəvü sinəzənləri, müqəttəat və rübaiyyat. Növhə və sinəzənlərin arasında yazılan əfrad mərhumül-məğfur Molla Hüseyn "Dəxil" təxəllüs şairin kəlamlarıdır ki, onları Raciyə nisbət vermək dürüst deyil. Divani-Racinin bə'zi nüsxələrində Dəxilin və Nacinin və Mirinin kəlamlarından dəxi seyyidüş-şühədanın müsibətinə dair növhə və sinəzənlər daxil olubdur. Belə ki, Təbriz mətbəələrində çap olunan kitabların çoxunda əsla bir qayda və səliqə yoxdur. Hər bir kitaba lazım olan föhristdən dəxi xəbərləri yoxdur. Ancaq onu qənimət bilirlər ki, kitabın boş qalan yerlərini hər nə ilə olacaq, olsun, doldursunlar.

Racinin səlis və rəvan təb'i olduğu əş'arından görünür. Onun qəzəllərinin çoxu dillərdə əzbər olubdur və xanəndələrin çox vaxtı toylarda və işrət məclislərində oxuduqları Pacinin gözəl qəzəlləridir. Necə ki, şair özü deyir:

De bir türki qəzəl, Raci,
Oxusun bu gözəl, Raci,
Bələd olsun əzəl Raci
Rümuzi-eşq dərdinə[556].

* * *

Raci, fünuni-şe'rdə gərçi vəhidsən,
Dəm vurma çox ki, baisi-lafü kəzaf olur[557].

Və həmçinin şe'r və qəzəl deməyə artıq meyl və həvəsi olmağını və həqiqi fəxarəti şe'r və qəzəldə görməyini bu beytində bildirir:

Tərk elə simü zəri, cəm' elə əş'arü qəzəl,
İstəsən, Raci əgər namü nişanın çıxsın[558].

* * *

Desəm Raciyə şe'r yaz, hey yazar,
Pul adı gətirsəm biləkdən qürur[559].

Racinin vətəndaşı və həmməclisi olan bir nəfər şəxs ilə dəmir yol[un]da tanış oldum. Ol cənab ziyarətə gedirdi və Racini görmüşdü. Racinin əxlaqü adabından əhvalpürsan oldum. Məzkur Hacı Racini çox tə'rif edib, ziyadə xoşxülq, xoşrəftar və xoşsöhbət olduğunu söylədi. Mərhumun əxlaqi-pəsəndidələrindən birisi də onun artıq mütədəyyin, vətənpərəst və həmçinin hirsü təmə'dən ari, cümləyə yaxşılıq edən dərvişsifət və əhli-qənaət, pakdamən bir vücud olması barəsində bir beytdə deyibdir:

Qalıb bu pənd mənə yadigar pirimdən:
Həmişə zində bu aləmdə niknam qalır[560].

Racinin dostluqda, vəfada və vətənpərəstlikdə sabitqədəm olmağına bu şe'rləri şəhadət verir:

Sər fədaye-dust kərdən pişe-ma doşvar nist,
Danəm in naqabeliha qabele-ezhar nist.

Hər ke aşeq şod yəqin başəd ke, əz can begzərəd,
Şeyx-Sən'an bəhre-tərsa arəş əz zonnər nist.

Dustan, əfğane-Raci başəd əz hobbe-vətən,
Mouseme-qol bolboli danəd ke, dər qolzər nist[561].

Və əyzən həqiqi dostluq babında deyibdir:

Hər kəs ke, koşte gəşt berahe-vəfaye-dust,
Əz-xune-u rəvast xəlayeq vozu konənd[562].

Padşah ilə gədanın və fəqir ilə dövlətlinin arasında həqiqətdə bir təfavüt olmadığını və cümlənin axırı puç olduğunu bu rübaisində bəyan etmişdir:



Girəm to padşahe-təmame-cəhan şəvi,
Girəm cəhaniyan həmera hokmran şəvi,
Girəm ki, qəsrhaye-to sər bir fələk keşəd,
Ruzi şəvəd to həm gele-kuzegəran şəvi[563].

Əgərçi Racinin divani-şe'ri Azərbaycanın hər bir vilayətinə dağılıb və kəlami-mövzunu dillərdə caridir, vəli biz də məcmuəmizi onun asari-lətifələrinlən xali qoymamaq üçün bir neçə nümunələr burada təhrir qıldıq.

Qəzəli-Raci:

Övza'i-çərx sanma ki, biixtilaf olur,
Cuyi-zəmanə gah bulanır, gah saf olur.

Verməzlə gah Yusifi Misrin bəhasına
Gəh pirəzal əlində bəhası kəlaf olur.

Eşq əhlinə bir özgə əziyyət rəva deyil,
Təni-rəqibü cövri-zəmanə kəfaf olur.

mə'şuqə aşiqin bilü razi-nihanını
Bu rişteyi-məhəbbət ona telqraf olur.

Kəşf eylərəm bu eşq ilə hüsnün mətalibin,
Amma yazanda xamə bu sirri şikaf olur.

Töv'əmdi* rəncü rahət, müdğəmdi eyşü qəm,
Vəslü fəraq, şadiyü matəm müzaf olur.

Hər şey'i öz yerindədi bu karxanənin,
Dəxlü təsərrüf eyləsə hər kim, xilaf olur.

Hər kimsə öz məqamını aləmdə seyr edər,
Ənqayə Qaf, cüğdə** xərabə mütaf*** olur.

Ustad hər kəsin qədinə bir qəba biçib,
Var bir qəba ki, özgə qəbayə sicaf olur.

Olmaz[564] yüz il fəğanə gələ zağ, əndəlib,
Pəşşə nə qədr tiz uça, simürği-Qaf olur.

* Tövəm – əkiz doğulan uşaq
** Cüğd – bayquş
*** Mütaf – Təvaf olunmuş məhəl

Bəs, hər kəs anlasın gərək öz qürbü qədrini,
Rubəh nə növ'i şirə hərifi-məsaf olur.

Amma olubdu çoxlara bu əmr müştəbeh,
Culfalıq etməmiş küləhduz kəlaf olur.

Raci, fünuni-şe'rdə gərçi vəhidsən,
Dəm vurma çox ki, baisi-lafü kəzaf olur[565].

Racinin bu qəzəlində xeyli məzmunlu şe'rlər vardır ki, onlara diqqət yetirməmək olmaz, əz cümlə zəmanənin övza'i müttəsil təğyirü təb'dil tapıb da, ixtilaf üzrə gərdiş etməsidir. Belə ki, "Cuyi-zəmanə gah bulanıb, gah saf olur". Ona binaən insan dəxi gərəkdir elmü bilik ilə mütəməddin olub, zəmanənin iqtizasınca dolanmağa özünə əsbabi-məişət mühəyya edə.

Atidə yazılan qəzəlində Raci insanın başına eşqdən gələn bəlaları bir-bir tedad edib, onların olmağını, filcümlə dünyada insanın zövq-vəfası və eyş-işrəti üçün xəlq olunmuş əsbabü əlamətlərin yoxluğunu və hüzn-ə'ləmin, qəm-qüssənin nəf'yini arzu edib əsil mətləb və təmənnası nə olduğunu məxfi saxlayır. Rus şairi Lermontov[566] kimi bizim Racimiz də nə ölmək istəyir və nə sağ qalmaq, nə şirinliyə meyl edir və nə aclığa, nə hicrin zəhri-həlahilini[567] və nə vəslin şəkəri-safını tələb edir. Haman qəzəl budur:

Nə eşq olaydı, nə aşiq, nə hüsni-dilbər olaydı,
Nə ayinə, nə səfa, ey könül, nə cövhər olaydı.

Nə nazü qəmzə, nə qəncü dəlalü* nə işvə,
Nə əczü labe** nə xunabi-dideyi-tər olaydı.

Nə zülf olaydı, nə ariz, nə xətt[568] olaydı, nə xal,
Nə müşk olaydı, nə məcmər, nə udü ənbər olaydı.

Nə hüsn olaydı, nə könlüm, nə dəstə-dəstə bu zülf,
Nə şərh, nə mülk, nə bu fövc-fövc ləşgər olaydı.

Nə əbruyi-xəm olaydı, nə çeşm, nə müjgan,
Nə tiğ olaydı, nə cəllad, nə bu xəncər olaydı.

Əzəl nə nəş'ə olaydı, sonra nə rənci-xumar,
Nə tiyşi-vəsl, nə ənduhi-hicri-dilbər olaydı.

* Q ə n c ü  d ə l a l – ikisi də nazü işvə məzmunundadır
** L a b e – söz, laf



Nə öldürəydi xətin gəlcək üzdə üşşaqi,
Məsih tək nə ləbi-lə'li-ruhpərvər olaydı.

Nə yalvaraydı rəqibə bu payədə üşşaq,
Və nə bu mərtəbə mə'şuqələr sitəmgər olaydı.

Nə şur olaydı, nə bülbül, nə gül olaydı, nə xar,
Nə lütfi-bağı-baharü nə cövri-sərsər olaydı.

Nə dil olaydı, nə qamət, nə qəlb olaydı, nə rux,
Nə şəmi-şö'lə, nə pərvanə, nə səməndər olaydı.

Nə gül, nə ətr, nə şümşad olaydı, nə şanə,
Nə zülf olaydı, nə məşşatə, nə bu zivər olaydı.

Nə şərhə-şərhə olaydı bu sinə tiğinlə,
Nə şərhi-dəftəri-dərdü bəla, nə müztər olaydı.

Cəfayi-yar ilə üşşaq inciməz, ey kaş,
Nə səndə mümkün o, məndə nə bu, müyəssər olaydı.

Nə hicr olaydı, nə giryə, nə künci-qəm, nə bu ah,
Nə abü atəşü xakü həva müxəmmər olaydı.

Nə tifl olaydı, nə məktəb, nə dərs olaydı, nə elm,
Rümuzi-eşq nə dillərdə böylə əzbər olaydı.

Nə kuyi-yarı qoyub xəlq edəydi meüli-behişt,
Nə şeyx olaydı, nə məscid, nə və'zi-mənbər olaydı.

Nə dil olaydı, nə didə, nə əşki-xunalud,
Nə kan olaydı, nə dərya, nə ləlü gövhər olaydı.

Nə ictinab, nə tövbə olaydı, nə pəhriz,
Şikəsti-tövbə nə peymandan füzuntər olaydı.

Məzaqi-Raci nə şirin olaydı, nə böylə təlx,
Nə hicr zəhri-həlahil, nə vəsl şəkkər olaydı[569].

* * *

Sənə bu hüsn, xəyal eyləmə müdam qalır,
Çəməndə hansı güli-tər ələddəvam qalır?!

Qalıb bu pənd mənə yadigar pirimdən:
Həmişə zində bu aləmdə niknam qalır.

Gözün könül quşun ovlar, ogorçi laçın tək
Və leyk axır özü paybondi-dam qalır.

O ləbləri ki edər kami-aləmi şirin,
Mənim kimi olu bir vaxt təlxkam qalır.

Gedər çü məstiyi-mey, zəhməti-xumar gəlir,
Həmişə başda haçan nəşyei-müdam qalır.

Həmişə aşiqinə naz edib, xəyal etmə
Sənə bu rəngü ruxü zülfi-müşkfam qalır.

Əsər xəzan yeli gülzari-hüsnünə bir gün,
Nə üzdə rəng nə zülfündə bir nizam qalır.

Nə çeşmi-məstin edər böyülə naz-naz nigah,
Səhi qəddin nə bu növ' ilə xoşxuram qalır,

O vaxta üz çevirib cümlə bədnəzər səndən,
Məgər bu Raciyi-biçarə sübhü şam qalır?[570]

Racinin fünuni-şe'rdə mahir olmağına onun təcnisləri dəxi şəhadət verir. Nümunə üçün onlardan bir neçəsini burada zikr etməyi münasib gördük:

Demə, zahida, sərgüzəşti-behişt,
Yoxumdur mənim meyli-gəşti-behişt.

Büküb qəddimi eşq ilə bari qəm,
Qəmindən iki aləmin fariqəm.

Dilü din ver müşkbu kakilə,
Mənim tək ol aşüftə bu kakilə.

Gəl, e aşiqin atəşə yanduran,
Məni yana-yana qoyub yan duran.

Nədir, ey səhiqəd günahım mənim,
Keçər ərşdən hər gün ahım mənim.

Sən oyna gecə rudü şətrənc ilə,
Töküm mən yüzə rud şətrənc ilə.

Rəvadır qalım mən şəbi-tar ilə,
Keçir sübhə tək sən şəbi tar ilə.



Sipahi-qəm aldı, aman, dövrəmi,
Təvam eylə, ey saqi, can dövrəmi.

Dolub dərd ilə meysərə meymənə,
Sınıq qəlbə bax vergilən mey mənə.

Yazın bu sözü səngi-mərmərdə siz,
Qoyun fərq namərd ilə mərdə siz.

Açıbdır qərənfil, güli-yasəmən,
Güli-yas tək batmışam yasə mən.

Könül şəm'i-ruyində pərvanədir,
Ona suzdən xövfü pərva nədir.

Səninlə böylə oldu cism, ey sənəm,
Həqiqətlə baxsan əgər mən sənəm.

Bilərsən əgər baxsan ayinəyə,
Sənə oxşadır xəlq ayi nəyə?

Məni aqibət öldürür dər diyar,
Xədəngi-cəfayə məni-dərdi-yar.

Könül şişəsin sındırıb səng ilə,
Genə səngdil eyləsən sən gilə.

Harayım çıxar ərşə hər gün, hər ay,
Yetiş, ey sitəmgar, harayə haray.

Sənə Raci, ey hur, ta bəndədir,
Həminə üzün nuru tabəndədir.

Çıxarmaz səni yaddan mah, sal,
Onu sən də bir yadə, ey mah, sal![571]

Racinin bu qisim təcnisləri çoxdur. Burada biz ancaq onlardan bir neçəsini yazdıq. Cümləsi ilə bələd olmaq istəyənlər onun divanına rücu etsinlər. Mərhum Hacı Əbülhəsən Racinin qönçeyi-təb'i-lətifi xüsusən facieyi-Kərbəlanı zikr etdikdə gül kimi açılıb, hər tərəf hüznü ələm gətirici otirlər saçıb və cümlənin ürəklərini qəmü qüssə ilə və gözlərini yaş ilə doldurur. Və lakin bu qəmü ələm və bu göz yaşı insanı məyüsü məğşuşü təzyiq etmir, bəlkə onun qəlbini səfalandırıb, gözünə işıq gətirir.

Əgər iradü etiraf olunsa ki, kədər ilə səfa və qəm ilə sürur və göz yaş ilə nur bir yerdə ola bilməz, bunlar bir-biri ilə zidd olduğu halda uyuşmaz, onda deyə bilərik, bəli, İmam Hüseyn müsibətində bu feyz vardır, bir

yandan ağlayır, bir yandan nuraniyyət bəxş edib şad qılır; bir yandan qəmləndirir, bir yandan qəmü qüssədən azad edir. Bir yandan şikəstəvü pərişanhal edir, bir yandan uca məqamlarda dövr etməyə pərü bal verir. Bu feyzü bərəkət, bu qeyri-adi halət və xüsusiyyət ancaq seyyidüş-şühəda müsibətü ə'zasına müxtəsdir, ancaq mahi-məhərrəmdə tərtib olunan tə'ziyələrdə hiss olunur. Raci isə bu tə'ziyələrin rövnəqi və matəmlərin şəfəqidir. Azərbaycan şüərasından Dəxildən sonra Raci Kərbəla gülşəninin ən fəsih bülbüli-xoşəlhanı və neynəva dəştinin ən suznak növhəxanı hesab olunur. Racinin növhələrində olan tə'sir çox rövzəxanların mərsiyələrindən artıqdır. Əzbəs ki, rövzəxanların əksəri oxuduqları əhvalatda bə'zikərə o qədər mübaliğə edirlər ki, o qədər fəhmü idraka sığışmayan və ağıl qəbul etməyən sözlər və hekayə söyləyirlər ki, əhli-məclis onlara inanmayıb, bir növ qövllərindən ikrah edirlər. Oxuduqları mərsiyəyə meylü rəğbət göstərmirlər. Raci Kərbəla faciəsinin hansı bir qissəsini rişteyi-nəzmə çəkibsə, tamamında böyük məharət büruz edibdir, əhvalatı eyni ilə sərapa, şairanə elə gözəl tərzdə nəql edir ki, cümlənin huşü diqqətini cəlb edir.

Məsələn, İmam Hüseyn əleyhissəlamın əziz və istəkli qızı cənab Səkinə Şamda cümleyi-əhli-beytlə əsirvar olduğu zamanda bir gecə yuxuda babası seyyidüş-şühədanı görüb, ona şərhi-hal etməsini, yainki aliəbanın Kərbəla diyarına yetişdikdə möhnətü qəm qubarına batmaqlarını və seyyidüş-şühədanın övladü ənsarının hər birinin vəsfi-halını və yainki əhli-beytin Şamdan Mədinəyə müraciət etməsini və əhli-Mədinənin şurişü nəvaya gəlməsini və mərizə Fatimənin hali-pürməlalını və bu qisim çox-çox Kərbəla əhvalatını Raci əleyhirrəhmə elə bir fəsahət və məharətlə təhrir qılıbdır [ki], hər kəs onları diqqət ilə oxusa, mə'yusü məlulü feyzyab olmaqla əhvalatdan dəxi filcümlə xəbərdar olar. Kərbəla şəhidlərinin müsibətinə şüru etməkdən qabaq şair həqq dərgahına münacat edib, ondan tövfiqü mərhəmət diləyir və səhni-çəməni-Neynəvanda pərvaz etmək üçün balü pər istəyir və nəfsi- şumun əlindən xilas olub, həqiqi aşiqlər məsləkinə daxil olmağa və vadiyi-heyrətdən qurtarıb nicat bulmağa lütf kimi bir dadrəsü rəhbər tələb edir:

Can bülbülü olmuş zəğəni-nəfsə giriftar,
Daim qəfəsi-sinədə eylər ona azar.
Bu, layiqi-firdovs, o, niyranə səzavar,
Ülvitələbi-süfldə ol hiyləgər istər.

Tövfiqini, ya rəb, bizə həmvarə rəfiq et,
Də'vayi-təvaliyi- Hüseynidə sədiq et,



Lütfün bu rəhi-eşqdə həmrahi-təriq et,
Dil vadiyi-heyrətdən, bu rəhbər istər.

Hər kimsənə istər ola aşiqliyə layiq,
Əlbəttə, xəlayiqdən edər qət'i-əlayiq,
Qəti-nəzər ondan da gərək aşiqi-sadiq,
Hər mamələkindən edə qət'i-nəzər istər[572].

Racinin növhələri mə'lum isə də, onlardan birini nümunə üçün burada yazırıq. Bu növhədə İmam Hüseyn həmşirəsi olan vəfa kanı və dəyanətü sədaqət mənbəyi Zeynəbi-qəmpərvərdə öz cananı ilə, yə'ni xaliqi-ləmyəzəl ilə ruzi-əzəldə elədiyi əhdləri bəyan edib, kamalicür'ətü fəxarət ilə deyir ki, həqq yolunda və eşq aləmində nə qədər ağır cəfalara və böyük bəlalara giriftar olsam, mənə eyni-səadətdir və yüz belə zəhmətlərə öz canımla dözərəm. Cənab Zeynəb isə qardaşına təsəlli verib hər növ' bəlalara təhəmmül etməsini təsdiq edib deyir ki, ya Hüseyn, ruzi-cəzada səninlə başlar əlində şühəda həşrə gələn zamanı mən də üsəranı başıma cəm' edib, bu zülfi-pərişanımla siz ilə müttəfiq cümlə [ümmətə] şəfaətçi olaram.

Haman növhə budur:

Belə əhd eyləmişəm, ey bacı, cananım ilən,
Ərseyi-Kərbubəladə boyanım qanım ilən.

Çünki bu cami-əcəldə şəkərü şəhdim var,
Bu səbəbdən susuz ölməkliyə çox cəhdim var,
Aləmi-zərrdə canan ilə bir əhdim var,
Varam öz eylədiyim əhd ilə, peymanım ilən.

Bacı, əhdim budu bu çöldə gərək qanə batam,
Qanımı Əkbərimin qanına şövq ilə qatam,
Can verib təşnə, gərək isti qum üstündə yatam,
Cismi-məcruhim ilə, sineyi-suzanım ilən.

Qan içində eləyim həqq ilə bir razü niyaz,
Budur əhdim ki, quram burda gərək məclisi-raz,
Can verən vəqtdə meydanda qılam, bacı, namaz,
Dəstəmazım ola bu şərt ilə öz qanım ilən.

Düşdü İbrahim əgər şövqi-həvayi-eşqə,
Etmədi tab, vəli dərdü bəlayi-eşqə,
Bircə qurban ilə gəldi o, Minayi-eşqə,
Gəlmişəm mən bura yetmiş iki qurbanım ilən.

Çəkmərəm dəm, dəmi-şəmşirdə, şəmşir nədir,
Xəncərü tiğ nədir, nizə nədir, tir nədir,
Məclisi-vəslə qədəm qoymağa təxir nədir,
Mən bu bəzmə gedirəm başım ilə, canım ilən.

Zövrəqi-cismimə var lücceyi-xun içrə nicat,
Təşneyi-eşqə verir suzi-ətəş abi-həyat,
İçmərəm gər tuta dünya üzünü abi-Fərat,
Bəzmi-vəslə gedirəm bə ləbi-ətşanım ilən.

Həq yolunda susuz ölmək demə zəhmətdi mənə,
Gözümə ox dəyə gər, eyni-məhəbbətdi mənə,
Aləmi-eşqdə hər zəhməti rahətdi mənə,
Dözərəm yüz belə zəhmətlərə bir canım ilən.

Çəkmərəm minnət ədudən, çəkərəm bu ətəşi,
Bacı, eşq aləminin çoxdu belə keşməkeşi,
Səni bazarə çəkərlər çü əsiri-həbəşi,
Şami-şum içrə əyali-şəhi-mərdanım ilən.

Əhli-Kufə yetirir zülmünü itmamə, bacı,
Bədənimdə dəxi qoymazla qala camə, bacı,
Nizələrdə aparırlar başımı Şamə, bacı,
Bədənim yerdə qalar peykəri-üryanım ilən.

Şamdə məclisi-işrət qurular, söz deməræm,
Kuçəvü bamdə səf-səf duralar, söz deməræm,
Xeyzüran çubu nə qədri vuralar, söz deməræm,
Bəzmi-əğyardə mən bu ləbü dəndanım ilən.

Zeynəb ərz eylədi: – Qardaş, bilirəm ruzi-cəza
Sən ilə həşrə gəlir başlar əlində şühəda,
Üsəranı başıma cəm' edərəm mən də, əxa,
Gələrəm məhşərə bu zülfi-pərişanım ilən.

Ümmətə cümlə şəfaət edərəm mən sən ilə,
Kərbəladə bulaşan qanına pirahən ilə,
Şimri-dunun yaxasından tutaram şivən ilə,
İstərəm qanını bu çaki-gəribanım ilən.

Ya Hüseyn, hövli-qiyamətdə yetiş imdadə,
Raciyəm, bircə ümidim sənə var üqbadə,
Ağlaram, olsa həyatım nə qədər dünyadə,
Gecə-gündüz sənə bu dideyi-giryanım ilən.



## PÜRQƏM

Racinin müasirlərindən "Pürqəm" təxəllüslü şair dəxi Azərbaycanı-əcəmdə şöhrət tapmışdır. Pürqəmin divani-əş'arü kəlamından öz əhvalü güzarişatana mütəəlliq iki kəlməsə də bir söz tapmadıq[574]. Hətta şairin adı dəxi öz divanında zikr olunmayıbdır. Ancaq divanın sərlövhəsində dərc olunmuş şe'rdən anlaşılır [ki], şairin ümdə məramı matəmi-seyyidüş-şühədanı zikr etməkdir:

Xəyalate-ma qesseyi-matəməst,
Çə zolfe-pərişan səxən dərhəməst,
Əgər delpəsənde-əhibba şəvəd,
Məsəmma beğəmxaneye-Pərqəməst[575].

Pürqəmin Raci ilə həməsr olmağına şəhadət edən kitabın tarixidir ki, əbcəd hesabı ilə bir "ğeyn"[576] ilə dörd "eyn"dən istixrac, Nəsrəddin şahın əsrində olunur, yə'ni 1280-ci sənə Pürqəmin kitabı tamam olubdur. Bu barədə şair kitabın bir yerində yazıbdır:

Saqi, nə ruze-səbrə şəkibəst in zəman –
Kin əhd-əhde-Nasere-dinəst, dustan.
Zan abe-rühpərvərəm ey ruhe-cane-mən,
Dəh sağəri bemehre-şəhənşahe-kamran.
Birun kənəm ze del ğəme-deyre-se pəncra,
Dər əhde-kamraniye-Cəmşid-astan.
Mey dəh, məpərs namə neşan əz vocude-mən,
Mey dəh məgir xurde binamə bineşan.
Ğeynə cəhar eyn ke, zəd təb'le-ərrəhil,
Şayəd bename-ma-zənəd in deyr xakdan...
Pərğəm, ze rəsme-eşq gərət nist entebah,
Giti bekame-pire-moğanəst dər Moğan[577].

Pürqəm özü saqiyə rücu edib deyir ki, mey ver, mənim namnişanım-dan soruşma, bu üç-dörd günlük fəna dünyaya nə e'tibar var? Cəmşid, Cəm, Kavus, Keyqubad, Kəyumərs kimi padşahlar fövt olub gedəndən sonra və onlardan bir namü nişan qalmayandan sonra mənim kimi həqirü zəlilü fürumayə şəxsin adı və sanı qalmaqdan nə hasil?

Pürqəmin fəqir, yoxsul və möhtac olmağı kitabının axırında yazdığı əvvəlinci misraları türkcə və axırıncı misraları farsca şe'rindən mə'lum olur:

Gözün fədasiyəm, ey saqiyi-səadətmənd –
Ki, dər məhəbbəti-mövla bedəh piyaleyi-çənd.
Gətirdi axiri-dəftərdə Cəbrəili-xəyal,
Hədisi-namü pənir əz bərayi-hacətmənd.

Bu beş gün ömrümü sərf etdim ahü zar ilə,
Dəmi nəşod diləm əz kami-dünyəvi xürsənd.
Əlimdə var-yoxu badi-fənayə verdi qəza,
Vəli bəhər dü cəhan pul migüşayəd bənd.
Skəndəri edər aciz bu nəhs pulsuzluq,
Çinan ki, qürbi-gəda nist nəzdi-dövlətmənd.
Keçib boğazıma bu tuği-fəqri-mövlana,
Tərəhhümi ki, məra qət' şüd sədayi-bülənd.
Bu ac qarın çörək istər, bu lüt bədən paltar –
Ki, şaxə-şaxə hüveydast əz dü pəhlu bənd.
Bu mürği-təbimi, şaha, salıbdı hövsələdən –
Ki, nist haləti-təğrir bər xuda sövgənd.
Kömür çuvalı ayaq bəndə xanədən çəkmiş,
Zi dəsti-cayi-xətai ki, yə'ni çarək qənd.
Qızıl-gümüş tükənib, cibdə yoxdu bir qara pul –
Ki, dər təsərrüfi-hər kəs dəmi bəvəd peyvənd.
Deyil lətifeyi-dərviş, Pürqəma, mənzur,
Bəvəd bərabəri-din əz şə'nidənəş xürsənd[578].

Pürqəmin divani-əş'arı dəxi Racinin divanı kimi ibarətdir farsi və türki mənzumələrindən. Şairin yazdıqları əksəriyyən pəncəni-ali-əbanın mədhinə və tövsifinə və ya mərsiyə və növhələrinə dair əsərlərdir. Pürqəmin dəxi təb'i rəvan isə, bir o qədər lətif və nazik deyil. Belə ki, Racinin kəlamında olan məlahətü abdarlıq Pürqəmin əş'arında məhsus deyildir. O cəhətə onun növhə və mərsiyələri bir o qədər şöhrət və rəğbət kəsb etməyibdir, nə qədər ki, Racinin və mərhum Dəxilin asari-məmduhələri mərufü məşhur olublar. Pürqəmin əsərlərindən nümunə üçün burada bir türki qəzəli və bir növhəsi tərqim olunur.

Qəzəli-Pürqəm:

Gəlir nəsimi-behişt aşikarə zülfündən,
Müəttər oldu bu məclis dübarə zülfündən.

Kəsib qabağını hüsnün misali-əbri-siyəh,
Olubdu mah ruxin bəxti qarə zülfündən.

Çəkəndə darə haçan böylə ah-zar elədim –
Ki, düşmüşəm bu gecə ahü zarə zülfündən?!

Rəqib çox çalışır kuyi-eşqə yol tapsın,
Vəli düşən deyiləm mən kənarə zülfündən.

Məti-müşkə bu tüccari-eşq olub talib,
Budur ki, şur düşüb hər diyarə zülfündən.

Fəraq oduna yanar həşrə dək dili-Pürğəm,
Gər olmasa bu yaman dərdə çarə zülfündən[579].



Növhə; qətlgahda cənab Fatimeyi-novərusun dilindən əmizadəsi cənab Qasımın nəş'inə xitabən:

Dur, ey biyarü biənsar əmoğlu,
Şəhidi-ləşkəri-küffar əmoğlu.

Dur, oldu ruzigarım qara sənsiz,
Yetişdi qəmli könlüm zarə sənsiz,
Salıblar canımı odlarə sənsiz,
Bu çöldə firqeyi-xunxar, əmoğlu.

Necə görsün gözüm qan toy hənasın,
Necə bilməm çəkim hicrin cəfasın,
Dur əyləş, bağlayım başın yarasın,
Məni-nakami-diləfkar, əmoğlu.

Qəsəm olsun o zülfi-müşksayə,
Məni saldı fəraqın min bəlayə,
Əsir etdi bu qövmi-əşqiyayə,
Nədir təqsirim, ey sərdar əmoğlu?!

Kimə dərdi-dilimi eyləyim faş,
Gedib yeksər əlimdən qövmü qardaş,
Nedim axır məni-biçarə, külbaş,
Mənə qalmıbdı bir qəmxar, əmoğlu.

Əcəb qoydun məni dəşti-bəladə,
Qəribü bikəsü tənha aradə,
Ərusundur gedər Şamə piyadə
Yanınca yox ənisü yar, əmoğlu.

Kərəm qıl, gəlmişəm billah amanə,
Məni yalqız yola etmə rəvanə,
Və ya tapşır gələn, Şimri-Sən'anə
Mənə çox etməsin azar, əmoğlu.

Şəbü ruz ağlaram bu qəmfəzadə,
Salan yox halımı bir kimsə yadə,
Nedim ərz etməyə bu macərədə
Tapılmaz Heydəri-Kərrar, əmoğlu.

Mən axır novgüli-bağı-əmirəm,
Mən axır novərusi-hicləgirəm,
Mən axır Şimr əlində dəstgirəm,
Dəxiləm, dur məni qurtar əmoğlu.

Əcəl yetməz ölüb rahət oleydim,
Bu xöfvü lərzədən can qurtareydim,
Dəxi Şimrin cəfasın görmiyeydim,
Ki, billah, olmuşam zinhar, əmoğlu.

Gəlib fəryadə cinnü insü adəm,
Olub Pürqəm qəmində qərqi-matəm,
Hər il saxlar ə'za mahi-məhərrəm,
Sənə ol zarü diləfkar, əmoğlu[580].

İmam Hüseynin şə'nində yazıbdır:

Vəfalı aşiq olan aləmi-vəfadə gəzər,
Təriqi-eşq tutub vadiyi-bəladə gəzər.

Bu kuyi-eşqə düşən tərk edər, çıxar vətəni,
Əyalını götürüb dəşti-Kərbəladə gəzər.

Vüsal istəyən aşiq riza qəzayə verər,
Özü yatar gün önündə, başı cidadə gəzər.

Riza qəzayə verən baş susuz gedər Şamə,
Yanınca nazlı qızı çölləri piyadə gəzər[581].

Hüseynə ağla ki, Pürğəm, sən ağlayanda o da[582]
Səsin qatar səsinə, çünki bu azadə gəzər.

Qəm etmə aşiq ilə həşrdə şəfaət üçün,
Əlində qanlı başı ərseyi-cəzadə gəzər[583].



## AĞAMİRZƏ MƏHƏMMƏD BAĞIR "XALXALİ"

Ağamirzə Məhəmməd Bağır Xalxali, demək olur ki, Azərbaycan-əcəmdə bu vaxta kimi zühur edən türk şairlərinin ən müqtədir və rəvan-təb'lisidir. Xalxalinin ləqəbi göstərir ki, ol cənab Təbrizin yaxınlığında Xalxal qəryəsindəndir və Qarabulaq sakinidir. Bu qəryə isə böyük və məhsuldar, xoş abü havalı bir mövqedə qədimdən bina olunmuş dehatlardan birisidir.

Mirzə Məhəmməd Bağırın ancaq bir əsəri-mətbuu "sələbiyyə – "Tülkü" adında ki, nəzm ilə inşa olunubdur, bizə mə'lumdur[584]. "Sə'ləbiyyə"dən qeyrisini görməmişik və anladığımıza görə, ondan səva özgə bir əsəri olmayıbdır[585].

Xalxalinin tərcümeyi-əhvalına məxsus əxbar cəm' edə bilmədik və bu barədə sə'yü təlaşımız bisəmər qaldı. Çoxları məlumat cəm' edib göndərməyi vədə etdilərsə də, vədələrinə vəfa edənləri olmadı. Ancaq "Sə'ləbiyyənin axırında şair öz əhvalına dair cüz'i məlumat verir. Onun öz yazdığından mə'lum olur ki, ol cənab Nəsrəddin şahın vəqti-səltənətində kitabını 13[10]-cu tarixdə itmamə yetiribdir və bu tarixi-kitab dəxi onun öz şe'rindən istixrac olunubdur əbcəd hesabı ilə[586]. Öz adını və məhəlli-təvəllüdünü dəxi şair bir şe'rində bəyan edibdir. Kitabın xatiməsində Nəsrəddin şahın duası babında yazdığı şe'rlər bunlardır:

Bihəmdillah, kitabi-"Sə'ləbiyyə"
Tamam oldu əcəb şirin qəziyyə.
Zamani-Nasirəddin şahi-Qacar,
Şəhənşahi-cahangirü cahandar.
Mənə yoxdur yolu şahı edim mədh,
Neçün ki, qorxuram mədhim ola qədh.
Və lakin şahımız çox yaxşı şəhdir.
Xilafət bürcünə rəxşəndə məhdir.
Onun əhdində asudə dolanıq,
Ədalət kölgəsində daldalanıq...
Xudaya, daimi qıl tacü təxtin,
Bülənd et himməti tək cahü bəxtin.
Özün, oğlanların, əhlü əyalın,
Hamı nökərlərin, cahın, calalın
Həmişə bu cahanda paydar et,
Onun bədxahına bərpayi-dar et...
Xəbər alsa biri adımı bilfərz,
Özüm öz adımı qoy eyləyim ərz.
Fününi-mə'rifətdən xaliyəm mən,
Məhəmməd Bağıri-"Xalxaliyəm"mən.
Bu fərdi-axirin nəzmi-savabı
Bəyan eylibdi tarixi-kitabı[587].

Bu yazılardan başqa Məhəmməd Bağır Xalxalidən özgə bir xəbərimiz yoxdur və çox heyif belə müqtədir, xoştəb' və şirinkəlam şairimiz adsız və sansız itib gedir və qədrü qiyməti kəma huvə həqqəhu bilinmir.

Çox ola bilir ki, Məhəmməd Bağır indiki hali-həyatda[588] sağ və salamat məişət dəryasına cumub, kəsbi-qüvvət və təhsili-məaş yolunda cəngü cidal etməkdədir;[589] vallahü ələm.

İndi "Sə'ləbiyyə" kitabına rücu edək. Xalxalinin bu əsəri başdan-ayağa nəzm ilə yazılıbdır. Nəzmi-şe'rində bir qüsur yoxdur. şe'rlərin hamısı səlis, rəvan və mövzundur.

Əgərçi mə'nanı şe'rlə ifadə etmək asan deyil və çox vədə şair qüvvəsini kəlamın vəzn, rədif və qafiyəsinə sərf edib, mə'naya və əsil mətləbə çəndan mültəfit olmur, amma həqiqi şair çox ali fikirləri və nazik mə'naları asan vəch ilə gözəl şe'rlər vasitəsilə bəyan edir. Necə ki, sabiqdə Füzulinin haqqında danışıldıqda biz dedik ki, "Leyli və Məcnun" hekayəsində nə qədər dərin mə'nalar, hikmətli sözlər və işarələr vardır, amma onların hamısını Molla Məhəmməd Bağdadi elə asan və açıq, şirin dil ilə şərhü tövsih edibdir ki, onları anlamamaq olmaz.

Həqiqi şairin baş vəzifəsi mə'nanı yetirməkdir. Çünki hər bir qissəvü hekayətin ruhu onun içində olan mə'na və məzmundur. Nə qədər ki, şairin başında doğan təzə fikirlər aydın, açıq və salamat olsa, bir o qədər də onları bəyan etmək asan olur. Çətin ancaq fikrin başda doğub pərvəriş tapmağıdır. Dolaşıq və qarışıq fikirlərin zühura gəlməsi də dolaşıq olur və bə'zi şairin yazılarının kəlamı o qədər qarışıq və bulaşıq olur ki, o qədər ağır və qəliz ibarələrlə malamal olur ki, elə ölçüsüz və biçiksiz yaraşılmayan dona geyinilir ki, onları oxuyanlar bir şey fəhm edə bilmir və bu kəlamı yazmaqdan şairin ümdə məramı nə olduğunu anlayıb başa düşmürlər.

Zənn edirəm ki, əgər şairin və ya ədibin özündən dəxi soruşulsa ki, cənab filan, sizin bu kəlamı yazmaqda əsl məramınız nə olubdur və bunun ruhu, canı nədədir, hansı mətləbi ifadə etmək istəyibsiniz, ol cənab bu suallara cavab verməkdə aciz qalsın...

Məhəmməd Bağır Xalxali Azərbaycan şairlərinin ən açıq və aydın fikirli və salamat əndişəli şairlərindən birisidir. Əqli-səlim və fikri-mətin ilə belə haqq-taala ona rəvan təb' dəxi mərhəmət etmişdir ki, onun vasitəsi ilə yaratdığı qissələrin cümləsində müfidü mə'qul hissələr götürmək olur.

Bəziləri irad edə bilərlər ki, xırdaca uşaqlar üçün məzhəkə səpkində yazılan "Tülkü" nağılından nə böyük hissələr və müfid təcrübələr əxz etmək olur? Doğrudur, Xalxali cənabları söylədiyi "Tülkü" nağılıdır və



ələzzahir çəndan əhəmiyyət və ləyaqəti ola bilməz və lakin şair məzhəkənin zimnində münasibi-halü məqal haşiyəsazlıq edib, xeyli məsləhətli sözlər və gözəl nəsihətlər söyləyir ki, cümləsi indəl-üqəla məqbulü müstəhsəndir. Xalxalinin bu tutduğu nizamü rəviş Mollayi-Ruminin şivəvü qaydasına bənzəyir ki, adi bir şey'in üstə söz açıb, tülküdən, canavardan, atdan, eşşəkdən və ya insan növ'i şahdan, gədadan, dərvişdən və qənidən bəhs etdiyi əsnada məqamı gəldikcə münasibi-məqal haşiyələr çıxıb, xeyli həkimanə və fəlsəfanə sözlər söyləyir ki, onların məalü məzmunu cümləni heyrətə salır.

Əlbəttə, Xalxali ilə Mollayi-Rumi arasında fərq çoxdur. Biri şəkkəri-Hindustan isə, o biri şəkkəri-Mazandarandır. Amma bunu dəxi inkar etmək olmaz ki, ikisində də şirinlik vardır. Mollayi-Ruminin "Məsnəvi"-sində olan dərin fikirlər, hikmətamiz sözlər, barik nüktələr, əlbəttə, Məhəmməd Bağırın "Sə'ləbiyyə"sində yoxdur. Amma onun "Sə'ləbiyyə"sində dəxi xeyli gözəl nəsihətlər və müşfiqanə öyüdlər, nazik işarələr və məqbul zarafatlar olmağını dəxi danmaq olmaz.

Xalxali kitabını məzhəkə tərzində yazdığının səbəbini xatimeyi-kitabda belə bəyan edir:

> Əvamün-nasə yazdım bu kitabı.
> Bu vəchi onlara qıldım xitabı.
> Deyib çox məzhəkə, qıldım zərafət,
> Onun zimnində yazdım həm nəsihət.
> Neçün ki, xəlqə həqq acı gəlübdür,
> Zərafət sözləri şirin olubdür.
> Qarışdırdım ikisin gəldi halə,
> Yetişdi müntəhayi-etidalə.
> Bu üzrümdən sora gər mərdi-bədxah
> Təərrüz eyləyə əlhökmü lillah.

Şair özü ifadeyi-məram etdikdə buna müqirr olur ki, kitabı avamün-nas üçün yazıbdır, mə'rifət və kəmal əhlinə tövsiyə və tənbeh etməkdən yaxasını kənara çəkir. Çün kitab avam xalq üçün tənzim olunubdur, ona binaən haqqı çılpaq söyləməkdən ehtiyat edibdir. Əzbəs ki, açıq söz, haqq kəlam avama həmişə acı və ağır gəlir və mənzurda olan nəticə hasil olmur, o səbəbə şair nəsihətini xalqa eşitdirmək üçün həqiqəti-halı zərifanə bir səbkdə və doğrunu məzhəkə sayağında söyləyibdir ki, avamün-nası sözlərini eşitməkdən və nəsihətlərini qəbul etməkdən birəğbətü mütənəffir qılmasın. Və insafən demək olur ki, Məhəmməd Bağır Xalxali belə zərifanə şe'r söyləməkdə, ziştü zibalı kəlam yazmaqda böyük məharət və qabiliyyət göstəribdir. Bir yandan güldürübsə, bir yandan da ağla-

dıbdır, bir yandan xoşhal şad edibsə, digər bir yandan da qəmgin, mə'yus və mütəfəkkir qılıbdır.

Kitabi-"Sə'ləbiyyə"də tülkünün öz hekayəsinə məxsus əhvalat kitabın ancaq onda bir hissəsi ola bilir. Mabaqisi qisim-qisim pəndü nəsihətlərdir və zəmanənin övza'vü əhvalına, müsəlman tayfasının dolanacağına, adatü adabına, əxlaqü ətvarına və dünya zindəganlığına və axirətə dair təhriratdan ibarətdir.

Burada kitabın mündəricatını tamamən nəql etməyə ehtiyac yoxdur və belə zənn edirik ki, "Sə'ləbiyyə" ilə əhli-savadımız aşinadır, aşina olmayanlara dəxi onunla tanış olmağı öz tərəfimizdən məsləhət görürük. İran kitab-füruşlarından onu az qiymətə almaq müyəssərdir. Ancaq biz burada – məcmuədə Xalxalinin bir para fikrü xəyallarını və hikmətamiz nəsihətlərini göstərib, möhtərəm oxucuların diqqətlərini onların tərəfinə çöndərmək istəyirik. Ta ki, özləri şairin qüvveyi-şe'riyyəsini və dərəceyi-mə'rifət və kamalını təmyiz etsinlər.

İsfahan şəhərində tülkünün aclıqdan bitaqət, zəifü nəhif olmasından danışıb, şair inqilabi-övza'i-ruzigara ətfi-kəlam edib deyir:

Bəli, heyrətdi bu çərxin qərarı,
Bilinməz işdi çərxin[590] karü barı.
Birisinə müyəssər nazü ne'mət,
Birisi ac çəkər yüz min məzəllət.
Birisi çigriyib yağlı pulovdan,
Birisi doymayıbdır nani-covdan.
Birisinin yağar dövlət başından,
Birisi görməyib bir pul yaşından.
Birisi başə qoymuş taci-şahi,
Birisi başıaçıq, yoxdur külahi,
Biri növ'kər, birisi xan olubdur,
Biri rə'yət, biri sultan olubdur.
Biri daim çalar çəngü çəğanə,
Birisi ney kimi gəlmiş fəğanə.
Birinin ağzı gülməkdən yığışmaz,
Birisi dərdü möhnətdən göz açmaz,
Birinin mənzili qəsrül-giramə,
Biri həsrət qalıb bir hisli-damə.
Biri atlas tuman geymiş damağlı,
Birinin bez tumanı var yamaqlı
Birinin gözləri qarə, qələmqaş,
Yazıb guya qələmlə dəsti-nəqqaş.
Birisi kök, deyərsən pərvəridir,
Birisi bir sümükdür, bir dəridir.
Birisinin sözü mat etmiş əqli,
Biri yazmış mənim tək "Tülkü" nəqli[591].



Bu gözəl şe'rlərdən sonra Xalxali nizami-aləmdən və insanın başına gələn bə'zi həvadisdən danışıb, o həvadisin vüquunu haqq-taalaya isnad verir və deyir ki, bunlar haqq-taalanın işləridir və aqil gərəkdir onlara mötəriz olmasın[592].

Bu babda Məhəmməd Bağirın bir neçə mə'qul fikirləri varsa da, mabaqisinə müfaviqət göstərə bilmərik. Əgər həqiqətdə ol cənab tedad etdiyi işlər Allahın işləri isə, sözümüz ola bilməz. Çünki onun çox hikmətləri vardır ki, insan onları anlamaqda acizdir. O hikmətlər ki, filcümlə ibarət olsun dünyanın yaranmasından və bizi əhatə edən təbiətin övza'vü əhvalından və ənva'i-məxluqatın təbiətü iqtizasından və sair əcaibü qəraibdən, bunların cümləsi filhəqiqə bizi böyük bir heyrətə salır. Doğrudur, elm sayəsində çox gizli sirrlərin və namə'lum şeylərin üzündən cəhalət pərdəsi götürülübdür və çox şeylərin səbəbi-xilqəti və mahiyyəti kəşfü bəyan olunubdur və olunmaqdadır, amma daha da çox şeylər var ki, onlar təhqiqü tədqiq olunmayıbdır və bu yolda hükəmavü filosoflar xeyli zəhmətlərə və məşəqqətlərə giriftar olublarsa da və ömürlər sərf ediblərsə də, yenə də bir məqama vasil olmayıblar və çox üləmavü hükəma axır nəfəsində həsrətlə canlarını təslim etdikdə dünyaya cahil gəlib, cahil getdiklərini söyləyiblər. Hasili-kəlam biz dediyimiz budur ki, xudavəndi-aləm öz qüdrəti ilə yaratdığı aləmin hər şey'ində bir hikmətü sirr vardır və hər nə ki, yaradıbdır, tamamisini öz yerində xeyli gözəl və qəşəng yaradıbdır və xüsusda bir e'tirazü irad ola bilməz və dünyaya bəsirət gözü ilə baxdıqda şairin sözü yadımıza düşür:

Bu kargahi-sün' əcəb karxanədir,
Hər nəqşi elmi-lədündən nişanədir[593].

Və Xalxali özü də bu qövlə müqirr olub deyir:

Bu övza'i görüb gəlmə sualə,
Təərrüz eyləyib çıxma cidalə –
Ki, hikmətlə xuda düzmüş nizami
Bu mətləbdə nə xoş yazmış Nizami:
"Cəhan çon çeşmo zülfo xalo əbrust –
Ke, hər çizi bəcaye-xiş nikust"[594].

Xalxalinin bu sözləri çox lətif və çox mərğub, şairanə yazılmış şe'rlərdir. Amma bunlardan aşağıda yazılan şe'rlərin məalına iradımız vardır və onların haqq olmasını təsdiq edə bilməyəcəyik. Haman şe'rlər bunlardır:

Fəqirin fəqri, mün'im cahü mali
Səlahül-külldür hali, məali.

Düşə dövlət fəqirü pəst əlinə,
Qılıc guya düşübdür məst əlinə.
Əgər mün'im kişi olsaydı zadi,[595]
Tutardı aləmi şərrü fəsadi.
Bunu çün anladın, ey mərdi-agah,
Hamı işlərdədi əlhökmü lillah.
Əgər naxoş olursan, qədrini bil,
Balam, səbr eylə, açma şikvəyə dil.
Mərəz[596] eyni səlahındır bu yerdə,
Düşünmürsən gözündə vardı pərdə.
Ata övladını bisərfə vurmaz,
Nihalın bağban bihudə qırmaz.
Sənə xaliq atadan mehribandır,
Düşübsən özə fikrə nə gümandır.
Xudadən gəlsə bir cüz'i-müsibət,
Əlində ya dilində var şikayət.
Bəladən incimə, ey kərbəlai,
Buyurmuş "əlbəlaü lilvəlai"[597].
Bəla versə sənə üz, olma məğmum,
Nə yaxşı söz deyib Məcnuni-məhmum;
Əgər ba digəranəş bud meyli,
Çera zərfi-məra bəşkəst Leyli[598].
Qərəz, Allah işində qılma irad, –
Ki, iradın olur mə'nada ilhad*[599].

Bu şe'rlərdə Xalxali cənabları müsəlmanların nə əqidə üzrə olmaqlarını göstərib öz tərəfində yenə də onlara tövsiyə edir ki, Allah dünyanı belə yaradıbdır ki, kimi fəqirdir, kimi dövlətli. Ona görə həqqdən şikayət etmək lazım deyil. İnsanlar[ın] belə təbəqə-təbəqə xəlq olunmasında, əlbəttə, bir sirr vardır. Belə ki, fəqir əlinə dövlət düşsə, gözləri qızıb, heç bir şey'i seçməyəcəkdir və dünyada çox fəsad törədəcəkdir və dövlət tapmış fəqirin halı əlinə qılıc düşmüş məsti-layə'qil halına bənzəyir ki, qabağına gələni qılıclayıb doğrayır. Əlbəttə, bu əqidə dürüst deyil, batil əqidədir. Haqq-taala hamı adamları bir halda, bir surətü hey'ətdə yaradıbdır və cümləyə ağıl, zehn və fərasət ə'ta edibdir. İnsanı yaradanda birisinin alnına ağalıq və birisinin[kinə] rəiyyətlik nişanəsi vurmayıbdır. Birini fəqir və birini mün'im yaratmayıbdır. İnsan arasında vüqua gələn bu fərq və təfavüt, bu ədalətsizlik və ədavət insanın əməlindən, tamah və hirsindən törəyib zühura gəlibdir və necə ki, adamlar öz nəfslərinə və bətnlərinə qulluq edəcəklər, öz hirs və tamahlarına tabe olacaqlar, yer üzündən zülm və sitəm əksilməyəcəkdir. İnsanlar firqə-firqə olub, biri ilə cəngü cidal edəcəklər. Yer üzündən büğzü ədavət, nifaqü fəsad qurtarmayacaqdır. Və bu büğzü ədavəti, nifaqü fəsadı Allah yaratmayıbdır, insanın özü yaradıbdır. Həmişə fəqir istəyibdir ki, fəqirlikdən və yoxsulluqdan xilas olsun, dövlətli də istəyibdir ki, dövləti və malı əlindən verməsin və hətta bacardığı qədər dövlətinin üstünə daha da dövlət artırsın. Bu yolda hər iki sinfin arasında həmə vəqt nizavü nifaq olubdur və olacaqdır.

---

* İlhad – təriqi-həqqdən üdul edib küfrə mail olmaq



Əgərçi peyğəmbər buyurubdur ki, "əlfəqrü fəxri", amma heç kəs bu fəxri kəsb etməyə meylü rəğbət göstərməyibdir. Peyğəmbərin əsrisəadətində fəqirlik səadət və fəxarət imişsə də, son əsrlərdə və bizim vaxtımızda fəqirlikdən və yoxsulluqdan böyük məşəqqət və zillət yoxdur və fəsadların çoxusu bu mənbədən zühura gəlir. Bəs, fəqirin fəqirliyi və mün'imin cahü malını səlahül-küll hesab etmək səhih deyil və həmçinin insanın başına gələn sair bəlaların cümləsinə təhəmmül edib, onların dəf'ü rəfinə çarələr axtarmayıb, "əlhökmü lillah" demək canına müsəlman olan düşmənin qılıcının altına kamali-əcz ilə boynunu uzatmaq həm əqlən və həm şər'ən dürüst deyil, böyük günahdır.

Doğrudur, haqq-taala insana atadan-anadan mehribandır və o mehribanlığı cəhətinə insan insana əbəs yerə zülm etməz, onu dərdü bəlalara düçar qılmaz. Ona binaən bizə bir müsibət və bəla üz verdikdə haqqdan şikayət etməyimiz nahaqdır. Çünki həqiqəti-halda o bəla müsibətlərin vüquuna əksəri-övqat bais özümüz oluruq. Allahın bunda bir qarışacağı yoxdur. Amma acizliyimiz və avamlığımız ucundan öz təqsirimizi və qəflətimizi haqqdan görüb, şaki və asi oluruq. Bilmək gərəkdir hamı müsəlmanlar və elmsiz tayfalar bu batil əqidə üzrə yaşamaqdadırlar.

Adamların işlərinə və dolanacaqlarına gəldikdə Xalxali zükur tayfasının haqq yoldan çıxmağından və avamlığından bir az danışıb, keçir ünas tayfasına və bunları iki yerə təqsim edir: bir qismi həyalı və ismətli, bir qismi də həyasız və əxlaqsız arvadlardır. Hər iki qisim arvadların barəsində Xalxali nə e'tiqad üzrə olduğunu bəyan edir. Söz yoxdur, şairin arvadlara bu sayaq baxmağı ümumidir, yə'ni şair nə göz ilə arvadlara baxırsa, onları nə sayaq yaxşı-yamana bölürsə, o sayaq da onun vətəndaşları baxırlar və təqsim edirlər. Zira ki, şair öz əsrinin və əbnayi-vətənin aynasıdır. Ətrafında vüqua gələn hadisələri, öz millətinin zahiri və batini aləmini eyni ilə göstərir. Yaxşı arvadları bu sayaq tövsif edir:

Biri vardır həyası var, hicabı,
Eşikdə üzdə rübəndü niqabı,
Ərinə qul kimi eylər itaət,
Ərə taət, xudavəndə ibadət.

Özün saxlar kişisinə damağlı,
Onun yanında durmaz qaşqabaqlı.
Kişi bilməz ərindən başqa haşa –
Ki, bir naməhrəmə qılsın tamaşa.
Kişi evdə olan vaxtı bəzəkli,
Geyər təzə libasini tüzəkli
Səfər etsə əri, silkər palasın,
Haman saət geyər köhnə libasın
Gözünə sürmə çəkməz, zinət etməz,
Evində əyləşər, qonşuya getməz.
Qənaətlə keçirdər ruzigarın,
Gecə-gündüz çəkər ər intizarın.
Nənəm olsun bu cür övrət tapılsa,
Nə yaxşıdır hamı evlərdə olsa!..
Bu cür övrət tapılsa, yox qüsuri,
Buna övrət demə, huridir, huri[600].

Bu şe'rlərdən mə'lum olur ki, yaxşı arvad olmaq üçün iki şərt lazımdır: əvvələn, arvad gərəkdir həyalı olsun və saniyən, ərinə tabe olsun. Bu iki vəzifəni kamalınca yerinə yetirən arvad həqiqətdə layiqi-təhsindir. Və lakin biz müsəlmanların nəzərində ismət və həya ancaq ondan ibarətdir ki, arvad evindən dışarı çıxanda gərəkdir başını və gözünü bərk-bərk sarısın və çalışsın ki, bir kəsə üzünü göstərməsin və ərə itaət də bundan ibarətdir ki, kişisinin qabağına təzə libas geyinib, özünə bəzək və düzək verə, onun nəzərində cilvələnib xuraman gəzə. Əri evdə olmayanda, səfərə gedəndə təzə libasını dəgişirib, köhnə libasa girə, qaşına vəsmə və gözünə sürmə çəkməyə, evdə otura, qonşuya getməyə, israf xərclər etməyib, qəaətlə dolana və ərinin intizarını çəkməkdən səva özgə bir dərdü qəmi olmaya. Bu cür övrətə huri demək səzadır və hansı evdə olsa, eyni-səadətdir.

Bu sən'ətlərin heç birini nəhy etməyib, öz tərəfimizdən ancaq bunu demək istəyirik: Bir üzə niqab salıb və ərin qabağında bəzənib şuxluq, nazü nəzakət etməklə bir növ' onun qüvveyi-şəhəviyyəsini tərpətməklə əvvəla arvadların vəzifəsi tamam olmur. Lazımdır anlayıb düşünmək ki, arvad da kişi kimi insandır, kişinin elm və ədəbə, ruhani və cismani tərbiyəyə ehtiyacı olan kimi, arvadın da bunlara ehtiyacı vardır.

Hər bir şeydən əvvəl insanın cisminin, ağlının və ruhunun tərbiyəsidir. Yaxşı tərbiyə alan arvadda və kişidə, əlbəttə, həya da olacaqdır, ismət də. Xüsusən tərbiyə və tə'lim arvadlara lazımdır ki, onun döşlərinin arasında və dizlərinin üstə, gözlərinin önündə və əllərinin altında təzə nəsil nəşvü nümə tapıb hasilə yetməkdədirlər. Təzə və cavan nəslin bəqası və səadəti, bilkülliyyə, analar əlindədir, onun himmət və mə'rifətinə bağlıdır.



Mahir, təcrübəli, elmli və bilikli bağban əkib-becərdiyi ağaclar salamat, gözəl və barvər olan kimi, elmli, mə'rifətli anaların təhti-tərbiyəsində böyüyən övlad dəxi gözəl, salamat, xoşxülq və sahibi-fərasət olacaqdır. Müsəlmanların mədəniyyət və tərəqqi yolunda dalda qalmaqlarına baş səbəblərdən birisi də arvadların zillət və üsrətlə güzəran etməkləridir. Şəri-şərif verdiyi hüquq və ixtiyarlardan xəbərləri olmayıb, pərdə altında, cəhalət aləmində ömürlərini çürüdüb, işıqlı dünyadan bixəbər qalmaqlarıdır. Belə zülmət və cəhalət içində dolanan anaların əllərində böyüyən övlad dəxi, əlbəttə, avam, qorxulu, cür'ətsiz və fəhmü fərasətsiz olacaqdır.

Bu halda xümsi-məskunda zindəganlıq edən müsəlman məktəblərinin hansı birisinə nəzər yetirsək, görərik ki, onlardan yazıq, aciz, bacarıqsız və cür'ətsiz tayfa yer üzündə yoxdur. Cəhəti ki, analar qoçaq, hünərli, elmli və bacarıqlı övlad yetirməyiblər. Bəs, lazımdır ki, arvadların tə'lim və tərbiyəli, ixtiyarlı və məlumatlı olmağına himmət sərf etmək və onları ziyalandırıb bir hala yetirmək ki, övladlarına tərbiyə verməyə özləri müqtədir olsunlar. Və illa onların sitr altında boğulub və dünyadan bixəbər qalıb, sırf cəhalətdə yaşamaqlarından bir nəticə hasil olmaz. Bizim arvadların halı gün şəfəqi və təmiz hava görməyən çiçəklərin halına bənzəyir ki, onlar şüküftə və xəndə olmamış, ətrafa ətirlər saçmamış soluşxuyub puç və zay olurlar.

İkinci qisim arvadların halü şə'ninə gəldikdə şair onların böyük eybini üzüaçıq gəzməklərində görür və üzüaçıq gəzməyi hiyləvü fəsad bilib, onları əxlaqsız və həyasız xatunlar silkinə daxil edir. Bu qisim övrətlərə şair min cür'ə eyib gətirən bəzəklər qoşub, xülaseyi-kəlamda deyir:

Bu cür övrətlərə min lə'nü nifrin
Dedim mən, siz deyin aminü amin[601].

Şair ünas əhlini iki firqəyə təqsim edib onlardan əvvəlincisini təhsin və ikincisini təzmim qılıb, dünyanı ikinci övrətlərə təşbih tutur və xəlayiqi onun məkrü hiyləsinə və zahiri zinətü bəzəyinə aldanmaqdan tənbeh edir:

Bu, çərxi-bivəfadır, ver təlağın,[602]
Boşa getsin, evindən kəs ayağın.
Bunu anla ki, axır səndə durmaz,
Vəfası yox, həyası yox, utanmaz.
Dolanma sən onun dövrü bərinə,
Yalançıdır, inanma sözlərinə.
Bu, təmkin etmədi heç padşahə,
Bu, təslim olmadı heç əhli-cahə.
Ləcuc olsan, təlağın verməsən sən,

Boşar axır səni ol bivəfa zən.
Təlaq eylər kişi gər həmsərini,
Bu mə'lunə boşar amma ərini.
Təlaqın ver, özün çək bir kənarə,
Bədəl qıl şurəzarı laləzarə[603].

Yəni dünyaya mayil olma, dünya bir hiyləsi çox, vəfası yox övrət kimi şeydir ki, səni öz toruna salıb, əl və ayağını bağlayıb böyrü üstə yıxacaqdır və sənin gözünün önündə qeyrisi ilə və hətta sənin rəfiqin ilə aşinalıq əlaqəsi bağlayacaqdır. Bəs, özünü qoru, ayıq və huşyar ol ki, bu məkkarənin duzağına bənd olmayasan, zira ki:

Bu, and içmiş ki, ta ruzi-qiyamət
Edə insanı iqva, qılma qəflət[604].

Bu batil əqidə dəxi biz müsəlman tayfasını dünya işlərindən, xüsusən kəsbi-məaşdan soyudub fəqrü zillətə salır. Qeyri-millətlər isə ümuri-məaşdan artıq huşyar və qeyrətmənd olub, öz dolanacaqlarını vüs'ətləndirirlər və gün-gündən sərvət və dövlət sayəsində tərəqqi bulurlar. Amma biz müsəlmanlar "Allahdan buyruq, ağzıma quyruq" – deyib, ehtiyac və yoxsulluq dəryasına qərq oluruq.

Dünya məaşı üçün çalışanları şair eşq əhlinə oxşadır, necə ki, aşıq sevgili mə'şuqəsindən doymaz, elə də dünyagir adam dünyanın malü dövlətindən doymaz:

Bəli, mə'şuqdən eşq əhli doymaz,
Məhəbbət həsbin əldən ölsə, qoymaz.
Dolar mə'şuq ilə cismü rəgü pust,
Olur aşiq fəna, qalmaz məgər dust.
Deyil mə'şuqdən bir ləhzə xali,
Olur mə'şuq ilə daim xəyali[605].

Dünyapərəst şəxslər dəxi bu dəsturi-dünyadan doymazlar:

Odur bais ki, dünyanı tutanlar,
Tutub dünyanı, üqbanı atanlar[606]
Həmişə cəhd edər, hərgiz yorulmaz,
Gecə-gündüz yığar dünyanı, doymaz.
Gəzər daim, dolanar dağü daşi,
Dəyər daşdan-daşa min dəfə başi.
Yığar dünyaları eylər xəzinə,
Xəyal[607] eylər o dəmdə öz-özünə,
Deyər: – Bihəddü əfzun dövlətim var,



Qabaqda xoş günüm var, ləzzətim var.
Münəqqəş mənzilim, yaxşı otağım,
Səfalı mənzərim, gülgəştü bağım,
Cəlalım, şövkətim, şanım, əsasım,
Mə'nalım, izzətim, faxir libasım,
Kənizim, növ'kərim, xidmətgüzarım,
Gözəlcə dilbərim, məhvəş nigarım.
Gedincə gah otağə gahi bağə
Təfənnüm eylərəm, gəlləm damağə.
Xəyal etməz qabağında əcəl var,
Qəzayi-xaliqi izzü cəlal var.
Əcəl birdən qoyar bir[608] ox kamanə,
Oxa eylər o bədbəxti nişanə.
Çəkər zur ilə yayi kinəsindən,
Gəlir pərran keçər ox sinəsindən.
Alır əldən hamı malü mə'nalın,
Gədalər tək edər aşüftə halın.
Çəkər ali imarətdən məzarə,
Olur qəbr içrə yoldaş murü marə.
Bəli, vallahi dünya bivəfadır,
Cahanın bağı bizövqü səfadır.
Əzizim, sən ki, dünyanı görürsən,
Nə böylə sən özünü öldürürsən?!
Yəqin eylə öləndə gec [və] ya tez,
Sənin haqqındı evdən bircə top bez.
Gözüm, aldanma bu malü mə'nalə,
Təəllüq tut xudayi-layəzalə[609].

Şair buradan yenə tülkünün nağılına rücu edib, onun aclığını və pəjmürdə əhvalını ziyadə fəsahət və məharətlə nəzm edir: Ac tülkü:

Xəyalında toyuq nəqşin çəkirdi,
Baxıb ol nəqşə, göz yaşın tökürdi.
Yuxusuna əgər gəlsəydi cücə,
Oyanmazdı yuxudan ta ölüncə.
Keçərdi göylərə ahü fisusi,
Eşitsəydi əgər bangi-xürusi[610].

Bu minval biçarə və natəvan tülkü neçə müddət ac-naəlac qalıb:

Baxıb gördü ürək durmaz, pırıldar,
Bağırsaqlar acından hey cırıldar.
Qoyub başın dix üstə, oldu xamuş,
Nigari fikrilən oldu həmağuş.
Xəyal eylərdi öz dərdinə dərman,

Bu fikrə çulğanıb qalmışdı heyran –
Ki, nagəh qeybdən qovzandı bir səs –
Ki, ey sərgəştəvü məğmumü bikəs,
Gərək aqil[611] olan qılsın təlaşın,
Gərəkdir anlasın rahi-məaşın.
Oturmaqdan dəxi yox çarəvü sud,
Deyil, əlbəttə, babi-rizq məsdud[612].

Burada şair sə'yü təlaşın və kəsbi-məaşın hər iki dünya üçün lazım olmağı babında bir neçə xoşməzmun şe'rlər yazır ki, zikr etməyə bilmirik:

Təlaş eylə dolansın karübarın,
Olub kasıb həbibi[613] kirdgarın,
Əgərçi xaliqin ruzirəsandır,
Təlaş etmək təriqi-aqilandır.
O kəslər kim, cahanda işləməzlər,
Çörək hərgiz doyunca dişləməzlər.
Bu aləm aləmi-əsbab olubdur,
Bu aləmdə əliboş ac qalıbdur.
Əzizim, olmasa sə'yü təlaşın,
Düzülməz isti aşın, ağ lavaşın.
Oturma mənzilində, ey nikunam,[614]
Deyib raziqdir Allah, tutma aram,
Təlaşın eylə ta ruzin yetişsin,
Bunu tərk eyləmə ta ömr keçsin[615].

Yenə Xalxali dünya təlaşından axirət mə'murəsi üçün təlaş etməyi tövsiyə edib deyir:

Bəli, canım, çi dünyavü çi üqba,
Təlaşın olmasa, olmaz müհəyya.
Əgər üqbayə vardır e'tiqadın,
Gərək qəbrə gedə hər gündə zadın.
Çəkərsən doqquz ay zəhmət, firavan –
Ki, xoş keçsin sənə üç ay zimistan.
Məgər bir qışca yox fərdayi-üqba,
Deyil bir hisli damca zilli-tuba?!
Təlaş eylə, deyil vəqti-təənni –
Ki, leysəd -dinə qət'ən bittəmənni.
Əlində görmürəms bir zad əməldən,[616]
Amandır, durma, getdi fürsət əldən...
Təlaşın eylə, ol əmrində cazim,
Mənim ərz etməyim daxi nə lazım[617].

Bundan sonra yenə tülkünün hekayəsinə qayıdır. Onun əhli-əyalından ayrılıb, İsfahandan qürbət vilayətə azim olmağını nəql edir və burada



şair tülkünün uşaqları, əyalı və anası ilə ayrılmağını və nə dil ilə onları dindirib, kimisinə təsəlli və kimisinə nəsihət verməyini və kimisindən xeyir-dua etməyini eyni-surətlə təqrirü təhrir qılır və hətta tülkünün əyalı ərindən ayrılandan ona bədnəzər dəyməsin deyib üzərlik yandırmağını da unutmayıbdır:

Xülasə, tülkünün bikəs əyali
Bu qəmli qissələrdən oldu hali.
Müsibət atəşinə düşdü, yandı,
Yetişdi başına bircə dolandı.
Əlindən, gah ayağından öpürdi,
Dalınca gözlərindən su səpirdi.
Deyirdi: Ey mənim avarə yarım,
Amandır, getmə, ey biçarə yarım!
Güzarın çın düşər hər rəhgüzərdən,
Sənə çox qorxuram mən bəd nəzərdən.
Mənə çün[618] eyləyibsən yaxşı ərlik,
Daban altında yandırram üzərlik.
Üzərlik yandırıb köz-köz edirdi,
Töküb göz yaşını hərdəm deyirdi:
Üzərlik, yan, üzərlik sən həvasən,
Həzaran dərdə dərmansan, də'vasən.
Üzərlik, yan, tütün ver qan qovuşsun,
Qada bundan, bəla bundan sovuşsun[619].

Burada şair yenə münasibi-məqal ər ilə arvadın arasında cari olan müamilə və ülfətdən danışıb, çox ədibanə və nazik imavü işarələr edir və vəfalı həmsərin şə'nində bu sözləri deyir:

Vəfalı övrətin heç qiyməti yox,
Vəfasız olsa, batsın gözünə ox.
Vəfalı övrətin bas öp gözündən,
Sənə hər nə desə, çıxma sözündən.
Vəfalı övrətə qılma xəyanət,
Əlindən hər nə gəlsə, qıl ianət[620].

İki və daha ziyadə arvad almaqdan danışıb, onlardan törənən bəlavü müsibəti bəyan edib deyir:

Sənə bir söz deyim, dillənmə, qardaş,
Əyalın üstünə evlənmə, qardaş!
Neçün kim, görmədim mən, ey vəfadar,
İkiövrətli olsun mərdi-dindar.
Avam olsa xüsusən vamüsibət,

Yəqin qalmaz əlində dinü millət...
Günü alsan günün qarə edərsən,
Özün hər işdən avarə edərsən.
Nə yaxşı söz dedi ol adı Gülzar:
Müsəlmanlar, günüm yoxdur, günüm var[621].

İki arvad almağın acı səmərini bir neçə gözəl və baməzə təmsillər ilə şərh qılıb, kərrat ilə tövsiyə eləyir ki, kişi iki arvad almaqdan sakınıb özünü bədbəxt və gününü qara etməsin.

Xalxali arvad məsələsini böyük məsələlərdən biri hesab edib, onun barəsində uzun mətləblər danışır və bu məsələnin əncamında arvad almaq və əyaldarlıq fəqərələrinə dair söyləyib, arvad almaqda bu şərtləri mülahizə etməyi tövsiyə edir:

Uzandı söz ki, qıldı xəlqi xəstə,
Qələm, durma, yeyin get mətləb üstə.
Deyim bir söz, sənə məndən vəsiyyət,
Əgər övrət alırsan, eylə diqqət.
Gərək lazım ola övrətdə dörd zad,
Qəbul eylə sözümü, ey niküzad!
Biri ismət ki, olmuş rükni-əzəm,
İkimcisi məhəbbət, ey müəzzəm!
Üçümcüsü ola xoşxu xəliqə,
Ola dördümcüsü sahibsəliqə.
Bu dörd vəsf ilə gər hüsn olsa məqdur,
Yəqin eylə olur nurün ə'la nur[622].

Əyaldarlıq babında deyir:

Bəli, vallah deyil[623] rəsm fütüvvət,
Cavanmərdiyyü insafü mürüvvət –
Ki, etsin şəxs əhlini fəramuş,
Özü işrət şərabın eyləsin nuş.
Əyalın yandıra nari-fəraqə,
Çəkə başın, gedə gözdən qıraqə.
Nə övlad anlayın, nə qövmü qardaş,
Nə ata var, nə ana, yarü yoldaş[624].
Öz özbaşın həmişə xoş keçir də,
Vəli əhlinə cami-qəm içir də.
Fərahəm eyləyəndə aşü nani,
Fəramuş eyləyə hər aşinani.
Özü kef eyləyə zövqü səfadə,
Qoya əhlini min dərdü bəladə[625].



Sonra Xalxali tülkünün qürbətdə başına gələn qəzavü qədərdən söyləyib, münasibi-hal haşiyələr çıxıb, hər qisim mətləblərdən danışır. Tülkü xoruzun banlamağını eşidib, onu dami-təzvirə salmağını nəql etdikdə sükut və xamuşluq faydası babında yazır:

Bəli, dildən gəlir başın bəlasi,
Qəmi, dərdi, bəlasi, mübtəlasi.
Danışmaqlıq gümüşdən olsa, billah,
Qızıldandır sükut, ey mərd, agah!
Deyər baş lal olarsan rahətəm mən,
Özüm asudə, həm bizəhmətəm mən.
İkidir çün qulağın, bir dilin var,
Eşit ikki, danış bir, ey vəfadar[626].

Qəzayi-ilahi gəldikdə insanın sə'yü təlaşı səmərə vermədiyi babında yazıbdır:

Bəli, billah, qəzadən qaçmaq olmaz,
Dügün çalsa[627] məşiyyət açmaq olmaz.
Kimi gördün ki, qurtuldu qəzadən,
Özün çəkdi kənarə macəradən,
Gələn vəqti qəza quş damı görməz,
Gözünü kor edər əncamı görməz.
Qəza gəlsə edər əbləh[628] təbibi,
Səfih eylər qəza mərdi-ləbibi[629].

Tülkü xoruz ilə mükalimə etdikdə özünə "hacı"lıq ləqəbi qoyub, hacılar barəsində yazır:

Dedi tülkü: – Xəyalın getməsin[630] kəc –
Ki, mən heç kimsə ilən etmərəm ləc.
Töküb pul, xərc edib mən hacı oldum,
Xudaya şükr mərdi-naci oldum.
Xəlayiqlər mənə hacı deyirlər,
Məgər hacı olanlar zülm edirlər?
Əgər zülm eyləsə hacı birinə,
Ona mə'lun deyin hacı yerinə.
Ziyarət eyləyin beytül-hərami,
Xilaf etsə, qoyun adın hərami.
Səfa təhsil edən sə'yü səfadən,
Gərəkdir göz yuma cövrü cəfadən[631].

Axırkı üç fərdləri çox gözəl deyibdir. Bizim hacılar hər nə pis əməllər var isə, beytüllahil-hərəmı təvaf edəndən sonra büruza gətirirlər və bu

qisim hacılara hacı əvəzinə hərami demək eyni savabdır. İnsanın qəlbi həqqin evi olmaq babında deyibdir:

Ki, ey yaran, bu sözdə yoxdur inkar –
Ki, Allahın iki yerdə evi var.
Birisinin binası səngü gildir,
Biri nuri-ilahi, adı "dil"dir.
Bu iki ev[632] içində, ey müəzzəm,
Olubdur qəlb beytül-lahi-əzəm.
Buna şahid hədisi-mavü minni,
Əzizim, əhli olsan eylə məni.
Buyurmuş yə'ni xəllaqi-müheymin,
Mənə mənzildi qəlbi-əbdi-mö'min.
Demə, canım, ürək bir parça ətdir,
Məhəlli-nuri-şəmsi-mə'rifətdir.
Ürək mir'ati-nuri-ləmyəzəldir,
Ürək mişkati-misbahi-əzəldir.
Ürək gər zində olsa, zindəsən sən,
Öülm yoxdur sənə, payəndəsən sən.
Gözün bir nöqtəsidir mənbəi-nur,
Əgər getsə bu nöqtə, göz qalır kur.
Ürək bir çeşmi batindir bədəndə,
Bu göz lazımdı salik[633] yol gedəndə.
Ürək salsan ələ gər, ey bərədər,
Taparsan bil səvabi-Həcci-əkbər...[634]

Tülkünün hiyləbaz və biəməl olduğunu xoruz ona sübut etdiyindən danışıb, şair mətləbi biəməl alimlərin tərəfinə çöndərir:

Bəli, alim olan amil gərəkdir,
Ümuri-şərdə kamil gərəkdir.
Çü alim getməyə öz bildiyinə,
Yəqinən e'tiqadı yoxdu dinə.
Adın molla qoyub süzdürmə qaşın,
Əməl lazımdı, çox oynatma başın.
Özün "latə'külu"[635] hökmün oxursan,
Yetimin malını yekca udursan[636].
Həmişə qəribə diqqət tutarsan,[637]
Əlinə düşsə qurd kimi udarsan.
Məaşü karbarın işvədəndir,
Hamı xürdü xurakın rişvədəndir.
Əməl divarının altın oyubsan,
İşin bu, adını alim qoyubsan.
Deyil layiq sənə alim desinlər,
Yeri vardır sənə zalim desinlər.



Əməl yoxsa, şəriətdə dolanma,
Adın qazi qoyub çox qazılanma.
Şəriət əhlisən, Allahı atma,
Gözəlcə dinüvi dünyaya satma...
Əgər alim yesə bir şübhəli mal,
Hərəmə meyl edər, bişübhə cühhal.
Əgər alim yeyə mali-hərami,
Bu şivə kafir eylər çox avami.
O alim kim, edər dünyaya iqbal,
Vəbalın boynuma, çöndər ona dal.
Gözüm, təqva yolun tut, tap səadət,
Öləndə səndən istərlər ibadət.
Çalarlar başına bu nəhvü sərfi,
Xəbər almazlar ismü fe'lü hərfi[638].

Bu mövzun şe'rlərdə Xalxali cənabları biəməl alimlərin, müfəttin və dünyapərəst ruhanilərin və tamahkar qazilərin vəsfi-halını bir tərzdə nəzmə çəkibdir ki, onlara heç bir tərəfdən irad etirafı oluna bilməz.

Tülkü xoruzun bihəya və biədəbliyni ona sübut etməyindən danışıb, kəlamı ədəbin üstünə gətirir və ədəbi belə vəsf qılır:

Bəli, sərmayeyi-izzət ədəbdir,
Nişani-izzətü rif'ət ədəbdir.
Gözüm, sən laf urma çox nəsəbdən,
Nəsəbdən əl götür, dəm vur ədəbdən.
Nəcib eylər ədəb hər nanəcibi,
Ədəb sultan edər mərdi-ədibi.
Ədəbdən bəndəlik yetmiş kəmalə,
Ədəb xoşdur xudayi-layəzalə,
Günah etsən xudaya biədəbsən,
Yəqin müstövcibi-qəhrü qəzəbsən.
Ədəblə peyrəviyi-ənbiya qıl,
Xilaf etmə xudavəndə, həya qıl[639].

Tülkü xoruzun zülmkar və mərdümazarlığından bəhs etdikdə şair münsibi-məqal zülmün zəmmindən və zalimin tövbixindən belə yazır:

Bəli, qardaş çü həqqün-nasdır zülm,
Süruri-sinəyə xənnasdır zülm.
Odur bais olub şərrül-məasi,
Olan zülmü onun yoxdur xilasi.
Gözüm, zülm eyləmə heç binəvayə,
Düşərsən möhnətü dərdü bəlayə...
Dağılmış zülmdən çox dudmanlar,
Xərab olmuş nə ali xanimanlar[640].

Çox yeməklik zəmmində, az yeməklik vəsfində yazıbdır:

Bəli, qarnın tox olsa, ey fələkcah,
Yəqin eylər səni, əlbəttə, gümrah.
Edər aclıq səni billah kamil,
Olubdur çox yemək rəsmi-əvamil.
Oğul, çox tıxma, gəl keç bu sifətdən,[641]
Özün ac saxla, ta dol mə'rifətdən.
Olubdur çox yeməkdən bissəviyyə,
Mərəzlər zahiriyyə, batiniyyə.
Balam, ta burnuva[642] kimi tıxıbsan,
Qızıbsan, şiveyi-həqdən çıxıbsan.
Həmişə talibi-rəsmi-kamal ol,
Oruc tut, ac dolan, ta nur ilən[643] dol.
Qarın dolsa, qızıb "dən, dən" deyərsən,
O vaxta dinü imanı yeyərsən[644].

Hər şəxs müqəddəm öz əməlinin cəzasını almaq barəsində yazıbdır:

Bəli, dünya evində hər nə afat
Gələr gər başına olmuş mükafat.
Nə gəlsə başına gör öz gözündən.
Müşəxxəs bil, özündəndir, özündən.
Otursa öz tükü üstündə hər kəs,
Tükü tərpənməz əsla, ey müqəddəs.
Yetimi incidib salma fəğanə.
Yetim eylər uşaqların zəmanə.
Gözüm, əlbəttə, incitmə fəqiri,
Olursan bir qəvinin dəstgiri.
Əgər rədd etməsən rəddi-məzalim,
Onu səndən alır bir güclü hakim,
Əzizim, ehtiyatın qoyma əldən,
Həmişə qorx mükafati-əməldən.
Cəhənnəm əhli abi-kövsər içməz –
Ki, hər kim arpa əksə, buğda biçməz.
İbadət yoxsa, sallanma behiştə,
Ayaqların çolaqdı, çıxma gəştə.
İtaət etməyibən umma zəhmət,
Cəhhənəmdir yerin, get, vermə zəhmət[645].

Mehmannəvazlıq barəsində yazıbdır:

Gözüm yağın yedirsəm gər qonağə,
Yəqinən xoşdu min qeyril-həmaqə.
Qonaq gəlsə, gəlir ruzi dalınca,
Nə ruzi, fəthi-firuzi dalınca.



Xudavənda, bəhəqqi-ali-ismət,
Qonaqdan heç kimi etmə xəcalət.
Nə xoş zaddır əziz etmək qonağı,
Qabağına qoyasan qayğanağı
Açasan xidmətində ağ lavaşı,
Çanağna doldurasan yarma aşı[646].

Cavanlıq əyyamının qədrini bilmək barəsində yazmışdır:

Bəli, billah, qənimətdir cavanlıq,
Cavanlıqda olurmuş kamranlıq.
Əgər məqsudun olsa malü dövlət
Və ya qəsdin itaətdir ibadət.
Cavanlıq mövsümündə eylə təhsil,
Əlindən hər nə gəlsə, eylə təcil...
Cavanlıqda qazan, yığ malü dövlət,
Qocalıq mövsümi qıl istirahət[647].

Bilmək gərəkdir Xalxali bu dünyadan artıq şikayətçidir. Ona binaən məqamı düşdükcə ondan şikayət edib, onu gah bivəfa övrətlərə, gah bidəyanət yoldaşlara, gah nəfsi-insanı bənd etmək üçün qurulan tələyə oxşadır, toruna düşməməkdən və hiyləsinə allanmamaqdan e'tiraz edir.

Xalxali dünyanı gah bir yumurtaya və dünyagir və axirət aləmindən bixəbər şəxsi onun içində pərvəriş tapan cücəyə bənzədir ki, cücə işıqlı və gen dünyadan bixəbər olmağa görə, belə xəyal eləyir ki, yumurtanın içindən yaxşıraq və rahatraq məskən ola bilməz:

Olur cücə yumurta içrə guya,
Deyir: Nə yaxşı mənzildir, xudaya.
Bu ərzimi eşit, ya rəb, dilimdən,
Bu yaxşı mənzili alma əlimdən.
Əcəb mənzildi, bir ziba otaqdır,
Yeri-divari, səqfi cümlə ağdır.
Əgər hər yanə dönsəm, vüs'əti var.
Bu cür mənzildə qalmaq ləzzəti var.
Deyə bilməm ki, ey biçarə cücə,
Fərasətdən olan avarə cücə,
Təəccübdür sənin bu e'tiqadın,
Deyil hasil, bu dar yerdə muradın.
Nədən böylə bu zülmətdə qalıbsan,
Bu qoxmuş mənzilə ünsün salıbsan.
Durub bu pərdədən[648] çıx, eylə pərvaz,
Uçub ol yarü yoldaşınla dəmsaz.
Təlaş eylə, qabıqdan çıx kənarə,

Güzər qıl bağü dəştü laləzarə.
Nə yaxşı çeşmələr, bağlar görərsən,
Gülüstanlar,[649] uca dağlar görərsən,
Gəlib pərvazə çək bir xoş tərانə,
Tamaşa qıl zəminü asimanə.
Bu dünya, ey oğul, üqba yanında
Yumurta kimidir dünya yanında[650].

Xalxalinin "Sə'ləbiyyə"si başdan-ayağa gözəl məsəllər və təcrübə üzü ilə deyilmiş atalar sözləri ilə doludur ki, tamamisini buraya yazmaq olmaz. Qərəz, məişətimizə aid bir məsələ və nüktə qalmayıbdır ki, Mirzə Məhəmməd Bağır onlara əl aparmamış olsun; az-çox əhəmiyyətli bir mətləb qoymayıbdır ki, onun barəsində söz danışmasın. Rə'yimizcə Xalxalinin "Sə'ləbiyyə" nam kitabçası ədəbiyyat xəzinəmizin ən qiymətli cəvahirlərindən və ən məqbul əsərlərindən birisidir. Amma lazımdır ki, giranmayəni bir para ləkələrdən təmizləyib, üstünə qonmuş toz-torpağı silib, sığallayıb təzədən çapa vermək. Çünki Təbriz çapında səhvü xəta çoxdur və bundan əlavə hekayənin bir neçə namünasib yerləri vardır ki, onları isqat etməklə kitaba bir xələl gəlməz və bu minval təshih olunduqdan sonra onun mütaliəsini şagirdlərə dəxi cayiz görmək olar.



## AXUND MOLLA HÜSEYN MARAĞALI "DƏXİL"

Dilsuzun həmməslək və həməsrləri olan Azərbaycan şairlərindən məşhurudur ki, "Dəxil" təxəllüsü ilə iştihar tapıbdır. Dəxilin yazdığı asarın cümləsi cənab İmam Hüseynin müsibətinə məxsus, Kərbəla faciəsinə dair əhvalatdır. Dəxilin kitabı mərsiyəxanların əlində ən mö'təbər kitabdır[651] və bu kitabda Kərbəla əhvalatı bə'zi yerdə nəsr ilə və əksərən nəzm ilə təhrir və tənzim olunubdur. Dəxilin Füzuli kimi nəsr ilə yazmaqda dəxi ziyadə qabiliyyəti və məharəti kəlamından mə'lum olunur. Necə ki, zeyldə yazılan sətirlər ona şəhadət edir.

Vəqta ki, şahi-Kərbəla-seyyidüş-şühəda, yə'ni məzlumlar ağası İmam Hüseyn Kərbəlada yekkəvü tənha qalıb özünə kömək çağırırdı, ol cənabın ahü naləsi göylərə və yerlərə böyük çaxnaş və zəlzələ saldı və pərvərdigari-cəlilin təsbihü təhlilinə məşğul olan görübən müqərribin və məlaikeyi-səmavatü ərzin Kərbəla səmtinə mültəfit olub gördülər bir gülzardır ki, xiyabanın gülləri sineyi-əhli-matəm tək çak-çak, çeşmə kənarının səbzələri çeşmi-həsrət kimi nəmnak[652] və səhəti-zəmini [misli]-daməni-gülçin sərasər laleyi-xun[in] və nəsimi-həvası manəndi-ahi-dilnişin və reyhanları yetim zülfü kimi qubaralud və sərvləri əsirlər ahı tək siyahəndud və qönçələri aşiqi-məhzun tək xunbar və sünbülləri zülfi-ərusani-matəmdidəmisal tarumar və rayiheyi-nəsimi əşki-əsiran ilə həmabü həva və həzarələri ətfali-qəriblərə həmnəva və cuybarı məcra-yi-əşki-laləgun və çeşməsarı beeynih dideyi-pürxun, bülbülləri xamuş və bağbanı mədhuş:

### NƏZM

Vəh nə gülşən, çeşməsarı cuyi-xun,
Novcavanlar nəş'i sərvi-vajəgun.
Qanə batmış türrələrdir sünbülü,
Pənbeyi-daği-cərahətdir gülü.
Bir tərəf güllər tamam olmuş xəzan,
Bir rərəf məbhut durmuş bağban.
Bir tərəf bihəm əsər badi-səmum,
Bir tərəf zağü zəğən eylər hücum.
Qüdsiyan ol gülşənə heyran həmə,
Vadiyi-heyrətdə sərgərdan həmə.
Bir belə gülşəndə ağlar bülbülü,
Qan içində tərbiyət tapmış gülü.
Etdilər diqqətlə çün hər yan nəzər,
Gördülər açmış zəban susən deyər:
Bu çəməndir bustani-Kərbəla,
Məqtəli-pirü cəvani-Kərbəla.

Bu həngamədə məlaikələr cəm'iyyən bina qoydular təfərrüc ilən Kərbəlanın gülşəninə baxmağa. Mütəvəcceh olub, tainki gördülər:

Bir tərəf qan içrə yatmış bir cavan,
Hülqi-pakından olur al qan rəvan.
Aşiyani-mürği-peykan peykəri,
Pay ta sər zəxm cismi-ənvəri.
Bəs ki, dəymiş tirü xəncər abdar,
Hər səri'-muyi olub bir çeşməsar.
Yusifi-Misri kimi gülgun qəba.
Seyd tək xəncəri-gürgani-cəfa.
Kimdi, ya rəb, ol cəvani-mahru?
Kimdi, yaran, ol ğəzali-mişkbu?
Ümmi-Leylanın Əliyyi-Əkbəri,
Kərbəla sərdarının gülpeykəri.
Gördülər bir yanda düşmüş xarüzar,
Bir uca qamətli qolsuz şəhriyar.
Bəs ki, cismindən olub al qan[653] rəvan.
Kuhü səhranı edib dəryayi-qan.
Kimdi, yaran, ol qəribi-naümid,
Təşnələr səqqası Abbasi-şəhid.
Naz ilən xab eyləyib bir sərvinaz,
Türrəsi eylər səbadən ehtiraz.
Cismi-pakı sərbəsər zəxmi-sinan,
Kakilindən telbətel qanı rəvan.
Olmamış bir ləmhə həmağuşi-yar,
Buyi-vəsl ilən olub bihuşi-yar.
Gül kimi cismində qanlı pirəhən,
Parə-parə nəş'inə olmuş kəfən.
Peykərində zəxmi-pürxuni-sinan,[654]
Şərhi-dərdi-hicr üçün açmış zəban.
Bəs ki, qan cari olub hər dağdən,[655]
Laleyi[656]-həsrət bitib torpağdən.
Mən nə hacət kim, edim adın bəyan,
Qan hənası eylər əhvalın əyan –
Kim, odur damadi-şahi-Kərbəla.
Təşnələb qurban olan kuyi-vəfa[657].

Cənab Əli Əkbərin şə'nində yazdığı qəsidənin başında bəladan bəhs edib belə buyurur:

Hədisdir ki, vəla əhlinə bəla gətirir,
Bəla nə qədər gələ qəlbə incila gətirir.
Tilayi-qəlb əgər qəlp ola şərari-bəla,
Nə qədər artıq ola, artıcıq bəla gətirir.



Mərizsən, mərəzindən mərəz edib qafil,
Sənə həmişə təbibi-xuda də'va gətirir.
Bəla də'vadır, əgərçi gəlir təbiətə təlx,
Vəli məzacına şirinliyi riza gətirir.
Əgər bəlanı qəbul eyləsən riza ilə,
Olara ruzi-cəza əhsənül-cəza gətirir.
Məriz hali-dil ilə də'vayə talib olur,
Əgərçi qal-qiyli hərfi-narəva gətirir.
Deyil təbib, ilahi, mərizdən qafil,
Odur ğəza gətirən, sən demə qəza gətirir.
Həmişə hikmət ilə hökm edər təbibi-həkim,
Qəbul et sənə hər nə də'va ğəza gətirir.
Pəriyü cinnü bəşər aqibət bəlayə düşər,
Bu hökmü xəlqə Süleymani-Kərbəla gətirir.
Fəna yelinə büsatın verib bilib ki, fəna
Həmin büsat də'va ilə çün liqa gətirir.
Düşüb bəlayə ki, naəhli-həqq ola agah –
Ki, xəlqi daireyi-həqqə ibtila gətirir.
Əliyyi-Əkbəri kuyi-bəlayə oldu dəlil,
Salıb dalınca onu xəlqə rəhnüma gətirir.
Ki, ümməti edə əsrari-şər'dən agah,
Dübarə ümmətə peyğəmbəri-xuda gətirir...

İmam Hüseyn bacısı müxəddəreyi-ülya cənab Zeynəb xatuna buyurduğu bə'zi xitabatü fərmayişatdan bir neçə əbyat:

Xoş ol zaman ki, çıxam bu hicabi-kəsrətdən,
Tapam bu kəsrət ara bir nişanə vəhdətdən.
Məhaldır ola tərki-əlayiqi-məxluq,
Könül gər olmaya agah sirri-xilqətdən.
Neçün məhəbbət ilə mə'rifət olur zahir –
Ki, xalq zahir olub məbdeyi-məşiyyətdən.
Gərək həmişə ola xaliqə təvəccöhi-xəlq,
Ğəzayi-ruh alalar vəhcəti-vəcahətdən.
O vaxtı əks salır surəti-cəmali-ilah –
Ki, qəlb ayinəsi pak ola küdurətdən.
Könül hərimi-ilahidi qeyrə yol verme,
Həramdır hərəmi-həqqi, salma hörmətdən.
Rəva deyil ola bir yerdə yar ilə əğyar,
Əgər kişi olasan, çox uzaqdı qeyrətdən.
Əgər xülusilə lillah ola əməl fillah,
Nə bak salik üçün tə'nəvü şəmatətdən.
Özünə xaliqi-mə'budi etgilən məhbub,
Əgər varındı şikayət əzabi-firqətdən.
Olanda vəslinə talib yanında hazırdır,
Hüzuri-talibi eylə xilas vəhşətdən.
Hicabsən özünə sən özün özündən çox,

Cəmali-yarı çıxar ta niqabi-qeybətdən.
Məcaz mənzərəsindən nə qədər keçməmisən,
Həmişə varsan uzaq mənzili-həqiqətdən.
Cəmali-şahid o vaxtı olur sənə məşhud –
Ki, kamyab olasan şahidi-şəhadətdən.
Özün şəhidü özün şahidü özün məşhud
Olursan, olsan əgər pak lövsi-kəsrətdən.
Səni bu can eləyib əcnəbi, mənim canım,
Bu canı qan ilə yu, ta çıxa cinayətdən.
Bu surəti sənə surətdə göstəriblər olar –
Ki, tərki-surət edib çıxmayıbla surətdən.
Hüseyn tahir idi, əthəri-mütəhhər idi,
Yenə yuyub üzünü qan ilə təharətdən.
Yuyubdu zahiri batin kimi əlayiqdən,
Çəkibdi ali-hərəm hicleyi-xidarətdən.
Qılıbdı qəlbini fariq şüuni-dünyadə
Əyalü malü mə'nalü cəlalü şövkətdən.
Edibdi izzətini tərk "ya əziz" deyib,
Təvəhhüm eyləməyib inkisarü zillətdən.

Cənab Leylanın oğlu Əli Əkbər olduğu məhəbbəti izhar edib, bilümum məhəbbətdən söyləyir:

Məhəbbət əhlinin əhvalı bərqərar olmaz,
Məhəbbət olduğu yerdə hayavü ar olmaz.
Məhəbbət əhli həras eyləməz məlamətdən –
Ki, hər nə fikrinə gəlsə, çıxar məhəbbətdən.
Səriri-məsnədə əyləşdi eşq sultanı,
Şikari-hökm ilə eylər qulam mövlanı.
Məhəbbət aşiqə mə'şuqi çün əziz eylər,
Ananı oğluna bir kəmtərin kəniz eylər.
Çün[658] ixtiyar ilə olmaz məhəbbətin səbəbi,
Həmişə aşiq lazımdı sədmeyi-qəlbi.
Məhəbbət olsa edər tazə qaidə tə'sis,
Məhəbbət ilə yetər abruyə miqnatis.
Olur məhəbbət məhbub ilə müqabil ola,
Xüsus o vaxta ki, məhbub əsli-qabil ola.
Gərəkdir aləmə məhbub ola Əli Əkbər,
Bu qabiliyyətə şahiddi cəddi peyğəmbər.
Tutub həbibi-xudayə şəbahətni güvah –
Ki, ol cəvanə deyilsin gərək həbibüllah.

Həzrət Abbasın atı Üqabın tə'rifində yazıbdır:

Minəndə sabitü möhkəm bəsani-kuhi-əzim,
Havalanandan uçardı havada çün təyyar.
Rəuf sahibinə çün mərakibi-cənnət,



Şədid düşmənə həmçün cəhənnəmi-qəhhar.
Gəzəndə yerdə mələk tək əlü əyağına
Nisar üçün tökülürdü səvabitü sə'yyar.
Urardı daməni manəndi-taziyaneyi-sim
Çəkəndə şeyhə çəkərdi fənayi-düşmənə xar.
Üqab üstə çü şəhbaz nizəsi çəngal,
Xədəngi-şəhpəri-minqarı xəncəri- xunxar.
Çəkib Üqab çü məhmiz döndü bir dalıya,
Dedi Hüseynə: xudahafiz, ey şəhi-biyar,
Həlal eylə, gedirəm, yalqızam, dua eylə,
Atam Əli yanına gəldi vədeyi-didar...

Cavani-valaşani-şücaətnişanü rəşadətbünyan, yə'ni Əli ibn Hüseynin müqabili-səfi-üdvanda durub zəbani-fəsahət-tərcümanı ilə bətəriqi-rəcəz söylədiyi nüktədən bir qit'ə:

## BƏHRİ-TƏVİL

Bilin, ey ləşkəri-kafərfərü bədtinətü bədheybətü biqeyrətü übbadi-sənəm, nəgi-üməm, hatiki-səttari-hərəm, düşməni-ərbabi-kərəm, mühriqi-Qur'ani-xuda, mözeyi-yarani-xuda fasiqü həm facirü həm ariqü həm şaribü həm zaniyü həm latiyü həm layi'ü əlqabi-kilab, afəti-əhbabi-lə'inani-bədayin, müridani-şəyatin, cəfacuy cəfakar, xətadidə xətakar, mənəm şibhi-peyəmbər, mənəm nayibi-heydər, mənəm misli-Qəzənfər, mənəm sahibi-xəncər.

Bir cavanəm ki, vəcahətdə, səlabətdə, səbahətdə, səxavətdə, şücaətdə, məlahətdə, təravətdə, təlaqətdə, lətafətdə, nəcabətdə nəzafətdə mənə yoxdu bərabər nə nəbiyyü nə vəliyyü nə səxibü və nəqibü nə fələkdə mələkü əncümü ənvari-məhü mehrü sitarə. Mənəm xəlqdə, həm xülqdə həm nitqdə mir'ati-rəsuli-mədəniyyü Qüreyşi məzhəri-övsaf Əli şiri-xuda şirsəda mehtərü həm kəhtərü həm xaceyi-Qənbərü həm saqiyi-kövsərü həm qatili-Əntərü həm qale'i-Xeybər ənə Əli ibnəl-Hüseyn.

Yoxdu hərçənd mənim tək dəxi bir sahibi- şəmşiri-şərərpeykərü həm xəncəri-xuncövhərü tizü təbərü nizeyi-suzəngüzərü sahibi-Səmsami-pələngəfkənü düşmənşikən əmma nə edim çarə bu küffarə necə tiğ çəkim xun töküm bikəsü biyarü mədədkar və bəradər, nə əmim həzrəti-Abbas na Ovnü nə Cəfər cigərim təşnə, atam təşnə, anam təşnə, susuzlar qəmi bir yanda, susuzluq qəmi bir yanda özüm yekkəvü tənha, tutub çevrəmi ə'da, gəlib üstümə yeksər, çəkib qətlimə xəncər məni-bikəsü biyar, nə bəradər nə Ovnü nə ləşkər ənə Əli ibnəl-Hüseyn.

Rəhm qıl, ey məlikül-ərş, bu biyarü diləfkarə ki, yox tabü təvanım, quruyub təşnə dəhanım, yanır ağzımda zəbanım, nə təbibim, nə həbibim,

tutub ətrafı rəqibim baxıram hər yana nə həmnəfəsim var, nə bir dadrəsim var, tutub dövrəmi ləşkər, alıblar ələ xəncər edər qülqülə əşrar urar həlhələ küffar, atam bikəsü biyar, anam xiymədə ağlar, bibim zülfün açıbdır, bacım rəngi qaçıbdır, çıxıb nalə hərəmdən bu cövrü sitəmdən hanı cəfəri-təyyar, hanı həmzeyi-sərdar, nolub Əhmədi-Muxtarə, nolub Heydəri-Kərrarə görə zarü zəliləm, qəribəm, Dəxiləm, gələ dadıma o sərvərü sərdari-dilavər görə bu ləşkəri-əbtər tutub dəşti sərasər ənə Əli ibn əl-Hüseyn.

Və üzün qoşun camaatına tutub buyurdu:

Sizdə əgər Yəzidi-bədəxtər nişanı var,
Gündən işıqdı bizdə[659] peyəmbər nişanı var.
Mən nayibi-Hüseyn, Hüseyn varisi – Əli,
Məndə Hüseynü Heydərü Səfdər nişanı var.
Vardır atam Hüseyndə çün surəti[660]-Əli,
Etsə qəbul məndə də Qənbər nişanı var.
Olmaz hərif kimsə mənə, məndə, bixilaf,
Abbasi-namdarü dilavər nişanı var[661]...

Dəxilin xah nəsr ilə və xah nəzm ilə yazılmış kəlamı onun təbinin mətin və rəvanlığına və lisanının güşadəvü fəsihü bəliğ olmasına şəhadət edir. şe'rində əsla bir rəkakət və siqlət görünməyib, vəzni, rədif və qafiyəsində əsla bir eyib və qüsur müşahidə olunmur.



## MƏHƏMMƏD ƏMİN "DİLSUZ"

Dilsuzun əsli təbrizlidir. Əşarü kəlamından belə mə'lum olur ki, Dilsuz bir fəqirü xoşxülqü [xoş]xasiyyət və haqsevən bir şəxs imiş:

Haqqı gör, haqqı danma, haq söz eşit,
Bəsdir, ey tirəqəlbi-kəcbünyad![662]

Şeyxülislamın mədhində yazdığı kəlamında Dilsuz öz bəxtindən və fəqirliyindən şikayət edib deyir ki:

Qibləgaha, fələyin qəsdi dili-zardədir,
Aləmin qüssəsi bu xatiri-əfkardədir.

Günü-gündən, bəli, ənduhü qəmim artıq olur,
Bilmirəm bəxtdə, ya çərxi-cəfakardədir.

Aləmin dadrəsi sənsən, əya dadrəsim,
Bunu iqrar eləyir hamı kim inkardədir.

Mən fəqirin də yetiş dadına, ey dadə yetən,
Dərdimin çarəsi budur ki, sərkardədir.

Mən ilə buğdanın aləmdə sən et divanın,
Görgilə məndədi təqsir, o xunxardədir[663].

Buğdanın kəmyablığından şikayət edib, Dilsuz öz yoxsulluğuna və ehtiyacda olmağına işarə edir. Buğdanın sorağınca kəndə gedir, buğda qaçıb kəndilərdə (buğda anbarlarında) gizlənir, şəhərə gəlir, tikili yüklərdə – çuvallarda əllafların anbarında ağzı bağlı görür və onu ələ gətirmək bağlıdır dirhəmü dinara, o da şairdə yoxdur. İndi Dilsuz şeyxülislama xitabən deyir:

Neçə müddətdi əlimdən qaçıb ol zalimi-dun,
Tutmuşam indi sorağın, sizin anbardədir.

İltimasım budu səndən tutub ol səngdili,
Verəsən bəndəyə, çün qəsdi-dili-zardədir.

Aparım mən də dəyirmanə onun başın əzim,
Dönməyib ta ki, dəyirman, nə qədər kardədir.

Mənə hər neyləsə səhlidi, vəli cənnətdən
Cəddimin çıxmağının cürmü bu bədkardədir –

Ki, gərək təndir içində bişirim, ta ceddim
Razı olsun ki, qisas oldu bu aşkardədir[664].

Qeybdən Dilsuzun qulağına nida gəlir ki, gecə və gündüz fikirdə məhzun olma:

Şeyxülislamə bu əsrarı əyan eyləgilən,
O verər gər güzəranın neçə xərvardədir[665].

Mə'lum olur ki, indiki üləmavü müctəhidlərin anbarları buğda və sair qəllə ilə dolu olan kimi, ol vaxtın şeyxülislamının dəxi anbarı dolu olarmış.

Yenə özgə bir əsərində şeyxülislama öz fəqirliyini və hali-dilini şərhü bəyan edib, ondan müavinət istəyir və onun başına fəqirlikdən nə bəlalar gəldiyini bildirir:

Bir soruş, ey dadrəs, çərxi-cəfakardən,
Bunca nə istər görüm ta məni-naçardən?[666]
Mən füqəra dadına kim yetişir qeyri-sən,
Nayibi-xeyrül-bəşər Əhmədi-muxtardən.
Xitteyi-Təbrizdə bizlərə səndən səva
Kimsənə yoxdur bu gün yarü mədədkardən.
Tulini ömrün sənin istəmişəm daima,
Xaliqi-fərdü əhəd, qadirü qəffardən.
Canə yetişdim dəxi, dərdimə bir çarə qıl,
Tarı bilir gəlmişəm təngə bu məkkardən.
Gah aparıb bəndəni şövq ilə baqqal edər,
Gündə gərək dad edim bir para həmkardən.
Gah tütünçülüyə göndəri min şövq ilə,
Gah qaçırdır məni məhsilü pakardən.
Gah dükandır edər, sən bilisən bu sözü,
Həqq özü bizardır cümlə dükandardən[667].
Gəh salı zindana bir erməni üstə məni
Gəh sizə növ'kər verib xövfi-tələbkardən.
Söz demərəm ustama, çox yemişəm çörəyin,
Dadımı alsın tarı şatirü pişkardən[668].

Bu şe'rlərdən mə'lum olur ki, biçarə Dilsuz fəqirliyin ucundan cürbəcür bəlalara giriftar olubdur: gah dükançılıq edib, gah tütün satmağa məşğul olubdur, gah baqqallıq edibdir. Hətta bir erməni üstə müttəhim olub, zindana dəxi düşübdür və tələbkarın xövfündən nökərçilik dəxi edibdir:



Mirzə Əbülqasimi* xaliqi-aləm gördüm
Hifz eləsin cümleyi-afətü azardən.
Verdi qəbz kəndinin kəndxudasından alam
Adı Məhəmmədəli Şimri-sitəmkardan.**
Mən belə gördüm onu dinü imandan keçər,
Keçməyəcəkdir yəqin bircə çürük daridən.
Əcz edərəm hər nə mən, faidə verməz ona,
Yox xəbəri qeyrətü namusü həm ardən.
Onda bir üz görmüşəm, görməsin heç erməni,
Lütf ilə imdad əgər olmaya sərkardən.
Çörəyin[669] çörəkçilər satar üç abbasiyə,
Evdə çörək yox, cibim pakdı dinardən.
Qarı da evdə girib kürsüyə hökm eyləri:
Yoxdu pulun nisiyə alma bu bazardən[670].
Bildir ağa lütf edən buğdanı get, al, gətir,
Bişirim evdə, olum eymən uşaqlardən.
Bu iki söz eyləyib dəhrdə aciz məni,
Səndən utanır üzüm, şərm edirəm qaridən.
Zadeyi-xeyrül-bəşər, müstəcibüd-dəvəsən,
Münkir olanmaz bu gün kimsə bu göftardən.
Ya sənə[671] ərzim budur, ey xələfi-Mustafa,
İstəgilən sən bunu qadirü qəhhardən.
Ya ki, bizim qarını alsın əlimdən mənim,
Ya məni etsin xilas əf-əfi-kaftardən.
Varü yoxum anlamır, neyləsin ol binəva,
Acda olmaz iman, hər şey olur vardən.
Gərçi bu Dilsuzda bir quru candır, vəli
Versən alırsan əvəz Heydəri-Kərrardən[672].

Mərhum Hacı Seyid Əzim Şirvani dəxi Dilsuz kimi fəqir olduğundan buğdadan zərifanə şikayət edib, onun sorağına düşür və Mahmud ağanın anbarında onu tapır və ol cənabdan ilhah edib deyir:

Sahiba, Mahmud ağa, lütfü mürüvvət dəmidir,
Eyləyib Seyyidi-miskinə xəyanət buğda.
İndi beş aydı ki, məndən qaçıb ol ruysiyah,
Qoyub avarə məni-zari bu nikbət buğda.
Tutmuşam indi sorağın, sizin anbardadır,
Qorxuram ki, qaça ordan dəxi xəlvət buğda.
Babamız Adəmin ol qəlbiqara düşmənidir,
Eyləyib həzrəti-Həvvayə ədavət buğda.

* Mə'lum deyil ki, Mirzə Əbülqasım şeyxülislamın öz pədərimi, yoxsa özgə ali cənabdır.

** Ağanın malı gedər, muzdurun canı.

Qoyma anbardə qalsın, onu ixrac eylə,
Nə bilir nanü nəmək, rəsmi-məhəbbət buğda.
Ver mənə, un tək onu ta ki, dəyirmanda əzim,
Çox veribdi məni-biçarəyə xiffət buğda.
Sahiba, buğdanın əhvalın əgər şərh eləsəm,
Olar afaqdə bir tul hekayət buğda.
Qərəz oldur ki, bu il həm dəxi bildirki kimi
Edəsən Seyyidi-biyarə inayət buğda.
Bir tağarın ədədi qədri həq etsin ömrün,
O qədər Seyyidə olsun dəxi qismət buğda.

Mə'lum olur ki, Hacı Seyid Dilsuzun buğdanın haqqında yazdığı əş'arı oxuyub, nəzirə səbkində haman məzmunda özü dəxi Mahmud ağadan buğda təmənna edibdir. Amma Hacı Seyid Əzimin əş'arı Dilsuzunkundan rəvan və abdardır. Bu barədə öz məqamında danışılmışdır. İndi Dilsuza müraciət edək.

Dilsuzun divanında şairin öz əhvalından və seyrü sülukundan və tarixi-təvəllüdü vəfatından bir xəbər yoxdur. Amma belə anlaşır ki, şair hicrətin 1250-ci[673] sənələrində hali-həyatda imiş və özü dəxi müsinn halında vəfat edibdir. Buna şahid özünün bir para əş'arıdır.

Məcmuəsinin başında, iyirminci səhifəyə kimi, dərc olunan kəlamın cümləsi fars dilindədir və onlar həzrət Əlinin mədhində yazılan qəsidələrdən və Kərbəla müsibətinə dair növhəvü sinəzənlərdən ibarətdir. İyirminci səhifədən başlanır türk dilində yazılan qəsidə, növhə və sinəzənlər və ədəbiyyatın sair qisimləri: qəzəliyyat, müxəmməs, saqinamə, mədhnamə, rübaiyyat, bahariyyat və qeyrə.

Türk lisanında yazılan qəsidələrin bərgüzidəsi xatəmül-ənbiya mədhində və həzrət Əlinin şə'nində tənzim olunan qəsidələrdir. Ən gözəl şivədə və rəvan dildə yazılan "Hədisi-mərdi-qəssab"dır ki, onda cənab Əmirin bir para mö'cüzələri bəyan olunur. Burada şairin təb' və elminin dərəcəsini göstərməkdən ötrü haman hədisin ibtidasından bir neçə sətir yazmağı lazım gördük:

İbtidayi-süxən bən'ami-xuda,
Xaliqi-kainatü ərzu səma,
Qadiri-zülcəlalü fərdi-vəhid,
Vahidü laşərikü bihəmta.
Saxlayan bisütun nöh əflaki,
Xaliqi-abü narü xakü həva*[674]
Gah əyan eyləyən zimistani,

* Ənasiri-ərbəə



Gah fəsli-bahar edər inşa.
Gah salan dəştə məsnədi-kafur,
Gah tökən bəhrə lö'leyi-lala.
Şəkəri neydən eyləyən cari,
Səngdən abü abdən xara.
Növ'i-insanı hər şərafətdə
Sairi-xəlqdən edən qərra.
Bədi-həmdü sənayi-həyyü qədim,
Eylərəm mən də şövq ilə imla –
Mədhini bir peyəmbərin kim, odur
Baisi-xilqəti-həmə əşya.
Nami-paki-Məhəmmədi-ərəbi,
Dini-islamı eyləyən bərpa.
Nuri-pakından ol şahənşahın
Olunub rövşən aləmi-bala[675] və hakəza.

Bu şe'rlər Dilsuzun təbinin ziyadə rəvan və mövzun olmağına aşikarən şəhadət verir və "Hədisi-mərdi-qəssab" axıra kimi belə açıq və rəvan dil ilə yazılıbdır ki, oxuyanlar artıq dərəcədə müstəfid olurlar. Aşağıda zikr olunan əsərlər Dilsuzun mərtəbeyi-təbini və məsləkini bildirir. Sair qisim kəlamlarından bir neçəsini burada zikr etməyi lazım gördük.

Qəzəl:

Qoydu məni bu dəhrdə avarə gözlərin,
Saldı məni bu qəmlərə ol qarə gözlərin.

Ey gül, işim olub gecə gündüz fəğan mənim,
Bülbülsifət gətirdi məni zarə gözlərin.

Ey Leylivəş, harayıma yet, olmuşam cünun,
Məcnunsifət salıb məni kuhsarə gözlərin.

Eşqin məni bu dəhrdə bimar eyləyib,
Əmr et ki, eyləsin mənə bir çarə gözlərin.

Bir vəhşi baxışilə alıb ixtiyarımı,
Bəxtim tək eyləyib günümü qarə gözlərin.

Şəm'i-ruxun fədası olum, qıl nəzər mənə,
Pərvanə tək salıb məni odlarə gözlərin.

Kami-dilim hər ikki cahanda rəva olur,
Bir ləhzə eyləsə mənə nəzzarə gözlərin.

Yusif kimi bu dəhrdə, ey şux dilrüba,
Çəkdi məni nə şövq ilə bazarə gözlərin.

Hər dəm xədəngi-qəmzə ilə qıldı çak-çak,
Zülm ilə etdi sinəmi səd parə gözlərin.

Bir baxmaq ilə aldı əlimdən qərarımı.
Saldı məni bu bəstəri-bimarə gözlərin.

Səbrim alıb, tükəndi qərarım hərayü hay,
Dilsuzi gətdi dəhrdə zinharə gözlərin[676].

## Əyzən qəzəli-Dilsuz:

Sənə mənzil cahanda, ey Fəlatun, Dilməqan* olmuş,
Mənim darün-nişat içrə işim ahü fəğan olmuş.

Misali-əndəlibəm düşmüşəm mən ayrı gülşəndən,
Gül üzlüm, firqətindən bu əlif qəddim kəman olmuş,

Çıxan gündən yəqin et xitteyi-Təbrizdən guya
Dağılmış zülmdən bu xaneyi-eyşim, viran olmuş.

Gecəm il, gündüzüm qarə, kəsim yox, həmdəmim nalə[677] –
Ki, bir badi-səba guya mənimlə həmzəban olmuş.

Xəyal etmə deyil Təbrizdə sən[678] gördüyün Dilsuz,
Çəkib əzbəs qəmü möhnət, bu yerdə nimcan olmuş[679].

## Yenə özgə qəzəl:

Zülfün düşəndə yadə, pərişan olur könül,
Lə'li-ləbin xəyalı ilə qan olur könül.

Seyli-sirişkim aləmi qərqi-bəla edib,
Əzbəs ki, dudi-ah ilə tufan olur könül...

Gülzari-hüsn içində əgər qönçə ləblərin,[680]
Bir nim xəndə eyləsə xəndan olur könül.

Görsəm səni rəqib ilə cami-mey içmisən,
Rəşk atəşində quş kimi büryan olur könül.

Qəmzən oxun atanda kəman qaşdan keçər,
Zənbur xanəsi kimi şan-şan olur könül...

* Yer adıdır



Hər dəm görəndə bağdə ol sərv qəddini
Bixud sənin dalınca xuraman olur könül.

Ruyin xəyalı ilə yatıb xab eyləsəm,
Xəlvətgəhi-vüsaldə mehman olur könül.

Dilsuzə lütf üzilə əgər eyləsən nəzər,
Müri-həqir olsa Süleyman olur könül[681].

## Müxəmməs, əsnafdan şikayət:

Ey əzizan, bir yaman dərd içrə zarü müztərəm,
Yanmışam bu çərx əlindən, bircə kəf xakistərəm.
Gərçi xakistər olub cismim, vəli bir əxkərəm,
Bivəfa[682] dövran əlindən hər zaman dad eylərəm,
Arifa, tut bir qulağın gör nə sözlər söylərəm.

Görmədim mən bu cahanda bir həqiqi aşina,
Hər nə gördüm, qəlp gördüm, əyri gördüm, bihəya,
Çərxi-kəcrəftarnisbət cümləsi eylər cəfa,[683]
..........................................................................
Baz söylər: mən sənə öz qardaşından behtərəm..

Ey könül, gəl bu cahanın aşinasın tərk qıl,
Olma qafil bu sitəmgər dəhrə vermə çox da dil,
Mərdi-rah ol, bircə bədkirdir fe'lindən çəkil,[684]
... Dünyanın həvasilə çox olma münfəil,
İstər isən mən sənə dəhrin cəfasın göstərəm.

Qazisin gördün ki, qurmuş dam xəlqin malına,
Mollasın gör hiyləvü təzvir külli-halına,
Hacısı tüksüzpərəstdir, baxma yoğun şalına,
Rövzəxanlar tüpürürlər bir-birinin yalına,
Bir-birilə bəhs edirlər mən də sahibmənbərəm.

Ol həkimlər bilmirəm mən neylər[685] axır kur ilən,
Öldürürlər dəhr ara çox naxoşi dəstur ilən,
Aləmi sərraf soyar, ağlar həmişə şur ilən,
Cümlə növkər babi xəlqin malın alır zur ilən,
Dinməsən söylər filan xan tövləsində mehtərəm.

Cümlə baqqalü çörəkçilərdə[686] yoxdur zərrə din,
Əllafı, qəssabı, yaran, xüşkəbarı həmçinin,
Hamı başmaqçıların dabbaqçılar bükmüş belin,
Ol qapandarlar yıxarlar cümləsi[687] xalqın evin,
Hər kəs istər ev yıxa, yıxsın evin sahibkərəm.

Mürdəşurü gurkənlər heç kimi sağ istəməz,
Çuxaçı, börkçü, corabçı ildə bir doğru deməz,
Zərgərü dərziyü şalçı zad halal olsa, yeməz,
Biimandır cümlə aşpəzü çilovpəz, nimpəz,
Söylərəm həcvin bularn həşrə dək əl çəkmərəm.

Ol palanduzlar tamamən xişdir Dəccal ilə,
Ülfət etmin siz dəxi, əlbəttə, həm dəllal[688] ilə,
Heç müsəlman aşinalıq etməsin baqqal ilə,
Əttarı batman ilə alır, satar misqal ilə,
Bir dirəm hil, üç çərək kağız nədəndir bilmərəm.

Hamıdan bədzat misgər, sağrıduz, həkkakdır,
Sinf arasında tütünçü hamıdan napakdır,
Təbrizi bədnam edən həm mütribü dəllakdır,
Cülfavü həllaclar hər barədən bibakdır,
İstərəm bunu yazıb mən hər diyarə göndərəm.

Cümlə ərbabi-təmə'lər kim, olublar çox yalaq,[689]
Binəva dərvişlərin xurakıdır bəngü araq,
Yox ağacçılərdə[690] iman, bağbanlarda qulaq,
Hər necə yorğa at olsa, nalbənd eylər çolaq,
Nəqqaşın var iddiası tarı tək surətgərəm.

Cümlə müst'əcirlərin qəbrini həq var eyləsin,
Nitq yox dildə qiflgər həcvin izhar eyləsin,
Nə deyim ayinəsazü mücrisaz ar eyləsin,
Həq çubuqçiyü səhafi dəhr ara xar eyləsin,
Daima mən böylə vəqti, bu məqamı gözlərəm.

Hər nə çertab ilə şərbafə deyəm, əfsanədir,
Əhli-tüllab hər nə var xeyrat evi zurxanədir,[691]
Hər nə bəngi, piləkeş var yeri qəhvəxanədir,
Heyf, yaran, xırdavatçı şəhrdə bir danədir,
Mən onu bu cümleyi-əsnafdən çox istərəm.

Fə'lə, bənnə, pinəçilər, çərçilər əhli-dehat
Hamı biqüslü təharət, hamı[692] bixümsü zəkat,
Nilfüruş, xırdafüruş, təxtəfüruşlar bisəbat,[693]
Bəhləduzü qəmməsazü səhmsazə yox nicat,
Fəxr edərlər hər biri mən ümməti-peyğəmbərəm.

Dülgərü xarratlər yonulmayıbdır heç biri,
Qalmasın Təbrizdə, ya rəb,[694] bir nəfər gəcpəz diri,
Ol dəyirmançıların yoxdur bu dünyada yeri,
Dən verərsən aparır dartarla yarma tək diri,
...yemişəm onlara aləmdə mən bir dən verəm.



Zurxanə əhlinin vəsfin sizə eylim bəyan,
Qırxı bir dünbəklə oynar, yə'ni işlər pəhlivan,
Şişəgərü camədardan əql ummun siz, aman,
Suçilərdən [siz] soruşmun bir nədir dinü iman,
Məhkəmə şagirdlərinin hamısına çakərəm.

Qaldı sərracü dəvatgər, qabqacaqçı, kuzəgər,
Bunların dördü, əzizan, bir-birindən hiyləgər,
Həm təkəltıduz, əlaqəbəndü saətsazlər,
Cümlə biimandır, bunlardan eylin siz həzər,
Xeyli qalayçı əlindən bağlayıb könlüm vərəm.

Müxtəsər əlvatını gördüm təmamən bivüqar,
Bir-birinə rəng ururlar hiyləsazü əxzkar,[695]
Gər danışrsan, deyirlər əqli kəmdir, etməz ar,
Dinməsən, söylər təkəbbürdür, edin ondan fərar.
Gər müsəlman olsa bunlar bilgilən mən kafərəm.

Sadərulər bə'zisi kundadəvü biardır,
Kərbəlayi, məşhədilər lotidən bədkardır,
Cümlə hammam əhli ol şeytan ilə həmkardır,
Tacirü bəzzaz xəlqin malına sərkardır,
Şairəm, mən, bil, bularn hamısından bədtərəm.

Mən bu dəhrin möhnətindən canə yetdim, ya Əli,
Bəhri-qəmdə Nuh tək tufanə yetdim, ya Əli,
Tapmadım bir dadrəs, hər yanə getdim, ya Əli,
Dərd əlindən atəşi-suzanə yetdim, ya Əli,
Rəhm qıl, Dilsuzəm, ey mövla, qulami-Qənbərəm[696].

Şair əsnafların hər birisinin övsafi-zəmimələrindən şəmmə'i zikr edib özgə bir kəlamında tüccarların üstə düşür və bunların ə'mali-şəninə və övsafi-məzmumələrini birbəbir həcv dili ilə bəyan eləyib deyir:

Adını hacı qoyub hiylələr eylər bu qədər,
Xəlq eşitsin ki, dəyib hacıya on şahi zərər,
Əjdaha tək hamının malını kamına çəkər,
Ya Seyid Həmzədə, ya müctəhid evində keçər
Həftəvü ruzü məhü salı bu tüccarlərin[697].

Xalqın malını min cür'ə hiyləvü təzvir ilə tovlayıb alıb, hacı övqatını müctəhidin evində keçirir. O müctəhidin ki, tüccarın haram yol ilə qazandığı pulu və dövləti hiyleyi-şər' ilə halala çıxardıb, ona şəriklik edir və hacı ilə nişəst-bərxast etməyə onun rütbəvü şə'nini avamın nəzərində uca qılır.

Çün Dilsuz binəvanın başına çox bəlalar gəlibdir, ona binaən, könlünə xitabən deyir ki, ey könül bir adamı imtahan etməmiş özünə dost tutma, öz sirrini hər bir kəsə demə, dünyaya bel bağlama, adamların axtardığı puldur və cifeyi-dünya üçün sənə mehribanlıq göstərirlər. Guşeyivəhdətdə əyləş, özünü qilü-qala salma, salimlik vəhdətdədir. Dilsuzun zeyldə yazılan kəlamı onun dünyaya nə göz ilə baxmağını anladır. Mə'lum olur ki, borc ucundan binəvanı dustağa salıblar və şərikləri ona əvvəlcə ümid verib, dar və ehtiyac günündə onu qoyub qaçıblar:

Ey könül, əvvəl rəfiqi imtahan etmək gərək,
İmtəhandan çıxsa gər, qurban can etmək gərək,
Bu sözü şamü səhər virdi-zəban etmək gərək,
Əldə bu nəqli həmişə imtahan etmək gərək,
Hamıya bu qissəni bir-bir bəyan etmək gərək,
Dildə daim bu müəammanı rəvan etmək gərək,
Şəhr içində şöhreyi-pirü cəvan etmək gərək.

Ey dili-gümrah, oyan, yatmagilən leylü nəhar,
Uyma çox bu qəflətə al pəndimi, ol huşyar,
Dəhr ara hər aşinayə bağlama, bel, zinhar
Mən də sən tək bağladım bel, görmədim bir e'tibar,
Axırı bir güni[698] üstə oldu məndən dilfikar,
Yetmiş iki millət içrə etmə sirrin aşikar,
Olsa gər sirri-nihan, candan nihan etmək gərək.

Görmədim heç aşinadə zərrə sifət, həq bilir,
Məhz dildir əxzi-əklü şürbü şöhrət, həq bilir,
Çoxların yolunda çəkdim cövrü möhnət, həq bilir,
Qalmayıb bir para kəsdə buyi-qeyrət, həq bilir,
Hər kəs ilə eyləsən bir ləhzə ülfət, həq bilir,
Görmədim axır vəfasın qeyri-töhmət, həq bilir,
Lalə nisbət dəhr ara bu bağı qan etmək gərək.

Ey könül, bu aləm içrə sevmə hərgiz qilü qal,
Yoxdu təklikdən cahanda yaxşı ne'mət bimisal,
Adəm oldur eyləyə guşini kar, nitqini lal,[740]
Sirrin heç kəs bilməsə yetməz sənə hərgiz zəval,
Üzünə hər kimsə gülsə, olma ondan xoşxəyal,
Bəs nə vaxt olursan, keçdi axır sinnü sal,
Gününü* bu gün özündən bədgüman etmək gərək[741].

* Könlünü və ya gününü



Çün şəriklər qoydular yalqız dükanda bəndəni,
Aşinalar söylədilər: qoymarıq pusluz səni,
Biri təvid eyləyib birisi etdi kisəni,
Xəlqə xatircəm olub, həm belə urduq dəməni,[742]
Başladıq borclulara "vəzzarəyat"ü "əmməni",
Axırı zindana saldı bəndəni bir erməni,
Böylə dərdi xalq ara daim əyan etmək gərək.

Dilsuza, vardır Əli tək şahi-mərdanın sənin,
Qəm yemə, daim yetər fəryadə sultanın sənin.
Hər iki dünyada versin dərdə dərmanın sənin,
İstəsən gər rahət olsun dəhr ara canın sənin,
Əldə qalsın abiruvü dinü imanın sənin,
Eyləsin şiri-xuda fəzl ilə divanın sənin,
Müxtəsər, səhranı Məcnun tək məkan etmək gərək[743].

* * *

Bilmirəm, ya rəb, yenə qəlbimdə bu qövğa nədir,
Axiri-ömrümdə bu başımdakı sövda nədir,

Gəh çəkər deyrə, gəhi bütxanə, gah məscidə,[744]
Bilmirəm məscid nədir, deyrü kəlisa həm nədir,

Hər nə gəzdim məscidü meyxanəvü bütxanədə,
Bilmədim kimdir müsəlman, kafərü tərsa nədir.

Aqiləm ya cahiləm ya mö'minəm ya kafirəm,
Bilmədim cahil nədir dünyada ya dana nədir.

Zahidü müftiyü şeyx şəhnəvü ya zöhdü fisq,
Nurü zülmət, xeyrü şər ya ziştü ya ziba nədir.

Eşq Məcnun eyləyib saldı mən səhralərə,
Bilmədim Məcnun nədir, Leyla nədir, səhra nədir.

Güldə nə hüsnü təravət, ya nədir bülbüldə şur,
Gül nədir, gülşən nədir ya bülbüli-şeyda nədir.

Neçə müddətdir təkəllüm eylərəm mən nikü bəd,
Bilmədim bu dil nədir ya dildəki guya nədir,

Ey məni xəlq eyləyən xaliq, özün imdad qıl,
Qalmışam valeh ki, bu dünya nədir, üqba nədir.

Gündə yüz yol kafir ollam, yüz yol iman istərəm,
Bilmədim gəh küfrü iman, gəh "bəli", gəh "la" nədir.

Gah bu Fir'oni-nəfs eylər məni səndən cüda,
Bilmirəm Fir'on kimdir, həzrəti-Musa nədir.

Turi-Sinadə münacat eylərəm xəllaq ilə,
Gəh əsanı əjdaha etmək yədi-beyza nədir.

Gah nəfsə[745] əql olur qalib deyir: key nəfsi-şum,
Munca gəl sərkeşlik etmə, xahişi-bica nədir.

Bircə insaf eylə sən də zahidi-bidin tək,
Bir belə hər gündə nahəq verdiyin fitva nədir.

Bir gecə bu fikr ilə yatdım dedim: Ya zülcəlal,
Sən mənə bildir görüm surət nədir, mə'na nədir.

Hatifi-qeyb ol zaman verdi cavab: – Ey bixəbər,
Bir belə bihudə fikri-zahirü ixfa nədir.

Bilməsən kimdir bu övza'ə səbəb ruzi-əzəl,
Baisi-icadi-aləm Adəmü Həvva nədir.

Sirri-həq damadi-peyğəmbər əmirül-mö'minin,
Görmüsən sən ol Əliyyi-aliyü ə'la nədir[746].

Bu axırıncı fərddən sonra başlanır mədhi-həzrət Əmir Əliyyül-Mürtəza və qurtarır matəmi-seyyidüş-şühəda ilə və ruzi-aşurada zülm ilə qətlə yetənləri əş'ari-cigərsuz ilə zikr edib, Yəzidi-pəlidə lə'nət oxuyub, bu sözlər ilə xətmi-kəlam edir:

Dilsuza, qıl müxtəsər bu qisseyi-dilsuzi sən,
Əcz ilə ərz et xudayə bu qəmi-üzma nədir.

Lə'nət eylə sən Yəzidə həşr olunca dəmbədəm,
Zülmi-bihədd etdi zalim, bilmədi fərda nədir[747].

## QƏSİDƏ

Ey dil, nə yatmısan, gözün aç bir cahana bax!
Səthi-zəmini seyr eləyib asimanə bax!

Sındır tilsimi-cismi, bu süfladə durma çox,
Çox da müqəyyəd olmagilən, cismü canə bax!

Süfladə mənzil etmə sən, ülviməqamsən,
Ey şahbazi-qüds, elə övc, aşiyanə bax!



Sal yadə bir gedənləri ya bir gələnləri,
Hər kəs gəlir, gərək gedə, bir karvanə bax!

Əqli unutma, nəfsə əsir olma, həqqi gör,
Nahəqqə ver təməyyüz bu sudü ziyanə bax!

Baxma bu xəlqə, bax özünə, həqqi gör müdam,
Nə an gör, nə in, nə ün nə anə bax!

Ver bircə guş-huşini, əsrari-həqq eşit,
Aç bir gözün, gözünlə[748] bu razi-nihanə bax!

Bel bağlama bu dəhrə, fənadır, bəqası yox,
Mövtü həyat, nəqli-baharü xəzanə bax!

Şahü gədayə verməz aman gəlsə gər əcəl,
İbrət gözilə bircə müluki-Kəyanə bax!

Aya nə oldu söylə səlatini-masələf,
Səlcuqiyanü Səncərü Pişdadiyanə bax!

Gör bir nə oldu əfsəri-Daravü cami-Cəm',
Baş ziri-xakə çəkdi Ənuşirəvanə bax![749]

Şair bu qərar üzrə keçmiş padşahların və ənbiyayi-kiramın bu fani dünyaya gəlib-getməklərini zikr edib, sonra keçir həzrətin mədhinə və yenə qəsidənin axırını Kərbəlada vüqua gələn qisseyi-pürqüssə ilə qurtarıb deyir:

Yetməz tamamə bu qəmi-üzma bəyan ilə,
Bu qəm cahanda şərh[750] ilə gəlməz bəyanə, bax!

Dilsuz edər həmişə sənə növhə, ya Hüseyn,
Bir lütf ilə cəza günü bu növhəxanə bax![751]

# QƏBUL EDİLMİŞ ŞƏRTİ İŞARƏLƏR

AƏT – Azərbaycan ədəbiyyatı tarixi, üç cilddə, Bakı, 1958; 1960.

BS – Библиографический словарь отечественных тюркологов (дооктябрьский период), M., 1974.

DD – Məhəmməd Əmin Dilsuz. Divan, Təbriz, H. 1281.

FQ – Feyzulla Qasımzadə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi, Bakı,1966.

GƏ – İsmayıl bəy Nakam. Gənci-ədəb (əlyazması), H. 1323, RƏF, B-672/9087.

H – Hicri.

HN – Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı tarixi materialları" əsərinin hazırki nəşri - Azərbaycan ədəbiyyatı, iki cilddə, Bakı, 2005.

İN - İlk nəşrdə - F.Köçərli. Azərbaycan ədəbiyyatı tarixi materialları, iki cilddə, Bakı, 1925; 1926.

İNİ – İlk nəşrdə "İdarə" də verilmiş qeyd.

KM – Mirzə Məhəmmədtağı Qumri. Kənzül-məsaib, Təbriz, H.1300.

KS – Mirzə Məhəmməd Xalxali. Kitabi-sələbiyyə, Təbriz, H.1310.

QM – Hüseyn əfəndi Qaibov. Məcmuə (əlyazması), RƏF, S-1091.

QMD – Hüseyn Əfəndi Qaibov. Azərbaycanda məşhur olan şüəranın əş'arına məcmuə (əlyazması), dörd cilddə, RƏF, I cild, M-131; II cild, M-132; III cild, M-133; IV cild, M-134.

M – Miladi.

MƏAD – Mirzə Həsən Əlqədari. Asari-Dağıstan, Bakı, 1903.

MHDD – Axund Molla Hüseyn Dəxil. Divan, Təbriz, H. 1325.

ND – Seyid Nigari. Divan, Tiflis, H. 1301.

PD – Pürqəm. Divan, Təbriz, H.1324.

RA – Məhəmməd ağa Müctəhidzadə. Riyazül-aşiqin, İstanbul, 1901.

RD – Əbülhəsən Raci. Divan, Təbriz, H. 1320.

RƏF – Azərbaycan Milli Elmlər Akademiyası Füzuli adına Əlyazmalar İnstitutu.

ŞD – Mustafa ağa Şuxi. Divan (əlyazması), RƏF, B-2584.

TN – Mirmöhsün Nəvvab. Təzkireyi-Nəvvab, Bakı, 1913.

YT – Yeni təqvimlə.

ZD – Molla Məhəmməd Zöv'i. Divan (əlyazması), RƏF, B-742 (2915).



# İZAHLAR VƏ QEYDLƏR

[1] İN-in mündəricatından buraya köçürülmüşdür.

[2] Sahib Şirvaninin şəxsiyyəti haqqında məlumat yoxdur.

[3] M. 1835. F.Köçərlidən sonrakı tədqiqatda Bahar Şirvaninin 1834-cü ildə Şamaxıda doğulduğu göstərilir. S.Mümtaz. Mirzə Bahar (əlyazması), RƏF., arx. 38, Q-31 (558), vərəq I; *FQ, səh.390.*

[4] İN: qəzəli.

[5] *Əndəlib Kaşani* – XIX əsr İran şairi.

[6] Tərcüməsi:

Cünəşlər hamı əyləşdi, günəşə bənzər mey hanı?
Ay qabaqlı gözəl necə oldu, şərab piyaləsi hanı?
Neyin nəğmələri hanı, rübabın təranəsi hanı?
Mərcan cəm' hanı, saf lə'l kimi mey hanı?
Sən mənim canım, ay qulamciyəz, tez ol!

[7] Tərcüməsi:

Badə vəhydir, Cəbrail isə saqi,
Hər kim bunu içsə, peyğəmbərdir.

[8] *Nəsrəddin şah (1831-1896)* – 1848-1896-cı illərdə İran şahı.

[9] Tərcüməsi:

Gecəm nalə, gündüzüm qaranlıqda keçdi,
Fəğan bu paslı göylərin dövranından.
Ömrümün günəşi damımdan keçdi,
Artıq yatmış bəxtimin oyanmasına ümidim yoxdur.
Dövranın möhnətindən qəddim əyildi,
Bəli, ağır yükdən qamət əyilər,
Mən qəmli asimanam, xoşbəxtəm ki, gecələr sübhə qədər
Göz yaşımın ulduzları seyr edirlər.
Dünya bostanında məcnun söyüd kimiyəm,
Üzüaşağı – əksinə tərəqqi edirəm...

[10] Tərcüməsi:

Ey dostum, əhdlər pozulduğundan
Həsrətli günlərim çoxaldı.

[11] Tərcüməsi:

Sənin ayrılığının əlindən elə zar-zar ağlayıram,
Sanki gözdən Zindərud * (daşqın çay) axır.

* Zindərud – İranın İsfahan şəhərindən axan çay

[12] İNİ: tərcüməsi:

Mən nerdəyəm, mən nerdə idim, nerdə olacağam,
Bu qədər çətin bir müəmma olurmu?
Ey dost, mən səni bula biləcəkmiyəm
Şərqdə, qərbdə, şimalda ya cənubda?

[13] M.1878.

[14] Tərcüməsi:

Mən demirəm ki, ürəyimi əlimdən almaqla sən bizi şad elə,
Bir əldən düşmüşü görəndə bizi yada sal.
Can verəndə sənin cəfandan şikayət etməyəcəyəm,
Ey namehriban, bacardığın qədər bizə zülm elə.
Demədim ki, qeyri rəhm ilə özünə ümidvar elə,
Sənə dedim ki, bir gecə bizim fəryadımıza qulaq as.
Məni incitməklə şad olursansa, qol-qanadımı qana boya,
Əgər sənin cəfandan nalə eləsəm, qəfəsdən bizi azad elə.
Ey həmaşiyan, nə vaxta qədər başım qanad altında həsrətlə qalsın,
Allah xatirinə, bizi ovçu evinə sarı yolla.
Sənin əğyar ilə ülfət vüsalında olmağından nə vaxta qədər
mənim ürəyim qan olacaq,
Ey hicran gecəsi, hardasan, gəl bizim dadımıza çat.
Bahar kimi nə vaxtadək səndən şad olmağımı bildirim.
Hərdən bir yolüstü bizi öz baxışınla şad elə.

[15] Tərcüməsi:

Vəsl günüdür, ya rəb, məni naz içində öldür,
Məni yenə görüş həsrətinə salma.
Bütün bu cövr-cəfanla sənə sarı gəlirəm, nə edim [ki],
Ürək məni yenə özbaşına gəzməyə qoysun.
Aman daş ürəkli ovçunun bu adətindən ki,
Qanadımı sındırır, sonra da mənə deyir uç.
Eh məh, yeri var ki, səni Allah adlandırım,
Çünki hər nəfəsdə məni öldürüb, sonra da dirildirsən.
Məni öldürmək üçün mənə nə qədər naz edirsən,
Məgər, ey gözəl qamətli büt, məni sən yaratmısan?
Baharın belə ağlar gözü və saralmış bənzi
Mənim sirrimi dünyada faş eləməyəcək.

[16] Tərcüməsi:

Ənbər saçan saçını töküb pərişan elədin,
Yenə mən bədnamı rüsvayi-cahan elədin.
Mənim ürəyimin çırpıntısından sənin zülfün pərişan oldu,
Bəli, quş çapalayanda qəfəsdə pərişanlıq olar.
Mənə vədə verdin ki, sübh çağı vəslə çatacağıq,



Məgər bilirdin ki, sənin ayrılığın mənim gecə-gündüzümü
bərabər edib?!
Ona dedim: – Sənin gümüş bədənini bağrıma basmaq istəyirəm,
Dedi: – Get, bu xam xəyalı başından çıxar.
Əgər surətdə Çin bütləri sənə oxşasalar,
Bundan sonra sənəmlərə səcdə eləmək vacib olar,
Saçının qaralığı əgər dinə belə qəsd eləsə,
İslamın qibləsini kafirlərin səcdəgahına çevirər.
Müstəhəqq olanlara gözəl ne'mətlər bəxş edirsənsə,
Əvvəlcə ürəyi xəstə Baharı söy.

[17] F.Köçərli bu qəzəlin altı beytinin bədii tərcüməsini aşağıda verdiyi üçün burada onun yalnız son beytinin tərcüməsi verilir:
Bahar sənin üzündəki tər damcısını yada salıb ilhama gəldi.
Damcı sədəfə düşəndə təmiz dürr əmələ gəlir.
[18] Tərcüməsi: Türk ətri gəlir.
[19] İNİ: "Yandırdı dürdən məni ruxsarın atəşi" olmalıdır.
[20] İNİ:

Zahid sözilə mən necə meyxanədən keçim,
Zahid özü keçərmi behişt ilə hurdən? –

– [olmalıdır].
[21] *La ilah* [*ə illəllah*]... – Allahdan başqa Allah yoxdur... (Q u r' a n ayəsindən).
[22] M: 1824-1829.
[23] *QM, səh.105.* Axırıncı misra İN-də: Yengicə kişi rahi-müsəlmana düşübdür.
[24] *QM, səh.138.*
[25] *QM, səh.140.*
[26] İN: nəfsi-əmmariyyəni.
[27] *QM, səh.108.*
[28] *QM, səh.78-79.*
[29] QM: qılma.
[30] *Ələstü birəbbiküm* – məgər mən sizin Allahınız deyiləm? Hədisdir.
[31] İN: Ey dil, çəkinmə, bimey mə'şuq ilə qoyma kim.
[32] İN: Hər kim bəzmi-eşqdə ki, mey nuş qılmadı.
[33] *QM, səh.140*
[34] QMD: rəzil.
[35] *QM, səh.140-141.*
[36] *QM, səh.142.*
[37] QM: müddəasıdır.
[38] İN: yar (QM).
[39] İN: duzəx kimidir (QM).
[40] QM: tutarsan.
[41] *QM, səh.122.* Son misradakı "də'va" İN-də: rəva.
[42] İNİ: Seyidin hansı qəzəlinə işarə olunduğu burada qeyd olunmamışdır. Ehtimal ki,

Nişimənin ki, sənin buriyadır, ey vaiz,
Qəsəm ol xaliqə kim, bu riyadır, ey vaiz!

- mətlə'li qəzəlinə işarədir.

[43] *QM, səh.148.*

[44] *QM, səh.110.*

[45] İN: şam (QM).

[46] *QM, səh.140.*

[47] M: 1830.

[48] Bixudun həmin əlyazması əldə edilməmişdir

[49] M: 1892.

[50] İN: Mehdiqulu xan Fəna.

[51] *"Beytüs-Səfa"* – Təxminən 1855-1860-cı illərdə Şamaxıda gənc şair Məhəmməd Səfanın evində təşkil olunmuş ədəbi məclis. Rəhbəri və aparıcısı Seyid Əzim Şirvani, fəal üzvləri isə Mollağa Bixud, Ağababa Zühuri, Mirzə Mahmud Zöv'i, Ağaəli bəy Naseh, Mirzə Nəsrullah Didə və başqaları olmuşlar. Nəsrəddin Qarayev. XIX əsr Azərbaycan ədəbi məclisləri (namizədlik dissertasiyası), Bakı 1971, səh.79-80.

[52] İN: müayinə.

[53] İN: Əgər şur ilə həcvim yüz qoya Dərbəndə, ey Qumri.

[54] İNİ: Dərbənd səddinə işarədir.

[55] *Ağ div* – "Şahnamə" qəhrəmanı Rüstəmin öldürdüyü ağ div.

[56] *Kamal əfəndi Ünsizadə* – Azərbaycan mətbuat xadimlərindən olan Səid və Cəlal Ünsizadələrin kiçik qardaşı. XIX əsrin axırı – XX əsrin əvvəlində şəxsi mətbəəsi olmuş və orada "Məzhər" adlı Azərbaycan dilində qəzet nəşr etmişdir. Bu qəzet çox qeyri-müntəzəm çıxmışdır.

[57] "Məcmuə" adı ilə çap olunmuş həmin kitabı 1895-ci ildə Tiflisdə H.Z.Tağıyevin pulu ilə şairin oğlu Mircəfər Seyidzadə çap etdirmişdir. Bu məcmuə yenə həmin ildə Təbrizdə eyni ilə çap olunmuş Seyid Əzimin Übeyd Zakanidən tərcümə etdiyi "Pişik və siçan" hekayəsi də əlavə edilmişdir.

[58] YT: iyulun 9-na.

[59] İNİ: Seyidin əsl nüsxəsinə baxılsa, bu beytin ikinci misrası "Tutubdur hansı kövnpərvər çün ə'za Kə'bə yazılıbdır...

[60] Misra HN, səh.118-də:

Arayıb gərçi düşmüş xanə-xanə.

[61] *A.O.Çernyayevski (1840-1897)* – məşhur Azərbaycan dili müəllimi və metodisti. Şamaxıda anadan olmuş və ilk təhsilini orada almışdır. Bir müddət Zaqafqaziya müəllimlər seminariyasının inspektoru olmuşdur. 1879-cu ildə Qori müəllimlər seminariyasının Azərbaycan şö'bəsi müdiri olmuşdur. BS, səh.288.

[62] *"Vətən dili"* – A.O.Çernyayevskinin ibtidai siniflər üçün yazdığı bu kitabın birinci cildi altı dəfə (1881, 1888, 1897, 1899, 1901 və 1910-cu illərdə) nəşr olunmuşdur. 1910-cu il nəşrini F.Köçərli müəyyən ixtisar və əlavələrlə çapa hazırlamışdır. Kitabın ikinci cildi 1888-ci ildə çapdan çıxmışdır. Onun müəlliflərindən biri də S.A.Vəlibəyov olmuşdur.

[63] Həmin məktəbdə S.Ə.Şirvani 1877-ci il sentyabrın birindən dərs deməyə başlamışdır. *AƏT, II cild, səh.293.*



[64] Tərcüməsi:

Eşitmişəm ki, qocalıqda kilsə keşişi olmusan,
Xoş halınıza, aqibətiniz xeyir olsa.

[65] İNİ: Seyidin vəfatı Ramazanın 21-dədir.

[66] YT: iyulun 1-nə.

[67] *Corc Qordon Bayron (1788-1824)* – böyük ingilis şairi, inqilabi romantizmin görkəmli nümayəndəsi.

[68] *Adam Mitskeviç (1798-1855)* – məşhur Polşa şairi, milli-azadlıq hərəkatının nəğməkarı.

[69] S.Ə.Şirvaninin "Xilafəti-həzrəti-Əbubəkr", "Qəzavati-həzrət Əli" və "Qissəsülənbiya" əsərləri əldə edilməmişdir.

[70] Seyid Əzimin "qəzəliyyat"ı 1903-cü ildə Bakıda mətbəə üsulu ilə çap edilmişdir.

[71] Seyid Əzimin 1902-ci ildə Təbrizdə çıxmış "Divan"ından, ehtimal ki, F.Köçərlinin xəbəri olmamışdır. Həmin "Divan" iki hissədən ibarətdir. Birinci hissədə şairin qəsidələri (1-252 səh.), ikinci hissədə qəzəlləri (1-204 səh.) verilmişdir.

[72] Ehtimal ki, Seyid Əzimin yuxarıda F.Köçərli tərəfindən adları çəkilən bütün əsərlərinin əlyazması"Azərbaycan ədəbiyyatı"nı yazarkən müəllifdə olmuş və alim onlardan istifadə etmişdir.

[73] "Müctəhidin məscidə təşrifi" və bir az aşağıda "Müctəhidin və'zi" başlıqlarını mətnə F.Köçərli artırmışdır.

[74] *Molla Sədra Şirazi* – İran fiqh alimi.

[75] *Beyzavi [Qazi Beyzavi]* – "Təfsiri Beyzavi" əsərinin müəllifi. XIII əsrdə yaşamış və Qur'ana şərh yazmışdır.

[76] *Razi [Fəxrəddin Razi]* – məşhur İran alimi; "Məbahisül-məşriqiyyə" əsərinin müəllifi.

[77] *"Tibyan"* – türkcə yazılmış bir təfsirin adı.

[78] *"Ruhül-bəyan"* – Şeyx İsmail Həqqinin Qur'ana yazdığı dörd cildlik təfsir.

[79] *Molla Fətullah Kaşani* – fiqh alimi olub ona aid bir neçə kitablar yazmışdır.

[80] *Ətəmürunən-nas* – Qur'anın 2-ci surəsinin 41-ci ayəsindən.

[81] Beytdə Məhəmməd peyğəmbərin "İza fəsadəl-alim, fəsadəl-aləm" (alim fəsad edəndə, aləm fəsada gedər) kəlamına işarə edilir.

[81a] *Süleyman* – Süleyman peyğəmbərə işarədir.

[82] İN: vəladiyəm.

[83] ... *[innə əkrəməkum] indəl-lahi ətqaküm...* – ... sizlərin ən hörmətlisi Allahın yanında o kəsdir ki, o, pak və pəhrizkardır. Qur'anda "Hücürat" surəsindən ayə.

[84] *[Qalə ya Nuhu, innəhu] leysə min əhlikə...* – [Dedi (Allah): eh Nuh, o sənin] əhlindən deyil... Qur'anda "Hud" surəsinin bir ayəsindən. Dini rəvayətə görə, Nuhun tufanında Nuh öz ailə üzvlərini və digər müsəlmanları gəmiyə oturdur. Amma onun kafir olan bir oğlu gəmiyə minmir və tufan zamanı suda boğulub ölür. Nuh Allaha müraciət edir ki, axı o, mənim əhlim idi!.. Cavab gəlir: ya Nuh, o sənin əhlindən deyildi, çünki kafir idi.

[85] *Ülaikə kələnami bəlhüm əzəllü səbilə* – Qur'anda bu məzmunda iki ayə vardır. F.Köçərli öz qeydində bunları bir-birinə qarışdırmışdır.

a) ... *ülaikə kələnami, bəlhüm əzəllü ulakə hümül-qafilün* – onlar (islamı qəbul etməyənlər) heyvanat kimidirlər; bəlkə onlardan da çox azğın düşmüş kəslərdir; onlar qafillərdir. Bu, Qur'anda "Əraf" surəsinin 178-ci ayəsindəndir.

b) ... *inhum illa kələnami bəlhüm əzəllü səbila...* – onlar heyvanat kimi vücuddan başqa bir şey deyillər; bəlkə onlardan da çox azğın düşmüş, yolunu itirmiş keslərdir. Bu isə Qur'anda "Fürqan" surəsinin 46-cı ayəsindəndir.

[86] ... *innəma yəxşəllahə min ibadəihil-ülə'maü...* – həqiqətən, Allahdan onun bəndələri, o cümlədən alimlər qorxurlar. Qur'anda "Fatir" surəsindən ayə. "İnnəma" İN-də: əynəma.

[87] Parça Sə'di Şirazinin "Bustan" əsərindəndir.

Tərcüməsi:

Bir padşah oğlunu məktəbə verdi,
Onun qucağına gümüş bir lövhə qoydu,
Lövhənin üzərində qızılla yazdı;
Ustadın əzabı ata məhəbbətindən yaxşıdır.

[88] İN: xəlqə.

[89] İN: kuyü.

[90] M: 1856.

[91] *İncil* – xaçpərəstlərin dini kitabı; *Zəbur* – İncildən götürülüb kilsələrdə dini nəğmə kimi oxunan surələr məcmuəsi.

[92] *Həl yəstəvi [əl-əma vəl-bəsir]...* – məgər korla gözlü şəxslər bərabərdir? Qur'anda "Ənam" surəsindən ayə.

[93] *Səlman* – Məhəmməd peyğəmbərin əshabələrindən biri. Əvvəl atəşpərəst, sonra xaçpərəst və nəhayət müsəlman olmuşdur.

[94] Bu başlığı F.Köçərli artırmışdır.

[95] *Əlkasibü həbibüllah* – kasıb Allahın dostudur. Hədisdir.

[96] *Əhməd bəy Ağayev (1868-1939)* – Azərbaycan burjua jurnalisti. "İrşad" və "Tərəqqi" qəzetlərinin redaktoru.

[97] *İnnəməl-mö'minunə ixvətün...* – mö'minlər bir-birinə qardaşdırlar... Qur'anda "Hücərat" surəsindən ayə.

[98] Son tədqiqatda Seyid Əzim Şirvaninin "Pərişannamə" adlı kitabının 1912-ci ildə İranda çap olunduğu və həm də fars şairi Qaaninin "Kitabi-pərişan" əsərinə nəzirə olduğu göstərilir. "Pərişannamə"nin "Rəbiül-ətfal"dan ibarət olduğu da ehtimal olunur. Həmin əsər hələlik əldə edilməmişdir. *S.Ə.Şirvaninin "Əsərləri"nin I cildinə yazılmış müqəddimə (Bakı, 1967, səh.8-10. Tərtib edəni: Süleyman Rüstəmov, redaktoru: Həmid Araslı); II cildinə yazılmış şərhlər (Bakı, 1969, səh.615-616. Tərtib edəni: Süleyman Rüstəmov, redaktoru: Əziz Mirəhmədov).*

[99] Tərcüməsi: Əlbəttə, ürəyində bir dərdi var.

[100] *"Xülasə"* – Şeyx Bəhaəddin Amilinin riyaziyyata aid "Xülasətül hesab" kitabı.

[101] *"Cəbrül-məqabil"* – Şeyx Bəhaəddin Amilinin cəbr kitabı.

[102] Übeyd Zakaninin əsəri. Bax: qeyd 2.

[103] "Kəlilə və Dimnə" kitabının meymun hekayəsinə işarədir.

[104] "Kəlilə və Dimnə"dəki dovşan hekayəsinə işarədir.

[105] *Əsgər ağa Gorani Adıgözəlov (1857-1910)* – Azərbaycan yazıçısı, "Əkinçi" qəzetinin müəlliflərindən biri.

[106] *Nəcəf bəy Vəzirov (1854-1925)* – məşhur Azərbaycan dramaturqu və publisisti.

[107] Beyt Füzulinindir. İkinci misrası şairin beş cildli əsərlərində: Təb'ə təğyir verib lə'li-Bədəxşan olmaz. *Məhəmməd Füzuli. Əsərləri, beş cilddə, I cild, Bakı, 1958, səh.379.*



[108] *Sən'an [Sən'an ibn Ənəs]* – Kərbəlada İbn Ziyad qoşunu sərkərdələrindən biri.

[109] Misra Sə'di Şirazinin "Gülüstan"əsərindəndir. Tərcüməsi: Adəti tərk eləmək xəstəliyə səbəb olur.

[110] Tərcüməsi:

Paxılların yanında onun qədri olmasa da,
Bəsirət əhlinin yanında onların hamısı Ədən dürrüdür.

[111] *Mahmud ağa* – XIX əsr Azərbaycan ziyalı mülkədarlarından biri. Şamaxıda ədəbi-musiqi məclisinə başçılıq etmişdir.

[112] İN: birisində.

[113] *Əhsənül-Qəvaid* – XIX əsr Azərbaycan maarif xadimi və jurnalisti gəncəli Hacı Məhəmməd Sadığın təxəllüsü. "Əkinçi" dövründə Rəştdə yaşamış və oradan qəzetə məqalələr göndərmişdir. *FQ, səh.433; AƏT, II cild, səh.143.*

[114] 1876-cı il aprelin 28-də çıxmış 8-ci nömrədə.

[115] *Mən ləm yəzuq və ləm yə'rif* – hər kəs dadına baxmasa bilməz. Ərəb atalar sözü.

[116] Tərcüməsi:

Gözəl surətə aşiq olmayanın
Başına ip keçir, dalına çul qoy.
Başında yar eşqi olmayan
Üçün palan və noxta gətir.
Gözəl üzlüyə aşiq olmayanın
Adını insanlıq lövhəsindən sil.

[117] Tərcüməsi:

Ruhun qidası köhnə şərabdır
Ki, onun rəngi və ətri gülün rəngini və ətrini dığladır.
Təmdə ata nəsihəti kimi acı və lakin faydalı.
Nadanların yanında batil, alimlərin yanında isə həqiqət olur.

[118] Tərcüməsi:

O, nə zülf və nə qulağın ətrafıdır, o, gecə və gündüzdür.
O, sənubər boylu deyil, həmişə yaşıl xurma ağacıdır.

[119] Tərcüməsi:

Şeyx istehza ilə mənə dedi: Şərab içmə haramdır.
Dedim ki, gözüm üstə, hər eşşəyə qulaq asmaram.

Beytdəki "betənz" və "çəşm" İN-də "betəne" və "huş". *Divane-Xacə Hafiz Şirazi: Tehran, səh.204.*

[120] *...ənharün min xəmrin ləzzətin lişşaribinə...* – orada (cənnətdə) şərabdan nəhrlər (çaylar) vardır ki, ondan içənlər ləzzət alırlar. Qur'anda "Məhəmməd" surəsinin 16-cı ayəsindəndir. Təfsirlərdə yazıldığına görə, cənnət şərabları adamı sərxoş eləmir.

[121] "Dəq kərdən"in mə'nası lüğətlərdə "pozmaq, qurub dağıtmaq" deyil, dığlatmaq, vərəmlətmək kimi verilir.

[122] İNİ: Rotəb' təzə xurma deməkdir.

[123] *[Yətufü əleyhim] vildanun məüxəlləddün...* – onları (behişt əhlini) həmişə orada (behiştdə) qalan cavan oğlanlar təvaf edər. Qur'anda "Vaqiə" surəsindən ayədir.

[124] *... əşşüəraü yəttəbiü hümül-ğavün...* – şairlər elə şəxslərdir ki, tüğyan edənlər, azğınlar onlara tabe olurlar. Qur'anda "Şüəra" surəsindən ayədir. Məhəmmədin dövründə islamiyyəti qəbul etməyən bir sıra şairlər vardı ki, peyğəmbərə həcv yazırdılar. Bu ayə onlar haqqındadır.

[125] *İlləlləzinə amənü [və əmilüssalihati]...* – Məgər o kəslər ki, iman gətiriblər və [xeyir əməllər edirlər]... Qur'anda "Şüəra" surəsindən ayədir. İslamiyyəti qəbul edən şairlər haqqındadır. Onlardan biri də Həssan ibn Sabit olmuşdur.

[126] Firdovsinin "Şahnamə" əsərindəndir. Tərcüməsi:

Şair inciyəndə həcv deyər,
Həcv isə qiyamətə kimi qalar.

[127] *İnnə lillahi təhtə ərşi künuz* – Allahın ərş altında xəzinələri (şe'r xəzinələri) vardır. Hədisdir.

[128] *Əşşe'rü hikmətün* – şe'r hikmətdir. Hədisdir.

[129] M: 781. Son tədqiqatda Həssan ibn Sabitin vəfatı tarixi H. 54-cü il (M.674) göstərilir. *Cürcü Zeydan. Ərəb ədəbiyyatı tarixi, dörd cilddə, I cild, Qahirə, 1957, səh.171.*

[130] *...nimə nasirünə...* – nə yaxşı köməkçimizdir. Hədisdir.

[131] *Şəra (şərayi-Yəmani)* – "Böyük it" bürcünün ikinci ulduzu Sirius.

[132] İN6 sərvəri-rəhman.

[133] M: 729.

[134] Tərcüməsi:

Söz asimandan enmişdir.
Söz göy aləmindən enmişdir
Sözün yerinə əgər gövhər olsaydı,
Sözün yerinə o, [yerə] enərdi.

[135] *İnnəməl-xəmrü [vəl məysirü... ricsün min əməliş-şeytani... fəctəni-buhu...]* – həqiqətən şərab içmək [və qumar oynamaq... murdar şeytan əməlləridir]... Qur'anda "ma'idə" surəsindən ayə.

[136] İN: pürdərdə.

[137] YT: Martın 21-də.

[138] *Səbbəhə lillahi [ma fissəmavati vəl-ərz]* -Allahı bütün yerdə və göylərdə olan hər bir şey (tə'rif edər). Qur'an ayəsindəndir.

[139] S.Ə.Şirvani. Əsərləri, II cild (səh.259): yerin.

[140] Tərcüməsi:

Kə'bə ilə bütxanə arasında heç bir fərq yoxdur.
Hər tərəfə ki, baxırsan, o bərabərdir.

[141] İNİ: Füzulinin:

Könül ta var əlində cami-mey, səhbayə əl urma,
Namaz əhlinə uyma, onlar ilə durma, oturma.

– mətlə'li qəzəlinə nəzirədir.



[142] *Seyid Məhəmməd Vəhəbi* – XIX əsrin əvvəllərində İranda şiə firqələrindən birinin başçısı.

[143] *İbrahim Həqqi (?-1772)* – məşhur türk filosofu və şairi; "mə'rifətnamə" əsərinin müəllifi.

[144] M: 5 dekabr 1828.

[145] M: 23 aprel 1892.

[146] M: 1 noyabr 1818.

[147] M: 30 noyabr 1891.

[148] M: 6 yanvar 1849.

[149] M: 1892.

[150] M: iyul 1832.

[151] *Bilal* – Məhəmməd peyğəmbərin qulamı.

[152] M: 30 yanvar 1876.

[153] Tərcüməsi:

Səfa getdi və işrət camımı sındırdı
Ey pir, məgər mənim üçün bəd dua eləmişdin?

[154] İN: Siyasət etsə mahrulər.

[155] F.Köçərli bu əsəri yazarkən sağ olan Məhəmməd Zöv'inin anadan olma və vəfatı tarixləri mə'lum deyildir.

[156] ZD, səh 60-67. F.Köçərli Zöv'inin bu əlyazma divanından istifadə etmişdir.

[157] ZD: Xoş ol gəh meykədələr içrə xanəmiz var idi.

[158] *ZD, səh.134.*

[159] İN: xak (ZD).

[160] İN: qurtarır (ZD).

[161] *ZD, səh.68.*

[162] M: 10 sentyabr 1856.

[163] Son tədqiqatda F.Köçərlinin müasiri Ağaəli bəy Nasehin 1914-cü ildə vəfat etdiyi göstərilir. *Bəylər Məmmədov. Sabir və Səhhətin dostu, "Ədəbiyyat və incəsən'ət" qəz., 9 may 1970.*

[164] *İNİ: Bağır* – qara ciyərdir. Fəqət əksəriyyəti-iste'maldan "ürək" mə'nasına keçdiyi burada bəllidir.

[165] İN: səfayi-vəsldən.

[166] Natəvanın "Ölürəm" rədifli qəzəlinə nəzirədir.

[167] *... kərrəmna...* – ... hörmətli və əziz etdik... Qur'anda "bəni-İsrail" surəsinin 72-ci ayəsindəndir. Ayədə deyilir: "Bəni-Adəmi hörmətli və əziz etdik, çölləri və dənizləri onların ixtiyarına verdik...".

[168] M:1840.

[169] *"Beyti-xamuşan"* – təxminən 1872-ci ildə Mirmöhsün Nəvvab tərəfindən yaradılmış ədəbi məclis. Fəal iştirakçıları Abdulla bəy Asi, Həsənəli xan Qaradaği, Məşədi Əyyub Baki, Fatma xanım Kəminə və başqaları olmuşlar. *Nəsrəddin Qarayev. Göstərilən əsəri, səh 166-178.*

[170] İN: dəvam

[171] İN: könlü.

[172] İN: irgac.

[173] İN:zəxmiğə.

[174] *Düxtəri-nəş arasında Cüdeyim var mənim. Düxtəri nəş* – Bənatün nəş (nəş qızları) bürcünə işarədir. Bu adla iki bürc məşhurdur: 1) Bənatün-nəş'i-kəbir yaxud Dübbi-kəbir ki, buna Böyük ayı bürcü deyilir; 2) Bənatün-nəş'i-səğir yaxüd Dübbi-səğir ki, buna da Kiçik ayı bürcü deyilir. Bu misrada söhbət kiçik ayı bürcündən gedir ki, onun sonuncu ulduzu Cüdeydir (qütb ulduzudur).

[175] İN: bir abinə.

[176] *... Mazaqə bəsər...* -... gözü meyl etmədi... Qur'an ayəsindən.

[177] İNİ: Bu qəsidə:

Həzar şükr, könül, mövsümi-bahar olacaq,
Həzar naləsi hər guşədə həzar olacaq.

– mə'tləilə başlanan qəsidədən ibarətdir ki, o da Hacı Seyid Əzim Şirvaninin tərcümeyi-halı arasında dərc olunduğundan təkrara hacət görülmədi.

[178] M: 1863.

[179] *Seyid Hüseyn ağa* – rəvayətə görə Natəvan dövründə Şuşada dərzilik edən bir cavan imiş.

[180] İN: latəvil

[181] Tərcüməsi:

Ey ürək, sözümə qulaq as, o, hər məclisin töhfəsidir,
Uyma dünyaya, bu alçaq dünya ...dir.
[Dünyanın] işi Zal fələyin Siyavuş kimi cavanlarının
Qanını tökməkdən, məkr və hiylədən ibarətdir.
Şərab içənlərin əlindəki gül rəngli şərab qədəhi
Fəramərzin kəlləsi və Təhəmtənin dodağıdır.
Dad pis üzlü qəzavü qədərin əlindən –
Ki, indi saxsının qiyməti Yəmən əqiqindən artıqdır.
Ürəyimin sirlərindən dünyada heç kəsin xəbəri yoxdur,
Dərdimə çarə yoxdur, bu dərd məni öldürəcəkdir.
Allah bilir ki, gecə-gündüz ciyərimin qanını içirəm,
Qarabağ şəhərində hasilim dərd-qəmdir.
Ürəyimin şikayətini kimə deyim, təngə gəlmişəm,
Çünki bu qəmi Kuhkəndən* başqa kimsə bilməz.
Tülküsifətlər şirlərin mağaralarında yatıblar.,
Simürğün Qaf dağı qarğa və dolaşaların seyrəngahına çevrilib.
İstədim öz qəmimi bir az şərh eləyim.
Ürəyim gülümsünüb dedi ki, ...
Guş qıl ta ki, yüzündən birini şərh qılım,
Mənim qəmginliyimə bais olan bu sözlərdir...

[182] M: 13 sentyabr 1874.

[183] İN: Əcəl peymanəsindən nuş etdi badə. Misra ilk nəşrdə idarədən verilmiş qeydə əsasən vəznə uyğun olaraq "Əcəl peymanəsindən içdi badə" kimi gedir.

[184] İN: Qaradanmı.

[185] İN: Nadən Əli, Əliyyən, Əliyyən, ya Əli.



[186] M: 1883-1884. RA-da (səh.175) İbrahim bəy Azərin təvəllüd tarixi H. 1251-ci il (M.1835), vəfatı tarixi h, 1302-ci (M.1835) il göstərilir.

[187] Bundan sonra İN-də aşağıdakı beyti F.Köçərli sual altında vermişdir.
(Hüsn Misrində, əzizim, ver şikəst bazarına,
Yusifin ta rismani-zalə sövdalənməsin?

[188] RA (səh.133) və TN-ə (səh.69) görə, Mirzə Əbülhəsən Şəhidin atasının adı Kərbəlayi Kazımdır.

[189] *Molla Zeynalabdin Sağəri* (*1793-1855*) – XIX ər Azərbaycan şairi. RA-da Şəhidin vəfatı tarixi H. 1301-ci (M.1884) il göstərilir.

[190] Tərcüməsi:

Ey eşqinin şuru başıma düşən,
İki dünyada səndən başqa istədiyim yoxdur.
Sənin xəyalın həmişə ürəyimdə canlandığından
Hara baxıramsa, gözümə səndən başqa heç kəs görünmür.
Sənin üzünə olan şövqüm səbr köynəyimi cırdı,
İndi mən [bu dərdə] necə dözüm.
Sənin adının zikri laim dilimin əzbəridir,
Surətin daim ürəyimdə nəqş olunmuşdur.
Sənin üzünə bir an baxıb kam almaq
Mənə yeddi iqlim məmləkətindən xoşdur.
Dünyaya üz tutub hər nəyə baxsam,
Gözümə səndən gözəli görünməz.

[191] Tərcüməsi:

Gözəllikdə indi yüksək mərtəbəli şah sənsən,
Sənin qılıncının şəhidi [bütün] şəhərdir, yoxsa nə ordudur, nə qoşun.
Sənin nurundan məndə qərar qalmadı,
Bilmirəm nəyə oxşayırsan: nə günəşsən, nə ay.
Sən gözümün qarşısındasan, lakin mənim heyrətdən
Nə danışmağa qüdrətim var, nə baxmağa cür'ətim.
Səni də adlandırım, sən hər nə desən ondan şirinsən,
Sənə nə deyim, sən hər nə istəsən ondan gözəlsən.
Sənin üzünə baxmaq mənim üçün padşahlıqdan artıqdır,
Sənə yaxın olmaqdan başqa heç bir mənsəb istəmirəm.
Məni min dəfə qılıncla vursalar da, səndən dönmərəm,
Kəhrəba kimi ixtiyarsız samanı özümə çəkirəm.
Mən sənin olmaq şövqilə göz yuma bilmirəm,
Qoşun arını öz balından necə ayıra bilər?
Sənin ay üzünə baxmağa məcbur olduğuma görə,
Eşq şəhidinin qiyamət günü günahı yoxdur.

[192] RA-da (səh.112) Salanın atasının adı Hacı Yusif bəy verilmişdir Burada onun vəfatı tarixi də göstərilir: H.1295-ci (M. 1878) il.

---

* "Xosrov və Şirin"dəki daşyonan (Kuhkən) Fərhad nəzərdə tutulur.

[193] RA-da Mirzə Haqverdi səfanın vəfatı tarixi H. 1294-cü (M.1877) TN-də H. 1299-cu (M.1881) il göstərilir.

[194] Tərcüməsi:

Bizim ah-əfğanımız çəmənə od vurubdur,
Ey bağban, çəməndə bizim aşiyanımız da yandı.
Qara qarğa bizim gülüstanı qərq elədi,
Gülüstanımız xəzan yelindən büzüşdü.
Qara qarğa gül budağında yuva saldığından
Bizim xoş nəğməli bülbülümüz susdu.
Sənin qapında rəqibdən başqa dadına yetən yoxdur,
Bizim gizli sirrimiz sənin qulağına nə vaxt çatar?!
Səfaya yüz cəfa yetsə də, yüngüldür (eybi yoxdur),
Bizim zəif bədənimiz bəladan başqa heç nə görməyib.

[195] Tərcüməsi:

Ey dostlar, Hindistandan uzaq düşüb
Qəmlərə mübtəla olan mənəm.
Ey cənnət bağının quşları.
Üns bustanından uzaq düşən də mənəm.
Ürəyim yenə can aləmini seyr edir,
Yenə ürəyim cananın əhdini yada salır.
Bağ, çəmən, məclis həvəsilə
Ruhumun quşu qanadlandı.
Başda bulbul olmaq həvəsi var,
Gül üçün qəribə nəğmələri var.
Unudulmuş aşiq vüsalı yada saldı,
Gör ki, Məcnun əslə doğru meyl etdi.
Ürəyin naləsi yenə huşumu başımdan çıxardı,
Yenə yarımı və diyarımı yada saldı.
Gülşən tərəfə meyl etdiyindən
Quş qəfəsdə çırpınır.
Həqiqi vətən ürəyin yadına düşdü,
Ürəyin işi yenidən müşkülə düşdü.
Əfsus ki, bahar keçdi və güllər saraldı,
Çəmən soldu, bülbül də [uçub] getdi.
Əgər zınqırov kimi ürəyimdən fəğan qoparsa,
Təəccüblü deyil, çünki karvandan geri qalmışam.
Ey xoş ol məclis ki, halım şad idi,
Ruhani məclisinin ruhunda idi.
Müqəddəs məclis idi, söhbət yardan idi,
Üns məclisi idi, çatışmayan yarın eşqi idi.
Ey xoş ol dərs ki, işraqidir.
Ey xoş ol şərh ki, müştaqidir.



Günəş batdı, bəsişıqlı ay hardadır?
Dəniz qurudu, bəs gövhər hardadır?
Hərçənd üzüm yarın üzündən ayrıdır,
Lakin onun surəti mənim yadigarımdır.
O dilrübadan zahirdə uzaq olsam da,
Ürəyimdə onun yaratdığı [elə bir] kəhrüba var ki,
Canımı mə'naya tərəf çəkir,
Mənə cananın yolunu göstərir.
Ey dənizdən yadigar qalan gövhər,
Ey yarın ətirli gülüstanının gülabı,
O gövhərdən çirağ kimi işıq bəxş elə,
Bu gülabımdan dimağımı ətirləndir.
Hərdən bir bu hicrana düşmüşdü yada sal.
Ürəyin Turunu öz nurunla nurlandır.
Hərdən bir tatar nafələrindən,
Hərdən bir ətirli namələrdən
O müqəddəs [diyardan] uzaq düşmüşə,
Ey mənim canım, lütf yolu ilə
Bizim yarın diyarından xəbər verən bir
məktub yolla ki,
Bizim xəstə könlümüzü şadlandırsın.
Yarın diyarından qalxan hər nəsim,
Aşiqin canını çox rahat edir.
Giriftar olanlara yar söhbəti xoşdur,
Bülbülə gülzar söhbəti xoşdur.
Mən ki, vətəndən, yardan uzaq düşmüşəm,
Ey mənim dostlarım, [qoy] sizin [gününüz] xoş keçsin.
Bütün varlığım fəğana gəldi:
Aman, hicran əlindən, aman!

[196] *Mixail Nikolayeviç Romanov* – Rus çarı II Aleksandrın kiçik qardaşı, 1862-1882-ci illərdə Qafqazın baş hakimi.

[197] Tərcüməsi:

Əgər zəif (zərif) çubuğa ziynət versən,
Vaxt olar ki, şahların öpüş yeri olar.

[198] Tərcüməsi:

Yenə Misir çəmənində gül üzlü Yusif göründü,
Bülbüllər Züleyxa kimi səs-küyə düşdü.
Çəmən quşu Fərhad kimi fəğana gəldi,
Qönçə səhər yelindən Şirinin dodağı kimi açıldı.
Lalənin ürəyinə Məcnun kimi od düşdü,
Nərgis çəməndə nazlanaraq Leyli oldu.
Bülbül qəmgin Vamiq kimi çəməndə seyr etdi,

Qızıl gül gülüstanda Əzranın üzü kimi oldu.
Bağ-bağça bülbülün Şur, Dügah, Nəva,
Rast və Humayun ahəngləri ilə doldu.
Ölülər İsanın səhər nəsimli nəfəsindən
Torpaqdan baş qaldırıb dirildilər.
Yusifi o Əyaza oxşar dilbərin qəmindən
Mahmud kimi dünyada eşq yolunda rüsvay oldu.

[199] Tərcüməsi: Bir ovuc (buğda, dən və s. b. k.) bir xalvarın nümunəsidir. Mə'nası cüzvə baxıb küllü təsəvvür eləmək olar.

[199a] Məxfinin vəfatı tarixi RA-da H. 1305-ci (M. 1887), TN-də H. 1309-cu (M.1891) il göstərilmişdir.

Son tədqiqat Nəvvabın göstərdiyi tarixi düzgün təsdiq edir. Məxfinin təvəllüd tarixi: 1821-ci il. *N.Qarayev. Göstərilən əsəri, səh.151-152.*

[200] Son tədqiqatda Məxfinin "Beyti xamuşan" deyil, "Məclisi üns" ədəbi məclisinin üzvü olduğu göstərilir.

*"Məclisi üns"* – XIX əsrin ikinci yarısında (1864-1897) Xurşidbanu Natəvanın evində təşkil olunmuş ədəbi məclisdir. Fəal üzvləri: Natəvan, Mirzə Rəhim Fəna, Mirzə Əliəsğər Novrəs, Məhəmmədəli bəy Məxfi və başqaları.

[201] *Ağköynək məsələsi* – keçmişdə hicri tarixlə məhərrəm ayının 10-da – Aşura günü avam camaat əyninə ağ köynək geyib başlarını xəncər və yaxud qılıncla yarardılar. Onların ibadət hesab etdikləri bu mərasim islam dinində və şəriətdə qadağan və haram sayılır.

[202] Tərcüməsi:

Gəl ki, sülh, barışıq, inayət vaxtıdır,
O şərtlə ki, söhbətin nədən getdiyindən danışmayaq.

[203] Şahinin vəfatı tarixi RA-da (səh.218) H. 1314-cü (M. 1896) il göstərilir.

[204] Son tədqiqatda Hacı Mirhəmzə əfəndi Nigarinin təvəllüd və vəfat tarixləri belədir: 1815-1885. AƏT, II cild, səh.63.

[205] *SND, səh.366.* Tərcüməsi:

Nübüvvət gülzarında bir gül bitdi:
Çəjimli Mirhəmzə ibn Paşa.

[206] Rəhim ağa Vəhidi haqqında bax: HN, II cild, səh.255-262.

[207] M:1859.

[208] *"Qeyrət"mətbəsi* – 1905-ci ildə Tiflisdə böyük Azərbaycan yazıçısı Cəlil Məmmədquluzadənin publisist Ömər Faiq və maarifpərvər tacir M.Ə.Bağırovla birlikdə təşkil etdiyi mətbəə-nəşriyyat. Burada Nigarinin divanı H. 1326-cı (M. 1908) ildə çap olunmuşdur. F.Köçərlinin istifadə etdiyi divanın eynidir.

[209] İN: mükərrəmdir.

[210] *SND, səh.212.*

[211] *SND, səh.2.*

[212] *SND, səh.190.*



[213] İN: bəhar (SND).

[214] İN: əbülaşiqdir (SND)

[215] *SND, səh.3.*

[216] *Əhməd Rüfət. Təsvirül-əxlaq, İstanbul, H. 1314, səh.184-185.*

[217] *SND, səh.3.*

[218] *SND, səh.6.*

[219] İN: cəfanı (SND).

[220] *SND, səh.8.*

[221] *SND, səh.11.*

[222] *SND, səh.190.*

[223] SND: Giriftarəm, əsirəm., mübtəlayəmü zarü məftunəm.

[224] *SNd, səh.53.*

[225] *SND, səh 73.*

[226] İN: divanələr (SND).

[227] İN: səd danələr (SND).

[228] *SND, səh.72.*

[229] *SND, səh.84-85.*

[230] *SND, səh.89.*

[231] SND: Lütf eylə dəmadəm, yeridir kaseyi-məmlu.

[232] İN: nəzər (SND)

[233] *SND, səh.192.*

[234] *SND, səh.271-273.* Son misradakı "kəlimi süxən" İN-də: sahibi-süxən.

[235] *SND, səh 87.*

[236] M: 17 avqust 1837. Son tədqiqatda Xurşidbanu Natəvanın təvəllüd tarixi 1830-cu il göstərilir. *AƏT, II cild, səh.160.*

[237] M: 1897.

[238] M: 1873. Son tədqiqatda bu tarix 1872-ci il göstərilir. *AƏT, II cild, səh.161.*

[239] M: 1854.

[240] Tərcüməsi:

Fatimənin* kənizi Xurşidbanu
Mələklə diz-dizə əyləşir.

[241] *Mirzə Bəybaba Əliyar bəy oğlu Fəna (1787-1867)* – XIX əsr Azərbaycan şairi.

[242] M:1841.

[243] Tərcüməsi:

Ey dost, sənin eşqin yolunda elə naşadam ki,
Fələk məni sənin yolunun tozu kimi yelə verdi.
Qəzanın qəfəsi içində qolsuz-qanadsız quş idim,
Ovçu tələ qurub məni hiylə ilə tutdu.
Bir ceyran idim, məni ümid dağında ram etdin,
Heyrət edirəm ki, mən sənin kəməndinə necə düşdüm.

* F a t i m ə – Məhəmməd peyğəmbərin qızı; ona "Fatimeyi Zəhra" da deyilir

Əgər mənim dərdli ürəyimin soyuq ahından qorxmursansa,
Allahın qəzəbinin atəşindən qorxub məni azad elə.
Sənin şurun mənim ovqatımı təlx etmişdir, çünki sən Şirinsən,
Fərhaddan fərqli olaraq mən səbr dağını kipriyimlə qazaram.
Pərgar kimi ömrüm boyu qəmlə dolandım,
Ey ustadım, aman bu çərxi-fələyin gərdişindən.
Kəminə səndən başqasına yalvarmadığından,
Ey Allah, əlimdən tut, əldən-ayaqdan düşmüşəm.

244 İN: 1318.

245 M:1847.

246 [*Fə eynəma tüvəllu fə*]*səmmə vəchüllah* – hansı tərəfə üz çevirsəniz, Allahın üzü o tərəfədir. Qur'anda "Bəqərə" surəsinin 109-cu ayəsi.

247 Asəf Lənbərani. HN, I cild, səh.496.

248 Tərcüməsi:

Ey ürək, bundan sonra öz nəfsindən keç,
Əgər aqilsənsə, dada çatan ol,
Fəqir Knyaz nə yaxşı demişdir:
"Heç kəsin ürəyini özündən incitmə.
Səadət yolu elə budur, vəssəlam!"
Hörümçəyin viranəsi məhv olsun,
Hörümçəyin evi qaranlıq olsun,
Hörümçəyin yuvası yerlə yeksan olsun,
"Əgər ürəyi milçəyin halına yanmasa,
Bir gecə hörümçəyin evi yansın".
Gəl bu xəstənin ürəyinə bir məlhəm qoy,
Bağlı qapıya bir açar sal.
Səhər gülündən ətrafıma bir dəstə qoy,
"Çəmənin fərşinə ahəstə ayaq bas,
Məbada səndən çör-çöp incisin".
Tale ovu dama saldıqda
Tamam ömrünün kökünü dibindən qoparır,
Bəla torunda əl-ayaq atır,
"Əgər qəfəsdəki quşa rəhmi gəlməsə,
Fələk sə'yyadın qolunu sındırsın".
Padşah ya bəndə olsan da
Şücaət taxtına layiqsən,
Bundan başqa daha ömr görməyəcəksən,
"Ey dost, nə qədər sağsan, yaxşılıq elə.
İkinci dəfə sənə nəfəs verilməyəcəkdir".
Qönçə kimi sən güllə dilbir ol,
Sən gülüstanın öz gülü ol,
Sən özünü gözəl əxlaqlı göstər



"Sən hamı ilə mehriban ol,
Heç kəsdən mehribanlıq təmənna eləmə".
Əgər insansansa, şeytan hiyləsi axtarma,
Nə şadlıq məclisi, nə də qəm küncü axtar,
Qənaət süfrəsində nə az, nə çoxsan,
"Xoş onun halına ki, dirhəmdən,
Nəfsin təhrikindən və nəfsin keydindən azaddır".
Üzr qəbul edən Novrəs cəsarət elədi,
Gəda padşahlar yanında cəsarətli olmaz,
Mən zəlil və fəqirliyə layiqəm,
"Vəfa insaf yolunu tut,
Səadət yolu elə budur, vəssəlam".

249 *Sultan Əbdülhəmid* (*1842-1918*) – 1876-1909-cu illərdə Türkiyə imperiyasının başçısı.

250 *Nəsrü minəllahi və fəthün qərib* – kömək Allahdandır və fəth (qələbə) yaxındır. Qur'anda "Səff" surəsinin 13-cü ayəsindəndir. Dini rəvayətə görə, bu ayə müsəlmanların Məkkədəki bütpərəstlərlə müharibəsi zamanı nazil olub, birinciləri vuruşa ruhlandırmışdır.

251 *Zünnureyi* [*yəni: iki nur sahibi*] – Xəlifə Osmanın ləqəbi. Məhəmməd peyğəmbərin iki qızını aldığı üçün ona bu ad verilmişdi.

252 İN: həshəsin.

253 M: 1900.

254 *Soltan Məcid Qənizadə* (*1866-1937*) – Azərbaycan yazıçısı və maarif xadimi.

255 *Mirzə Əliəsğər Novrəs. Pəndi-ətfal, Tiflis, H. 1316* (M. *1900*), *səh.3-4.*

256 *Yenə orada, səh.19-20.*

257 Tərcüməsi:

Adəm övladı ilandan pisdir,
Qəlblərə daim əziyyət verməkdədir.
İnsanların batini xəbis və murdar,
İlanın zahiri yumşaq və hamardır.
İlanın arxasına əl sürtmək
Mənim nəzərimcə yaxşı və münasibdir.
Adəm övladı ilə əl vermək
Ağıllı adamın işi deyil.
İlan hərdən bir adamı sancır,
Adəm övladı ilandan pisdir.
Pis əxlaqlı ilanın niştəri yaxşı olur,
İnsanın niştəri zərərli və ağırdır.
Cəfərin nəsihətlərini inkar edənlər
Rəzil, murdar və yaramazlardır.
Nadanları görməkdən Cəfərin gözü
Nərgis kimi daim xəstədir.

[258] Tərcüməsi:

Öz övladına yaxşılıq eləmə,
Öz əcdadına yaxşılıq eləmə,
Əgər yaxşılığın faydası olsaydı,
Nə üçün Adəm öz övladına eləmədi?

[259] *Ya leytəni türab* [*ya leytəni küntü türabən*]... – ... nə olaydı torpaq olaydım... Qur'an ayəsindən.

[260] *Şeyx Şamil* (*1798-1871*) – Dağıstanda çarizmə qarşı milli-azadlıq hərəkatının başçısı.

[261] M: dekabr 1902.

[262] M: aprel 1883.

[263] Son tədqiqatda Nacinin 1805-ci ildə anadan olub, 78 yaşında isə vəfat etdiyi göstərilir. *M.X.Ne'mətova. İki Gəncə həkkak-xəttatının işi haqqında, Azərb. EA Xəbərləri. İctimai elmlər seriyası, 1959, № 8.*

[264] RƏF-də Nacinin iki divanı saxlanılır. 46 vərəqdən ibarət olan birinci divan avtoqraf, 128 vərəqdən ibarət olan ikinci divan isə Mirzə Əliəkbər adlı katib tərəfindən köçürülmüş surətdir. Həmin divanlarda Nacinin "Təbib" təxəllüsü ilə də şe'rləri vardır. Ehtimal ki, F.Köçərli bu divanları görməmişdir.

[265] İN: bir.

[266] *Həsən Qarabaği* (*1824-1904*) – XIX əsr Azərbaycan şairi, "Məclisi-üns" ədəbi məclisinin üzvü.

[267] Ehtimal ki, Abbasqulu ağa Bakıxanov Qüdsi nəzərdə tutulur.

[268] Tərcüməsi:

Saqi, badə gətir, bahar gəldi,
Mey məclisinin büsatı başlandı.
Səbzələr uşaqlar kimi yuxudan oyandı,
Yer lalə və güllərlə doldu.
Səbzələrin uşaqları buludların döşündən
Allahın əmri ilə südəmər oldu.
Çiçəklər qara torpaqdan baş çıxarmışlar,
Allahın sən'ətkarlığına bax ki, qüdrətindən nə etmişdir.
Səmnanı buludundan yerə sular axıb töküldü,
Uca sərv ağacının altında arx əmələ gəldi.
Yaradanın hökmü ilə nisan yağmağa başladı,
O hər sədəfin bətnində qiymətli dürr oldu.
Budaqlarda cürbəcür meyvələr göründü.
Qurumuş budaqda alma, heyva, nar əmələ gəldi.
Söyüd ağacı barlı ağacları görüb
Xəcalətdən başını aşağı saldı.
Laübalı badəpərəstlər badə içdiyinə görə,
Meynə çubuğunda tə'nəyin qızı salxımlandı.
Dağ kəklikləri hər tərəfdə xuraman oldu.



Kəklik şahinin pəncəsində ovlandı.
Hər tərəfdən şükufələr çəmənə tərəf gəldilər,
Çəmənin məclisi rövnəqlənib qüvvətləndi.
Gül yüz qürurla hamıdan yuxarıda əyləşib,
Kamına çatmış fərmanverici padşah oldu.
Bayrama hər cür bəzək verdilər,
Çəmən saqiləri dolanmağa başladılar.
Hər kəs nə qədər bacarırdı içdi,
Nərgis çox içdiyindən xumarlandı.
Yüz ləzzət və şadlıqla bir-birinin yanında əyləşdilər,
Bülbül ah-nalə ilə, gül xar ilə yoldaş oldu.
Bülbül güldən vəfa ətri görmədiyindən
Ürəyi qan oldu, gözlərindən yaş tökdü.
Nə üçün lalə ürəyinə həsəd dağı çəkdi,
Nəstərən [gülü] və bənəfşə isə kübarlar əlində gəzdi?
[Lalə] güllərin arasından çıxıb dağa, səhraya üz qoydu,
Onun dağlarda məskən salmasına məhz bu səbəb oldu.
Zəmanənin adəti daim belə olduğundan [o],
Ruzigarın dövranından xar və zəlil oldu.
Elə ki, bahar vaxtı, gül mövsümü keçdi,
Payız gəldi, çəmənin üzü qubarlandı.
Şadlıq camı, gül və çəmən alt-üst oldu,
Gül rəngli qəba gülün qamətini [görüb] tar-mar oldu.
Bağların bütün quşları susdu,
Yazıq bülbül bağdan baş götürüb getdi.
Naci, bu dünyanın eyş-işrəti və ləzzəti heç kəsə qalmamışdır.
Bu dünyada heç bir adam daimi olubmu?

[269] Şö'lənin bu məcmuəsi əldə edilməmişdir.

[270] İN: səbzəyat.

[271] *Azərbaycan İraqı* – Cənubi Azərbaycanda hazırkı Həmədan mahalı.

[272] M: 1839.

[273] M: 1836.

[274] *Hübbül-vətəni minəl imani* – vətənə məhəbbət imandandır. Hədisdir.

[275] M: 1886.

[276] *Məmməd Səid Ordubadi* (*1872-1950*) – böyük Azərbaycan yazıçısı.

[277] İN-də də natamam və ləngdir.

[278] İN: var.

[279] *Düldül* – həzrət Əlinin atının adı.

[280] İN: şəbniklər.

[281] [*Və qiylə*] *ya ərz, übləʼi maəki* – [deyildi ki,] ay yer, öz sularını ud... Qur'anda "Hud" surəsinin 46-cı ayəsindəndir. Dini rəvayətə görə, Nuhun tufanı qurtaranda Allah əmr edir ki, ay yer, öz sularını yenidən ud, ay göylər, siz də öz sularınızı geri çəkin. Guya bu zaman, əmr icra olunur; sular çəkilir və Nuhun gəmisi yerə oturur.

[282] İN: İrəvan.

[283] M: 1846.

[284] *Mirzə Məhəmmədtağı Sidqi Naxçıvani (1854-1904)* – XIX əsr Azərbaycan şairi, jurnalisti və maarif xadimi.

[285] F.Köçərli İrəvan gimnaziyasına 1885-ci ildə Azərbaycan dili müəllimi tə'yin olunmuşdur.

[286] M: 1888.

[287] İN-də "Nakam" səhvən mö'tərizə içərisində getmişdir. Həmin nəşrdə bə'zi təxəllüslər, yer adları və s. düzgün oxunmaq məqsədilə mö'tərizə daxilində verilmişdir.

[288] İN: mundan.

[289] İN: 1832.

[290] *"Came'i-Abbasi"* – Şəriət kitabı. Məktəblərdə dərslik kimi işlədilmişdir.

[291] Tərcüməsi:

Ey qələm, ey mənə gecə-gündüz dost olan,
Başını qaldır, bir an dodaqlarını arala,
Hədsiz-hesabsız zəhmətlərdən sonra
Kitabın ikinci hissəsi qurtardı.
Üçüncü hissədən bir nəğmə başla,
Pərdədə olan sirləri bir-bir aç.
Mənim barmaqlarımın hökmündən boyun qaçırma,
Naməhrəm yanında bə'zi sözlər danışma.
Bəzən elə olur ki, tüğyan edirsən,
Hər gizli sirri açırsan.
Sənə hər nə deyirəmsə, boğazında saxla,
Ürəyin sirrini ağzından qaçırma
Mənim fikrimin əksinə çıxırsan,
Mənim qədəmimin əksinə qədəm qoyursan.
Mənsur ağzından çox sirlər qaçırdığına görə,
Onu boğazından dara çəkdilər.
Ömrünü eşqə sərf edib əsla dönmədi –
Ki, bu söz çoxlarını xar elədi.
Ürəyini mənə ver, heç kəsə vermə,
Sən'anın günahı onun məhəbbətidir, vəssəlam!
Eşq və eşqbazlıq sözünü danışma,
Yanar oddan salamatlıq gözləmə.
Eşq nəhayətsiz işlər görür,
"Dinlə neydən çün hekayət eyləyir"...*

[292] *"Kəşkül"* – C.Ünsizadənin redaktorluğu və naşirliyi ilə 1883-1891-ci illərdə Tiflisdə çıxan əvvəlcə aylıq jurnal (1883-1884, № 1-11), sonra isə həftəlik qəzet (1884-1891).

[293] *Kəlamüllah* – Qur'ana işarədir.

[294] Fars atalar sözüdür. Hərfi tərcüməsi: Bu karvan qiyamətə kimi ləngdir (yəni: Qozbeli qəbir düzəldər).

* Misra Cəlaləddin Ruminin "Məsnəvi"sindəndir.



[295] M: 1892.

[296] İN: batində.

[297] "Əkinçi"də: oldu.

[298] "Əkinçi"də: halətdə.

[299] İN: ola.

[300] "Əkinçi"də: hamı.

[301] "Əkinçi"də: edə.

[302] "Əkinçi"də: Var bizim şəhərin də bir neçəsi.

[303] "Əkinçi", 1877, № 20.

[304] İN: halımdır.

[305] İN: fərş.

[306] Benddəki bütün "edək"lər İN-də: edin.

[307] İN: könlünüzü.

[308] İN: əglənib.

[309] *QM, səh.247-250.*

[310] M: 1906.

[311] İNİ: Bu maddeyi-tarix şairin 1322-ci ildə deyil, 1312-ci (M. 1896) ildə vəfat etdiyini göstərir.

Tərcüməsi:

Dövrün əsilzadələrinin fəxri Seyid Rza Sabir idi.
[Onun vücudu] bəlağət elmini əhatə edən, ağıl və kamalın toplanan yeri idi.
Dünyadan birbaşa cənnət bağına köçdü,
Şe'ri ariflərə çox xoş gəldiyindən
Onun vəfatı tarixi "şairi-şirinməqal" oldu.

[312] M: 1845.

[313] M: 1907.

[314] *Müzəffərəddin şah* – 1896-1906-cı illərdə İran şahı, Nəsrəddin şahın oğlu.

[315] *Ərfəüddövlə* – İran yazıçısı və dövlət xadimi Mirzə Rza xan Danişin ləqəbi. İranın Tiflis və İstanbul səfiri olmuşdur.

[316] *...qul kəfa...* – ... de ki, kifayətdir... Qur'anda "Rə'd" surəsində ayədir. Dini rəvayətə görə, kafirlər Məhəmməd peyğəmbərin Allah tərəfindən göndərildiyinə inanmır və onun peyğəmbərliyini qəbul etmirmişlər. Bu ayədə peyğəmbərə xitab olunur ki, "onlara de ki, mənimlə sizin aranızda Allahın şahid olması kifayətdir".

[317] *"Şərhi-təcrid"* – Şeyx Məhəmməd ibn Məhəmməd Tusinin (ibn Tusi və yaxud Şeyx Tusi adı ilə məşhurdur) əsərinə Əli Quşçinin yazdığı şərh.

[318] *Laröhbaniyyətə filislam (şe'rdə vəznə görə: laröhbanə)* – İslamda tərkidünyalıq yoxdur. Hədisdir.

[319] İN: nüqadi-can.

[320] Tərcüməsi:

Ey dörd və yeddinin nəticəsi,
Yeddi və dörddən daim yanırsan.
Sənə min dəfə demişəm ki, şərab iç,
Geri qayıtmağın yoxdur, elə ki, getdin, getdin.

Rübaidəki "dörd" kainatdakı dörd ünsürü (su, od, torpaq, külək), "yeddi" isə göyün yeddi qatını bildirir.

321 *Əlhəqqü mürrün (şe'rdə vəznə görə: mürr)* – haqq söz acı olar. Bu Qur'an ayəsi yox, ərəb atalar sözüdür.

322 İN: Söylərəm xövfü xətərsiz mən şiri-aslan içmişəm.

323 İN-də "təxtə" sözündən sonra mö'tərizə içində bir sual işarəsi qoyulmuşdur.

324 İN: soruşmaq.

325 Misra İN-də də ləngdir.

326 "Əznab" ərəb dilində "zənəb" (quyruq) sözünün cəm'idir. Əslində isə burada zənb (günah. cəm'i: zünub) sözündən istifadə edilməli idi.

327 M: 1871.

328 İN: 1243.

329 Tərcüməsi:

Dünyada kitabdan yaxşı dost yoxdur,
Dünya qəmxanasında qəmxar yoxdur.
Təklik guşəsində hər an ondan
Yüz rahatlıq var, heç vaxt əziyyət yoxdur.

330 "Qəfir"dən əbcəd hesabı ilə Mustafa ağa Nəsirinin vəfatı tarixi H.1290-cı (M. 1873) alınır.

331 İN: əsrinə.

332 Bu divan hələ əldə edilməmişdir.

333 İki misra mə'naca İN-də də naqisdir. Ehtimal ki, onların ortasından bir neçə misra düşmüşdür.

333a Tərcüməsi:

Ürəyim istəyir ki, dünyanın bütün əhvalını
Əvvəldən axıra kimi yazım.
Dünya daim öz kamınca dolanıb,
Ağıllıya çox zülm edir.
Əbləhlərin hamısı naz-ne'mət içindədirlər,
Ağıllılar isə cigər qanı içirlər.
Ağıllı daim nadandan cəfa görür.
Adəm dövründən burada bir misal gətirim:
Habil naqabil Qabilin əlində
Onun iti (qabil) oxunun yarasından öldü.
Elə ki, Nəmrüd öz odunu yandırdı,
Xəlili götürüb odun içinə atdı.
Təmiz və gözəl xasiyyətli Yusif
Züleyxadan necə töhmətlər gördü.
Əgər tarixi oxusan, görərsən ki, Yəhyanın
Kafirlər əlində başı kəsildi.
Yəhudilər təmiz və pak olan İsaya,
Hədsiz-hesabsız zülm etdilər.



Əğyarın cövründən keçə bilərəm,
Yahuda ki, onun şagirdlərindən idi.
Rəvadırmı ki, İsanın o əzəmətlə
Sığınacaq yeri Suküba deyri olsun?
Görmədin ki, Misirdə Fir'onun əlindən
Musanın gecə-gündüz ah-zarla keçdi?!
Nəhayət, yüz cür müsibətdən sonra
Öz qövmü ilə dənizdən keçdi.
Qəbilədə Qeys adlı bir ağıllı vardı,
Leylanın eşqindən onun adı Məcnun olmuşdu.
Əgər Vamiq öz əsrinin yeganəsi olmasaydı,
Əzranın dərdindən suda boğulmazdı.
Sokrata öldürücü zəhəri də
Onun camaəti insafsızcasına içirtdi.

334 Tərcüməsi:

Onun sinəsi büllur kimi olsa da,
Ürəyi çaxmaq daşından bərkdir.
Ey ürək, daxilindəki qanı nə vaxta kimi gizlədəcəksən?
Sənin sirrin mənim göz yaşlarımda zahir olmuşdur.
Mənim yarımın üzü görünəndə
Gözəllər ulduzlar kimi yox olurlar.

335 Tərcüməsi:

Tusi əgər dilimdə olsa,
Bu parlaq beytləri alqışlayar.
Fələk səfehlərə cah-cəlal verib,
Ağıllılara isə qayğı göstərməyib.
Qeyrətlilər bəxt ilə daim vuruşurlar,
Dəyyusların bütün ləvazımatı hazırdır.
Fələk daim pakların qanını tökür,
Saqi, o büllur camı dolandır.
Kim ki, kişilikdən dəm vurdu, xar oldu,
Bu müəmmadan heç kəs baş çıxara bilmədi.
Sən on yaşında ürəklərin qəmini ələ aldın.
Ən ə'la dürrlər bu yaşda əldə edilir.
Ey ürək, elə ki yaşım qırxa çatdı, ölümdən başqa
Bu rəzil dünyadan təmənnam yoxdur.
Dünyada çoxları aşiq olublar,
Amma Nasir kimi rüsvay olanı yoxdur.

336 Tərcüməsi:

Afərin o təb'ə ki, dəniz kimi qiymətli dürrlər mə'dənidir.
Afərin bir nəzmə ki, onun bəhrəsi lö'lə və mərcandan yaxşıdır.
Uca Tanrı, bu dərəcədə də gözəl danışmaq və dürr tanımaq olar,
Onun gövhər saçan ürəyi məgər Ümman dənizidir?!

Layiqdir ki, onun nəzm boyunbağısını mələk boynundan assın,
Onun incə kəlamını fələk də can-dildən alar,
İndi onun şe'ri göydə Zöhrədən üstündür,
Əgər Çin bəhramı çalmasını açırsa, təəccüblü deyil.
Ütarid* onun nəzminin katibi olmağa dəyər,
Uca Allah, bu nə nəzmdir ki, sən deyirsən canın cövhəridir.
Əgər mənim təşbihlərim bir növ' kafirlər şəriətinə bənzəyirsə,
Nə eybi var hər hansı müsəlman olmayan desə:
Əgər onun sözünü Allahdan nazil olmuş vəhy adlandırsam heç eyb olmaz.
İlahi, günahımı əfv elə ki, bu, bir söz ustası haqqındadır.
Belə bir təbi sən verdin ki, xalq onu dəniz hesab edir.
Böyüklərin yanında onun bacarığı bundan da artıqdır.
Hərçənd onun nəzminin qiyməti dünyaya dəyər,
Ariflər yanında bu qiymət çox ucuzdur.
O, İsa mö'cüzəsi kimi ölüləri dirildir,
Xəstələrin ürəyi üçün belə şe'rlər dərmandır.
Ömrümdü gözüm belə yaxşı şe'r görməyib,
Onun hər nöqtəsinə insan gözü desəm dəyər.

[337] Tərcüməsi:

Uzunqulaqlar qızıl yüyənlə dünya üzünü tutmuşlar,
Ey ürək, ərəb atlarına bax ki, ağır palan altındadırlar.
Fələk hünər əhlini əbləhlərə möhtac edir,
Dünya həmişə əyrilərin və nadanların kamınca gərdiş eləyir.
Səfehlər və axmaqlar öz arzularına çatırlar,
Ağıllıların nəsibi həmişə məhrumiyyət çərxinin altıdır.
Elmdən bəhrəsi olanlar bəlaya giriftar olurlar,
Hikmətdə Loğman olanlar cahillərə nökər olurlar.

[338] İN: xun.
[339] İN: zülfi-müşkininə.
[340] *Ordibehişt* – İran hicri şəmsi təqviminin ikinci ayı, miladi təqvimlə 21 apreldən 21 maya qədər.
[341] İN: eyn.
[342] İN: dedim.
[343] İN: karandaşın.
[344] İN: olan.
[345] "Kiyah" vəznə görə "kiya" şəklində işlənmişdir.
[346] Tərcüməsi:

Pak ruhu quşlar kimi pərvaz elədi,
Allahın lütfü ilə yeri behişt oldu,
Qüdsiyyət aləminin sakinlərindən olduğu üçün
Öz mənzilinə şadlıqla getdi.

---
* Zöhrə – Venera, Bəhram – Mars, Ütarid – Merkuri planeti



[347] Əbcədlə H. 1320-ci (M. 1902) il alınır.
[348] *Haza mübahi* – bu mübahdır. *Mübah* – şəriətcə haram və ya məkruf olmayan şey.
[349] İN: Burada Xosrov, Şirin özündən gedir.
[350] *"Rəhbər"* – 1906-1907-ci illərdə Bakıda nəşr olunan siyasi-ictima'i ədəbi, pedaqoji jurnal. Redaktoru və naşiri: M.Mahmudbəyov.
[351] M: 1822.
[352] M: 1857.
[353] İN: bəhrəmən.
[354] İN: yay.
[355] İN: feyzin.
[356] İN: ümman.
[357] Misra İN-də naqisdir.
[358] Tərcüməsi:

Ağıllıların nəzərində yaşıl ağacların yarpağının
Hər biri Allahın qüdrətindən bir dəftərdir.

[359] Tərcüməsi:

Bəxtiyar sədəfdə nisan yağışının bir damcısı
Allahın qüdrətindən saf cəvahir olur.
Zəif bir qurd ağacın yarpağını yeyir, ondan
Allahın qüdrətilə təbii atlas əmələ gəlir.
Saqi badə verir və müridlər məst olurlar,
Hər biri Allahın qüdrətindən danışırlar.

[360] İN: Məsihadır.
[361] İNİ: Əbcəd hesabilə 1289 (M. 1867) olur.
[362] *Yə'cuc* – rəvayətə görə, Makedoniyalı İskəndər zamanında qətl və qarətlə məşğul olan vəhşi tayfalar: İskəndər onların qarşısını almaq üçün Dərbənd səddini səkdirmişdir. *Dəccal* -özünü on ikinci imam (Mehdi) e'lan edəcək yalançı imam.
[363] M: 1874.
[364] İN: məhəbbəti-səmimi.
[365] Son tədqiqatda Şahnigar xanım Rəncurun təvəllüd və vəfat tarixləri 1850-1890-cı illər göstərilir. *AT, II cild, səh.168.*
[366] İN: Nigaridir kəm, kani-kəmdəstini baz etmiş.
[367] Əbcədlə: 1300 (M. 1882).
[368] Tərcüməsi:

Şe'r – şairə, zirə – Kirmana məxsusdur,
"Vəsfi-yaran"ın haqqında qafiyələr,
Bir neçəsi də "Dərdi-pünhan"dan,
Xatiməsi isə "Əhvali-dövran"dır.

[369] *Haza firaqü beyni və beynikə* – bu, mənimlə sənin aramıza ayrılıqdır. Qur'an ayəsi. Ayədə deyildiyinə görə, Musa peyğəmbər Xızr peyğəmbərlə yoldaşlıq etmək

istəyir. Xızr deyir ki, sən mənim yoldaşlığıma davam gətirə bilməzsən. Musa tə'kid etdiyindən o razılaşır. Bir müddət keçəndən sonra Musa doğrudan da onun yoldaşlığına davam gətirə bilmir. O zaman Xızr deyir: – Haza firaqü beynivə beynikə.

[370] Tərcüməsi: Saqi, bir piyalə dolandır, özün üçün bir (xeyir) iş gör.

[371] İN: alırlar.

[372] Tərcüməsi: Ay Allahımız, sənə inandım, sənin əzəmətin uca olsun.

[373] İN: oğul-qız ağ ata-anayə.

[374] Tərcüməsi:

O, sənə deyər: dəli, axmaq!

[375] Tərcüməsi:

Məni başa düşmədin, heyvan it.

[376] *Makedoniyalı İskəndər* – e. ə. 356-323-cü illərdə Makedoniya hökmdarı. Şərq ədəbiyyatında İskəndəri-Rumi, İskəndəri-Kəbir, İskəndər Zülqərneyn adı ilə məşhurdur.

[377] İN: qəfəsdən.

[378] Tərcüməsi: Yol göstərən, bələdçi Allah səninlə olsun.

[379] İN: naf.

[380] *Fateh, Nicati* – XIX əsr mərsiyə şairləri.

[381] M: 1882.

[382] M: İyul 1888.

[383] İN: bu.

[384] Axırıncı iki misra yuxarıdakı əsas mətndə (səh.263-265) verilməmişdir.

[385] RƏF-də Şuxinin iki divanı saxlanılır. B-2584 şifrəli divan 217 səh., M-125 şifrəli divan isə 220 səhifədən ibarətdir. Müqayisə zamanı aydın oldu ki, F.Köçərli bunların birincisindən istifadə etmişdir.

[386] *ŞD, səh.65.*

[387] Tərcüməsi:

Bu gördüklərin adamların əksidir,
Adam deyillər, adam qanıdırlar.

[388] İNİ: haman tərcibənd Nacinin olmayıb Ziya paşanındır. Doğrudan da həmin parça türk şairi Ziya paşanındır. *Ziya paşa. Tərcibənd, İstanbul, (ili yoxdur), səh.12.*

[389] Bu bənd Ziya paşanın tərcibəndində yoxdur.

[390] *ŞD, səh.83.*

[391] İN: üzidə.

[392] *ŞD, səh.19.*

[393] *ŞD, səh.63.*

[394] ŞD-də (səh.4) Mustafa ağa Şuxinin vəfatı tarixi 1892-ci il oktyabrın 11-i göstərilir.

[395] İN: gəlməz.

[396] *ŞD, səh 55.*

[397] *Prixod mollası* – məhəllə mollası.

[398] Molla Məhəmməd Hüzninin divanı əldə edilməmişdir.



[399] İN: dəmdə.

[400] *Üsrən yüsrən* [*fəinnə məəl-üsri yüsrən*] – hər çətinliyin bir rahatlığı var. Qur'anda "İnşirah" surəsindən ayə.

[401] *...ələm nəşrəh...* – ... məgər şərh etməmişik?.. Qur'an ayəsindən.

[402] M: 1841.

[403] Son tədqiqatda Nakamın təvəllüd və ölüm tarixi 1839-1906-cı illər göstərilir. FQ, səh.392. Nakamın F.Köçərlinin qeyd etdiyi üç divanından ikisi – "Gənci-ədəb" və "qəzəliyyat"ı RƏF-də saxlanılır. Qəzəliyyat bir neçə nüsxədən ibarətdir. Üçüncü divan əldə edilməmişdir.

[404] F.Köçərlinin Məmmədəli Sidqiyə yazdığı 3 dekabr 1913-cü il tarixli məktubunda (RƏF, arx. 25, Q-8 (203), inv. 15903) və alimin arxivində saxlanılan bir sənəddən (Azərbaycan klassik yazıçı və şairlərinin siyahısı, RƏF, arx. 24, Q-1 (15), inv. 17953, I dəftər, XXXVII qeyd) mə'lum olur ki, Nakamın əsərlərindən nümunələri ona Salman Mümtaz göndərmişdir.

[405] İN: Səmalı dəhrdə (İsmayıl bəy Nakam, Divan, RƏF, M-58).

[406] İN: nida.

[407] İN: karım.

[408] Beyt Füzulinin divanında:

Yəni ki, vücud dami-qəmdir,
Azadələrin yeri ədəmdir.

[409] Buradan belə nəticə çıxır ki, guya adları çəkilən şairlərin İbrahim Həqqiyə nəzirə yazdıqları tərkibbəndlərin hamısı "Molla Nəsrəddin" jurnalının 2-ci nömrəsində çap olunmuşdur. Əslində isə jurnalın 21 aprel 1906-cı il 3-cü nömrəsində yalnız Molla Nəsrəddinin (Cəlil Məmmədquluzadə) nəzirəsi getmişdir. şe'r "Qərbdən məktub" fe'lyetonunun sonunda verilmişdir. Jurnalda İbrahim Həqqinin bu şe'rinə C.Məmmədquluzadənin ikinci nəzirəsi "dəli" imzası ilə yazdığı "Yuxu" fe'lyetonunun sonunda getmişdir: *"Molla Nəsrəddin" jurnalı, 22 dekabr 1906, № 38.*

[410] İN: qədri-xudra.

[411] İN: həman.

[412] İN: nurdur.

[413] İN: nüktərəvan.

[414] İN: kön.

[415] İN: gəhi.

[416] Parça Nizami Gəncəvinin "Sirlər xəzinəsi" əsərindəndir. Tərcüməsi:

Biz ki, sözə nəzər salmışıq,
Onunla ölü və onunla diriyik.
Eşq lüğətində söz bizim canımızdır,
Biz sözük, bu xəraba saray bizim eyvanımızdır.
Sözdən yuxarıda oturan bir kəs yoxdur,
Bu dünyanın hökmranlığı sözündür, vəssəlam!

[417] İN: xifr.

[418] Parça Nakamın "Gənci-ədəb" əsərindəndir. *GƏ, səh.27-33.*

[419] *İlminski N.İ. (1822-1891)* – əvvəlcə Kazan ruhani akademiyasında təbiət elmləri və türk-tatar dilləri müəllimi, 1861-ci ildən isə Kazan Universitetində türk-tatar dilləri və tarix-filologiya fakültələrinin müəllimi olmuş, 1871-ci ildə Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir. BS, səh.168-170.

[420] İN: gərdənkəsən.

[421] İN: miksan.

[422] İN: xosrovan.

[423] İN: müft.

[424] GƏ: dedi ki.

[425] GƏ: bihudə bir.

[426] GƏ: hökm verib, əmr edib, etdi nida.

[427] *GƏ, səh.33-37.*

[428] Üç misra İN-də:
Oldu rəhi-həqqi bulub hissəmənd.

[429] Buradan 9 beyt buraxılmışdır.

[430] İN: etdiyi əsər.

[431] *GƏ, səh.37-40.*

[432] Şe'r parçası Şəms Təbrizinin deyil, Şeyx Bəhaəddin Amilinin "Nanü-halva" əsərindəndir. Tərcüməsi:

Gözəl üzə mübtəli olmayanın
Adını insanlıq lövhəsindən sil.
Başında yar eşqi olmayan
Üçün palan və cilov gətir.
Gülüzlülərin məhəbbətindən boş olan ürək
Sürsümüklə dolu dəri çantadır.

[433] İN: məhəl.

[434] *GƏ, səh.40-42.*

[435] M: 1906.

[436] *"Dərbəndnamə"* – Mirzə Cəbrayıl Süpehrinin Dərbənd tarixinə dair əsəri, Dərbənd, 1891, səh.1-7. Əlyazması RƏF-də (B-333) saxlanılır.

[437] *I Keyqubad* – 488-531-ci illərdə Sasanilər sülaləsinin hökmdarı.

[438] *"Dərbəndnamə", səh-1-7.*

[439] Mirzə Kərim Şüainin divani H. 1298-ci (M. 1880) ildə Təbrizdə çap olunmuşdur.

[440] İN: farsca.

[441] Əlişir Nəvai noqay dilində deyil, cığatay dilində yazmışdır.

[442] M: 1819

[443] Qumrinin "Kənzül-məsaib" əsəri şairin bir neçə dəfə çap olunmuş divanına daxildir. Müqayisə zamanı F.Köçərlinin divanın H. 1300-cü (M. 1882) il Təbriz çapından istifadə etdiyi müəyyənləşdirildi. Həmin divan iki hissədən ibarətdir. (I hissə: mərsiyə və növhələr. II hissə: "Kənzül-məsaib").

[444] *Əl məcazu qəntərətül-həqiqə* – ərəb zərbi-məsəlidir. Hərfi tərcüməsi: məcaz həqiqətin körpüsüdür.



[445] *KM, səh.3-4.*

[446] KM: qəvam.

[447] İN: müstəhfər.

[448] *KM, səh.45.*

[449] Tərcüməsi:

Hər nə desəm, eşq ondan üstündür,
Eşq – Heydər əmirəlmö'minindir.

[450] İN: olanda vəsli tər-gül qönçənin arayiş əyyamı.

[451] *KM, səh.5.*

[452] Mətnə "Ağıl", "Təb'" və s. başlıqları F.Köçərli artırmışdır.

[453] İN: ruzigardə.

[454] İN: zibadən.

[455] KM: abid

[456] KM: qeyrət.

[457] *KM, səh.5-6.* Son beytdəki "təbini" İN-də: səbini.

[458] Bəxt olub qismət ola cür'əi hər aşiqə kim...

[459] İN: Qumriyi-gülzar (KM).

[460] *KM, səh.6.*

[461] İN: çarə.

[462] *KM, səh.7.* Beytdəki "pərirulərdən" KM-də: cəfaculər; "yar". İN-də kar.

[463] İN: xüsus.

[464] *KM, səh.7*

[465] *KM, səh.7-8.*

[466] İN:Hərgiz qulaq bu söhbəti-peymanə əqli-tacdar.

[467] İN: bağ.

[468] İN: Qumri olubdur aşiqi-şu şeydası dilbərin.

[469] İN: zülflərin.

[470] KM: Başında həvayi-eşqi-ruxi-dilbər olmasa.

[471] İN: tapılmaz.

[472] KM: Kamil deyil o kimsə ki, dövri zəmanədə
Tumari-eşqi məşq ona əzbər olmasa.

[473] *KM, səh.8-11.* Son misradakı "nişan" İN-də: fişan

[474] İN: baxır.

[475] *KM, səh.14.* Son misra İN-də:
Salıbdı nəzmi-gülüstanə nəzm ilə tufan.

[476] KM: Görüb bu məclisi bir dəm xəmuş oturdum lal.

[477] KM: cilvə qıldım.

[478] *KM, səh.14.*

[479] *KM, səh.14-15.*

[480] İN: xətaf.

[481] KM: həmişə nökər olaydım bu bəzmi-manda.

[482] *KM, səh.15.*

[483] *KM, II hissə, səh.1*

[484] KM: Miftahi-kənzdir alat şe'rdən.

[485] KM: hər kəs vaqif.
[486] İN: Nəf' nəfis olur bu təmənnadə nüktəsənc.
[487] İN: Var bu rümuzi-eşqdə ayati-bənat.
[488] *KM, II hissə, səh.1-2.* Son beytdəki "bənnayi-ruzigar" İN-də: əbnayi-ruzigar.
[489] *Əbülqasim Ünsüri* – Sultan Mahmud Qəznəvi sarayının şairi olub "Məlikuş-şüəra" ləqəbi almışdır. "Vamiq və Əzra"əsərinin müəllifi.
[490] KM: dərrakına.
[491] *KM: II hissə, səh.5.*
[492] KM: yığıb.
[493] İN: tutasan
[494] İN: xeyrü-xəst.
[495] *KM, II hissə, səh.5-6*
[496] *KM, II hissə, səh.10.* Beytin birinci misrası divanda: Piyalə ver mənə, aləm həvası gəlir.
[497] *İyyakə nə'bdü...* – sənə ibadət edirəm... Qur'anda "Həmd" surəsindən ifadə. Ayədə Allaha müraciət edilir.
[498] KM: müsəlmanan.
[499] KM, II hissə, səh.8-9.
[500] Tərcüməsi: Ağlar göz Allahın feyz çeşməsidir.
[501] *KM, II hissə, səh.10.* Birinci misradakı "bilməyirəm" İN-də: bilməyir.
[502] Tərcüməsi:

> Əcəl yeli ədəm səhrasından bir an kənar oldu,
> O gözəl çiçək gözlənilmədən dünyanın əlindən getdi.
> Bu fəna dünyadan yığışıb əbədi dünyaya köçdükdə
> İllərdən 1309 il keçirdi.

[503] M: 1891.
[504] Həmin məcmuə çap olunmamışdır. Əlyazması RƏF-də (S-200 saxlanılır. Həcmi: 272 səh.Yazılma tarixi yoxdur.
[505] *"Kənzül-maarif", səh.216-217.*
[506] M: 1834.
[507] M: 1877.
[508] MƏAD: istiqamətdən.
[509] *MƏAD, səh.215-216.*
[510] *MƏAD, səh.217.*
[511] MƏAD: olmadı heç birində asudə.
[512] *MƏAD, səh.217.*
[513] İN: xam.
[514] *MƏAD, səh.218.*
[515] *MƏAD, səh.219.*
[516] İN: əskəri.
[517] F.Köçərli burada "Asari-Dağıstan"ın mündəricatını kiçicik sadələşmə ilə vermişdir. *MƏAD, səh.8-10.*
[518] *MƏAD, səh.4-5.* Son misradakı "ğəvaşi"dən "Asari-Dağıstan"ın yazılma tarixini göstərən H. 1317-ci (M. 1899) il alınır.



[519] İN: rəhmət.
[520] İN: rayic; AD: rayih.
[521] İN: ah.
[522] İN: cərid.
[523] İN: üstə.
[524] *MƏAD, səh.5-8.* Son misradakı "duası" İN-də: duasın.
[525] Fürqan – Qaran adlarından biri.
[526] İN: Zəbani-farsü Türkiyəyə lazım istilahatı.
[527] Misra İN-də də ləngdir.
[528] *Və ma min daabbətin illa [və ma min daabbətin fil ərzi illa ələllahi rizqüha...]* – Yer üzündə elə bir canlı yoxdur ki, onun ruzusu Allah yanında müəyyən edilməsin. Qur'anın "Hud" surəsinin 8-ci ayəsindəndir.
[529] İN: əlsinətin.
[530] "Ğəşkəb"dən H. 1322-ci il (M. 1904) alınır ki, bu da mənzumənin F.Köçərliyə göndərilmə tarixidir. Həmin tarixdən iki il sonra 1906-cı ildə F.Köçərli M.H.Əlqədari haqqındakı bu oçerki yazmışdır: *HN; II cild, səh.346-356.*
[531] M: 1878. İN-də: 1695. Həmin tarix 334-336-cı səhifələrdəki şe'rin axırıncı bəndinə əsasən düzəldilmişdir.
[532] *MƏAD, səh.226-227.*
[533] M.H.Əlqədari 1910-cu ilin sentyabr ayında vəfat etmişdir. *"Səda" qəz., 10 sentyabr, 1910.*
[534] İN: tüccar. Düzəliş Mirəli Mənafinin "Mirzə Əbdürrəhim Talıbovun həyat və yaradıcılığı" namizədlik dissertasiyasına (Bakı, 1966) əsasən edilmişdir.
[535] Son tədqiqatda M.Ə.Talıbovun təvəllüd tarixi 1834-cü il, vəfatı tarixi 1911-ci il martın 10-u göstərilir.
[536] Əsər "Pəndnaməyi-Markusi-qeysəri-dövvüm" adı ilə H. 1310-cu (M.1893) ildə İstanbulda nəşr olunmuşdur.
[537] Əsər "Kitabi-fizik ya hikməti-təbiiyyə" adı ilə H. 1311-ci (M.1894) ildə İstanbulda çap olunmuşdur.
[538] Əsər "Risaleyi-hey'əti-cə'did" adı ilə H. 1312-ci (M.1895) ildə İstanbulda çap olunmuşdur.
[539] Əsərin adı "Səfineyi-Talibi ya Kitabi-Əhməd"dir. İki hissədən ibarət olan I cildi H.1311-ci (M.1894) və H.1319-cu (M.1901) illərdə, II cildi H.1312-ci (M.1895) ildə İstanbulda nəşr olunmuşdur.
[540] Əsər H.1323-cü (M.1905) ildə Qahirədə çap olunmuşdur.
[541] "Səfineyi-Talibi ya Kitabi-Əhməd"in III cildi hesab olunan bu əsər "Məsailül-həyat və ya Kitabi-Əhməd" adı ilə 1906-cı ildə Tiflisdə "Qeyrət" mətbəəsində çap olunmuşdur.
[542] Əsər H.1310-cu (M.1893) ildə İstanbulda nəşr olunmuşdur.
[543] "Səfineyi-Talibi ya Kitabi-Əhməd", səh.16.

Tərcüməsi:

Mənim dostlarım və İranın bütün müəllimləri yaxşı bilirlər ki, bəndənin oğlu Əhmədin uşaqlıqda necə qəribə iste'dadı vardı, necə məzəli uşaq idi. Onun "Eynəkli pişik" hekayəsi, gəmi düzəltməsi, şəkil çəkməsi, topçu paltarı geyməsi məşhurdur. Mənim övladım olsa da, onun salamatlığı üçün başqaları məndən çox dua edirdilər.

[544] *Fi əbsarihim ğişavətün...* – onların gözlərində pərdə var... Qur'anda "Bəqərə" surəsinin 6-cı ayəsindən. İslamiyyəti qəbul etməyənlər barəsində olan bu ayədə deyilir ki, onları qorxutsan da, qorxutmasan da, islamı qəbul etməyəcəklər; onların qulaqlarında və gözlərində pərdə var, həqiqəti görmür və eşitmirlər.

[545] *Ma huvə illa zikrün lil-aləmin* – o, dünya əhli üçün nəsihətdən başqa bir şey deyil. Qur'anın "Qələm" surəsindən ayə. Dini rəvayətə görə, Məhəmməd Qur'an ayələrinin islamı qəbul etməyənlər üçün oxuyub onları dinə də'vət edəndə onlar Qur'an haqqında beldə deyirdilər.

[546] M: 1902

[547] Mö'tərizənin içindəki F.Köçərlinin əlavəsidir.

[548] "Məsalikül-möhsinin", səh.43-48. Tərcüməsi:

İndi biz bu geniş məsələyə təcrübi cəhətdən baxarıq, onda sınaqdan çıxmış böyük dəlillərin şərhi düzgün hökmü sübut etmək üçün kifayət elər. Bu gün Avropanın on səkkiz dövləti xaçpərəstdir. Onların hamısı birlikdə islam millətinə qalib gəlib, məmləkətlərini istila edib öz məzhəblərini onlara qəbul etdirib arzularına çatmaq istəyirlər. Yə'ni məscidlərimizi kilsəyə çevirsinlər və bizi özlərinin qulları və təbəələri bilsinlər və eləsinlər. Belə olduqda, əlbəttə, biz gərək cəhad edək. İndi buyurun görək bəndə, siz və kənarda əyləşib şərbət içən ağalardan ibarət olan müsəlmanlar tə'lim görmüş əsgərlərin, təhpor tüfənglərinin, hər dəqiqədə iki yüz əlli gülləni bir ağaclıq məsafəyə atan topların həmləsinə (qarşı durub) müdafiəyə qadirikmi? Cəhada gedə bilərikmi? Əgər getməsək əsir olarıq, məğlub edilərik, məzhəbimiz və vətənimiz qaliblərin əlinə keçər. Belə olduğu halda vəzifəmiz budur ki, qanunun hökmü ilə iyirmi yaşlı bütün cavanlara cəhadı vacib edək. Hər il neçə min gənc arasında püşk ataq, hər kimin adına düşsə, o, at belində iki il hərbi elm öyrənsin və sonra azad olunsun. Lazım olduqda silaha sarılaraq öz vətənini və məzhəbini əcnəbilərin təcavüzündən qorusun. İndi çomaq, nizə, qılınc və təbərzin ilə ölkəni qorumaq mümkün deyildir. Gərək silahlı mücahidlərimiz olsun. Onların saxlanılması xərcləri üçün hər il bütün vətəndaşlardan "müdafiə vergisi" adı ilə müəyyən məbləğ pul alaq, orduya və onun sərkərdələrin sərf edək.

Ağa (yəni müctəhid) buyurdu: – Məgər bizim əsgərlərimiz yoxdur? Dedim: – Bəli, varımızdır. Vətəndaşlar onlar üçün pul da verirlər. Lakin o pulu toplamaq və xərcləmək üçün qanunumuz olmadığına görə, həmin pul başıbağlı başqalarının kisəsinə gedir. Əsgər isə ac, paltarsız və silahsız qalır. Əgər bu qanunu hərtərəfli və yaxşı tərtib etsək, hər kəs hüququnu və qanunu pozduqda alacağı cəza dərəcəsini bilsə, hərbi məhkəmə tərəfindən cəzalandırılsa, Allah eləməsin, onda biz cəhadın vacibliyini təhrif eləmiş oluruq?! Yaxud belə bir qanunun tərtibi və qaydaya salınması bid'ət olarmı?! Fəqət onun layihəsi, icra qaydası əsrin tələbinə uyğunlaşdırılar və möhkəmləndirilər... Bəs, hər bir şüurlu və münsif müsəlman bu barədə azacıq düşünsə, başa düşər ki, hər əsrin tələbləri əvvəlki və sonrakı əsrlərin tələblərindən tamamilə fərqlidir. Əgər bunları anlamasaq, bilməsək, həyata keçirməsək, min il bundan qabaqkı halda qalsaq, bu cəhaləti bir az da davam etdirsək, onda nə islamiyyətimiz qalacaqdır, nə də onun ehkam və ən'ənələri. Əcnəbi millətlər bu qəflətimizdən istifadə edəcək və bizə qalib gələcəklər.

[549] *Əlyövmə əkməltü ləküm dinəküm və ətməmtü əleyküm ni'məti və rəzzəytü ləküm əlisləmə dinən* – bu gün sizin dininizi kamil elədim, sizə bağışladığım ne'mətlər tamam oldu və sizin üçün islam dinini bəyəndim. Qur'anda "ma'idə" surəsinin 5-ci ayəsi. Dini rəvayətə görə Məhəmməd Məkkə səfərindən qayıdarkən Xüm çölündə onunla Məkkəyə gedən camaatı tapmayıb Əlini özünə xəlifə e'lan edir. Guya bu ayə də o zaman nazil olmuşdur. Yə'ni: Əlini xəlifə tə'yin etməklə islam dini kamilləşmiş oldu.

[550] *"Məsalikül-möhsinin", səh.271-272.* Tərcüməsi: Bilin ki, sizi tam azadlıq və hürriyyət Kə'bəsinin ziyarətinə də'vət edirəm. Siz vətənə məhəbbət və hökumətə pərəstiş məclisinin iştirakçılarısınız. Sizi islamın qanunlarına və tək Allaha and verirəm, tərəqqinin müqəddiməsi, istiqlaliyyəti qorumaq səngəri olan bu yaxşı işin bərqərar edilməsində və "Müzəffər qanunu"nun çıxarılmasında öz sevimli oğlanlarınızın müalicəsinə çalışdığınız kimi sə'y edin. Allahdan və imamlardan köməklik istəyin, məndən isə cəza və mükafat gözləyin. Hər kim hər nə bilirsə, azad surətdə desin, qorxmasın, xacətaşanlıq etməsin, şəxsiqərəzliyi olmasın... Öz fərmayişlərimin sonunda xatəmül-ənbiyaya istinad edərək deyirəm: "əlyövmə əkməltü ləküm dinəküm və ətməmtü əleyküm niməti və rəzzəytü ləküm əlisləmə dinən..."

Ondan sonra gülər üzlə, şahlara məxsus iti baxışla ətrafı və oradakı adamları mərhəmət nəzəri ilə süzdü. Qadağan olunmasına baxmayaraq, bütün iştirakçılar, hətta firənglər də "Yaşa! Uzun ömür sür!" sözlərini elə qışqırırdılar ki... bu böyüklükdə otaq titrədi. Bu sevindirici səsdən yuxudan ayıldım. Gördüm o qədər yuxulamışam ki, üzgözüm şişib. Qalxdım. Ev qaranlıq. Çıraq sönüb. Kibrit yox. Gecənin bu zülmətində hara gedim? Addımımı evdən bayıra qoysam, darğasız oğrulara rast gələrəm. Fikirli oturdum, gördüm ki, yatmaqdan yaxşı şey yoxdur. Başımı balışa qoyub yenə yuxuladım. Görək nə vaxt ayılaram.

[551] Racinin H. 1320-ci (M.1902) ildə Təbrizdə çap olunmuş divanı nəzərdə tutulur. F.Köçərli həmin divandan istifadə etmişdir.

[552] Tərcüməsi: Günahsız mərhum filankəsin divanı çox hörmətli məşhədi filanın göstərişi əsasında tamam oldu və ya xeyrül-həqq filan kərbəlayının sə'yi nəticəsində çap olundu.

[553] M: 1831-1836.

[554] M: 1875.

[555] Tərcüməsi:

Heyif ki, həzrət Raci
Dostlarının kisəsindən qızıl kimi getdi.
Hədsiz əfsus, yüz min heyif
Dünya evindən həsrətlə getdi.
Bizim ürəyimizə ayrılıq dağı çəkdi,
Ürəyimizi ayrılığı ilə yandırıb getdi.
Nə gecəm gecə, nə gündüzüm gündüzdür,
Başımdan huşum, ürəyimdən səbrim getdi.
Ey şadlıq çirağının çeşməsi, sənsiz
Gözlərimin işığı getdi.
(Yəqin) fələk başımıza qəm torpağı töküb –
Ki, sənin ayağına ölüm tikanı batdı.
Heyif o qülleyi-Qafın tərlanından –
Ki, Ənqa kimi ədəm (yoxluq) Qafına getdi.

Heyif onun kəmalatından –
Ki, əcəl küləyi ilə birdəfəlik (heç olub) getdi.
Ey suyu qan olanümman,
Sənin və bizim üzümüzün suyu getdi.
Sənin şurundan ürəklərdə şur var,
Sənin qığılcımından canlara qığılcım düşdü.
Kaş o, gəmiyə minəndə
"Ey yer suyu ud" hökmü veriləydi.
Yüz min təəssüf ki, onun qəbri
Pünhan oldu.
Onun qəbri Allah adamlarının qəlbindədir,
Hərçənd o, zahirən nəzərlərdən (uzaq düşüb) getdi.
Ölüm zülmətinə tək getdiyinə baxmayaraq,
O Xızr kimi diri və əbədi oldu.
Yunis kimi dari-fəna Misrindən
Axirət nəhənginin ağzına getdi.
Hər şey su ilə diridir,
Diri bir quş olub Xızr kimi getdi,
Cənnət evinə tərəf yollandı,
Müqəddəs quş özü evinə getdi.
Cismi qoyub başdan ayağa can oldu,
İkiliyi tərk edib tək getdi.
Bu gülşəndə gül kimi açıldı,
Çəməndən ayaq çəkib heçliyə getdi.
Kəlim kimi görüş arzusunda idi,
"Ərni" deyərək Sina dağına getdi.
Üzü mə'nəvi gözəl kimi görsəndi.
Musa kimi təcəlla ardınca getdi.
Eşq şərabından bir qurtum içdi,
Yenə badə kimi Minaya tərəf getdi.
Ərzdən təmizlənib cövhər oldu,
Ruh kimi çirkabdan təmizlənib getdi.
Nəhayət, dost öz dostuna çatdı,
Arzu elədiyi məqsədə yetişdi.
Ətirli, ənbərli, səbirli qələm
Onun tarixini yazmaq üçün gedib
"Əya ğəffiri" ifadəsini tapıb yazdı.

Son beytdəki "Əya ğəffari" ifadəsindən əbcədlə H. 1293-cü il alınır.
[556] *RD, səh.50.*
[557] *RD, səh.50.*
[558] *RD, səh.55.*
[559] *RD, səh.56.*
[560] *RD, səh.60.*



[561] *RD, səh.13-14.* Tərcüməsi:

Başı dosta qurban eləmək bizim üçün çətin iş deyil,
Bilirəm ki, bu naqabil bir şeydir və demək mümkün deyil.
Aşiq olan kəs canından keçməlidir.
Şeyx Sən'anın tərsa [qızı] üçün zünnardan arı yoxdur.
Ay dostlar, Racinin əfğanı vətən məhəbbəti üçündür.
Gül mövsümünün (qədrini) gülzarda olmayan bülbül bilər.

[562] *RD, səh.18.* Tərcüməsi:

Dost vəfası yolunda ölənin
Qanı ilə rəvadır ki, camaat dəstəmaz alsın.

[563] *RD, səh.42.* Tərcüməsi:

Tutaq ki, sən bütün dünyanın padşahı olacaqsan (oldun).
Tutaq ki, sən dünya xalqı üçün hökmdar olacaqsan,
Tutaq ki, sənin saraylarının başı fələyə çatacaq,
Bir gün olacaq ki, sən də kuzəgərlər üçün gil olacaqsan.

Bu rübai Ömər Xəyyamın "İn kuzə çü mən aşiqi-zari budəəst" mətlə'li rübaisinin tə'siri ilə yazılmışdır.
[564] İN: amma.
[565] *RD, səh.49-50.*
[566] *Mixail Yuryeviç Lermontov (1814-1841)* – böyük rus şairi.
[567] İN: hilalını.
[568] RD: xal.
[569] *RD, səh.59.*
[570] *RD, səh.60.*
[571] *RD, səh.84-85.*
[572] *RD, səh.111.*
[573] *RD, səh.120-121.*
[574] Pürqəmin divanı bir neçə dəfə Təbrizdə çap olunmuşdur. Ehtimal ki, F.Köçərli onun H. 1324-cü (M.1906) il çapından istifadə etmişdir.
[575] *PD, səh.2.* Tərcüməsi:

Bizim fikrimiz matəm hekayətidir,
Nitq pərişan zülf kimi qarışmışdır.
Əgər dostların xoşuna gəlsə,
O, Pürqəmin qəmxanəsi adlanar.

[576] İN: eyn.
[577] *PD, səh.24.* Tərcüməsi:

Saqi, səbr, dözüm zamanı deyil,
Dostlar, dövr Nəsrəddin dövrüdür.
Ey canımın ruhu, o ruhpərvər suyumdan

Kamran şahənşahın məhəbbəti ilə bir qədəh ver
Belə xoş bir zamanda, Cəmşid astanalı [padşahın] dövründə
Bu beş günlük dünyanın qəmini ürəyimdən çıxaracağam.
Şərab ver, mənim vücudumun ad-sanından soruşma,
Şərab ver, mənə adsız-sansız olmağımı eyib tutma.
(Dünyadan) köçmək təb'li çalan "eyn" və dörd "ğeyn"
Bu dünyada bəlkə bizim də adımıza onu çaldı.
Pürqəm, əgər eşq yolunda ayılmayacaqsansa
Dünya Muğanda muğlar pirinin kamıncadır.

[578] *PD, səh.121-122.*
[579] *PD, səh.114.* Son beytin birinci misrası İN-də:

Fəraq oduna yanar həşrə dək dili-Pürqəm.

[580] *PD, səh.90-91.*
[581] PD: Səkinəsi yanınca çölləri piyada gəzər.
[582] PD: Hüseynə ağla ki, Pürqəm, sən ağlayanda gəzər.
[583] *PD, səh.109.*
[584] Əsər bir neçə dəfə çap olunmuşdur. Burada onun H. 1310-cu (M.1892) il çapından istifadə olunur.
[585] Son tədqiqatda göstərildiyinə görə, Məhəmməd Bağır Xalxalinin Azərbaycan, fars və ərəb dillərində divanları olmuşdur. Bunlardan ancaq Azərbaycan dilindəki divanı "Sə'ləbiyyə" adı ilə nəşr edilmişdir. *AT, II cild, səh.169.*
[586] Aşağıdakı şe'rin sonundakı "Xalxaliyəm" sözündən əbcəd hesabı ilə H. 1310 (M.1893)-cu il alınır ki, bu da kitabın yazılma tarixini göstərir.
[587] *KS, səh 109-110.*
[588] İN: hal-hazırda.
[589] Son tədqiqatda Məhəmməd Bağır Xalxalinin XX əsrin ilk illərində 72 yaşında vəfat etdiyi göstərilir. *AƏT, II cild, səh.168.*
[590] KS, aləm.
[591] *KS, səh.110.*
[592] İN: etməsin.
[593] İNİ: Bu beyt Ziya paşanındır. Özü də belə olmalıdır:

Bu kargahi-sün' əcəb dərsxanədir,
Hər nəqşi bir kitabi-lədündən nişanədir.

[594] *KS, səh.4.* Son beytin tərcüməsi:

Cahan göz, zülf, xal və qaşdır,
Hər şey öz yerində gözəldir.

[595] İN: Əgər münədəm kişi olmayaydı zadi.
[596] İN: qərəz.
[597] *Əlbəlaü lilvəlai* – bəla dostlar üçündür. Hədisdir. Yə'ni: necə ki, dünyada biz həmişə zillətdə və bəla içində olmuşuq, bizi istəyənlər və bizim dostlarımız da bəla içində olarlar.



[598] Beytdəki "zərfi-mərə" İN-də: hərfi-mərə. Tərcüməsi:

Əgər meyli başqalarına idi,
Nə üçün Leyli mənim qabımı sındırdı?

Rəvayətə görə, Leyli xörək hazırlayıb öz əlilə yoxsullara paylayır ki, bəlkə Allahın rəhmi gəlib onu öz sevgilisinə çatdırsın. Bunu eşidən Məcnun əlinə bir qab alıb həmin yoxsullar arasında öz qabını Leyliyə uzadır ki, ona da xörək versin. Lakin Leyli onu görcək əlindəki qabı alıb yerə çırpır. Məcnun bundan çox xoşlanır. Ona deyirlər ki, sən özünü Leylinin yolunda həlak edirsən, o isə sənə bir qaşıq xörək vermədi-vermədi, üstəlik qabını da sındırdı. Onda Məcnun yuxarıdakı beyti deyir.
[599] *KS, səh.4-5.*
[600] *KS, səh.6.*
[601] *KS, səh.7.*
[602] KS. Bu çox hərzə olubdur, ver tələğın.
[603] *KS, səh 13.*
[604] *KS, səh.15.*
[605] *KS, səh 16.* II-IV misralar İN-də:

Məhəbbət həsbin əldən ölsə qoymaz,
Dolar mə'şuqlə cism, dirək, pust,
Olur aşiq fəna qalmaz məgər dust.

[606] İN: atarlar.
[607] İN: əyal.
[608] İN: qoparır
[609] *KS: səh.16-17.*
[610] *KS: səh.18.*
[611] İN: qafil.
[612] *KS: səh.18.*
[613] İN: cibi.
[614] KS: nikufam.
[615] *KS: səh.19.*
[616] İN: əlində görmürəm o əməldən.
[617] *KS: səh.20.* Son misradakı "ərz" İN-də: fərz.
[618] İN: çox.
[619] *KS: səh.34-36.*
[620] *KS: səh.29.*
[621] *KS: səh.32.*
[622] *KS: səh.37.*
[623] İN: deyildir.
[624] qövmü qardaş.
[625] *KS, səh.80-81.*
[626] *KS: səh.39.*
[627] İN: çalsan.
[628] İN: eylə.
[629] *KS: səh.45.*

[630] İN: getsin.
[631] *KS, səh.46-47.*
[632] İN: qəlb.
[633] İN: salma.
[634] *KS: səh.47-48.*
[635] *...latəkülu [əmvaləhum]...* – onların (yetimlərin) mallarını yeməyin. Qur'anda "Nisa" surəsinin 2-ci ayəsindəndir. Ayədə yetim malı yeməyin böyük günah olduğu göstərilir.
[636] İki misranın son sözləri KS-də: edirsən: yeyirsən.
[637] Durub özgələrə diqqət tutursan.
[638] *KS: səh.50-51.*
[639] *KS: səh.53.*
[640] *KS: səh. 57-58.*
[641] KS: Oğul, çox tıxma, keç bu bəd sifətdən.
[642] İN: qarnuva.
[643] İN: nurvəş.
[644] *KS, səh.83.*
[645] *KS: səh.81-82.*
[646] *KS: səh.84.*
[647] *KS: səh.98.*
[648] KS: yerdən.
[649] İN: gülüstandır.
[650] *KS, səh.103-104.*
[651] Dəxilin divanı bir neçə dəfə çap edilmişdir. Burada onun H.1325-ci (M.1907) il çapından istifadə olunur.
[652] MHDD:
[653] İN: hər yan.
[654] İN: pürxundi-sinan.
[655] İN: dağimdən.
[656] İN: laləyə.
[657] *MHDD, səh.225*
[658] İN: çox.
[659] MHDD: məndə.
[660] İN: nayibi (MHDD).
[661] *MHDD, səh.151.*
[662] Dilsuzun divanı bir neçə dəfə çap olunmuşdur. Müqayisə zamanı F. Köçərlinin əsərin H. 1281-ci (M.1864) il Təbriz çapından istifadə etdiyi aydınlaşdırıldı. *DD, səh.64.*
[663] *DD, səh.80.*
[664] Yenə orada.
[665] Yenə orada.
[666] DD: Bunca nə istər məni-bikəsi-naçardən.
[667] İN: həmleyi-dükkardən.
[668] *İNİ: Pişkar* – çörəyi yaxşı bişirməyib xəmir çıxaran şatir deməkdir.
[669] DD: çörəyi.



[670] DD: Daşlar olub kim, siyah, alma bu bazardən.
[671] DD: ya yenə.
[672] *DD, səh.80-81.*
[673] M: 1834.
[674] DD: Xəlq edən abü xakü narü həva.
[675] *DD, səh.27.*
[676] *DD, səh.88-89.*
[677] İN: Gecəm il, gündüzüm qarə kim, yox həmdəmi-nalə.
[678] İN: bu.
[679] *DD: səh.89.*
[680] DD: Gülzari-hüsn içində ləbi-qönçeyi-nigar.
[681] *DD, səh.91.*
[682] Divanda bu sözün yerində söyüş yazılıb.
[683] Divanda da bir misranın yeri boş buraxılmışdır.
[684] DD:

Ey könül, külli-cahanın aşinasın tərk qıl,
Olma qafil, bu sitəmgər dəhrə, bəsdir, vermə dil,
Mərdi-rah ol, sirrlə bu bədkirdar fe'lindən çəkil.

[685] İN: bilmir.
[686] İN: kəndçilərdə.
[687] DD: cümlə.
[688] İN: dil.
[689] DD: Cümlə ərbabi-tərəblər pürtəmədir çün yəlaq.
[690] İN: ağaçilər də.
[691] DD:Əhli-tüllabə, bilin xeyrat evi zurxanədir.
[692] DD: cümlə.
[693] DD:Nilfüruş xırdafüruşla toxməfüruşlar bisəbat.
[694] DD: yaran.
[695] İN: əxsazü hiyləkar.
[696] *DD: səh.103-105.*
[697] *DD: səh.105.*
[698] DD: Adam oldur eyləyə guşin kərü nitqini lal.
[699] DD: Koli bir kolun özündən bədgüman etmək gərək.
[700] DD: Xəlqə xatircəm olub urduq belə bir daməni.
[701] *DD: səh.108-109.*
[702] DD: Gəh çəkər deyrə, gəhi bütxanəyə, gəh məscidə.
[703] İN: nəfsinə.
[704] *DD: səh.115-116.*
[705] *DD: səh.117.* Son beytdəki "zalim" divanda: mə'lun.
[706] *DD: göz ilə.*
[707] *DD: səh.118*
[708] İN: şərt.
[709] *DD: səh.119.*

# KİTABDAKILAR

**FİRİDUN BƏY KÖÇƏRLİ**

# AZƏRBAYCAN ƏDƏBİYYATI

İKİ CİLDDƏ

II CİLD

"AVRASİYA PRESS"
BAKI-2005

Buraxılışa məsul: *Umud Rəhimoğlu*

Texniki redaktor: *Mübariz Piriyev*

Kompyuter səhifələyicisi: *Allahverdi Kərimov*

Korrektor : *Rövşən Hacıbəyli*

